

**Nəsrullayev Nüsrət Nəsrulla oğlu**
1947-ci il iyun ayının 14-də Masallı rayonunun Qızılağac kəndində anadan olub.

1968-ci ildə Ç.İldırım adına Azərbaycan Politexnik İnstitutunun nəzdində Bakı Politexnik Texnikumun Avtonəqliyyat fakültəsini fərqlənmə diplomu ilə bitirmişdir. Bakı şəhəri "Dəniz neft birliyi"nin avtonəqliyyat müəssisəsində məsul vəzifələrdə çalışmışdır.

1971-ci ildə Qızılağac kəndində "Kalinin" adına sovxozda təhlükəsizlik texnikası üzrə mühəndis işləmişdir.

1979-cu ildə Ç.İldırım adına Azərbaycan Politexnik İnstitutunun "Avtonəqliyyatın istismarı" fakültəsinə daxil olmuş, 1985-ci ildə oranı bitirmişdir. 1972-1986-cı ilə kimi Masallı rayon "Oktyabr" (Xıl kəndi) sovxozunda baş mühəndis, 1987-1995-ci illərdə 2715 saylı Masallı avtobazasında işləmişdir. "Qızılağac dünən və bü gün" kitabının müəllifidir. "İslam çələngi" adlı üç cildli kitab üzərində işləyir.

Hal-hazırda Qızılağac kənd məscidinin axundudur. Ərəb, fars, rus dillərini bilir. Dörd oğul, iki qız atasıdır.




www.adiloglu.az

# QIZILAĞAC və QIZILAĞACLILAR

MOLLA KƏRBƏLAYİ
NÜSRƏT QIZILAĞACLI




MOLLA KƏRBƏLAYİ NÜSRƏT
QIZILAĞACLI









QIZILAĞAC
və QIZILAĞACLILAR


RUSİYA FEDERASİYASI
DAĞISTAN
GÜRCÜSTAN
ERMƏNİSTAN
İRAN
XƏZƏR DƏNİZİ
TBİLİSİ
TELAVİ
GÜRCAANİ
SAQARECO
RUSTAVİ
QARDABANİ
MARNEULİ
Siqnaxi
Dedoplis-Tskaro
Noyemberyan
İCEVAN
Berd
Çambarək
Sevan
RAZDAN
Göyçə gölü
Kamo
Martuni
Vardenis
Yeğeqnadzor
Vayk
SİSİAN
GORUS
QAFAN
Balakən
Poştbinə
Kortala
ZAQATALA
Əliabad
QAX
ŞƏKİ
Əyriçay
AĞSTAFA
QAZAX
TOVUZ
Kür
Şəmkir su anb.
Mingəçevir su anb.
Samux
Dəlilər
Nəbiağalı
MİNGƏÇEVİR
ŞƏMKİR
GƏNCƏ
XANLAR
Gədəbəy
DAŞKƏSƏN
Goranboy
Naftalan
YEVLAX
TƏRTƏR
Tərtər
BƏRDƏ
Kəlbəcər
İstisu
Qorçu
XANKƏNDİ
Xocalı
Xocavənd
ŞUŞA
Minkənd
Laçın
Zarıslı
Qırmızı Bazar
Kəndələnçay
FÜZULİ
Horadiz
Cəbrayıl
Qubadlı
Həkəri
Zəngilan
AĞDAM
AĞCABƏDİ
BEYLƏQAN
Qarabağ kanalı
Yuxarı Qarabağ kanalı
Sədərək
Şərur
Araz
Şahbuz
Badamlı
Kükü
Araz novsdqını su anb.
NAXÇIVAN
Babək
Nehrəm
Culfa
Ərəfsə
Xurs
Parağaçay
Ordubad
Valama
Müqtədir
XUDAT
Xiv
Qasımkənd
Rutul
Məhərrəmkənd
Samur
Samur
QUSAR
Mocuq
XAÇMAZ
Çarxı
QUBA
Qudiyalçay
DAVAÇİ
SİYƏZƏN
Qonaqkənd
Oğuz
QƏBƏLƏ
Turan
Xızı
Altıağac
Şuraabad
İSMAYILLI
ŞAMAXI
Qobustan
SUMQAYIT
Abşeron
Pirallahı
Çilov a.
Binə
Xırdalan
BAKI
Daş Zirə a.
Böyük Zirə a.
Şah dili
Türkmənbaşı 305 km
Maraza
GÖYÇAY
AĞDAŞ
Şirvan
Yuxarı Şirvan kanalı
AĞSU
UCAR
KÜRDƏMİR
Zərdab
Şirvan
Mollakənd
Hacıqabul r-nu
Çeyldağ
Ələt
Sahil
Qobustan
Zənbil a.
Xərə Zirə a.
HACIQABUL
ƏLİ BAYRAMLI
SABİRABAD
SAATLI
Sarısu g.
İMİŞLİ
Qaraçala
Cuxanlı
SALYAN
Yuxarı Qaramanlı
Kür
Bankə
NEFTÇALA
Salyan 157 km
BİLƏSUVAR
Bolqarçay
Allar
CƏLİLABAD
GÖYTƏPƏ
Qızılağac körfəzi
MASALLI
Ərus
Boladigah
Yardımlı
Kirəvud
Şıxlaşər
LƏNKƏRAN
Lerik
Pirasora
Kijoba
ASTARA
Həştərxan 863 km
Mahaçqala 507 km
I
II
III
IV
VI
VII
VIII

Az
N 57

*Bu kitabı Qızılağac məktəbinin*
*110 illiyinə ithaf edirəm*

Redaktor: **Minaxanım Təkləli**
pedaqoji elmlər doktoru

**Kitabın sponsoru Hidayət Əsgərov**

N 57 **Molla Kərbəlayi Nüsrət Qızılağaclı**
**Qızılağac və qızılağaclılar**
Bakı, "Adiloğlu" nəşriyyatı - 2006, 520 səh.

***Kitabda respublikamızın dilbər guşələrindən olan Qızılağacın tarixi keçmişindən və bü günündən xəbər verilir. Bu sahəyə ikinci dəfə müraciət edildiyindən kitab böyük maraq doğurur.***

***Kitaba daxil edilmiş yazılar müəllifin gərgin əməyi və ciddi axtarışlarının bəhrəsidir. Ümid edirik kitab oxucular tərəfindən maraqla qarşılanacaq və geniş əks - səda doğuracaqdır.***

N $\frac{4712310316}{121\text{-}2006}$ qrifli nəşr

© "Adiloğlu" nəşriyyatı

## *REDAKTORDAN*

*Son zamanlar Azərbaycan tarixinə - istər onun öyrənilməsinə və eyni zamanda, bu tarixin öyrədilməsinə maraq xeyli artmışdır.*

*Bu yüksəliş ən çoxu respublikamızın müstəqilliyini əldə etməsi və bu müstəqilliyin nəhayət fikir və düşüncələrə, dünyagörüşlərə də sirayət etməsilə bağlıdır.*

*Bəzən bu sahədə tarixçilərlə yanaşı, yurdun ziyalıları, başqa peşə adamları sadəcə yurdsevərlər də işə qoşulur və heç də alimlərdən az iş görmürlər.*

*Belə araşdırmalar "həvəskar" tədqiqlər olsa da, xalqın etnik simasının müəyyənləşdirilib bütövləşdirilməsində, parlaqlaşdırılmasında, etnik psixoloji xüsusiyyətlərinin, ənənəvi mədəniyyət, məişət məsələlərinin, hətta qarşılıqlı mədəni əlaqələrin öyrənilməsi işində zəngin material verir. Belə diyarşünaslıq zəhməti itirilməməlidir.*

*Bu istiqamətdə Molla Kərbəlayi Nüsərt Qızılağaclının "Qızılağac və Qızılağaclılar" kitabı təqdirəlayiq əsər kimi diqqətimizi cəlb etdi.*

*Kitabda ayrıca bir regionun əhalisinin həyatı, onların güzəranı, ailə-məişəti, tarixi, milli köklərdən rişə verən mədəniyyəti, xalq sənəti formaları, təsərrüfat həyatı haqqında geniş məlumat verilir. Bu məlumat müəllifin - uşaqlıqdan həyatı bu yerlərdə keçən və bu torpağa möhkəm tellərlə bağlı olan müəllifin geniş müşahidələri əsasında yaranmışdır.*

*Müəllif - Kərbəlayi Nüsrət Qızılağaclı araşdırmasını tarixlə, xüsusən etnoqrafiya istiqamətində əlaqələndirməklə arxeoloji, coğrafi aspektlərlə dolğunlaşdırmışdır.*





*Bu torpaqla, yurdla bağlı sanki heç nə müəllifin gözündən qaçmır: qədim dövrlərdən Azərbaycanda olmuş səyyahların yol qeydlərini, xatirələrini toplayıb nəzərdən keçirir, Qızılağacla bağlı əldə etdiyi hər bir məlumatı oxucusuna ötürməyə çalışır.*

*Axı məlumdur ki, Azərbaycan haqqında etnoqrafik məlumatlar Qafqazşünasların, - xüsusən Azərbaycanda olmuş səyyahların əsərlərində sıx-sıx rastlanır. Müəllif avropa səyyahlarının, həm də rus müəlliflərinin (buraya məşhur dövlət adamlarının rəsmi sənədləri və s. də daxildir) qeydlərini diqqətlə araşdırır.*

*Qızılağac istər əlverişli dayanacaq: - liman kimi, istərsə də quru yolu üzərində mühüm məntəqə kimi məlum idi. Buna onun səfalı iqliminin də güclü təsiri səbəb olmuşdu.*

*Kitabda "Qızılağac xəritələrdə", "Makedoniyalı İskəndər Qızılağacda olmuşdur", "Qızılağac qoruğu", "Qızılağac körfəzi", "Səyyahlar Qızılağacda", "Qızılağaclı Musa xan" və s. kimi başlıqlar işin hərtərəfliliyini, çoxcəhətliliyini, dolğunluğunu göstərməkdədir. Həqiqətən çəkilən zəhmət böyükdür. Müəllifin mövzuya münasibəti, yanaşma tərzi də maraq doğurur; cəsarətli fikirlər irəli sürülür: Qızılağac vaxtilə çiçəklənən şəhər olmuşdur və dərhal həmin şəhərin qalıqlarının, daha doğrusu şəhər xarabalıqlarının mövcudluğu göstərilir və oxucu müəllifin fikrinə ortaq edilir, inandırılır.*

*Makedoniyalı İskəndərin qadınlardan təşkil olunmuş qoşun ilə vuruşması fikri təkzib edilir. Müəllif sadəcə bunu İskəndərin böyüklüyünə yaraşdırmır. Onu qadınlarla üz-üzə qoymur.*

*Kitabın yazılma üslubunda ziyalı əməli və vicdanı aydın duyulur. Yer adlarının dəyişdirilməsi qəbul edilmir. Bu böyük ziyalılıqdır. Axı bu addəyişmədən ən çox ziyan çəkən elə*





*Azərbaycan və onun tarixi olubdur. Hamımızın yadındadı, kabinetlərdən verilən əmrlərlə (o əmrlərin yurd-vətən sevgilərinə şübhə edirəm) bərabər yerli ziyalı qrupları kollektiv ərizələrlə doğma yurdun, ocağın nə qədər adlarını dəyişdilər. Nə qədər gözəl, qədim adlarımızdan məhrum olduq. Yer adı həmin yerin sahibinin - xalqın sənədidir; belə adlar tarixi abidələr dəyərində hifz olunmalı ikən amansızlıqla ləğv olunub yeni adlarla əvəz olundu. Həmin "ziyalılar" səbəb onu göstərdilər ki, yer adının mənası onlara aydın deyil və ya bu məna çox xoşagəlməzdi. Onu unudurdular ki, ulu babalarımız ləyaqətsiz adı öz ocaqlarına yaraşdırmazdılar.*

*Həmçinin o ziyalılar kabinetlərdən fərmala gələn və o torpaqla əlaqəsi olmayan yeni uydurma adı sükutla qarşılayır, səslərini çıxarmırdılar.*

*İxtisasca Kərbəlayi Nüsrət nə tarixçidir, nə də filoloq, fəqət doğma yurda aşiq, vətənsevər, yurdsevər bir ziyalıdır - diyarşünasdır.*

*Kitabın ayrıca bir müəyyən qismini qızılağaclılar - bu yurddan çıxan, öz əməyi, zəhməti ilə böyükləşən böyük insanlar tutur. Müəllif bu bölməni kəndin müəllimləri ilə başlayır. Çünki məktəb, maarif yolunda səy göstərənlər, çalışanlar, millətə elm ziyası bəxş edənlər ən böyük hörmətə layiqdir. Bəzən ən kiçik detallar, incə bir ştrix və ya ötəri təfərrüat daha böyük təsirə malik olur. Bu mənada belə tədqiqatçı həssaslığına təsadüfi baxmaq olmaz.*

*Kitab gərgin əmək, həm də uzun müddət çəkilən zəhmət hesabına ərsəyə gəlib.*

*Müəllif qədim xəritələrdə səyyahların qeydləri üzrə mühüm sənədləri, eləcə də müasir tarixi mənbələri araşdırmaqla Qızılağac (böyük Qızılağac - yəni körfəz, qoruq və s. əlavə edilməklə) haqqında bütöv söz deyib dolğun fikir yaratmağa çalışır.*

 

*Nəticələr sevindiricidir: Xəzər dənizinin kənarında Qızılağac qoruğu ilə bağlı adaların təbiəti və tarixi təqdim olunur. Oxucu bu zaman əski, köhnə adlarla tanış olur (Məsələn, Kulakin adasının əsl adının olduğu kimi, və s.). Axı Xəzər dənizinin istilası (daha doğrusu, sahillərinin) nəticəsində I Pyotr dərhal həmin adaların adlarını öz xoşuna gələn adlarla (yəni özünə rahat görünən) əvəz etmişdi. O adlar indi də yaşamaqdadır...*

*Zəngin bir irs dəyərində Azərbaycanın cənub regionlarının ciddi öyrənilməsinə xüsusi ehtiyac vardır. Bu özü bütövlükdə Azərbaycan xalqının qədim və zəngin maddi mədəniyyətinin, tarixinin və s. öyrənilməsinə kömək edər. Çox səmərəli olardı ki, bu regionun milli geyim-kecimi, yeməkləri, sənətkarlıq örnəkləri, folklor nümunələri də bu əsərdə öz yerini tapaydı. Biz əsərin yeni capında müəllifdən bunu gözləyirik.*

*Vətən tarixi açılmamış xəzinədir. Bəzən onu açarı qeyb olan bir dəfinə sandığına bənzədirsən... Belə kitablar isə Böyük Tarixin ayrı-ayrı səhifələridir. Bu yarpaqlarda, bu sətirlərdə ürək döyünür, oğul ürəyi; vətənin, el-obanın qədrini bilən, sevincini yaşayan, qəhrini çəkən övlad ürəyi.*

*Yanır, çırpınır belə ürəklər. Hansı işlə məşğul olsa da, çiynindəki yükü, boynuna çəkdiyi məsuliyyəti vətən qarşısında borcu hiss edir. Bəzən bu borc yükü məngənə kimi onu sıxır, rahatlığını pozur. O da əllərindəki işi bir yana qoyub bu qələmdən yapışır. Hər şeydən əvvəl gözləri önünə Ana gəlir, başı örpəkli, baxışı həyalı ana. Sonra dərsə getdiyi cığırlar, otları qalxıb çitədiyi, gahdan da qarlar altında görünməz olan yollar-yolaqlar gəlir. Fəqət gözüyumlu bildiyin, bələd olduğun, əlhavasına belə tapa bildiyin döngələr, cığırlar.*

**Minaxanım TƏKLƏLİ,**
*filologiya elmləri doktoru*

  

## ÖN SÖZ

***Kim bilir neçədir dünyanın yaşı,***
***Tarixin nə qədər yazısı vardır.***
***Hər saxsı parçası, hər məzar daşı,***
***Nəsildən nəsilə bir yadigardır.***

Qızılağac! Nəsillər yadigarı, adı ilə dünyanın alim, səyyah, din xadimlərinin, bilicilərin yaddaşına, qədim tarixi ilə əsərlərə həkk olunan, qəlblərdə silinməz iz buraxan doğma kəndim. Neçə-neçə mərd mübarizlər, xeyirxah insanlar, iman sahibləri və din xadimləri, alim, şair, dövlət adamı yetişdirən kəndim. Həmişə mavi Xəzərin həzin-həzin laylası ilə gecələyən, xəfif küləyi ilə yenidən oyanıb sakinlərinə yaşayıb-yaratmaq ümidi bəxş edən, doğma diyar...

Allahın yer aləminə bəxş etdiyi tükənməz sərvəti olan, dünyada öz gözəlliyi ilə tanınan cənnət timsallı dilbər guşə - qədim diyar, doğma kəndim! Sənin qoynunda gəzdim. Həmişə məni bu gəzintilər fikrə, xəyala qərq edirdi. Bu fikr-xəyal sənin haqqında eşitdiklərimi, gördüklərimi, oxuduqlarımı cəm edib gələcək nəslə çatdırmaq idi. Sən dünənin və bu gününlə sabaha örnək olan, doğma və əziz məskənsən!..

"Qızılağac dünən və bu gün kitabı"nı oxucuların ixtiyarına verdikdən sonra mənə olunan müraciətləri, təklifləri və iradları səmimi qəbul etdim.

Baxdım gördüm ki, oxucuların bəziləri həqiqətən qədim yaşayış məskəni olan Qızılağacla bağlı məlumatlarla, Qızılağacın yerləşdiyi qədim Azərbaycanla, onun ərazisi ilə maraqlanırlar. Mən "Qızılağac dünən və bu gün kitabı"nda tarixi təd-

  

qiqatımın nəticələrini müxtəsər olaraq qeyd etmişdim. Odur ki, geniş oxucu kütləsinin rəğbətini qazanan həmin kitabdakı tarixi qədimliyi, bir çox mənbələrdə yazılanları oxuculara çatdırmaq üçün istifadə etdiyim ədəbiyyatlardakı məlumatlara bu kitabda açıqlama və şərh verməyə çalışmışam.

Bildiyimiz kimi tarixi mənbələrdə dünya yaranışı haqqında tam məlumatlar mövcud deyil. Ona görə ki, Allah təala yer kürəsini öz qüdrəti ilə iki gündə xəlq etmişdir. Quranda Allah buyurur: **"Biz insanların yaşayışını təmin etmək üçün yeri döşədik."** Həmin yer kürəsidir ki, Allah onu xəlq edib ki, insanlar, yer üzərində yaşayan canlılar rahat yaşasınlar. Lakin bunun yaranma tarixi bilinmir. Bəzi mənbələrdə insanın yer üzərində xilqətini müxtəlif illərlə qeyd edirlər. Bu müxtəliflik tarixi baxımdan biri-birindən çox fərqlidir.

Quran Məkkə torpağını yerin anası adlandırır. Lakin bu müqəddəs məkanın da nə vaxtdan mövcud olmağı yenə məlum olmur...

Deməli, çox uzun müddətli dövrü əhatə edən tarixi, yazılı mənbələrdə axtarmaq ona görə mümkün deyil ki, sadəcə həmin tarix yazılmayıb. Yazılı mənbəsi olmayan dövrün tarixini müasir arxeologiya elmi öyrənir. Hörmətli sənət sahibləri olan görkəmli arxeoloqlar maddi-mədəniyyət abidələrini tədqiq etməklə keçmiş tariximizdən xəbər verirlər. Onlara bu sahədə bütün dünya xalqları minnətdardılar. Çünki onların zəhməti, elmi axtarışları nəticəsində Yer kürəsinin hər bir sahələrində yaşayan xalqlar öz tarixini biliblər. Əlbəttə bu qədim insanların yaşadığı yerlərə aiddir. Bu sahədə müxtəlif elmi tədqiqatlar aparan alimlər Yer kürəsinin təxminən 15 milyard il bundan əvvəl yaranmasını söyləyirdi. Bu da ehtimal-





dır. Doğrusunu ancaq Allah bilər.

**"Kim bilir neçədir dünyanın yaşı"** - deyən şair də tarixi bilmək istəyir. Ancaq sualın cavabını yenə elm karifeyləri, elmi, texniki tərəqqinin həyata bəxş etdiyi nailiyyətlərdən istifadə edərək, inşaallah deyə biləcəklər. Görkəmli tarixçi alim, etnoqraf, tarix elmləri doktoru, professor, Milli Elmlər Akademiyasının Etnoqrafiya İnstitutunun şöbə müdiri Əsədulla Cəfərov yazır:

"Tarixi mənbələrdən, coğrafi və geoloji ədəbiyyatlardan məlumdur ki, Azərbaycanın ərazisi lap qədim zamanlardan ibtidai insanların yaşaması üçün olduqca əlverişli təbii, coğrafi şəraitə malik olmuşdur. Ona görə də, yazılı mənbələrin olmadığı bir dövrdə bu diyarda ibtidai insanların yaşayış tərzini öyrənmək daha maraqlı və əhəmiyyətli idi.

Bunun üçün bərəkətli torpağımızın, onun dağlarını, dərələrini, çay vadilərini qarış-qarış gəzib tədqiqat aparmaq lazımdır. Torpaq üzərində olan hər bir daşa, saxsı parçasına, küp qırığına diqqət yetirmək, təpələrə, kurqanlara, xaraba qalmış şəhər yerinə, qala divarlarına, çay terraslarına səyahət etmək və arxeoloji kəşfiyyat işləri aparmaq lazımdır. İnsanlığın uzaq keçmişinin tədqiq olunub öyrənilməsi çox da asan deyildi. Bunun üçün zəhmət çəkmək, gecəni-gündüzə qatıb Azərbaycan ərazisinə səyahətə çıxmaq tarixi, geologiyanı, coğrafiyanı, botanikanı, zoologiyanı və başqa elm sahələrini mütləq bilmək vacib idi." (Ə.Cfərov "Azərbaycanın ilk sakinləri" Bakı, 2004, səh. 32.)

Göründüyü kimi bir yerin, ölkənin, xalqın tarixin bilməklə insan həm də gələcək nəslə onu çatdırır. Bu yolda insanın çəkdiyi zəhmətə qiyməti xalq verəcək. Respublika ərazisində

aparılan arxeoloji işlərdən tapılan tapıntılar təsdiqləyir ki, insanlar bu ölkədə çox qədimdə poleolit çağında - qədim daş dövründə yaşamışlar.

İlkin insanlar öz yaşayışlarını təmin etmək üçün əlverişli yer axtarırdılar. O yerlərin biri də Azərbaycan ölkəsi idi. O ölkə ki, Allahın bəxş etdiyi sərvətlə, təbiət mənzərələri ilə, möhtəşəm Xəzəri ilə tarixi qədimlikdən xəbər verir. Belə bir cənnət məkanlı yerin ayrı-ayrı regionlarının tarixi keçmişi, tarixi yaddaşı vardır. Bu tarixin yaşamasını təmin etmək üçün bir neçə əlamətləri də qoruyub saxlamaq əsasdır. Onlardan biri, həmin yerin tarixi abidələri, ikinci, tarixi abidələrdən tapılan maddi-mədəniyyət nümunələri, üçünücü, həmin yer haqqında mövcud olan yazılı mənbələr.

Bütün yuxarıda dediklərimizə bunu əlavə etmək istərdim ki, gərək hər bir yaşayış yerinin tarixi öyrənilsin, yazılsın və oxuculara çatdırılsın. Bu da gərgin əmək və axtarışlar tələb edir.

Xalq şairi Bəxtiyar Vahabzadənin bu misralarını nəzərinizə çatdırıram:

***Xalqın tarixini bilməyən insan***
***Özünü tanımaz, sözünü bilməz.***
***Bulaq çeşməsindən su içən heyvan,***
***İçdiyi çeşmənin gözünü bilməz.***

Bəli, Qızılağac qədim diyarın bir yaşayış məskənidir ki, onu da öyrənmək hər bir qızılağaclıya vacibdir. Bu diyarın tarixi salnaməsində sizə bələdçi olmağı qarşıma məqsəd qoydum. Allahınköməyi ilə axtarışlarımı bu kitabda sizinlə bölüşəcəyəm.

Dünya ölkələri içərisində öz tarixi qədimliyi, təbii sərvəti, füsunkar mənzərəsi, əsrarəngiz təbiət lövhələri, 9 iqlimi,





maddi-mədəniyyət abidələri, tarixi şəxsiyyətləri ilə məşhur olan dilbər guşə, doğma diyar Azərbaycan.

***El bilir ki, sən mənimsən,***
***Yurdum yuvam məskənimsən.***
***Anam doğma vətənimsən***
***Ayrılarmı könül candan,***
***Azərbaycan, Azərbaycan!***

deyən, Azərbaycanın xalq şairi Səməd Vurqun vətənə bağlı bir vətəndaş, vətən oğlu olmağını hər bir Azərbaycanlıya təlqin edir. Tarixi qədimliyi ilə tanınan, bu diyarın ərazisindəki yaşayış yerlərinin qədimliyi də inkar edilməzdir. Azərbaycan haqqında yazılan tarixi faktları onun cənnət timsallı qoynundakı maddi-mədəniyyət abidələri də təsdiqlədi. Tarixi yazıların maddi-mədəniyyət abidələri ilə birgə vəhdaniyyətliyi Azəri xalqının qədimliyi üçün bir həqiqətdir. Bu ideyanı görkəmli alim Qiyasəddin Qeybullayevin dedikləri ilə dinləyək:

"Azərbaycan ərazisində eradan əvvəlki I min illikdə mannaların, madyaların, kasların və kaspilərin türk mənşəli etnos olduğunu bilirik. Azərbaycan xalqı dünyanın qədim xalqlarından biridir. Artıq tarixi həqiqiliyi ilə tanınan Azərbaycan xalqının dünyanın qədim xalqları içərisində öz adı, öz dəsti xətti var. O, xalq qədimdir ki, onun tarixi var, onun ərazisində tarixi qədimliyini təsdiqləyən maddi-mədəniyyət abidələri vardır. Bəli, qədim tarixə malik olan Azərbaycan ərazisində ilk insanların yaşadığı dövrə aid olan maddi-mədəniyyət mərkəzlərində bu qədimliyi təsdiqləyən, əmək alətləri və əşyalar ta-

pılıb tədqiq edilir. Bu ibtidai varlığın indiki və gələcək dövrə çatdırılmasında gecəli gündüzlü zəhmət çəkən arxeoloqların gərgin əməyinin nəticəsidir. Bu sahədə əvəzsiz xidmətləri olanlardan biri də tarix elmləri doktoru professor Əsədulla Cəfərovdur. Görkəmli alimin bu barədə dedikləri yuxarıda dediklərimizi təsdiqləyir.

"Azərbaycan Respublikası ərazisində aparılan arxeoloji tədqiqatlar zamanı ilk sakinlərinin məskunlaşmasına aid zəngin maddi-mədəniyyət nümunələri aşkar olunmuş və bunun nəticəsində respublikamızın ərazisinin, insanın formalaşdığı məskənlər siyahısına daxil olmasına zəmin yaranmışdır. Azərbaycan ərazisində ilk ibtidai insanların 1,7-1,8 milyon il bundan əvvəldən yaşamağa başlamasına aid ən qədim arxeoloji və paleontoloji materiallar tapılmışdır. *(Əsədulla Cəfərov, "Azərbaycanın ilk sakinləri" səh. 7, Bakı 2001.)*

Bəli, Azərbaycan çox qədim tarixə malikdir. İlk ibtidai insanların yaşadığı dövr, yer, məkan onların yaşaması üçün ən başlıca amillərdən biri hesab olunurdu. Görəsən o insanların həyata, insanlığa münasibəti necə olmuşdur? Ona görə ki, həmin dövrdə ilkin insanlıq dövrü idi. Onlar başqalarının yox, özlərinin hesabına yeniliklərə nail olmalı idilər. Bu nailiyyətə nail olmaq üçün onlar zehni və fiziki qüvvədən faydalandılar. Bu faydalılıq onların həyatı işlərinin və məişətinin mənafeyinə uyğun idi. Faydalanmanın nəticəsi əmək və məişət alətlərinin istehsalında dolğun şəkildə özün göstərdi və ilkin vaxtlarda insana, insanlığa xidmət üçün bu böyük nailiyyət idi.

"Aparılan elmi tədqiqatlar göstərir ki, planetimizin ilk sakinləri lap qədim zamanlarda bir yerdə yaşamış, birlikdə yemək, sığınacaq axtarmağa başlamış, vəhşi heyvanlardan qo-





runmaq, ilk əmək alətləri, ibtidai tikili yerləri hazırlamaq və süni od əldə etmək üçün birlikdə yaşamaq məcburiyyətində qalmışlar. Birgə yaşayış ulu sakinlərimizin qarşısına çıxan çətinlikləri aradan qaldırmağa kömək etmiş və bu günə qədər gəlib çatmış maddi və mənəvi sərvətlərin yaradılmasına səbəb olmuşdur." *(Ə.Cəfərov, Azərbaycanın ilk sakinləri, Bakı 2001. səh.9)*

Alimin qənaətə gəldiyi bu fikir Allahın bəşəriyyətin hidayəti üçün göndərdiyi Qurani-Kərimdə əvvəlcədən verdiyi xəbərdə təsdiqlənir. Quranın Bəqərə surəsinin 213-cü ayəsində Allah buyurur: "İnsanlar (əvvəldə) bir dəstə idi (və onların arasında ziddiyyət yox idi, tədricən cəmiyyət və siniflər meydana gəldi, sonra onların arasında ixtilaflar və təzadlar yarandı, bu zaman) Allah peyğəmbərləri göndərdi ki, onlar camaata (ilahi nemətlərə) müjdə verən və *(ilahi əzabdan)* qorxudan olsunlar". Göründüyü kimi ilk insanlar nə qədər biri-birinə mehriban olublar. Bu mehribançılıq insana baş ucalığı bəxş edir. Kaş onlar həmişə mehribanlığı qoruya biləydilər. "Hal-hazırda planetimizdə müxtəlif xalqlar yaşayır *(2000 xalq, 3000 danışıq dili var – N.Q.)*. Onların dilləri, məşğuliyyəti, mədəniyyəti, ictimai-iqtisadi quruluşları və dinləri müxtəlifdir. Lakin alimlərin apardığı elmi tədqiqatlar göstərir ki, ən ulu sakinlərimizin ilkin səhər çağında əmək fəaliyyəti, formalaşmaq xüsusiyyətləri, çay daşlarından hazırladıqları əmək alətləri 6 milyon il bundan əvvəl tamamilə bir-birinə yaxın, demək olar ki, oxşar olmuşdur." *(Ə.Cəfərov. "Azərbaycanın ilk sakinləri" Bakı 2001, səh. 9)*

Məhz bu deyilənlərin nə dərəcədə keçmiş insanlar üçün özünəməxsus vəhdəti indiki insanları düşündürməlidir. Çün-

 

ki əcdadlarımızın keçdiyi həyat yolu insanlığın ilkin çağlarına aid olan xüsusiyyətlər idi.

"İnsanlığın səhər çağlarında coğrafi aləm olduqca mənzərəli və rəngarəng idi. Sanki təbiət cənnət guşəsini xatırladırdı. Hər tərəf yamyaşıl idi, dağların qoynunda ceyran-cüyür, dağ keçisi, ibtidai öküz, maral otlayırdı. Meşələrdə isə quşların səsi insanı məftun edirdi. İlk vaxtlardan etibarən su insan üçün həyat mənbəyi olmuşdur. Ona görə də ulu sakinlərimiz əsasən, çay kənarlarında olan mağaralarda məskən salmış, diqqətini çayda olan dağlara yönəltmişdir." *(Ə.Cəfərov. "Azərbaycanın ilk sakinləri" Bakı 2001, səh.11)*. Bəli, bu vəsf ediləsi mənzərə də qabaqcadan ilahi tərəfindən Quranda xəbər verilmişdir.

**"Yeri də bütün məxluqat üçün o döşədi. Yaşıl ikən yarpaq, quruluğunda saman olan saçaqlı, dənli bitkilər və xoş ətirli çiçəklər *(reyhan, qızılgül, yasəmən, bənövşə, qərənfil və s.)* vardı.** *(Ər-Rəhman surəsi, 10-12 ayə).*

İlahi tərəfindən həyata insan, insanlıq naminə hər şey bəxş edilib. O cümlədən ilk insanların keçmişindən xəbər verən maddi-mədəniyyət abidələri də ilahinin yaratdığı yer kürəsindədir. Bəs nə vasitə ilə indiki insanlar keçmişlə tanış olurlar? Onlara çatan yazılı mənbələr və arxeoloji qazıntılar zamanı əldə olunan maddi-mədəniyyət abidələrindəki qədim tapıntılar ilə tarixi yaşadan xalq özüdür. Əgər xalq öz tarixi keçmişinə doğma münasibətlə yanaşsa, onun tarixi heç vaxt unudulmaz. Mən də bunları nəzərə alaraq qədim diyarın cənnət guşəsində qərarlaşan Qızılağacın tarixi ilə oxucuları tanış etmək üçün səy və bacarığımı əsirgəmədim.

"Dünyada olan hər bir xalqın təşəkkülü, mövcud olduğu





 

ilk günlərdən davam etmiş, arasıkəsilməz etnik prosesin nəticəsidir. Etnik prosesin komponentləri - qəbilələr, tayfalar, xalqlar və millətlər, bir sözlə etnoqrafiya elmində qəbul edildiyi kimi etnosdur. Azərbaycan ərazisində (yerli türk mənşəli) etnoslar-mannalar, madaylar, kaslar, kaspilər, albanlar məskunlaşaraq bu diyarın füsünkar gözəlliyindən və sərvətindən faydalanmışlar. Bununla da xalqımızın təşəkkülündə iştirak etmiş etnik komponentlərin etnik məsuliyyətləri müəyyən edilmiş oldu və Azərbaycanlıların orta əsrlərdə iranlılar və dağıstanlılardan dönmə olması haqında konspensiyanın puçluğu üzə çıxdı. *(Qiyasəddin Qeybullayev. "Azərbaycan türklərinin təşəkkülü tarixindən", Bakı, 1994, səh.15).*

Azərbaycan xalqı haqında tarixi həqiqətlər tez-tez təhrif olunur. O cümlədən onların yaşadığı yerləri də fərqli qeyd edənlər də az deyil. Qiyasəddin Qeybullayev yazır: "Azərbaycan ərazisində eradan əvvəl I minillikdə mannaların, madayların, kasların və kaspilərin türk mənşəli etnosları olduğunu bilirik. Azərbaycan ərazisində kuti, lulube və kas etnoslarının Altay mənşəli olduğunu təsdiq edirlər. Atropoten xalqının türk mənşəli etnos olması, Atropotenlərin Azərbaycanlıların birbaşa ulu əcdadlarından biri olduğunu bildirir.

Alban etnosu da türk mənşəlidir. Türk xalqları zaman etibarilə min illərlə ölçülən zəngin tarixə malikdirlər. Dünyada heç bir xalqın əcdadlarını tarixini döyüş meydanlarında yaratmış qədim türklərlə müqayisə etmək olmaz. Türklər heç vaxt tabelikdə, asılılıqda yaşamamışlar. Azərbaycanlıların arxasında arasıkəsilməz şanlı tarix və zəngin mədəni irsi vardır. Bu





tarixi həqiqətdir". *(Q.Qeybullayev. "Azərbaycan türklərinin təşəkkülü tarixindən" 1994).*

Bizim eradan əvvəl V əsr müəllifi Ksenofont qurqanlıların və kadusların qonşuluğunda sakların yaşadıqlarını yazmışdır. (Ksenofont V.3.24) Bu əyalət Midiyaya daxil idi. İndiki Şimali Azərbaycana aid olan Muğan və Lənkəran-Astara bölgəsini də əhatə edirdi. Qədimdə indiki Muğan və Səlyan düzlərində kaspilər məskun idilər və ona görə bu ərazi antik müəlliflərin əsərlərində Kaspiana adlanırdı. Saklar gəldikdən sonra bu əyalət Balasakan (türkcə "bala" - "düzənlik" sözü *(V.B.Radlov (V.II.1182)* və sak etnonimindən) adlanmışdı. Balasakan toponimi ilk dəfə III əsrdən məlumdur. Axırıncı dəfə Balasacan formasında bu adı XIII əsr müəllifi Yaqut Həməvi çəkir. Ehtimal ki, eradan əvvəlki son əsrlərdə saklar kaspiləri sıxışdırmış və onların ərazisinə yiyələnmişdirlər. Bir antik mənbədə kaspilərin ətrafında at əti yeyənlərin yaşadıqları göstərilir. "At əti yeyən" bu köçərilər güman olunur ki, Saklar idilər. *(Qiyasəddin Qeybullayev. "Azərbaycan türklərinin təşəkkül tarixindən", səh. 157.) (Oxucu onu da bilməlidir ki, Muğan, Lənkaran-Astara ərazisi indiki istilaya görə yazılıb – N.Q).*

Məqsədim bütün bu deyilənləri nəzərə alaraq Qızılağacın qədimliyini imkan dairəsində geniş şərh etməkdir. Çünki tarixi baxımdan Qızılağac kəndi (şəhəri) böyük əhəmiyyət kəsb edən yaşayış sahələrindən biri olub. Qızılağac haqqında yazılı mənbələrdə olanlara müraciət edək.

***Müəllif***



 

# Qızılağac haqqında qısa məlumat

 

# QIZILAĞAC QƏDİM YAŞAYIŞ MƏSKƏNİ

Azərbaycan respublikasının Masallı bölgəsində kənd. Rayon Mərkəzindən 15 km, Viləş çayının sağ sahilindən 3 km aralı, Kalinovka, Port-İliç şose yolu kənarında Lənkəran ovalığındadır. Əhalisi 5500 nəfər. Tərəvəzçilik, heyvandarlıq və taxılçılıqla məşğuldur. 2 orta məktəb, klub, 3 kitabxana, tibb məntəqəsi, rabitə şöbəsi, arxeoloji abidələrdən dəmir dövrünə aid kurqan (*"Həzi təpəsidir"*).



***Kəndin küçələrindən biri***

Qızılağac orta əsrlərdə Xəzər dənizi limanları ilə ticarət əlaqəsi saxlayan yaşayış məntəqəsi idi. Əhali gəmiçilik və balıqçılıqla məşğul olurdu.

Qızılağacda əkinçilik və maldarlıq inkişaf etmişdi. Gilan və

Mazandarana gedən karvan yolu Qızılağacdan keçirdi. Qızılağac 15 əsrədək Avropa və yaxın şərq arasındakı ticarətdə mühüm yer tuturdu.

Kəndin beş məhəlləsi vardır. Kəndin adamlarına adlardan əlavə ləqəblər verildiyi kimi kənd ərazisi də məhəllələrə bölünərək öz adı ilə tanınır.

1. ***Qərəymanlı (Karamanlı) məhəlləsi*** - Orta Asiyadan Kiçik Asiyaya *(Türkiyə)* qədər yayılan türk tayfası Qaraman adı ilə bağlıdır.

***Əslim Qaramanlıdı,***
***Elim adlı sanlıdı.***
***İgid döyüşdən gəlir,***
***Gözləri nə qanlıdı.***

2. ***Bahadırlı məhəlləsi*** - Şeyx Fətulla Axundun babasının adı ilə bağlıdır.

3. ***Muradxanlı məhəlləsi*** - Azərbaycanın bir sıra rayonlarında da Muradxanlı kəndləri vardır. Muradxanlılar Qızılbaş tayfa birliyinə daxil idi.

4. ***Cınqırlı məhəlləsi.***

5. ***Alçallı məhəlləsi*** - Qızılağac ilə Qədirli kəndi arasında olan Alçallı yaşayış məntəqəsindən tarixən köçüb gələn adamlarla bağlıdır. Həmin adamlar öz kəndlərinin adı ilə o məhəlləni Alçallı adlandırıblar.

İlk dəfə həmin məhəlləyə 3-4 nəfər gəlib, sonradan onların qohum-əqrəbası artıb.





## QIZILAĞAC (ALNUS)

Qızılağac ağacı Qozağacıkimilər fəsiləsindən birevli, ayrı cinsli ağac və ya kol cinsildir. Kənarı dişli yarpaqları növbə ilə düzülür. Əksəriyyəti erkən yazda, hələ yarpaq açmamış çiçəkləyir. Çiçəkləri sırğacıqlarda yerləşir. Meyvəsi birtoxumlu fındıqçadır. Paxlalı bitkilər kimi, qızılağacın da köklərində yumrucuq bakteriyaları olur. Qızılağac 100 il, nadir halda isə 300 ilə qədər yaşayır. Əsasən çayların sahilində, münbit, yaxşı aerasiya olunan, çox rütubətli torpaqda, bəzi növləri isə qumluq və daşlıq yerlərdə bitir.

Şimal yarımkürəsində 42-47, keçmiş SSRİ-də 10-15, o cümlədən Azərbaycanda 3 növü yayılmışdır. Ürək yarpaqlı Qızılağac (A.Subcordata), boz Qızılağac (A.Insana) və saqqallı Qızılağac (A.Bardata). Boz Qızılağacın hündürlüyü 15-20 m-ə qədərdir. Qabığında çoxlu aşı maddəsi var. Ürəkyarpaqlı Qızılağacın hündürlüyü 28-30 m-ə (bəzən 35 m-ə) diametri 160 sm-ə çatır. Oduncağı qırmızımtıl olur. Qabığında aşı maddəsi var. Saqqallı Qızılağacın hündürlüyü 20 m-ə *(bəzən 25 m-ə)* qədərdir. Bu növ, rütubət və işıqsevən, tez böyüyən ağacdır. Qızılağacın havada qızaran açıq rəngli, yüngül oduncağı mebel, tara istehsalında, sualtı və yeraltı qurğularda tikinti materialı kimi işlədilir. Bəzi növlərinin qozalarından alınan tiktura kolit və dezinteriyanın müalicəsində, qabığı boyaqçılıqda, bir çox növü isə yaşıllaşdırmada istifadə edilir.

# QIZILAĞAC KÖRFƏZİ

Xəzər dənizində qədim tarixə malik olan bir neçə körfəzlər vardır. O körfəzlərin biri də indiyə qədər qədimliyini qoruyub saxlayan Qızılağac körfəzidir. Qızılağac körfəzi Antik dövr alimləri tərəfindən vaxtilə tədqiq edilmiş və bu müəlliflər körfəzin böyük əhəmiyyətə malik olmasına əmin olmuşlar. Xəzəri tədqiq edən alimlər onda irili-xırdalı 31 körfəz olduğunu qeyd edirlər. Həmin körfəzlərdən 8-i iri körfəzdir. *(Konstantinova - 1969)*. O körfəzlər cərgəsində böyük və kiçik Qızılağac körfəzinin də adı vardır. Böyük Qızılağac körfəzi Cənubi Xəzərin qərb hissəsində yerləşir. O, Şərqdən Kür dili, Qərbdən Sara yarımadası, Şimaldan isə materiklə hüdudlanır. *(Ə.Qasımov. "Xəzər dənizi planktonunun ekologiyası", Bakı, 1987)*. Böyük Qızılağac körfəzinin sahəsi 1931-ci ildə 850 min ha., həcmi 3,5-kub km-dir, eni 28 km, uzunluğu 24 km, orta dərinliyi isə 4,6 metr olmuşdur. 1946-cı ildə dəniz səviyyəsinin enməsi ilə əlaqədar körfəzin sahəsi 712 kv. km, həcmi 1,5 kub km, eni 24 km, uzunluğu 22 km, orta dərinliyi 2,8 metr olmuşdur. 1965-ci il ərəfəsində Böyük Qızılağac körfəzinin sahəsi 692 kv km-ə qədər kiçilmişdir. (Q.Gül. 1967). 1986-1988-ci illərdə körfəzin sahəsi 50,5 min ha, həcmi 1,0 kub km, dərinliyi isə 4,5 metr olmuşdur. Əgər müxtəlif illərdə körfəzdə baş verən dəyişikliyi nəzərdən keçirsək, müxtəlif fərqli rəqəmlərlə dəyişdirildiyini görürük. Buna səbəb suyun azalması olmuşdur. Görkəmli alim Əbdül Qasımov yazır: "2003-cü il ərəfəsində körfəzin sahəsi Xəzər





dənizinin səviyyəsinin qalxması ilə əlaqədar 120,8 kv km-ə qədər artmışdır." *(Əbdül Qasımov. "Xəzər dənizi planktonunun ekologiyası, Bakı, 2004, səh.318)*

Göründüyü kimi bir əsr ərzində Xəzər dənizinin səviyyəsinin hesabına Qızılağac körfəzi də öz ərazisini, həcmini və s. dəyişmişdir. Xəzərin qısa icmalını şərh etməkdə məqsədim bir çox mənbələrdə Xəzər haqqında yazılanları araşdırmaqdır. Bu araşdırmadakı bir neçə faktlara oxucunun diqqətini cəlb etməkdi. Ona görə ki, Xəzər sahilində olan yaşayış məntəqələrinin bəziləri çox qədim zamanlara aid edilir. Bu qədimliyi nəzərə alaraq tədqiqat apardım. Müraciət etdiyim mənbələrdə Xəzərin və ətrafında olan yaşayış məskənlərinin qədimliyinə aid məlumatları gördüm. Bəziləri indiki Xəzər sahilindəki yaşayış məskənlərini tarixi unutqanlıq ucbatından çox yaxın zamanlara aid edirlər. Bu da tarixi baxımdan düzgün hesab olunmur. Əgər belə "yeniləşdir"mələr olmasaydı tariximiz müxtəlif şəkildə yazılmazdı və onların qədimliyini heç bir tarixi yazılar dəyişdirə bilməzdi. Xəzərə axan çaylar da qədim tarixli çaylardır. O, çaylardan Volqa, Kür və Araz çaylarının da mövqeyi işıqlandırıldı. Görkəmli alim Şirbəy Əliyev yazır: "1896-cı ilə qədər Araz bilavasitə Xəzər dənizində olan Qızılağac körfəzinə tökülürdü. *(Ş.C.Əliyev. "Xəzər dənizi tarixi xəritələrdə" Bakı, 1973.)"*

Bütün bu deyilənlərə əsaslanaraq onu demək kifayətdir ki, Qədim Xəzərin sahil kənarında yaşayış məskənləri olub. O, yaşayış məskənlərindən biri də Qızılağac (şəhəri) kəndidir. Tarixi mənbə və məxəzlərdə, maddi-mədəniyyət abidələrində öz adını yaşadan Qızılağacdan, yeni nəslin nümayən-

dələrinə məlumat verməyi özümə borc bilirəm. Bu işdə ulu tanrıdan kömək diləyərək, çox hörmətli oxuculara da kitaba qarşı diqqətli olmağı tövsiyə edirəm.

Bunun üçün tarixi mənbələrə müraciət etmək vacibdir. Görkəmli coğrafiyaçı alim Şirbəy Əliyev yazır: "Xəzər dünyanın böyük çökəkliklərindən biri olan Aral Xəzər çökəkliyinin ən dərin hissəsində yerləşir. Xəzər mövcud olduğu zamandan indiyə qədər öz şəklini dəfələrlə dəyişmişdir. Vaxtilə Aral və Xəzər dənizinin birləşməsi nəticəsində böyük bir hövzə yarandı. Bu zaman orta Asiya sahillərinin çox hissəsi Xəzər boyu ovalıq Kuma-Maniç çökəkliyi və Xəzər Aral dənizi suları altında qalırdı. Bu böyük dəniz Xvalin dənizi adlandırılırdı. Bu dövrdə Xəzər dənizi Kuma-Maniç depressiyası vasitəsilə Qara dənizlə və buradan da dünya okeanı ilə əlaqə saxlayırdı." *(Şirbəy Əliyev. "Xəzər dənizi tarixi xəritələrdə" səh. 6, 1973.)*

Göründüyü kimi Xəzər ilk öncə okeanla birləşən bir dəniz olmuşdur. Bu bir həqiqətdir ki, indi Xəzərdə okeanda yaşayan canlılara rast gəlinir. Xəzər müasir şəklə dördüncü dövrün ikinci yarısında Qara dənizdən ayrılandan sonra düşmüşdür.

Xəzər dənizi cənubdan şimala doğru 1200 km məsafədə uzanır. Onun ən enli yeri 554 km-dir. Xəzər dənizinin sahil xəttinin uzunluğu 6380 km-dır ki, bunun da 800 km-i Azərbaycan respublikasının sahil xətti hissəsinə düşür. Xəzərin cənubunda ən dərin yeri 1025 m-ə *(Lənkəran çökəkliyində)* çatır. Xəzər dənizinə axan ən böyük çay Volqa çayıdır. Volqa çayı dənizə tökülən suyun 80%-ni təşkil edir. Kür çayı böyüklüyünə görə ikinci çaydır ki, Xəzərə tökülür. Kür çayının uzunluğu 1515 km, hövzəsi isə 188 min kv km-dir.





Xəzər dənizi yeganə dənizdir ki, 60-dan çox adla adlandırılıb.

Qədim diyar Azərbaycan haqqında indiki dövrdə çoxlu tədqiqat əsərləri yazılıb. Əvvəlki illərlə indikiləri müqayisə edəndə istər-istəməz insanı düşündürən bir neçə məsələ qarşıya çıxır. Onlardan biri də tarixi mənbələrdə özünü göstərən müxtəlifliliklikdir. Bu ikiliyə demək olar ki, son zamanlarda görkəmli tarixçilərimiz və etnoqraf alimlərimiz son qoymaq üzrədirlər. Çünki onlar keçmişdə Azərbaycan haqqında yazılanlarda yanlış fikirlərin çoxluğunu gördükdən sonra yeni reallığa üstünlük verirlər.

Azərbaycanın və onun ərazisində olan yaşayış məskənlərinin qədimliyini dünyaya tanıtdıran ona məxsus olan qədim abidələrdir. O abidələr önündə duranlardan biri də Xəzər dənizidir. Hansı xalqın tarixinə nəzər salsan onlarda müəyyən səbəblərə görə yerdəyişmə halları tarixən mövcud olmuşdur. Lakin Azərbaycanı Xəzərsiz, Xəzəri isə Azərbaycansız heç vaxt təsəvvür etmək mümkün olmayıb, olmaz da. Xəzər Azərbaycan xalqının qədim yaşayışını təmin edən başlıca mənbələrdən biri hesab olunur. Ona görə ki, ilk insanlar məhz öz həyatlarını, yaşayışını təmin etmək üçün su kənarın seçiblər. Xəzərin qədim olduğu kimi Azərbaycan da qədimdir. Elə isə Azərbaycanın yerləşdiyi ərazinin çox hissəsini əhatə edən Xəzər dənizinin tarixinə biganə qalmaq özü də yaxşı hal hesab olunmaz. Çünki indiki zamanda mövcud olan Xəzər insanlara çox sadə təsir bağışlayır. Lakin onun qədim tarixinə nəzər salanda bu sadəlik onu görənlərin nəzərində ucalır və möhtəşəmliyi ilə insanı heyrətə gətirir. Bunların belə fərqlə artıb-azalmasını fikirləşərkən tarixi keçmişimizin də

fərqlərini düşünürükmü? Ona görə düşünməliyik ki, heç vaxt dünyada olanlar əbədi deyil. Vaxtilə dünyada şəhər kimi tanınan Qızılağac indi kənddir. Bir vaxtlar şəhər kimi tanınan ərazidə "Xaraba şəhərin qalıqları" mövcuddur. Bütün bunlar tarixin yazılmış səhifələridir. Tarixi qoruyub saxlamaq üçün insanlar ona yaxından münasibət göstərməlidirlər. Görkəmli alim Ş.Əliyev Qızılağac Körfəz haqqında deyir:

"Vaxtilə Qızılağac körfəzinə Kürün qolları və başqa xırda çaylar axırdı. Körfəzin sahil xətti çox girintili-çıxıntılıdır. Onun sahili alçaq, bataqlıq və bir sıra dillərdən ibarətdir". Körfəzin şimal hissəsi dayaz, cənuba getdikcə dərinləşir. Keçmişdə körfəzdə Sara (Sarı), Qarabattaq (Baklani), Yovşan (Burunki), Kulakin, İtdişi, İvanov və bir sıra başqa adalar var idi. Dəniz səviyyəsinin aşağı düşməsi ilə əlaqədar olaraq bu adalar sahil ilə birləşmiş, körfəz öz formasını dəyişmişdir və bunun nəticəsində Sara adası yarımadaya çevrilmişdir. *(Ş.C.Əliyev, "Xəzər dənizi tarixi xəritələrdə", səh. 13, 1973).*

Qızılağacın tarixi keçmişi haqqında tədqiqatımda Xəzər dənizi haqqında da yazmaqla onunla bağlı olan məsələlərə açıqlama vermək daha önəmli olar. "Qızılağac dünən və bu gün" kitabının nəşrindən sonra oxucular tərəfindən irad və təkliflər, göstəriş və məsləhətlər aldım. Odur ki, onların dediklərini əsas götürərək mən tədqiqatımı davam etdirdim. Mənbə və məxəzlərdə Qızılağac haqqında olanlara şübhə yeri qalmamaqdan ötəri tapıntılarımı bu kitaba daxil etdim. Yəqin ki, oxucularım məni başa düşüb, fikirlərimi qəbul edəcəklər. Kəndimin tarixi baxımdan qədimliyi onlara da böyük təsir bağışlayacaq.





## HƏZİ TƏPƏSİ (KURQANI)

Qızılağacda çox qədim dövrə aid olan Həzi təpəsi (kurqanı) indi də keçmişdən xəbər verir. Arxeoloqların fikrinə görə kurqanlar yeni Daş dövrü və Mis Daş dövrə (neolit, enolit) aiddir. Bununla da kurqan keçmişdən xəbər verməklə 7 min il bundan qabağı xatırladır. Qızılağacda olan dünyaşöhrətli şəxsiyyətlər vaxtilə Qızılağacın şəhər olduğunu qeyd ediblər. Qızılağac şəhəri indiki Həzi təpəsi adlanan ərazidə olmuşdur. Həmin ərazi min illər keçməsinə baxmayaraq öz sirrini qoynunda yaşadır. Bu gün artıq bu şəhərin tarixi abidəsini tədqiq etmək vaxtı gəlib çatmışdır. Bəlkə də tədqiqatlar bu təpənin daha keçmişlərə aid olduğunu sübuta yetirəcəkdir.



*Həzi təpəsi*

Qızılağac kəndində mövcud olan və tarixi mənbələrdə Həzi təpəsi adı ilə tanınan qədim abidə tarixi keçmişimizdən xəbər verir. Qızılağacdakı Həzi təpəsi (kurqanı) hündürlüyünə görə o ətrafda (yəni olduğu yerdə) çox möhtəşəm qorunurdu. Deyilənlərə görə keçmiş SSRİ dövründə ətrafı şumlanmış yavaş-yavaş təpə yeyilmişdir. 1964-cü ildə tarixçi alim Qara Əhmədovun başçılığı ilə orada axtarış aparılmışdır. Tapılan maddi mədəniyyət abidələri tədqiq edilərkən çox qədim dövrə aid olduğunu qeyd etmişlər. Onların gəldiyi qənaət axır tunc dövrü və ilk dəmir dövrünə aid olması ilə kifayətləndi. Lakin bu tarixlə indiki dövrdə razılaşmaq olar bəlkə də gələcəkdə bu tarixdən də o tərəflərə tunc, daş dövrünə məxsusluğu maddi-mədəniyyət abidələrini tədqiq edəndə məlum olacaq. Mən bu işdə xidmət göstərənlərə bu başdan minnətdarlığımı bildirirəm.

Qızılağac haqqında bir çox tədqiqatçıların əsərlərində rast gəlmək olur. Müasir dövrdə öz tədqiqatları ilə indiki və gələcək nəslə məlumatlar verənlərdən biri də həmyerlimiz Musarıza Mirzəyevdir. O özünün "Mənim Masallım" kitabında yazır: "Rayonumuzun ərazisində mövcud olan toponimlər arasında adı tarixi məxəzlərdə tez-tez çəkilən Qızılağac qədim yaşayış məntəqələrindən biridir. Burada arxeoloji abidələrdən olan "Həzi təpəsi" kurqanı Dəmir dövrünə aiddir."

"Həzi təpəsi" ərazisində "Daşlı quyu" adlanan qədim bir quyu var. Quyunun suyundan indiyə qədər heyvanları yay fəsilində suvarmaq üçün istifadə edirlər.

"Həzi təpəsi" deyilən yerdə olan şəhər, deyilənlərə görə, zəlzələ nəticəsində batmış, şəhərin qala divarlarından əlamət





nümunələri indi də mövcuddur. Düşmən təhlükəsinin qarşısını almaq məqsədilə şəhərin ətrafı qala divarı ilə əhatə olunmuşdur. Qala divarlarındakı bürclərdə gözətçilər durarmışlar...

Artıq "Həzi təpə"sində qazıntı işləri aparmağın vaxtı gəlib çatıb. Xalq şairi Rəsul Rza demişkən:

***Kim zirvəyə qalxar deyin,***
***Yollar boyu hər pilləni,***
***Bir günləri, yüz illəri,***
***Qəlbimizlə,***
***beynimizlə,***
***ömrümüzlə***
***doldurmasaq.***

# MAKEDONİYALI İSGƏNDƏR QIZILAĞACDA OLMUŞDUR

Görkəmli Azərbaycan şairi, filosofu, alimi dahi Nizami demişdir:

*Elə söz var ki, yaramaz demək,*
*Başqa bir dil ilə söyləmək gərək.*
*Onu incə-incə söyləyərkən bir-bir,*
*Ondan hər eşidən alar bir təsir.*

Hər bir millətin, xalqın, qəbilənin, varlığının əsası olan dili və sözü onun tarixini yaşadır. Mən birinci kitabımda Qızılağac haqqında Antik dövrün tarixçilərinin yazdıqlarını müxtəsər şəkildə qeyd etmişdim. Kitab nəşr olunandan sonra ziyalı yoldaşlardan İsgəndər Makedoniyalının Azərbaycan ərazisində olmadığını iddia edənlər də oldu. Hətta onlar qəti şəkildə bildirdilər ki, İsgəndər İrandan Azərbaycan torpağına keçməyib. Mən birinci kitabın müxtəsər tarixi məlumatlarına şübhə edənlərə və bütün oxuculara maraqlı olsun deyə öz tədqiqatımı bu kitabda bölmələr üzrə təqdim etməyi qərara aldım. Ona görə ki, oxucularımın müxtəlif dünyagörüşə, biliyə malik olan insanlar ola biləcəyini nəzərə alaraq bölmələr şəklində mövzuları, yəni tarixi faktları, istinad etdiyim mənbələrə əsaslanaraq müxtəsər şərh ilə onlara çatdırım. Bəlkə də sadaladığım mənbələrdən əlavə qeyrilərində də yeni tapıntılar ola bilər. Onların tədqiqi istinad olunan mənbələrə əsasən davam etdiriləcək. "Qızılağac dünən və bu gün" kitabının 11-ci səhifəsində Makedoniyalı İsgəndər haqqında verilən məlumat barəsində çoxlu sayda yazılı mənbələr də vardır.





Onların içərisində Plutarxin "İsgəndər Zülqərneyn" kitabıdır. İsgəndər haqqında verdiyim məlumatı yanlış hesab edənlərə faktların şərhini verirəm. Görkəmli alim Əlisa Nicat Yunan filosoflarının, alimlərinin ümum bəşəri tərəqqinin inkişafında rolunu öz tərcüməsində belə qeyd edir: "Böyük Alman filosofu Fridrix Nitşe 8 filosofu özünün müəllimi və ustadı hesab etmişdir. Sonralar onları götür-qoy edib, çoxusunu bəyənməmiş, lakin iki filosof - tarixçinin üstündə möhkəm dayanmışdır. Bunlar qədim yunan mütəfəkkiri Fikudidi və İhtibah İtaliyasının çiçəyi Makavelli olmuşdur. Lakin bir tarixçi kimi onun ürəyi daim Plutarxla döyünmüş və o, bu məhəbbətinə ömrünün axırına kimi sadiq qalmışdır. Ümumiyyətlə, tarixi meylli bütün əksər filosof və dövlət xadimlərinin masası üstə 2000 ildir ki, Plutarxın əsərlərinin yeri dəyişilməzdir. Bəs bunun səbəbi nədir? Niyə zövqü, amalı başqa-başqa olan şəxsiyyətlər Plutarxın ən sadiq oxucuları olmuşlar?

Birinci səbəb odur ki, böyük filosof özünəqədərki tarixin adi məxluqlarını deyil, tarix yaradanları deyil, başında tacdan başqa daha bir gözəgörünməz tac-zəka və hünər tacı daşıyanları tərənnüm etmişdir.

İkincisi onları necə tərənnüm etməsindədir. O şəxsiyyətlər ki, tarixin qaymağıdırlar, Plutarx onlara adicə tərcümeyhal deyil, himn həsr etmişdir. Perikl, İsgəndər, Sezar beləlіrindəndir. Plutarx təxminən bizim eranın 46-cı ilində Yunanstanda kiçik Heroneya şəhərində anadan olub, 80 ilə yaxın ömür sürüb. 210 əsərin müəllifidir. İsgəndər obrazı Şərq xalqlarının, xüsusilə Azərbaycan xalqının yaddaşında dərin iz buraxmışdır. Onun haqqında çoxlu rəvayət və əfsanələr var və onların bir çoxunu dahi Nizami qələmə almışdır. Belə gö-

zəl əfsanələrdən birində deyilir ki, bir kişi bir gün insanı gözəgörünməz edən bir üzük tapır və onunla ürəyi istəyənləri edəndən sonra, İsgəndərin tacını başından götürüb yerə çırpmaqla onu rüsvay etmək niyyətinə düşür. Lakin gəlib əlini şahın tacına toxunduran kimi mühafizəçilər tərəfindən tutulur. Hamı heyrət edir. Sonra məlum olur ki, o yalnız İsgəndərə toxunanda gözə görünürmüş. Qəribə əhvalatın səbəbini və sirrini qoca bilicilər izah edib hökmdara deyirlər ki, Allah sənə bir bəxt verib ki, tilsim də sənə batmır. Tilsim də batmayan belə bir məxluqun tərcümeyi-halını gözəl yazmamaq olardımı? *(Plutarx "İsgəndər Zülqərneyn" Bakı, 1933, səh.3-5).*

Bu duyğular təsirində olan dahi Nizami Azərbaycan ədəbiyyat xəzinəsinə böyük bir inci bəxş etmişdir. O da onun şah əsəri, "İsgəndərnamə"dir. Plutarx yazır: "İsgəndər Fərata qədər bütün ölkələri fəth etdikdən sonra Daraya tərəf döndü. Həmin vaxtdan Dara da 1 milyonluq qoşunla ona doğru gəlirdi." *(Plutarx "İsgəndər Zülqərneyn", Bakı, 1993. səh.31.)*

Dara ilə İsgəndər arasında həyata keçən savaşda İsgəndər böyük qəhrəmanlıq göstərdi. Daranı məğlub etdi, onu öldürdü. İsgəndər də fatehliklə yanaşı alicənablığa bərqərar idi. Bunu İsgəndərin Daranı öldürəndən sonra onun meyidinə olan münasibətində özünü göstərir. Daranın meyidini İsgəndər şah kimi geyindirib, anasına göndərdi, Daranın qardaşı Eksatrı isə yanında saxladı. *(Plutarx "İsgəndər Zülqərneyn", Bakı, 1993,səh.42).*

İskəndərin Dara ilə döyüşündən sonra Hirkana gəlməyini müəllif belə qeyd edir: "Bundan sonra İsgəndər qoşununun ən yaxşı hissələri ilə Hirkana gəldi. Burada o suyu başqa dənizlərdəkindən çox-çox duzsuz olan dəniz körfəzini gördü. Güman ki, Pontdan kiçik olmayan bu körfəz haqqında konkret heç nə öyrənə bilməyən şah, belə qərara gəldi ki, bu Meotidin kənarıdır. Yeri gəlmişkən təbiətşünaslar bu barədə həqiqəti artıq bilirdilər. Hələ İsgəndərin yürüşündən çox illər qabaq onlar yazmışdılar ki, Hirkan körfəzi və ya Kaspi dənizi okeanın dörd körfəzindən ən şimalda olanıdır." *(Plutarx "İsgəndər Zülqərneyn", Bakı, 1993, 44-cü bölmə, səh.42).*





Elə bu xəbərlə əlaqədar bir neçə faktlara müraciət edək. Xəzər dənizinin suyunun şorluğu okean və Qara dəniz sularından üç dəfə azdır. Bütün dənizin tərkibində orta şorluq təxminən 13 promilə bərabərdir. Bunun əsas səbəbi dənizə tökülən şirin sulu çaylardır. İsgəndər Kaspi dənizi ilə üzməyin mümkün olub-olmaması ilə maraqlanmağa başlamışdı. Makedoniya çarının əmri ilə Kaspi dənizini öyrənmək üçün ekspedisiya hazırlanmışdı. Arrion yazır ki, İsgəndər "Heraklidi... gəmi qayıranlarla... Qirqaniyaya göndərərək, ona əmr etdi ki, Qirqaniya dağlarında meşələri qıraraq ellin tipli üstüörtülü və üstüaçıq uzun gəmilər qayırsın: o, Kaspi və ya Qirkan dənizi adlanan bu dənizin hansı dənizlə birləşdiyini tədqiq etmək istəyirdi..." *(Azərbaycan tarixi, Bakı, 1961, səh.57).*

Kaspi dənizi - Bu ad Zaqafqaziyanın orta və cənub Şərqində eramızdan iki min il əvvəl yaşamış qədim Kaspion tayfasının adı ilə əlaqədardır. Sonradan qonşu xalqlar kaspiləri dənizin cənub-qərb hissəsinə sıxışdırılmış və beləliklə, bu yerlər Kaspion, dəniz isə Kaspi adın almışdır. Kaspi və Kasb sözünün mənası "Atlılar ölkəsi" deməkdir.

Ellin yazıçılarının məlumatına görə Kaspi tayfaları skiflərdən, köçərilərdən və dəniz sahilində yaşayanlardan ibarətdir. Xəzər dənizi okean səviyyəsindən 28 metr aşağıdır.

Bütün bunlarla yanaşı bizi maraqlandıran məsələ İsgəndərin Azərbaycanda olub-olmadığıdır. Elə isə "Nizami və tariximizin açılmamış səhifələri" başlıqlı, 1981-ci il 5-7 avqust tarixli "Azərbaycan müəllimi" qəzetində filologiya elmlər namizədi E.M.Əlibəyzadənin tədqiqatını nəzərdən keçirək.

O yazır: "Azərbaycan xalqının tarixini, xüsusilə, bu tarixin Nizamiyə qədərki dövrünü biz hələ layiqincə öyrənməmişik, bilmirik. Etiraf edək ki, bu tarixi Nizami bizdən yaxşı öyrənmiş, bilmişdi. Nizaminin qələmə aldığı tarixi qəhrəmanlar və onlarla əlaqədar təsvir etdiyi hadisələr şair təxəyyülünün məhsulu olmayıb, məhz mövcud tarixi şəxsiyyət və hadisələrin bədii gerçəkliklə tərənnümüdür. İsgəndərin Azərbaycana gəlməsi Nüşabə ilə görüşü, Şirvandan keçib Dərbəndə getməsi, türk xalqları ilə diplomatik əlaqələri, sülh, dostluq müqavilələri, əhd-peymanları, Çin səfəri və şair "Nizamiyə məlum olan ciddi tarixi dəlillər, həqiqətlər idi və bunları inkar etmək üçün heç kəs, heç bir tədqiqatçı ortaya tutarlı fakt dəlil-çıxara bilməz. Bunları təsdiq üçün isə tarixdə kifayət qədər dəlillər vardır. Nizami özü yazırdı:

*Ən kəskin qələmlə ciddi yazılan*
*Dastanımda yoxdur azacıq yalan.*

*(İsgəndərnamə. I cild, s.27)*

Makedoniyalı İsgəndərin zamanında, əlbəttə ayrıca Azərbaycan, onun adı yox idi. Azərbaycan adının ilk şəkli olan Atropatena və müstəqil Atropat hökmranlığı vardı. Azərbaycan adı sonralar b.e.əvvəlindən ortaya çıxır, tarixi mənbələrə düşür.

Məsələn, F.Simokattada bu ad Aqerbayqan (Agərbaycjan) şəklində dörd yerdə xatırlanır. Artıq VI-VII əsrlərdə Azərbaycan müstəqil ölkə idi. Adı da müəyyən idi, onun yenilməz Bayandur xan hakimiyyəti vardı. VII-IX əsrlərdə bu ölkəni tamamilə ərəblər istila etdi; XII əsrdə isə qüdrətli Azərbaycan dövləti yarandı. Eradan əvvəlki IV-III əsrlərə Nizami məhz XII əsrin gözü ilə baxmış, Makedoniyalı İsgəndərin Qafqaza, Atropatena və Albaniyaya yəni Azərbaycana səfərini tarixi mənbələr təsdiq etməkdədir.





O tarixi mənbələrdən:

1. Yunan mənbələri, Flavi Arrian (II əsr);
2. Suriya Nşsrani mənbələri;
3. Gürcü mənbələri;

Mahmud Kaşqarinin e.ə.dövr IV əsr yunan mənbələri və Nizamin "İsgəndərnamədə" istifadə etdiyi dəlillərlə tam uyğun gələn məlumatları da bu tarixi həqiqətlərlə səsləşir.

Mahmud Qaşqari yazır: "Zülqərneyn türk xalqı ilə barışdıqdan sonra şəhərlər saldırmışdı. Zülqərnyin saldırdığı şəhərlər: Sulmi, Qoçu, Canbulaq, Beş balıq, Yenibalıqdır".

İsgəndər haqqında bir çox ölkələrin alimlərinin yazdıqlarına müraciət etsək görərik ki, İsgəndərin dünya şöhrətli mövqeyi hər minilliklər varlıqlarına tutarlı dəlillərdir.

Çünki İsgəndər olduğu kimi yazılarda işıqlandırılmayıb. Lakin qədim dövrün, antik ədəbiyatın yazdıqlarını tutuşdurmaqla tarixi dəqiqliyə nail olmaq olar.

XII əsrdə yazılmış gürcü "salnaməsi" məlumat verir ki, Makedoniyalı İsgəndər Gürcüstana iki dəfə daxil olmuşdur. Nizami də təsvir edir ki, Makedoniyalı İsgəndər Azərbaycana iki dəfə daxil olmuşdur.

V.A.Paxomov yazır: "Azərbaycanda tapılan ən ilkin sikkə Makedoniyalı İsgəndərin sikkələridir" *(e.ə.336-323-cü illər)*.

Makedoniyalı İsgəndərin sikkələri özü ilə gəlib Azərbaycana çıxmış və o vaxtdan ölkənin bütün mədəni mərkəzlərinə yayılmışdır. Beləliklə, İsgəndərin "Azərbaycana gəlməsi haqq-həqiqətdir". *(Elməddin Əlibəyzadə. "Azərbaycan müəllimi" qəzeti, Bakı, 1981-ci il, 5-7 avqust).*

Göründüyü kimi Makedoniya çarı Azərbaycanda olmuş və bir neçə özünə məxsus işlər görmüşdür. Bu tədqiqatı davam etdirərək yeni başlıqda Azərbaycan Pedaqoji Xarici Dillər İnstitutunun "Bilik" qəzetində Ə.Sərkaroğlunun "İsgəndər Azərbaycanda olubmu?" məqaləsinə nəzər salaq. O yazır: "Nizami İsgəndəri Azərbaycanda təsvir edib, deməli, həqiqətdir. Düzdür Makedoniyalı İsgəndərin vuruşduğu ölkələr tarixən qeydə alınıb. Onun Azərbaycanda Bərdə hakimi və Şamaxı hakimi ilə görüşləri yürüş hesab edilməyib. Tarixən Fateh şah kimi qələmə alıblar. Əslində belə deyil. O mədəni bir qəhrəman kimi tarixə daxil olub. Məsələn İ.S.Şifmanın "Makedoniyalı İsgəndər" əsərində oxuyuruq: "İsgəndər girkanlıları evlənib ailə qurmağa və əkinçiliklə məşğul olmağa, araxos və soqdiyaları valideynlərinə qoca vaxtı ömrünün sonuna qədər qulluq etməyi *(onlar valideynlərini qocalan kimi öldürürlərmiş),* qədim iranlılara isə yaxın qohumla evlənməyi qadağan edib (səh. 3). Belə bir şəxsiyyət qadınlarla vuruşardımı? Əlbəttə yox.

Makedoniyalı İsgəndərin Azərbaycanda olması haqqında məlumatları V.V.Qriqoryevin "İsgəndərin Qərbi Türküstana yürüşü" (SPV 1881) İ.Ş.Kovalyovun "Makedoniyalı İsgəndər" (Lenq. 1937) E.A.Kostyuxinin "Makedoniyalı İsgəndər ədəbiyyat və folklor ənənələrində" (Moskva, 1972), A.S.Şofmanın "Makedoniyalı İsgəndərin Şərq Səyahəti" (Kazan,





1976), F.Şakarmayrin "Makedoniyalı İsgəndər" (M.1984) və s. ingilis və fransız və alman dillərindəki əsərlərdə və onlara əlavə edilmiş xəritələrdə rast gəlinir. Hər halda bütün bu əsərlər Nizami əsərlərində verilmiş faktı sübut edir. *(Ə.Sərkaroğlu - "Bilik" qəzeti 1991-ci il, N 10).*

Bütün bunların bu kitaba daxil olunmasında məqsədim ondan ibarətdir ki, oxucular göstərilən kitablara müraciət etsin və İsgəndər haqqında geniş məlumata malik olsunlar.Deməli, İsgəndər Azərbaycanda olub. İranı qarış-qarış gəzib, o cümlədən İrandan keçərək, Qızılağaca, Bərdəyə, Şamaxıya və s. yerlərə getmişdir. Neftçala rayonu haqqında tədqiqat aparan tədqiqatçılar sübut etməyə çalışırlar ki, İsgəndər Neftçala ərazisində olmuşdur. B.Mikayıllı yazır: "Elmi faktlarla sübut olmuşdur ki, bu ərazidə insan hələ qədim dövrlərdən məskən salmışdır. Makedoniyalı İsgəndər uzun müddət bu şəhəri mühasirədə saxlamış, lakin almağa müvəffəq olmamışdır. Yalnız həkim Ərəstun tərəfindən hazırlanmış su halında olan dərmanın köməyi ilə şəhər mühasirəyə alınıb, qala divarları uçurulmuş və şəhəri su basmışdır. Su altında qalmış bu şəhər o vaxtdan "Xaraba şəhər"adlanır." Bəli, əgər M.İsgəndər Neftçalada qədim "xaraba şəhərdə" olubsa, deməli onun keçdiyi yol "suyu başqa dənizlərdən çox-çox duzsuz olan" dəniz körfəzi məhz Qızılağac körfəzidir, 2000 il bundan əvvəl Strabon göstərdiyi Qızılağac şəhəridir ki, indi də mövcuddur. Çünki İsgəndər Hirkandan ancaq Qızılağacdan keçib Neftçalaya gedə bilərdi.

Tarixdən məlumdur ki, M.İsgəndər birinci dəfə b.e.ə. 333-cü ildə İran şahı III Daranın qoşunu ilə müharibə aparmış və qalib gəlmişdir. Bu zaman III Daranın ailəsi - anası, arva-

dı, iki qızı və körpə oğlu İsgəndərə əsir düşmüş, səyyar şah sarayı İsgəndərin əlinə keçmişdir.

İkinci dəfə isə III Daranın qoşunu M.İsgəndərlə b.e.ə.331-ci ilin oktyabr ayının 1-də Cangal (Qovqamela) düzənliyində üz-üzə gəlmiş və qanlı döyüşdə yenə də İsgəndər qalib gəlmişdir. İsgəndər buradan b.e.ə.330-cu ildə Midiyanın paytaxtı Ekvatana (Həmədana) gəlmişdir. Bunları nəzərə alsaq Qızılağacın tarixi qədimliyini – Tunc dövrünə aid etmək daha doğru olardı.

İsgəndər Kaspi dənizini öyrənmək fikrini həyata keçirə bilmədi. Slevik çarı I Nikator bu vəzifəni hərbi rəis Patrokla həvalə etdi. O, miladdan əvvəl 285-282-ci illərdə Kaspi dənizini tədqiq etdi. Bu, Kaspi dənizini öyrənmək üçün elm aləmində məlum olan ekspedisiyaçıların birincisi idi. Roma sərkərdəsi Pompey (miladdan əvvəl I əsr) bu ekspedisiya materiallarından istifadə etmişdir. XVIII əsrin 30-cu illərində Rus hidroqrafları Qızılağac limanını tədqiq etmişlər. Onu da qeyd edək ki, Xəzər dənizinin geoloji tarixini öyrənməkdə Rus alimi H.N.Andrusovun böyük elmi xidməti olmuşdur. Bütün bu yazılanlara səthi maraq cəhətindən yanaşmaq yox, tarixi baxımdan yanaşmaq lazımdır. Çünki tarixin oyrənilməsinin hər bir insanın doğma torpağa bağlılığında böyük təsiri vardır. O təsir ondan ibarətdir ki, insan yaşadığı yerin həqiqi tarixini bilir. Bu bilgi onun zehnində, düşüncəsində yer edib dünyabaxışını gücləndirir.

Qızılağacın qədim tarixi keçmişinə nəzər salmaq və öyrənmək günün vacib məsələlərindən biri hesab edilməlidir. Bu kəndin (şəhərin) qədim abidəsi – "Həzi təpəsi" tarixin yaddaşıdır. "Həzi təpəsi"ndə tədqiqatlar aparmaqla Qızılağacın daha qədim dövrlərə aid olduğunu araşdırmaq olar.





## QIZILAĞAC TOPONOMİYASI

Qızılağac haqqında yazmağa həvəs oyanan gündən - yəni gənclik illərimdən indiyə qədər bu adın kökünün nəyə bağlı olmaqlığı məni çox düşündürdü. Məhz bütün bunları nəzərə alaraq toponomiyaya aid kitablara müraciət etdim. Lakin heç bir kitabda bu adın mənşəyinin elmi mahiyyətini tapa bilmədim.

Görkəmli alim Azərbaycan Milli EA-nın akademiki Afad Qurbanov "Toponimik tədqiqat və onun elmi əhəmiyyəti" məqaləsində qeyd edir:

"Toponomik tədqiqat xalqın və onun dilinin tarixi ilə əlaqədar bir sıra mühüm məsələlərin həllinə kömək göstərir. Toponimlər müasir bir çox məsələlərin dəqiqləşdirilməsi, qədim şivə xüsusiyyətlərinin yayılma areallarının öyrənilməsi üçün qiymətli material verir. Yer adlarının müxtəlif tarixi dövrlərə aid mənbələrdə qeyd olunmuş formaları ilə müasir formalarının müqayisəli tədqiqi dil ünsürlərinin yaşını müəyyən etməyə və dilin lüğət tərkibində baş vermiş linqvistik proseslərin izlənməsinə imkan yaradır. Azərbaycan toponimlərinin semantik xüsusiyyətləri, bu və ya digər obyektin nə üçün məhz belə adlandırılması hələ keçmiş dövrlərdə alimləri maraqlandırmışdır". *(A.Qurbanov. Toponimik tədqiqat və onun elmi əhəmiyyəti. "Elm və Həyat" jurnalı. 1988, № 10)*

Toponomiya yer adları öyrədən elm sahəsi olduğu üçün hər bir yer adları elmi cəhətdən araşdırılmalıdır. Qızılağac toponominin yaranması indiyə qədər öyrənilməyib. Toponomiya konkret regionun oykonimlərini (yaşayış məntəqə adlarını), oronimlərini (relyef quruluşu, obyekt adlarını), hidronim-

lərini (su mənbələrinin adlarını) tədqiq etməklə yanaşı hər hansı sahəyə verilmiş adları da öyrənir.

Bu adların öyrənilməsi mən deyərdim ki, hər bir insan üçün vacib məsələlərdən biridir.

Bəzi yerlərə verilən adlar əsrlər, lap min illər keçsə də dəyişilməz qalır. Bəzi yerlərin adı dövrün və insanların təsirindən dəyişir. Adlar dəyişilsə də belə yerin ilk adını yaddan çıxarmaq lazım deyil. Yəqin ki, müəyyən vaxtdan sonra həmin yerlərin tarixi adları özünə qaytarılacaqdır. Bunun üçün toponim tədqiqatçılarının üzərində böyük vəzifə xidməti qalır.

"Azərbaycan toponimlərinin yerli izahı ilə ilk dəfə Hacı Zeynəlabdin Şirvani məşğul olmuşdur. Azərbaycan toponomiyasının tədqiqi sahəsində ilk elmi təşəbbüsü keçən əsrin ortalarında görkəmli tarixşünas alim A.Bakıxanov tərəfindən göstərilmişdir. O, Azərbaycan coğrafi adları ilə əlaqədar tarixi məlumatlardan istifadə etmiş bəzi toponimləri qədim tayfa adları ilə bağlamışdır". *(A.Qurbanov. Toponimik tədqiqat və onun elmi əhəmiyyəti. "Elm və Həyat" jurnalı, 1988, № 10)*

Göründüyü kimi toponomiyada qədim tayfa adları da öz əksini tapır. Qızılağac toponomiyası da qədim türk tayfası olan Qızıl boy kökündən hesab olunur *(bu haqda sonrakı bölmədə söhbət açacağam).*

Lakin tayfa adı ilə bağlı olan toponimləri orta əsrlərdə və indiki dövrlərdə də başqa cür izah etməyə çalışanlar da az olmamışdır. O, cümlədən Qızılağac haqqında maraqlı sözlər deyilmişdir. Onlardan bir neçəsinə diqqət edək: Bəziləri bu adı, bu yerlərdə bitən qızılı ağac növlü ağac və kolla əlaqələndirirlər. Digərləri xalq əfsanələrinin deyilişini əsas götürürlər.





Necə ki, əfsanələrin birində deyilir: guya Şah Abbasın Qızılağacdan gedərkən əlində olan Qızıldan düzəldilmiş ağacı yaddan çıxıb orda qaldığı üçün bu ərazi "Qızılağac" adlandırılmışdır və s. Deyilənlər qədim tarixə malik olan Qızılağacın adına, tarixinə xələl gətirir. Bu kimi adlar coğrafi adların yeni məzmun kəsb etməsinə gətirib çıxarır. Bunun da nəticəsi tarixi baxımdan müxtəlifliyin əmələ gəlməsinə səbəb olur. Bu fikri akademik A.Qurbanovun sözləri ilə desək: "Azərbaycan qədim və erkən orta əsr tarixi yadelli mənbələr əsasında öyrənilir. Bu mənbələr o zaman Azərbaycanda mövcud olan yer adlarını, toponimlərini saxlamışdır. Belə adlar müxtəlif dillərdə, o cümlədən Azərbaycan (ümumtürk dili əsasında) dilində olmuşdur. Belə toponimlərin tədqiqi Azərbaycan dilinin yazısız dövrünün tarixinə nəzər salmağa imkan verir". *(A.Qurbanov. Toponomik tədqiqat və onun elmi əhəmiyyəti. "Elm və həyat" jurnalı, 1988, N 10).*

Alimin bu fikri tam dolğunluğu və məzmunu ilə indiki dövr tədqiqatçıları üçün başlıca istiqamətdir.

Qızılağac toponimi haqda Əsgər Zahidov özünün "Muğan" adlı kitabında yazır.

"Reçpublikamızın Masallı, Səlyan və Göyçay rayonlarında Qızılağac adlı kəndlər vardır. Lakin bunların içərisində Masallı Qızılağacının adi tarixi mənbələrdə və xəritələrdə daha qədimdən çəkilir. Qızılağac kəndi və (şəhəri) və Limanı (bərgahı) XX əsrin 20-30-cu illərinə kimi fəaliyyətdə olmuşdur. Onun qalıqları indi də qalmaqdadır." *(Əsgər Zahidov. Muğan. Bakı 1999, səh. 77).*

Göründüyü kimi, Qızılağac kəndi (şəhəri) öz keçmişini indiki və gələcək nəslə mövcud olduğu abidələri ilə tanıtdı-

rır. Bu mövcud olanlar irqindən, cinsindən mənsubiyyətindən asılı olmayaraq fərq qoyulmadan mövcud olduğu şəkildə işıqlandırılır. Lakin bəzi müəlliflər isə bu tarixi həqiqəti yanlış təsəvvür edirlər. Onlardan biri Rəşid Əsgərov adlı müəllifdir. R.Əsgərov "Ulduz" jurnalı 1971-ci il 2 saylı nömrəsində "Faktlar sübut edir ki..." məqaləsində yazır:

"Ə.Zahidov Muğan şəhərinin dağıdılmasından danışanda Cəfər İbrahimovun Azərbaycanın XV əsr tarixinə dair oçerklər kitabındakı faktlara müraciət edir. O yazır: "Sultan Əbu Səid öz ordusunu Muğan-Mahmudabad və Qızılağac arasında yerləşdirir. Üçbucaq şəklində yerləşən bu yaşayış məntəqələrinin üçü də Masallı ərazisindədir. Əbu Səidlə Uzun Həsən arasında 1468-ci ildə qanlı vuruşma nəticəsində Muğan şəhəri dağıdılır." *(R.Əsgərov. "Ulduz" jurnalı, 1971-ci il, N 2, səh.55)*

Əsgər Zahidovun yuxarıda yazdıqlarına öz əsassız iradını aşağıdakı məzmunda R.Əsgərov həmin məqalədə bildirir. "Herat hakimi Sultan Əbu Səid Uzun Həsənin Şamaxı xanları ilə mübarizəyə başı qarışdığından istifadə edərək, Azərbaycana soxulur. Muğan ərazisini və Qarabağı istila edir. Sonra aclıq və yem çatışmamazlığı üzündən Qarabağı tərk edir, o zaman Şirvan ərazisinə daxil olan Muğana-Mahmudabada və Xəzər dənizi sahilində yerləşən Qızılağaca getməyə məcbur olur. Müəllif unutmuşdur ki, Salyan rayonu ərazisində, Xəzər dənizi sahilində Qızılağac kəndi indi də vardır". *(R.Əsgərov. "Faktlar sübut edir ki..." "Ulduz" jurnalı, 1971-ci il, N 2, səh.55).* O vaxt Əsgər Zahidovun yazısına irad tutan R.Əsgərov hansı məqsədlə belə addım atmasını ancaq özü bilirdi. Lakin tarix insanların subyektiv mühakimələri əsasında, insanın





özü bildiyi kimi söylənilmir. Bunun üçün tarixi sənədlərə müraciət olunmalıdır. Mən də bu mövzu ətrafında çoxlu kitablara müraciət etdim, hansı müəllifin daha düzgün mövqedə olmağını araşdırdım. Tarixi yaradan xalq özüdür. Tarix əsrlərin, min illərin, dünənin, bugünün, sabah üçün səlnaməsidir. Əgər bu səlnamə yazılarsa, onda xalqın, millətin tarixi yazılır. Məşhur fransız yazıçısı Ekzuperi yazır ki, "bir almanın budaqda tumurcuq bağlayıb, çiçək açmasından başlayaraq, meyvəyə dönüb budaqdan düşməsinə qədərki tarixi yazılsa, bir kitab yaranardı." Həqiqətən də tarixi proses ardıcıllıqla yazılmasa o tarixə dərindən bələd olmaq mümkün olmaz. Mən də bu iki müəlliflərin yazılarının müqabilində tədqiqat apardım, görüm əvvəlki deyimlər tarixdə necə öz əksini tapmışdır. Odur ki, istəkli oxuculara çatdırmaq üçün Sultan Əbu Səidlə Uzun Həsən arasında gedən müharibə haqqında ədəbiyyatlara müraciət etdim. O mənbələrdən birində həmin hadisə Dövlət Mükafatı Laureatı görkəmli tarixçi alim Sara Aşurbəylinin "Şirvanşahlar dövləti" kitabında belə təsvir olunur: "Qaraqoyunlu dövləti 1468-ci ildə Uzun Həsən tərəfindən büsbütün darmadağın edildikdən sonra onun yerində Ağqoyunlu dövləti bərqərar oldu. Uzun Həsən Cənubi Azərbaycanı və Qarabağı tutdu. Təbriz Ağqoyunlu dövlətinin paytaxtı oldu... Hicri 869 (1465)-ci ildə taxta çıxmış Fərrux Yassarın Uzun Həsənə münasibətini, ata və babasının Teymurilərə arxalanmaq mövqeyini dəyişdirməyə məcbur etdi... Hakimiyyətin lap əvvəlində Fərrux Yassar Teymuri sultanı Əbu Səidlə toqquşmalı oldu. Əbu Səid hicri 873 (1468)-ci ildə Uzun Həsənlə mübarizə aparmaq məqsədilə Heratdan çıxıb Qarabağa gəldi. Sonra o Şirvanşahdan yardım almaq ümidilə Muğan, Mahmudabad və

Qızılağaca - Xəzər dənizi sahillərinə keçib getdi. Fərrux Yassar əvvəlcə Əbu Səidə kömək göstərərək, onun düşərgəsinə dəniz yolu ilə ərzaq göndərirdi. Lakin Uzun Həsənin hədələrindən qorxuya düşən Şirvanşah qəflətən Əbu Səidə yardım göstərməkdən və onunla ittifaqdan imtina edərək Uzun Həsənə qoşuldu. Ağqoyunlu hökmdarı başda olmaqla Şirvanşah Fərrux Yassar və Ərdəbil hakimi, Cüneydin oğlu Şeyx Heydər Səfəvidən ibarət güclü ittifaq yarandı. Uzun Həsən Əbu Səidin düşərgəsinə gedən bütün böyük yolları və keçidləri kəsdi. Düşərgədə aclıq başladı. Teymuri qoşunlarındakı atlar yemsiz qalaraq Muğan düzündəki zəhərli otları yeyib kütləvi surətdə qırılmağa başladılar.

...Uzun Həsənin və onun müttəfiqlərinin saysız-hesabsız qoşunu göründü. Əbu Səidin əmirlərindən bir qismi öz istehkanlarını tərk edib düşmənin tərəfinə keçdi. Hicri 873-cü il rəcəb ayının 16-da (31 dekabr 1468-ci il) günorta Əbu Səidin qoşunları məğlubiyyətə uğradı, özü isə qaçdı.

... Uzun Həsənin iki oğlu onu təqib edərək yaxaladı və atalarının qərargahına gətirdi. ... Rəcəb ayının 20-də Sultan Əbu Səid "Əzablı ölüm şərbətini içdi"." (S.Aşurbəyli, "Şirvanşahlar dövləti". səh. 300-302). Göründüyü kimi görkəmli tarixçi alim öz yazısında Əbu Səidin ölümünü 1468-ci il qeyd edir. O cümlədən Ə.Zahidov da Cəfər İbrahimova istinad edərək yazır: "Hələ vaxtilə Əbu Səid Şirvanla bağladığı müqaviləyə görə (XV əsr) Şirvan şah Qızılağac Limanı vasitəsilə onun ordusunu, atlarını yemək, sursat və otla təmin etməli idi." (Ə.Zahidov. Muğan. Bakı 1999, səh.77).

O dövr üçün Qızılağac limanı ən əlverişli liman idi. Ona görə də ikinci dayanacaq yerini Sultan Əbu Səid Qızılağaca yaxın olan ərazini bildi. Belə bir əlverişli şərait (yəni dənizlə əlaqə - N.Q.) Sultan Əbu Səid üçün çox vacib idi. Əgər Fərrux Yassar öz sözündən dönməyib, onunla bağladığı müqaviləyə əməl etsəydi, yəqin ki, Əbu Səid məğlub olmazdı.





Bu mövzuya aid olan çoxlu mənbələrə istinad etməklə bəzilərini çıxmaq şərti ilə, qalan tarixçilər Sultan Əbu Səidin ölümünü 1468-ci ilə təsdiq edirlər. Digər müəlliflər, o cümlədən R.Əsgərov bu hadisənin 1469-cu ilə təsadüf etdiyini qeyd edir. Burada fərq 12 saatdır. Çünki Sultan Əbu Səid dekabrın 31-də günorta məğlub olduğu üçün il 1468-ci il hesab olunur.

Hətta R.Əsgərov "Faktlar sübut edir ki..." məqaləsində yazır: "Beləliklə də, Əsgər Zahidov Muğan şəhərinin adının meydana çıxması, həmin şəhərin dağıdılması, Mahmudabad və Qızılağacın yerləşdiyi ərazini, hətta Əbu Səidlə Uzun Həsənin arasındakı döyüşün tarixini belə (döyüş 1468-ci ildə deyil, 1469-cu ilin əvvəlində olmuşdur) düzgün izah etməmişdir" *(R.Əsgərov. "Faktlar sübut edir ki..." Ulduz jurnalı 1971-ci il N2, səh. 55).*

R.Əsgərovun irəli sürdüyü fikirlərin tarixi mənbələrə görə yanlışlığını faktlarla sübut etməyə ehtiyac duyulur. Odur ki, bu barədə antik dövr müəlliflərinin əsərlərinə müraciət etdim. Əldə etdiyim çoxlu faktlardan bir neçəsinə açıqlama verməklə Qızılağac tarixini oxuculara çatdırıram.

Hansı Qızılağac?

Göyçay və Səlyan rayonu ərazisində də Qızılağac kəndi və "Qızılağac" adında respublikamızda bitən ağac və kol növü də məlumdur. Orta əsr fars, rus və ərəb mənbələrində Qızılağacın adına tez-tez rast gəlirik. Teymurilər sultanı Əbu Sə-





id 1468-ci ildә Qızılağacda olmuşdur." *(Musarza Mirzәyev. "Mәnim Masallım" sәh. 46, 1990).*

Mәlum olduğu kimi respublika әrazisindә Qızılağac adı ilә adlanan üç kәnd vardır. Onun biri Göyçay әrazisindә olan Qızılağac kәndidir ki, 1000-dәn çox әhalisi var. O biri isә Sәlyan әrazisindәki Qızılağacdır ki, 3000 nәfәr әhalisi vardır. Hәmçinin Türkiyәnin Antaliya vilayәtindә dә Qızılağac adlı yaşayış mәntәqәsi vardır. O cümlәdәn başqa ölkәlәrdә dә Qızılağac adlı kәnd vә ya şәhәr ola bilәr. Tarixi mәnbәlәrdә bu mәskәnlәr haqqında verilәn xәbәrlәr , mәlumatlar Qızılağac kәndlәrinin qәdim olduqlarını tәsdiqlәyir. Әvvәlki bölmәdә Qızılağac haqqında söhbәtlәrin davamı olmaqla "Faktlar sübut edir ki..." mәqalәsindә "müәllif unutmuşdur ki, Sәlyan rayonu әrazisindә, Xәzәr dәnizi sahilindә Qızılağac kәndi indi dә vardır..." yazmaqla sübut etmәk istәyir ki, Ptolomeyin göstәrdiyi Qızılağac ~~Sәlyan~~ Qızılağacı deyil. Masallı

"... Bu faktlar sübut edir ki, Sultan Әbu Sәidlә Uzun Hәsәn arasındakı döyüş Masallı әrazisindә deyil, Sәlyan әrazisindә yerlәşәn Mahmudabad-Muğan-Qızılağacda baş vermişdir. Ә.Zahidov yoldaş bu mәsәlәdә tarixi dolaşıqlığa yol vermişdir." *(R.Әsgәrov. "Faktlar sübut edir ki..." Ulduz jurnalı 1971-ci il N2, sәh. 55).* Bu mәqalәdәn sonra Ә.Zahidov yazır: R.Әsgәrov "Faktlar sübut edir ki..." mәqalәsindә heç bir elmi mәxәzlәrә vә bu haqda mövcud tәdqiqat әsәrlәrinә әsaslanmayaraq belә bir fikir irәli sürürü ki: "... Mahmudabad Masallı rayonu әrazisindә ola bilmәz. Müәllif indiyә kimi Liman (bәrgah) qalıqlarını özündә saxlayan, XX әsrin 20-30-cu illәrinә kimi Xәzәr dәnizinin qәrb limanlarından biri kimi fәaliyyәt göstәrәn Masallı rayonunun Qızılağac kәndinin Sәl-









yan rayonunun Qızılağac kәndi olduğunu irәli sürür, lakin onun burada olmasına dair heç bir әsaslı fakt gәtirә bilmir. Çünki o Bәcrәvan şәhәri kimi Qızılağacın da yerini düzgün göstәrә bilmәmişdir". *(Ә.Zahidov "Muğan" Bakı, 1999, sәh. 58).*

Mәn dә bir tәdqiqatçı kimi bu mövzulara biganә qala bilmәdim. Çünki söhbәt mәnim kәndimdәn, onun tarixindәn gedir. Odur ki, hansı müәllifin iddiasının doğru olduğunu oxuculara faktlarla tәqdim etmәyi özümә borc bildim. Hәm Mahmudabad, hәm dә Qızılağacın tarixi keçmişi hansı dövrә aid olduğuna diqqәt edәk. Dünya tarixinin banisi, yәni dünya tarixin yazan antik dövr tarixçisi vә coğrafiyaşünası Heredota (bizim eradan әvvәl 484-cü ildә kiçik Asiyanın Halikamos diyarında dünyaya göz açıb) bütün yer üzәrindә yaşamış vә yaşayan insanlar, o cümlәldәn biz Qızılağaclılar da borcluyuq. Çünki dünyanın nadir mәdәniyyәt xәzinәsi sayılan bu әsәrdә bizim dә payımız vardır. Heredot öz әsәrini gәzib gördüklәri yerlәrlә vә әldә etdiyi mәlumatlarla zәnginlәşdirilmiş vә "tarixin atası" adın qazanmışdır. Heredotdan bir neçә әsr әvvәl (IX-VIII әsrlәr) Homer dünya xәritәsini tәrtib edәrkәn Xәzәr dәnizini dә qeyd etmişdir. Homer öz әsәrindә Xәzәri Günәş Nohuru gölü adlandırmışdır. Homerdәn sonra Heketay Mileteli (e.ә.550-480-ci illәr yaşamış) görkәmli tarixçi-coğrafiyaşünas vә sәyyyah olmuşdur. O dünyada birinci coğrafi әsәr yaratmışdır. Әgәr nәzәr yetirsәk görәrik ki, Xәzәr dәnizi dә, Hekateyin xәritәsindә öz әksini tapmışdır. Bunlardan sonra Heredot bu dahiyanә kәşflәrindә faydalanaraq tarixi yazmışdır. Heredot Xәzәr dәnizi ilә maraqlanmış vә yazmışdır:





"Kaspi dənizi başqa dəniz və okeanlarla birləşməyən daxili su hövzəsidir". Heredot o zaman Xəzərin enini və uzunun da müəyyən etmişdir. O yazır: "Xəzər dənizi müstəqil dənizdir. Onun uzunluğu avarlı qayıqla getdikdə 15 *(təxminən 1600 km)*, eni isə 8 günlük (900 km) yoldur". Görün Heredot nə qədər incəliyə fikir vermiş və o cümlədən Xəzər ətrafı yerlər haqqında da məlumat vermişdir. Minillikləri arxada qoyan Qızılağac haqqında da öz sözünü demişdir. B.Hüseynbalaoğlu və M.Talışlı yazırlar: "Lənkəran və onun ətraf yerlərinin daha çox qədimliyinə nişan verən sənədlərdən məşhuru yunan tarixçisi Heredotun məlumatıdır. O, göstərirdi ki, indiki Masallıya yaxın yerlərdə Dubil adlı bir kənd varmış. (B.Hüseynbalaoğlu və M.Talışlı. "Lənkəran", Bakı, 1999, səh.15). Bu həmin Dubli kəndidir ki, Strabon onun adını Qızılağacla yanaşı çəkmiş və ona yaxın olduğunu söyləmişdir. Ərəstun (eradan əvvəl 384-322-ci illər), Patrokl (e.ə.356-323-cü illər), Erafosfen (276-194 illər) Xəzər və Xəzər sahilindəki yerlər haqqında xəritələrində məlumat veriblər. Qədim yunan coğrafiyaşünası və tarixçisi Strabon *(eramızdan 63 il əvvəl və eramızın 23-cü ilində yaşamış)*, onun ən məşhur əsəri "Coğrafiya" adlı kitabıdır. Məhz Strabonun Xəzərlə bağlı qeydləri daha önəmlidir. Strabon Xəzər dənizinin xəritəsini tərtib etməklə yanaşı, dənizdə olan adaların, dəniz kənarındakı yaşayış məntəqələrinin adlarını da, qeyd etmişdir. Strabon tarixi qədim olan doğma kəndimiz barədə belə qeydlər aparıb: "Qızılağac şəhərinin əks tərəfində sahildən 1,5 mil aralı iki ada Kexol və Ali bulax yerləşir". *(Ə.Əliyev, İ.Əhmədqızı. "Masallı dünən və bu gün". Bakı, 2002, səh. 21)*. Strabonun qeyd





etdiyi yerdə Qızılağac körfəzində indi də həmin adalar mövcuddur. Ali bulax haqqında da bir ehtimal irəli sürülür, o da bundan ibarətdir.

V.Hüseynbalaoğlu, M.Talışlı özlərinin "Lənkəran" kitabında yazırlar: "... həmin yerləri qədim tarixçi Strabon belə vəsf etmişdir: "Bu yerlərdə dağların arasında Kiover (xəritədə Kulver), Maranki, Deidevend və başqa kəndlər, dağa yaxın isə Dubil kəndi yerləşmişdir. Qızılağac şəhərinin əks tərəfində sahildən 1,5 mil aralı iki ada Keoxol, Ali bulax (xəritədə Əli bulax) yerləşir". Əli bulağın uzunluğu 3 mildir. Öz adını əfsanəvi söhbətdən almışdır. Farsların dediyinə görə, guya Əli(ə) (İslamın böyük şəxsiyyəti, peyğəmbər (ə) vəsisi, Allahın vəlisi, birinci imam - (kursiv müəllifindir N.Q.) bir dəfə buralarda olmuş, yanğısını söndürmək üçün su tapmadığı zaman Allaha öz gücünü göstərmək üçün (düzgün ifadə deyildir - kursiv N.Q) bir quyu yaratmış və o indi də su verir. Bu ada sahildən qamışla əhatə olunmuşdur". *(B.Hüseynbalaoğlu və M.Talışlı. "Lənkəran", Bakı, 1990, səh.28)*.

Ali bulaq haqqında müxtəlif söyləmələr mövcuddur. İndiki dövrdə Ali bulaq haqqında söylənilən bu rəvayətlər tarixlə təsdiqlənən mənbə kimi əsas ola bilməz. Ona görə ki, Əli (ə) bəşər kimi dünyaya bizim eranın 599-cu ilində bəxş olunub. Bu tarixlə Strabonun tarixində fərq çox böyükdür. Əli (ə) qazavatları haqqında yazılan "Xavərnamə" kitabında Əli (ə) bu ərazilərdə olması və dənizlə Dərbəndə getməyi barədə əhvalatlar öz əksini tapır. Bəlkə də farslar həmin kitabda yazılanlara istinad edərək Ali bulax - Əli bulax kimi qeyd edirlər. (Bax:"Xavərnamə" (farsca)). Yəqin ki, farsların Strabonun məlumatından anlayışları olmamışdır. Ona görə də söylənən

bu rəvayətlərin tarixi baxımdan tutarlı olmadığı üçün bu rəvayət tarixə zidd hesab olunur. Ali bulaq (Əli bulaq) indi də mövcuddur. Orada nar, əncir, ağacı da çoxluq təşkil edir. Quşlar və çöl heyvanları orada rahatca məskunlaşırlar. Deyilənlərə görə yay fəslində çoxlu gürzə ilanı da olur. Ümumiyyətlə, elmə məlumdur ki, ada ərazisində qazılan quyuların suyu nə səbəbə şirin olur. Buna misal olaraq Sara (Sarı) adasın göstərmək olar. Orada qazılan quyuların suyu şirin və quyunun suyu fəsilərdən asılı olaraq azalıb çoxala bilir.

Strabondan sonra qədim dünyanın görkəmli riyaziyyatçı astronomu, coğrafiyaşünası İsgəndəriyyəli Klavdi Ptolomey (eramızın 90-168-ci il ) Dünya tarix xəzinəsinə sanballı töhfələr bəxş etmişdir. Onun töhfələri içərisində Qızılağac adlı şəhər, Viləş adlı çay, Sara adlı ada da vardır. R.Əsgərov iddia edir ki, Ptolomeyin xəritədə göstərdiyi Qızılağac Səlyan Qızılağacıdır. İndi araşdıraq görək müəllifin iddiası doğrudurmu, yoxsa fərqli mülahizənin nə faydası varmış? Əsgər Zahidov yazır: "Hələ Ptolomey (e.ə.90-168-ci illər) Xəzər dənizinin xəritəsini çəkən zaman Qızılağac şəhəri, Limanı var imiş. Ptolomey həmin xəritədə Xəzər sahilində yerləşən əsas coğrafi adları qeyd etmişdi". *(Ə.Zahidov. "Muğan". Bakı, 1999, səh. 58)*.

Göründüyü kimi Ə.Zahidovun istifadə etdiyi mənbə əsaslı mənbədir. Çünki o xəritədən düzgün faydalanmış və Ptolomeyin müəlliflik hüququna hörmət olaraq faktları yerindəcə qeyd etmişdir. Necə ki, Ə.Zahidov yenə yazır: "Hələ Yunan coğrafiyaşünası Ptolomey (b.erada 90-168-ci il) Xəzər dənizinin xəritəsini tərtib edərkən Qızılağac kəndinin (şəhərinin) adı var imiş. Burada Viləşçayın Talış dağlarından başlayaraq





Xəzər dənizinə axması təsvir edilmişdir. Xəritədə Qızılağac Viləşçayın Xəzər dənizinə töküldüyü yerin yaxınlığında, onun qərb sahilində göstərilir. Həqiqətdə də Viləşçay Qızılağac kəndinin yaxınlığından Xəzər dənizinə tökülür" *(Ə.Zahidov. "Muğan". Bakı, 1999, səh. 77)* .

Onu da bilmək lazımdır ki, Viləşçayı Qızılağac ərazisində 14,5 ha sahəni əhatə edir. Çay Qızılağac körfəzi vasitəsilə Xəzərə qovuşur. Klavdi Ptolomeyin uzaq görənliyi onda olub ki, mövcud olan yerlərin coğrafi əlamətlərini də hesablayıb. O, Viləşçayın en və uzunluq dairəsini hesablamışdır. Bunu bizlərə sadə tərzdə çatdıran Ş.S.Əliyevdir. Şirbəy müəllim Ptolomeyin Xəzər dənizinin xəritəsini təhlil edərkən göstərir ki, "Viləşçayın en dairəsi $42^0$ $45^I$ uzunluq dairəsi $81^0$ $00^I$ olduğunu və Qızılağac körfəzinə töküldüyünü qeyd edir. *(S.C.Əliyev. Xəzər tarixi xəritələrdə. Bakı, 1973, səh.55-56)*. Göründüyü kimi Ptolomeyin xəritəsində indiki Masallı ərazisi olan Qızılağacdan söhbət gedir.

## QIZILAĞAC SÖZÜNÜN MƏNŞƏYİ

Apardığım araşdırmada əvvəlcədən ona əmin idim ki, bu ad hər halda "qızıl" və "ağac" sözlərinin müstəqim mənası ilə bağlı deyil. Yəqin ki, oxucu deyərdi, nə çox respublikada Qızıl ağac bitən yer. Bəs nə üçün o yerlər Qızılağac adlanmır? Bu sözün kökünün hara bağlı olduğunu oyrənməyə çalışdım. Dünyanın qədim mədəniyyət mərkəzlərindən sayılan Güney və Quzey Azərbaycan torpaqları və bu ərazilərdə yaşayan əhali beş min illik dövrü əhatə edir. Bu sözlərlə görkəmli alim Firudin Ağası oğlu Cəlilov özünün "Azər xalqı" kitabında "Subar boy" başlıqlı yazısında qeyd edir ki, "Qədim Azərbaycan ərazisində, xüsusilə Urmi gölü hövzəsində eradan əvvəl III-II minilliklərdə yaşayan Subarlar, türklər, lulu və Qutilər haqqında Şumer və Akkad dilli mənbələrdə məlumatlar vardır. Adı çəkilən tayfalar həmin ərazilərdə zaman-zaman siyasi cəhətdən, qonşu ölkələrlə münasibətdə olmuşdur. Azərbaycan xalqının soy kökünü təşkil edən bu tayfalardan biri Subar boyları (tayfaları) haqqında bəzi məlumatlara toxunaq. Sonralar bütöv Avroasiyaya yayılan Subarlar təkcə Azər xalqının deyil, türk xalqlarından bir neçəsinin də formalaşmasında iştirak etmişdir. Subarlar haqqında məlumatlar beş min il arası kəsilmədən davam edir" *(F.Ağasıoğlu. Azər xalqı. Bakı, 2000)*.

Göründüyü kimi Azərbaycanlıların ilk soy kökü nə qədər qədim dövrə gedib çatır. Onun nəticəsidir ki, indi artıq Azərbaycan türklərinin özünə məxsus tarixi qədimliyi bir həqiqətdir. Türklərin qədim tarixə malik olmasının nəticəsidir ki, "...Məlum olur ki, onların bir qismi eradan əvvəl II minilliyin





ortalarında Sibirə qədər getmiş, iki min il sonra isə Subar soylu boylar yenidən böyük Xəzərin üstündən Ata yurda qayıtmışlar. Subar etnomu qədim türk dilində "Çay adamı" anlamında işləmişdir. Çünki su sözünün qədim forması "sub" idi və dağ əhalisi "dağ adamı", meşəlikdə yaşayanlar "ağacəri" adlandığı kimi fərqləndirilməsi təbii idi. ... Ən qədim Subarlar haqqında məlumatlara görə, onlar eradan əvvəl IV-II min illərdə iki çay arası adlanan ərazidə, Fəratla, Dəclə çayı arasında yaşamışlar. ...Subar bəyliyi e.ə.673-cü ildə tarix səhifəsindən silindi.

Qədim Azərbaycana (diqqət edin Qədim Azərbaycana - N.Q.) oradan da Doğuya çəkilib dilini mühafizə edən subarların törəmələri isə Subar, Süvar, Sibir, Sabir adlarıyla müxtəlif yerlərdə günümüzə qədər yaşadı. ... Beləliklə, aşağıdan sami Asur tayfalarının, yuxarıdan Qafqaz dilli hürrü tayfaların arasında qalan Subarlar üç qola ayrıldı: Batı, orta, və doğu qollar. Batı Subar boyları 38-ci paralel boyunca, doğuya gələnlər Urmi hövzəsində yerləşdi və daha sonralar xeyli hissəsi Sibirə və Türküstan tərəflərə miqrasiya etdi." *(Firudin Ağası oğlu. Azər xalqı. Bakı, 2000)*

Yazıdan göründüyü kimi Qədim Azəri xalqı öz türkçülüyünü və danışıq dilini həmişə qoruyub saxlayan xalq olmuşdur. Bunu Qiyasəddin Qeybullayevin dedikləri ilə əlaqələndirsək görərik ki, Azərbaycan türkçülüyü qədim və uludur. Müəllif yazır: "eradan əvvəl I minillikdə mannaların, madayların, kasların və kaspilərin türk mənşəli etnoslar olduğunu təsdiqləyən faktlar mövcuddur. Həmin minilliyin ortalarında Midiyanın bir hissəsi - məhz, indiki Cənubi Azərbaycan ərazisini əhatə edən, mənbələrdə "Kiçik Midiya" adı ilə adlanan

hissəsi əhalinin etnik mənsubiyyətinə görə Böyük Midiyadan ayrıldı. Bu Azərbaycan ərazisində qabaqkı əsrlərdə getmiş etnik prosesin nəticəsi idi. Manna, Maday, Kas və b. qədim etnoslar əsasında yeni etnos formalaşmışdı. E.ə. IV əsrdən sonra kiçik Midiya ölkəsi və xalqı Atropatena adlandı. VI əsrə aid Dərbənd qala divarlarında epiqrafik abidədə "Aturnatkin" adının yazılması özlüyündə göstərir ki, Atorpaktan bu ölkənin rəsmi adı idi. Burası da məlumdur ki, artıq XII əsrdə ərəb müəllifləri bu adı "Azərbaycan" kimi yazırdılar... "Azərbaycan" sözünün Atropatın adından yarandığını deyənlərin tərəfində dururuq. Əsas məsələ Atropatın və onun adı ilə adlanmış ölkədə əhalinin etnik mənsubiyyətinin öyrənilməsidir. Bununla belə bir düyün açılmamaş qalır: bir tərəfdən e.ə.III-II əsrlərdə yaşamış antik müəllif Polibiy (Polibiy 55-ci il VI əsr) yazır ki, Atropaten çarlığı hələ farsları (yəni Əhəmənilər sülaləsinin) vaxtından qalmışdır. Digər tərəfdən tarixşünaslıqda "Azərbaycan" adı Makedoniyalı İsgəndərə qarşı İran ordusunun başçılarından olmuş Atropatın adı ilə əlaqələndirir. ... I min illiyin əvvəllərindən Azərbaycan ərazisində yerli türkmənşəli etnoslar-mannalar, madaylar, kaslar, kaspilər, albanlar məskun idi. Bununla da xalqımızın təşəkkülündə iştirak etmiş etnik kompanetlərin etnik mənsubiyyətləri müəyyən edilmiş oldu və Azərbaycanlıların orta əsrlərdə iranlılardan, dağıstanlılardan dönmə olması haqqındakı konsepsiyasının puçluğu üzə çıxdı. E.ə.VIIIəsrdən başlayaraq ta eramızın XII-XIII əsrlərinədək Azərbaycan ərazisində dalğalarla müxtəlif türk etnosları da gəlmişdir. Bu da faktdır. Lakin bu dalğaların dəqiq vaxtları və gəlmə etnosların tərkibində türk tayfalarının adları məlum deyil. Onların adlarını yalnız qədim





və erkən orta əsrlərə aid yaşayış məntəqələrinin adlarının və etnotoponimik paralellərinin arasından müəyyən etmək olur. Bu göstərir ki, Azərbaycan ərazisində çox mürəkkəb etnik proses getmişdir. Bir tərəfdən yerli türk tayfaları ilə gəlmə türk etnoslarının Qafqaz dilli və İran dilli tayfaların müəyyən hissələrini özünə qatması-assimliyasiyası prosesi getmişdir... ümumiyyətlə, etnik proses çox saylı prosesdir. *(Q.Qeybullayev. Azərbaycan türklərinin təşəkkülü tarixindən. Bakı 1994, səh. 221-223).*

Yazıdan göründüyü kimi Qədim Azəri xalqı öz türkçülüyünü və danışıq dilini həmişə qoruyub saxlayan xalq olmuşlar.

Bu mövzuya müraciət etməkdə məqsədin qısa da olsa Qədim Azərbaycanı indiki və gələcək Azərilərlə tanış etmək, onların tarixi keçmişi haqda oxucuya müxtəsər məlumat vermək olsa da, Qızılağacın qədimliyindən söhbət açmaqdır.

Odur ki, yenə də möhtərəm oxuculara Qızılağac sözünün mənşəyi haqda Ə.Zahidovun yazdıqlarını çatdırıram. Çox hörmətli Ə.Zahidov yazır: "Bahəddin Ögəlin "Böyük Hun imperiyası" kitabında da hunların yaşadığı yerdə Qızılağacın olmasından və oraya sitayiş edilməsindən söz açılır. Deməli, Qızılağac tayfa üzvlərinin həm müqəddəs yeri, həm də yaşadığı yer imiş. "Türkün Qızıl kitabı"nda Rafiq Özdək göstərmişdir ki, qədim türklər güney Sibirdə yaşayırdılar. Burada Qızılağac və Aba Qızıl adlı türk tayfaları da yaşayırdı." *(R.Özdək türkün Qızıl kitabı. Bakı, 1992, səh 17).*

Buradan nəticə əldə etmək üçün böyük imkanlar var. Çünki F.Ağasıoğlunun və Q.Qeybullayevin dedikləri yuxarıdakılarla uzlaşır və Qızılağac sözünün bağlı olduğu mülahizələr

ortaya çıxır. Bunun üçün yenə də Ə.Zahidovun yazdıqlarına müraciət edək: "Keçmiş hunların və proto-monqolların yaşadığı ərazilərdə çoxlu çay, dağ relyef, kənd, şəhər və digər yerlər qızıl adı ilə adlandırılmışdır. Hunlar proto-monqollar çox milyonlu olmaqla çox qəbilə, tayfa və tirlərə malik imişlər. Vaxtilə Çin kimi dövlət onlarla mübarizə aparır, gah da dinc yanaşı yaşamaq üçün müqavilə bağlamalı olurdu. "Böyük Hun İmperiyası" kitabının proto-monqollardan danışılan yerində bir sıra tayfa birləşmələrinin (Ə.Zahidov, "Muğan", 1999, səh.185) adı çəkilir, tayfanın da yaşadığı göstərilir və onlar Proto-monqollar (yuesilər, sienbinlər və vusanlar) Hun tayfalarının qalığı olsa da həmişə hunlarla uzun müddətli müharibələr aparıblar. Uyğurlar, Altaylar, maldar Qırğızlar, türküstanlı türklər, Göy türklər və Orxan türkləri ayrı-ayrılıqda dövlətləri olsa da, Hunların tərkib hissələri olmuşlar. Burada Vusanların paytaxtı olan "Qızıl vadi" haqqında söhbət (səh. 273) gedir. Qərbə ilk axın e.əvvələ aiddir. Sonralar da Türklərin axınları olmuşdur *(yəni köçürülənlər, yaxud özləri, müəyyən səbəblərə köçənlər)*. Görünür Hunlar içərisində proto-monqollar da "Qızıl tayfa" adlı insan qrupları var imiş.

Bəllidir ki, köç edənlər tayfa üzvlərinin hamısı olmur, onların bəziləri öz ata-baba yurdlarında qalırlar. Asiya, Qazaxıstan, Ural, Sibir, Uzaq Şərq, Çinin ərazisində və başqa yerlərdə indi də həmin tayfaların qalıqları yaşamaqdadır". *(Ə.Zahidov. Muğan, Bakı,1999, səh.78-79)*. Burada mən də indiki insanlara məlum olanları xatırlatmaq istərdim. Bildiyimiz kimi keçmiş SSRİ dövlətinin siyasətinin bir sahəsi də imkanlılara qarşı yönəldilmişdi. Belə ki, imkanlı azərbaycanlıları öz ata-baba yurdundan zorla didərgin salaraq öz vətənindən uzaqlaş-





dırdılar. Onlar da sürgün edildiyi yerlərə öz ata-baba yurdundakı yurd yerinin adını qoydular. Necə ki, deyirlər Qazaxıstan ölkəsinin Çu vilayətində Qızılağac, Şirvan, Gəncə və s. adlarla küçə, məktəb, məhəllə adları mövcuddur. Bu da həmin insanların ana torpağa bağlılığının nəticəsidir. O cümlədən "müəyyən tarixi şərait nəticəsində türk dilli tayfaların ərazi dəyişiklikləri olmuşdur. Ona görə də, əsl yaşadığı yerlərdə və sonralar köç edərək, yaşadığı yerlərdə Qızıl adlı şəhər, çay, kənd adları yaranmışdır ki, onların bəziləri indi də qalmaqdadır. Naxçıvanda, Göyçə mahalında və respublikanın digər yerlərində Qızılvəng monastrı və kəndi, bir sıra digər yer adları, o cümlədən Qızılağac kəndləri olduğu kimi, qonşu ölkələrdə də həmin adla bağlı yerlər mövcuddur." *(Ə.Vahidov, "Muğan" Bakı, 1999, səh. 79)*.

Bu yazılardakı tarixi faktlar bizim eradan əvvəl və bizim eranın I minilliyi ilə bağlı olanlar idi. Əsasən tayfaların köç etməsi bizim eranın I minilliyinin axırına qədər davam etmişdir. Sonradan yaşayışlarının təmin olunması cəhətinə köç edərək yeni yerlərdə məskunlaşaraq öz tayfa adlarını ora qoymaqla əbədiləşdirmişlər.

"XIII əsrdə Azərbaycanın Masallı rayonuna Qızıl tayfasının köçürülməsi nəticəsində Qızılabad kəndi salınmışdır. Sonralar bu kəndə Qızılavar ("avar" fars dilində gətirilmək və köçürülmək mənasındadır) demişlər *(Ə.Zahidov, "Muğan", Bakı,1999, səh. 79)*. Zahidovun avar-apar böyük tayfa adını xatırlatmaması maraq doğurur. Göründüyü kimi Qızıl adı ilə bağlı olan bütün yer adları eyni soy tərkibinin şaxələridir. Bunu Mahmud İsmayılovun "Sənin ulu Baban" kitabında da görmək olur. O yazır: "İlk orta yüzilliklərdə, xüsu-

sən V yüzilliyin sonları VI yüzilliyin əvvəllərində Azərbaycanın demək olar ki, hər yerində dilləri bizim Azərbaycan dilinin kökündə dayanan Soylar yaşayırdılar. Bu dövrdə Azərbaycanda məskunlaşan Savir-Hun İttifaqına, Q.Voroşilovun külli miqdarda qaynaqlar, xüsusilə başqa xalqların qaynaqları əsasında gəldiyi nəticəyə görə onoğurlar (on oğuzlar), sarıqurlar (sarı oğuzlar) Qafqazda ən güclü iri və soy birləşməsi olan gəngərlər tayfa birləşməsinə daxil idilər. Məlumdur ki, tarix ədəbiyatında Azərbaycan xalqının və dilinin təşəkkülünü XI-XII yüzilliklərdə Azərbaycan torpaqlarına kütlə halında gəlmiş oğuzlar və qıpçaqlarla bağlamaq kimi səhv, heç bir elmi əsası olmayan fikir, mülahizə vardır." *(M.İsmayılov. "Sənin ulu Baban". səh. 292-293)*

Azərbaycan dilinin nə qədər zəngin və qədim olmağını təsdiqləyən bu deyilmələr bizlərin yad təsirlərdən kənar olduğumuzu təsdiqləyir. Odur ki, Qızılağac kənd camaatının danışıq dili heç bir təsirə məruz qalmadığına görə qorunub saxlanmışdır. Yəni, danışılarkən sözlərə əlavələr olunmur. Bu da onun soy-kökə bağlılığına əsasdır. Ə.Vahidov yazır: "XIII əsrdə Tatar-monqolların şərqi Avropaya hücumu nəticəsində Batı xanın rəhbərliyi ilə həmin ərazidə "Qızıl orda" (orda - tayfa deməkdir) dövləti yaradılmışdır. Çingiz xan, Batı və Okegey Kaan (xan) Qızıl tayfasının yetişdirmələri idi. Lakin köç edənlər arasında iran dilli və digər soylar da olmuşdur. Qızılağac toponimində "ağac" sözü vardır. Orta əsrlərdə "ağac" ölçü vahidi olmaqla 6-7 km-ə bərabər idi.

Qızılağac sözü haqqında bir sıra etimoloji şərhlər də mövcuddur. Onun biri Şah Abbasla bağlıdır. Guya Şah Abbas Qızılağacda olmuş, orada ov etmiş, dincəlmiş və bu zaman Qızıl





ağacını itirmiş və buna görə də kəndin adı Qızılağac adlandırılmışdı. Lakin tarixi həqiqət rəvayəti təsdiq etmir. Xəritələrdə Qızılağacın adı bir şəhər, kənd adı kimi, bizim eranın II əsrində çəkilir. Şah Abbas isə XVI əsrdə yaşamışdır. Belə olduqda bunlar arasındakı fərq düz 14 əsrdir. İkinci rəvayətdə isə deyilir ki, guya o ərazidə Qızılağac çox bitdiyinə görə belə adlanıbdır. Bəs o biri Qızılağac kəndlərində də Qızıl ağaclar bitibmi? Yox, əgər "Qızılağac" ağaca görə adlanıbsa, başqa yerdə bitən Qızıl ağac meşəsinin ətrafındakı kəndlərə "Qızılağac" adı verilməmişdir? Olsa olsa ona Qızıl ağac bitən meşə və s. demişlər." *(Ə.Zahidov. "Muğan", Bakı, 1999, səh. 80).*

Başqa mənbələrdə bu adla bağlı toponimlərə də rast gəlmək olar. O cümlədən, Musarza Mirzəyevin "Mənim Masallım" kitabında müəllif yazır: "Qızıl qiymətli metal adı deyil, əlamət bildirən sifət "a" birləşdirici səsdir. *(Qızıl həmçinin türk və farsdilli xalqlarda şəxs adıdır.)* Qızılavar kənd orta məktəbinin müəllimi Tofiq Şahbazov yaşadığı kəndin adının talış dilində olan "Qızıləlşvo" sözündən yarandığını göstərir. Bu sözün Azərbaycan dilinə tərcüməsi isə "Qızılağac" deməkdir." *(M.Mirzəyev. Mənim Masallım. Bakı, 1990, səh.20).*

Göründüyü kimi Qızılağac sözü ağac ilə yox, yuxarıda qeyd etdiklərimizlərlə bağlıdır. Həm də əsl türk mənşəli sözdür. Azərbaycan ərazisində dilləri dilimizin kökündə dayanan soyların çox güclü olmasını, əslində xalqın, Azərbaycan xalqının təşəkkül tapmasını qaynaqlarda görə bilirik. Ərəb xəlifəsi Muaviyyənin yaxın adamı olan bir nəfərin söylədiyi və ərəb dilli qaynaqlarda öz əksini tapmış dəlil çox maraqlıdır.

Həmin adam yazır: "Muaviyənin yanında idim. Bu zaman Ermənistan valisindən ona namə gəldi. O naməni oxudu və qəzəbləndi. Sonra katibini çağırıb dedi: "Onun naməsinə belə cavab yaz. Xatırladırsan ki, türkləri mənim torpağıma doğru gəlib oranı qarət ediblər, bəzi şeyləri ələ keçiriblər, sonra türklərin dallarınca adam gəlmiş, ələ keçirdiklərini geri almışlar. Anan səni itirsin, bir də belə işi tutma və onları heç bir şeyə təhrik etmə, ələ keçirdikləri şeyləri geri almağa çalışma. Mən peyğəmbərlərdən eşitmişəm ki, onlar yovşan bitən yerə qədər gedəcəklər". Muaviyyənin bu fikri ilə uyğunluq təşkil edən digər sözləri də maraq doğurur: "Nə qədər ki, türklər bizlərə toxunmurlar, onlardan uzaq gəzin". Bu türklərin mübarizliyi üçün təsdiqlənməlidir. Digər bir rəvayətdə deyilir: I Muaviyyə (661-690) Azərbaycana qoşun göndərməzdən qabaq öz saray alimini çağırıb soruşmuşdu:

- Azərbaycan barəsində nə bilirsən?

Azərbaycanla yaxşı tanış olan alim belə cavab vermişdir:

- Azərbaycan qədimdən türklər ölkəsidir və onlarla məskundur.

Başqa Ərəb qaynaqlarında göstərilir ki, Ər-Rəiş adlı hökmdar, hələ Məhəmməd Peyğəmbər (ə) vaxtında şimala, Azərbaycan torpaqlarına göndərdiyi qoşun yerli "türkdilli əhali ilə qarşılaşmışdır."

Bundan bir qədər sonra isə Yəmən hakimi Tubba Mosuldan Azərbaycana hərəkət etmiş, burada qaynaqda yazıldığı kimi "Türklərlə toqquşmuşdur." *(M.İsmayılov. Sənin ulu baban... Bakı, 1989, səh. 296-297).*

Bir neçə dini kitablarda, o cümlədən Nizami-mülkün "Siyasətnamə"sində Azərbaycan haqqında və onların danışıq di-





li barədə xəbərlər vardır. Bu xəbərlər doğma dilimizin qədimliyini təsdiqləyir. Vaxtilə doğma dilimizin başına cürbəcür oyunlar gəlmiş, və bu dili XII əsrdə bu torpaqlara Səlcuqların gəlməsində təşəkkül tapdığını iddia edirdilər. Hətta ulu əcdadlarımızı irandillilərlə hurritdilli göstərirdilər. Artıq bu sahədə elmi fikrimizin intibahı başlanıb. Alimlərimiz sübut edirlər ki, heç vaxt Azərbaycan türkləri başqa dillərdə danışmayıb. Məhz bunu biz Ə.Zahidovun yazdıqlarında görə bilərik." "... Vaxtı ilə Hələb şəhəri ətrafında yeni el yaranmış, bu ərazidə Kür, Xurbəndəlu ilə yanaşı Qızıl tayfasının oymaqları da var. Zülqədərli elində 21 boyla yanaşı Qızıl tayfasından da yaşayanlar vardı. Azərbaycan və Gürcüstan ərazisində Qızılhacılı kəndləri vardır. Başqa ölkələrdə və respublikamızda "Qızıl Qocalı" adlı toponimlər vardır. Etimala görə "Qızıl İrmaq" çayı həmin tayfanın adı ilə adlandırılmışdır.

Qızıl-a-bad bitişdirici bir reallığı bildirir. Qızılavar-Qızılabad eyni tayfanın yaşadığı kənddir. Qızıllar tərəfindən salınıb və abad edilən kənd mənasını verir. Qızılabad tayfalarının gəlişinə kimi bir yaşayış məntəqəsi kimi mövcud imiş, köç edənlər onu abadlaşdırmış və adını dəyişdirmişdir. Qızılağac və Qızalabad toponimlərindəki "ağac" və "abad" sözləri arasında 1100 il fərq vardır. Bunlar hər iki adın sinonimidir. Qızılağac və qızılabad eyni kökdən olmaqla hər ikisi Qızıl tayfasının məskənidir.

... Deməli, onların əsli "Qızıl" tayfadan olmaqla qədim Hunların qalığı olan proto-monoqollardan, tatar-monqollardandır." *(Ə.Zahidov, Muğan. Bakı, 1999, səh.80).*

Bəli! Artıq bir neçə əsaslarla Qızılağac toponiminin mahiyyəti açıqlandı. Qızılağac türkün Qızıl boy kökündəndir.

Hələ ikinci xəlifənin zamanında Azərbaycanda əhalisi başdan-başa Azərbaycan dillilərin məskunlaşdığı bir həqiqətdir.

Ərəb qaynaqlarının birində qeyd olunur ki, "Əbu Davud xəbər verdi ki, nə qədər türklər sizə toxunmayırlar, onlara dəyməyin, belə ki, mənim xalqıma verilmiş xoşbəxtliyi birinci Qanturanın oğulları zəbt edəcəklər". Tədqiqatçılar Qanturanı Azərbaycan ərazisində məskun olan əhalinin başçısı hesab edirlər.

Digər Ərəb müəllifi "Kitab əl-fitan" adlı əsərində Muaviyyənin xəlifəliyi dövründə baş vermiş hadisələrdən danışaraq göstərir ki, Azərbaycan ərazisi başdan-başa qədim azərbaycan dillilərlə məskun idi. *(M.İsmayılov. Sənin ulu baban... Bakı, 1989, səh. 297).* Bütün bu deyilənlər bir həqiqətdir. Həqiqəti başqalarına çatdıran sözdür.

Bir şəxs İmam Sadiq (ə) hüzurunda çox danışardı, Həzrət ona belə buyurdu: "Ay kişi! Sözü kiçik bir şey hesab edirsənsə onu bil ki, Allah öz peyğəmbərlərin tanıtdırmaq istəyəndə, onları qızıl, gümüş ilə tanıtdırmayıb. Bəlkə söz danışmaq vasitəsilə onları dünyaya tanıtdırmışdır".

Bu mübarək kəlam hər insan üçün həyatda əsas olmalıdır. Ona görə ki, söz vasitəsilə millətin, xalqın səsi eşidilir. Ona görə ki, söz millətin, xalqın, ölkənin, yerin mövcud olmaqlığından xəbər verir. Ona görə ki, əsrlərin, min illərin sorağını çatdırır. Məhz bunu əsas tutaraq mən də bu kitab vasitəsilə ölkəmin, kəndimin, müxtəsər də olsa tarixindən söz açıram ki, hər bir Qızılağaclı bilsin, onun anadan olduğu yerin nə qədər dünya şöhrəti var. Onun mənsub olduğu soy-kökü nə qədər qədimdir.

Peyğəmbər (ə) buyurub: "Mömin şəxs həmişə hikmət ax-





tarar. Hər kimdən eşitsə yadında saxlayar, lakin əhəmiyyət verməz kim tərəfindən söylənilib". Bunu şair Məmmədnəsirin yazdıqları ilə bəyan etmək məqsədə uyğundur.

***Bağlı sandıqdır hər insan, deməsə bir neçə söz,***
***Alacaq qiymətini ərz eləsə bir neçə söz.***
***Ürəfa əhli üçün daimi qiymətdə olub,***
***Çünki ağlar ürəyi, güldürəcək bir neçə söz.***
***Pisə pis, yaxşıya qiymət də verib ariflər,***
***Onu dərk etmək üçün söyləyirəm bir neçə söz.***

Sözə ehtiram edərək başqa mövzuya keçirəm.

## QIZILAĞAC XƏRİTƏLƏRDƏ

Doğma kəndimizin ulu keçmişi haqqında yazdıqca ruhuma fərəh və sevinc bəxş olunur. İnsan könlüncə olan hər hansı bir işi görmək istədikdə o işdən böyük həzz və mənəvi ləzzət zövq duyar. Qədim Qızılağac haqqında tədqiqatları davam etdirdikcə bu zəhmət və əmək insana ilham bəxş edir. Vaxtilə Qızılağaca dünya tarixçiləri, coğrafiyaşünaslar, alimlər tərəfindən böyük maraq oyanması öz əksini yazılı mənbədə tapmışdır. Bu maraq Qızılağacda olan təbiətin özünəməxsus fərqli əlamətləri olsa da, lakin başlıca cəhət onun əlverişli mövqedə qərar tutması olmuşdu. Qızılağac həm də yaxın və orta şərq ölkələri ilə, o cümlədən Rusiya ilə geniş ticarət əlaqəsi saxlayan liman şəhəri idi. Qızılağaca gələn səyyahlar bu yeri o dövrə məxsus əlamətlə vəsf ediblər. İstər antik dövrün alimləri, səyyahları, istər ondan sonrakı səyyahlar, Qızılağac şəhərini, onun iqtisadi inkişafının özünəməxsus xüsusiyyətlərini öz əsərlərində dolğun və məzmunlu şəkildə təsvir etmişlər. Elə isə biz də ulu keçmişimizdən xəbər verən Qızılağacı seyr edək. Heredotun, Strabonun, Ptolomeyin, Plutarxın yazdıqlarının sonrakı dövrdəkilər tərəfindən təsdiqi, doğruluğu da əsas amillərdən biridir. Azərbaycan və onun ərazisi haqqında çox dəyərli və dolğun məlumat verən səyyahlardan biri dahi Alman alimi Adam Olearidir. Onun tərcümeyi halına diqqət etsək görərik ki, bu şəxs böyük simalardan biri olub. Oleari (1599-1671) Leypsiq Universitetini bitirmiş, fəlsəfə magistri dərəcəsini almışdır. Tarixdən başqa astronomiya, riyaziyyat, fizika və coğrafiyanı yaxşı bilirdi.







***Ptolomeyə görə dünya xəritəsi (II əsr)***

Oleari Almaniyada olan xırda feodal dövlətlərdən birinin Qolştiniya Hersoqunun sarayında xidmətə başlamışdı. Hersoq III Fridrix (1616-1659) dərin məlumatlı Olearini Moskvaya və Səfəvilər dövlətinə danışıqlar aparmaq üçün göndərilən Qolştiniya səfirliyinin tərkibinə daxil etmişdir. Oleari Azərbaycanda olarkən, bu ölkə haqda çoxlu məlumatlar əldə etmişdir. Onun ilk ən geniş məlumatı Xəzər barədədir. Alman alimi də ayrı-ayrı vaxtlarda Xəzərin müxtəlif adlar daşıdığının qeydlərini aparıb. O cümlədən Xəzər dənizinin xəritəsini də tərtib etmişdir. Ən başlıca maraq doğuran əlamətlər həmin xəritədə Qızılağac haqqında olanlardır. A.Olearinin 1646-cı ildə tərtib etdiyi xəritə eranın əvvəlində (90-168) Klavdi Ptolomeyin tərtib etdiyi xəritədəki yerlər ilə eyni yerdə qeyd edilir. Belə ki, II əsrdə Ptolomeyin tərtib etdiyi xəritədə Qızılaqac, Sara adası, Viləş çayı Olearinin xəritəsində də eynilə Ptolomeyin xəritəsindəki kimi təsdiqlənir.

Ptolomey Xəzər dənizinin xəritəsini tərtib edib. Həmin xəritədə Qızılağac kəndinin (şəhərinin) adı var . Həmin xəritədə Viləş çayının Talış dağlarından başlayaraq Xəzər dənizindəki Qızılağac körfəzinə töküldüyü əks etdirilir. Qızılağac isə xəritədə Viləş çayının qərb sahilində göstərilir. Həmin xəritə doğruluğunu və buna görə də əhəmiyyətini indi də təsdiqləyir. Çünki Viləşçayın şərq tərəfində Qızılağac şəhəri saxlamaqdadır. *(Qədimdə Viləş çayı Quru çaydan keçərək Xəzərə tökülürdü).*







*Ptolomeyə görə Xəzər dənizi xəritəsi (II əsir)*

Xəritədən göründüyü kimi Qızılağac yaxınlığında Sara adası da var. Elə isə təhlilə ehtiyac olduğu üçün nəzərinizə çatdırım ki, Səlyan ərazisində olan Qızılağacın yanında nə Viləş çayı var, nə də Sara adası. Bütün bu tutarlı faktlara baxmayaraq bəzi müəlliflər tərəfindən Ptolomeyin xəritəsində göstərdiklərinə əhəmiyyət verməmiş onu öz istədikləri kimi şərh etməklə kifayətlənmişlər. Öz istədiklərinə üstəlik haqq da qazandırmağa səy göstərirlər. Onlardan biri R.Əsgərovdur. Onun iradları göründüyü kimi əsassız hesab olunur. Ona görə ki, indiki Səlyan Qızılağacı dəniz sahilindən 40-50 km uzaqda qərarlaşıb. Digər tərəfdən orada tarixi yaddaşı özündə qoruyub saxlayan "Həzi təpəsi" yoxdur və olmayıb da. Sultan Əbu Səidin Şirvanşahla bağladığı müqaviləyə əsasən Qızılağac Limanına Şirvanşah ərzaq və digər ehtiyacı ödəyənləri göndərəcəkdi. Çünki həmin dövrdə dəniz təhlükəsiz idi. Bəli heç bir vaxt tarixin təkərin geri döndərmək olmaz. Ona görə ki, Xəzər dənizinə tökülən Viləş çayı, Xəzərdə olan Sara adası qədimdən mövcuddur və olaraq qalır. Bunları əsas fakt bilərək demək istəyirəm ki, Qızılağac indi də Xəzərdən 3-4 km məsafədə yerləşir. Əvvəllər isə Xəzər kəndin 200 metrliyində mövcud idi. Salyan rayonunda olan Qızılağac isə Xəzərdən çox kənardır, buna görə də orada liman ola bilməzdi. Bu haqda sonra da söhbətlərimizə səyyahların məlumatı əsasında qayıdacağıq.

Uzaq bir tarixin doğruluğunu təsdiqləyən maddi-mədəniyyət abidələri əsas amillərdən biridir.

O, cümlədən ASE III cildində Masallı ərazisindəki Qızılağac haqqında məlumat olduğu halda bəs nə üçün Səlyan Qızılağacı əgər qədimdirsə (?) onun haqqında məlumat verilmə-





yib? Bu özü də Qızılağac haqqında ikili fikrə son qoymaq üçün əsasdır.

Deməli Ptolomeyin göstərdiyi Qızılağac kəndi (şəhəri) indi Masallı rayonunun ərazisində olan Qızılağacdır, nəinki Salyan rayonu ərazisində olan Qızılağac. Həqiqətin üstünə pərdə çəkilsə də, çox keçməz ki, doğruluğu ilə məlum olar və təsdiqlənər.

Uzun müddət keçməsinə baxmayaraq, Olearinin xəritəsindəki ad göstəriciləri indi də mövcuddur. O cümlədən şükür ki, Qızılaqac və Qızılağac körfəzlərinin adı heç bir vaxt başqa adla adlandırılmayıb.

A.Olearinin xəritəsində Əli bulaq (əslində Alı bulaq) Sara adası, Qızılağac və başqa yaxın ətraf şəhər və kəndlər də göstərilir. Bu da onu göstərir ki, bu yerlərə verilən adlar da dəyişilməz qalıb. Məsələn: Sara adası və Astara. A.Oleari Qoliştiniya elçiləri ilə birgə Ərdəbilə getmiş və Səfəvi sarayından qayıdarkən 1638-ci ildə ikinci dəfə Azərbaycan torpağına qədəm basmışdır.

Görkəmli alim Yaqub Mahmudov "Odlar yurduna səyahət" əsərində yazır: "A.Oleari fevralın əvvəllərində Astaraya çatır, səyyah burada "adam yoğunluğunda üzüm tənəkləri" olduğunu qeyd edir və bu barədə vaxtilə "Strabon verdiyi məlumatı təsdiq etdiyini" bildirir.

Oleari yazır ki: "Astaralılar həmişə silahı hazır saxlayırlar". Çünki Volqanın aşağı boynunda qaçaqçılıq edən kazaklar qənimət üçün tez-tez Azərbaycanın sahil rayonlarına, o cümlədən Astaraya hücum edib əllərinə keçəni talayabı aparırlar.

***Haşiyə:*** Qızılağac ərazisində Xəzər sahilinə yaxın Kazak

yeri deyilən yer adı var. Mən dünyagörmüş müdrik qocalardan bu yerin nə üçün Kazak yeri adlanma səbəbini soruşardım. Onlar təxminən yuxarıdakı deyilişə yaxın söhbət edərdilər. Onlar deyirdilər ki, kazaklar bura (yəni sahilə) gəlib qənimət əldə edərdilər. Olearinin dedikləri və Qızılağacda olan (Kazak yeri) eyni mənbəyə bağlıdır. Qızılağac körfəzinin keçmiş adı bu şərhə əlavə olunmağa ehtiyac olduğunu nəzərə alaraq oxuculara aşağıdakı məlumatları çatdırıram.

Heç bir tarixi mənbələrdə Qızılağac körfəzi başqa adla adlanılmayıb. Əgər biz Xəzər sahilindəki körfəzlərin adına nəzər etsək görərik ki, Qızılağcac körfəzi öz adını əvvəldən qoruyub saxlayıb, yəni o başqa adla adlanmayıb. Bunu görkəmli ilahiyyatçı alim, mühəddis (hədis toplayan), əllamə, molla Məhəmməd Bağır Məclisi (ə) "Biharül Ənvar" kitabında Səlbidən etdiyi rəvayətlə müqayisə edək. M.B.Məclisi yazır: Səlbdən rəvayət nəql edib buyurur: Əshabi Rəs Həzrəti Süleyman (ə)dan əvvəl yaşamış və onların yaşadığı yerdə olan çayın adı Araz (başqa mənbələrdə Ərəss) olub. Bu çayın uzunluğu 800 km-dir. Asiyanın şərqindən Ərzurum dağından başlayıb Qızılağac körfəzində Xəzər dənizi ilə qovuşur.

Həmin çay hal-hazırda Azərbaycan respublikasını İran İslam Respublikasından ayırır.

Avestada *(120 min inək dərisi üzərinə yazılmış atəşpərəstlərin müqəddəs kitabı)* bu çay "Dantya" kimi qeyd edilir.

"Əshabir-Rəs" sözü bu çayın adı ilə çox əlaqəlidir. Məcuslar (yəni atəşpərəstlər) əhli kitabdırlar. Onlara Zərdüşt adında Allahın peyğəmbəri Məbus olmuşdur. Lakin Atəşpərəstlər öz peyğəmbərlərini öldürüb, dinlərində çoxlu uydurmalar vücuda gətirmişlər. Onların əqidəsində su, torpaq, od,





külək və s. ünsürlər çox müqəddəs və sitayişə layiqdir... Təsadüfən onların bayram günü idi. Allahın izni ilə dəhşətli bir külək qopdu. Hamısı cəhənnəmə vasil oldular. Həmin qəbilənin paytaxtı İsfəndər olmuşdur.

1820-ci ildə yazılmış və Sankt-Peterburqda nəşr olunan "Puteşestviye na Vostok" kitabında göstərilir: "Möcüzələr kitabında yazılıb:"bağırsaq qurdları xəstəliyindən əziyyət çəkənlər Araks çayının suyuna girəndən sonra (su topuğa və dizə dəysə) xəstəlikdən sağalar. O şəxslər ki, ayaqlarını dizlərindən də bir qədər aşağı su dəyməklə çayı keçsələr və ayaqlarını çətinliklə doğan qadının kürəyinə qoysa, o qadın tezliklə hamiləlikdən azad olur." *(Putehestvie na Vostok. səh.17).*

Araz çayı barədə bunları da bilmək yaxşı hal hesab olunar.

Q.İ.Məşədiyev yazır: Rass, Arras, Aras, Eraks sözünün İran mənşəli dillərin birində su mənasında olduğunu fərziyyə şəklində söyləmək mümkündür.

"Ermazıdan əvvəl III-I əsrlərdə Arazın sahilində Yunanların və ya Ərəblərin yaşamış olduğu məlum deyildi... İran torpağında Araks adlı ikinci bir çayın olması həmin fikrin doğruluğunu bir qədər gücləndirir." *(Bax: SMOMPK, III c., Tiflis, 1907. s.15).*

Yazıçı Elçinin bir məqaləsində oxuyuruq: "Psevdo Plutarxın əsərində çox maraqlı... məlumata rast gəlirik. O, Araz çayının coğrafi mövqeyindən bəhs edərək yazır: "Bu çayın sahilində yerli əhalinin Araz adlandırdığı bir bitki yetişir. Bu sözün tərcüməsi belədir: "Qız sevməz" Bu bitkini qızlar dərən kimi yaralayır və solur. Maraqlıdır ki, qədim babalarımızın dilində Araz sözü varmış. Araz çayının adının mənşəyi güman

etmək olar ki, məhz bu sözlə əlaqədardır."

Arif Rəhimov Araz sözünün türkmənşəli olduğunu bildirərək yazır: "Sel, su, çay mənalırnda olan Araz adi türk dillərinə məxsus olan bir sözdür."

M.Elli yazır: "Fikrimizcə Araz (Arras) sözü qədim türklərin ulu babası və ilk xaqanı sayılmış Əfrasiyabın qardaşı Aqrearsin adı ilə bağlıdır. Aqreras, Areras, Arras, Araz, "Avesta"da isə Aqrerat şəklində verilmişdir... O daha sonra qeyd edir: Bizcə Kür sözü Qara su (Böyük su) deməkdir.

... Qolştiniyalıların karvanı fevralın 11-də Qızılağaca gəldi. *(Onu da qeyd edim ki, A.Oleari yox, Qolştiniyalıların karvanı o karvanın tərkibində bir çox nüfuzlu diplomatlar və dövlət adamları, səfirliyin işçiləri olub. - Kursiv bizimdir – N.Q.)*

Adam Oleari yazır ki, burada, sahildən xeyli aralı bir ada var. Yerli camaat onu torpağının rənginə görə "Sarı ada" adlandırır. Bu məlumat uzun zaman xəritələrdə "Sara adası" kimi qeyd olunmuş, həmin adanın əsl adının tarixi mənbələrdə qalması baxımından çox maraqlıdır. (Əslində Sarı adasıdır - kursiv bizimdir.) Sara adası haqda sonra söhbət açacağam. Oleari Qızılağac adının da "Qızıl" və ya "Qırmızı" sözləri ilə "ağac" sözünün birləşməsindən yarandığını qeyd edir. (Bax: Qızılağac toponimi - N.Q.)

Oleari burada "adi gözlə ucu-bucağı görünməyən bir çəmən olduğunu yazır. A.Olearinin bu cümləsini əsas götürərək "Puteşestviye na Vostok" kitabında Qızılağacla bağlı bir əhvalatı nəzərinizə çatdırım. Bu kitab Sankt-Peterburqda 1820-ci ildə nəşr edilib.








*Adam Olyariyə görə Xəzər dənizinin xəritəsi (1646-cı il)*



*Adam Olyariyə görə Xəzər dənizinin xəritəsi (1646-cı il)*





Səyyah şimaldan başlayan səyahətini özü qeyd etməklə yanaşı, həm də Hacı Zeynalabdin Şirvaninin "Bustanus səyahə" kitabından istifadə etmişdir. Həmin kitabda səyyah yazır:

Göy təpədən yol səhralıq ilə keçir. Bu səhralarda qaz, ördək və çöl toyuğu qışlayır. Durnalar mədəniyyəti olmayan cəmiyyətdən özgələşərək bir qədər cənuba uçub gedirlər. Heç bir məcara olmadan mən Qızıl-ağac (Qırmızı ağac) çayı *(burada Viləş çayı nəzərdə tutulur)* boyunca yola düşdüm. Burada çayın eni 6-7 səcən idi. Bir cüt səyyah buranı keçəndə az qala öləcəkdi. Suyu çox olan yerdən içi boş olan araba ilə keçən zaman güclü çay axını arabanı qoşa at qarışıq aparır. Atlar boğulub ölür, məşhur səyyahı isə kazaklar sudan çıxarıb, xilas edirlər. Qızılağacdan yol dənizə keçir. On verst getdikdən sonra Qum-başı dəniz limanından bərə vasitəsilə hərəkət etməyə başladım. Limanın eni 50 səcən, dərinliyi isə bir arşın idi. Burada bərədən istifadə etmək vacib idi. Çünki Liman Lənkarana qədər uzanırdı. Bərə üç kolaz (lodka) üstündə qurulmuşdur və olduqca ləng hərəkət edirdi. Bərəni bir bərəçi çəplər (avar) ilə çox tənbəl sürürdü. Liman ətrafı ov quşları toplaşıb. Bu ətrafda suyun dərinliyinə salınan yolda kazak daxmaları var. Limanın digər tərəfində isə ot yığımından ötrü kazak evləri salınmışdır. Ümumiyyətlə Səlyandan Lənkərana qədər olan yol Bakı ətrafında olan çılpaq səhralıqdan fərqlənir. Burada olan gözəl və geniş yaşıllıq zəngin ölkəni xatırladır. Lənkərana 10 verst qalmış Saru adasına tərəf döngə var. Döngəyə çatanda ada görsənir və bu döngədən Saru adasına 7 verstlik yoldur. Fransız səyyahı Şavvalye Qamba Bakıdan Saru adasına 15 verstlik yolun olmasını demişdir. Lakin onların arasındakı məsafə 145 verstdir. Fransız səyyahına şərəf, alqış

olsun. Lənkərana yaxınlaşdıqca mən bataqlıqdan çıxıb sahildə yağış altında sanki sıraya düzülmüş çoxlu tısbağa (çanaqlı bağa) gördüm. Onları çevirib, çanaqları üstə qoysan, bütün gecəni səhərə qədər belə qalarlar. Kütləvi tısbağa ovu üçün bu bir üsuldur. Lakin mən tısbağalar ilə yox, Lənkəran ilə məşğul olmalı idim. Artıq şər qarışırdı (gecə düşürdü). İcazənizlə mən sonuncu fəslə (hissəyə) keçim... *(Puteşestviye na Vostok. səh.110-111)*. Qızılağac haqqında yazarlardan biri də Ottens olmuşdur. Ottensin Xəzər dənizi xəritəsi (1722-23) 1699-1703-cü illərdə I Pyotrun göstərişi ilə Həştərxan dəniz donanmasının kapitanı Yeremey Meyerin tərtib etdiyi xəritənin davamıdır. Xəritədə göstərilənlərdən başqa Xəzərin bir neçə adı qeyd olunmuşdur. O cümlədən bu xəritədə Qızılağac Xəzər dənizinin cənubunda, Sara adasının Şimal qərb istiqamətində indiki Qızılağacın yerində göstərilib. Bütün bu faktlar Qızılağac haqqında olan ikili rəyə *(yəni Səlyan Qızılağacında olmağa - N.Q.)* son qoyur. Məhz bu deyilənləri qəbul edərək bilməliyik ki, eyni adda olan kəndlər bir-birindən köçmək və ya tayfaların yer dəyişməsi hesabına yaranmışdır.

Ş.Əliyev yazır: “Xüsusilə qeyd etmək lazımdır ki, dəniz xəritələri tərtibinə aid birinci sıçrayış II əsrdə Ptolomeyin, sonra isə XVII əsrin əvvəllərində I Pyotrun dövründə olmuşdur. Bu dövrlər arasında Xəzər dənizi xəritələrinin görünüşü müxtəlif şəkillərdə çox vaxt bir-birinin əksi olmuş olsa da, yenə dəqiqliyə doğru inkişaf etmişdir. Həmin dövrdən başlayaraq Xəzər dənizi quruluşu və öz həqiqi formasına yaxınlaşır.

Bu İvaşevskinin (1856) vaxtında tamamilə həll edilmiş olur və Xəzər dənizi xəritələrdə əsil və müasir formasını alır.” *(Ş.S.Əliyev. Xəzər dənizi tarixi xəritələrdə. Bakı, 1973, səh 127.)*.








Ottensin Xəzər dənizi xəritəsi (1722-1723-cü il)




***Yan Struysa görə Xəzər dənizinin xəritəsi (1668-ci il).***





## SƏYYAHLAR QIZILAĞACDA

Qızılağac böyük karvan yolunun üstündə yerləşdiyi üçün, buradan keçən karvanlar, ticarətə gedən tacirlər, ziyarətə gedənlər zəvvarlar, səyyahlar, dövlət başçıları, alimlər və hər hansı bir ayrı-ayrı insanlar bu kənddə (şəhərdə) müvəqqəti qalıb, dincəlmişlər.

O cümlədən, Qərbin ən böyük və tanınmış səyyahlardan biri olan Con Bryus da Qızılağacda olmuşdur. Con Bryus Qızılağac və Lənkəran haqında qeydlər aparmışdır. Con Bryus, Şarli Antoni, Bill Con və başqaları Qızılağacda olmuş bu yerdə gördüklərini, xatirələrini qələmə almış tarixin qızıl səhifəsinə daxil etmişlər. Qızılağac bir tərəfdən Avropa, digər tərəfdən Yaxın Şərq arasında ticarət və iqtisadiyyatda başlıca rol oynamışdır. Qızılağac demək olar ki, mövcud olduğu vaxtlardan Liman şəhəri olduğu üçün Xəzər dənizi vasitəsilə dünya ölkələri ilə əlaqəsi olan yer olmuşdur. Əsasən orta əsrlərdə bu şəhərin limanı böyük əhəmiyyət kəsb etmişdir. Məhz bunun nəticəsidir ki, orta əsrlərdə Hindistandan Azərbaycana gələnlər Qızılağac Limanında da işləmişlər.

Görkəmli alim Əli Əjdər Səidzadə orta əsrlərdə "Azərbaycan Hindistanla mədəni əlaqələri tarixindən" kitabında yazır ki: "... bəhs etdiyimiz dövrdə yalnız Azərbaycanlılar Hindistana deyil, hindlilər Azərbaycana gəlirdilər. Onlardan bəziləri, hətta çox qüvvətli ehtimal ilə demək olar ki, bəlkə də ilk olaraq hindlilər Azərbaycana gəlmişdilər və ancaq sonralar Azərbaycanlılar Hindistana getməyə başlamışdılar.

Azərbaycanda (əsasən Bakı və Şamaxıda, qismən isə Lənkəran, Qızılağac və Səlyanda da) ömürlük olaraq yaşamağa qalırdılar. Səlyan, Lənkəran və Qızılağacda isə hələ XIX əsrin əvvəllərində də hindlilərdən bəziləri balıq vətəkələrinin bir neçəsinə sahiblik edirdilər. (Bəzi məlumata əsasən yəqin etmək olar ki, atəşgahda (Bakıda olan) sonuncu, az miqdarlı hindlilər, "xaki" (*4 ünsürdən biri olan "torpağa" ibadət edənlər)* idilər. Hindistanda "xaki"lərin əsas mərkəzi - Fərəhabad (Aid) şəhəri yaxınlığında idi. Azərbaycana gələn hindlilər heç də yalnız atəşpərəstlər məbədini ziyarət edənlər deyildilər. 1638-ci ildə Lənkəranda olmuş Rus zadəganı məşhur kilsə xadimi Artmey Suxanov hindlilərin Lənkəranda və Qızılağac limanında işlədiyini görmüş və belə qeydlər aparmışdır:

"... Hindlilər Qızılağaca gedərkən su hövzəsindən yüklərini yerli adamların altı balıqçı gəmiləri ilə daşımışlar". Məşhur kilsə xadimi olan Artmey Suxanov özünün IV kitabının 5-ci fəslinin "Rəştdən Qızılağaca qədər və Gilan vilayətinin sonuna kimi" (1638-ci il) başlıqlı yazısında həmin səfər haqqında yazır və Gilandan qayıdan zaman bir neçə yerdə Lənkəranın adını çəkir: "Biz 4 mil sahil ilə hərəkət edib Ləngərquna dar yolu ilə daxil olduq. Burada meşəlik, hündür dağlar sahilə doğru düşür. Lakin dənizin digər sahil tərəfi çox yumşaq bataqlıqdır. Bu keçidin yanından dağdan tərsanə çayı (soyuq çay) axır. Sonra Lənkərana gəlir.

Bu yer öz adını Lövbər salma və liman adından almışdır. Baxmayaraq ki, burada həqiqi liman yoxdur, ancaq körfəz





vardır. Bu körfəz Lənkəran tərəfdən meşə, başqa tərəfdən, Qızılağacdan qamışlıqla əhatə edilmişdir, yarım ay şəklindədir...

Biz yolumuza davam edib 5 mil yol gedərək Qızılağacadək 4 ədəd dərin çay üzərindəki körpüdən keçdik.

Bunlar: Kasiende, Noabine, Djili və Buladi idi. Sonuncu çaydan biz gəmi ilə keçdik. Arxamızca və yanımızca atlarımız üzə-üzə sahilə çıxdılar. Sonra yaşıl sahildə böyük dairəyə bənzər su hövzəsindən at üzərində keçdik.; Yüklərimizi isə 6 ədəd böyük balıqçı qayığı ilə dəniz vasitəsilə hərəkət etdirərək iki bir-birinin əksi olan adanın sahilinə çıxardıq. Bu adalardan biri torpağının rənginə görə Sarı adlanırdı. Bura hündür qamışlıq və lığla örtülmüşdü. Sonra Qızılağacda sahilə çıxan kimi bizi yüzə qədər təmiz geyimli atlılar yerin sahibi ilə birlikdə qarşıladılar. Burada yarım milə yaxın düzənlik və Viləş çayı yan-yana dayanmış, Gilan dağı sola keçmiş, sanki qədim Mokan (Muğan) tərəfə kiçik evlərlə yönəlmişdir... Uzaqdan baxanda dağın ətəyində bir çox kəndlər görünürdü. Deyirdilər ki, bu yerlər heyvan otarmaq üçün gözəl otlaqlardır."

Artmey Suxanovün təsvir etdiyi bu yerlərin bu vəsvedici mənzərəsi tarixi baxımdan çox təqdirəlayiq əlamətdir. Çünki həmin dövrdən indiyə kimi böyük dəyişikliklər əmələ gəlmiş, indiki mənzərə şəklinə düşmüşdür. Bu da tarixi proseslər nəticəsində baş vermişdir. Odur ki, həmin dövrlə indiki dövr arasında fərqi də nəzərə almaq lazımdır.

Əslən Şotlandiyalı olan, Rusiyada həkim işləyən başqa bir səfarət nümayəndəsi Bel İran ölkəsindən keçərək Lənkərana

gəlməyini qeyd edir. O, yazır ki, 1717-ci il dekabrın 2-də isə Lənqara gəldik. Sonra Lənqardan beş ağac (30 km) aralı yerləşən Qızılağaca getdik. Belin yazdığına görə Lənkərandan Qızılağaca gedərkən bir çox dərin çayların üzərində qoyulmuş körpülərin üstündən keçməli olduq. Şimal küləyi əsəndə, yağış yağanda həmin çaylar daşaraq körpülərin üstündən aşır, sahilləri basır və gediş-gəlişi çətinləşdirirmiş.

Göründüyü kimi dünya ölkələrindən gələnlər çox böyük tarixi iş görmüşlər. Onlar yol qeydləri aparmaqla keçmiş haqqında tarixi bizə çatdırmışlar. O səyyahlardan biri məşhur Rus dövlət xadimi, Türkiyə və İranın dövlət işlərində çalışan Artemiy Petroviç Volnski (1689-1740) səfər qeydlərində Qızılağacın ticarət və relyefi haqqında ətraflı məlumatlar vermişdir. Volinski Qızılağac haqqında apardığı müşahidələrində belə qənaətə gəlmiş olur: "Güman etmək olar ki, burada vaxtı ilə qala divarları olmuş və onları su yuyub aparmışdır. Volnskinin Qızılağaca gəlişi və müşahidələri 1717-ci ilin sentyabr ayının 1-dən başlamışdır. Qızılağac haqqında tarixi materiallara ərəb və fars səyyah və alimlərinin əsərlərində tez-tez rast gəlinir. Belə ki, IX əsrdə yaşamış böyük ərəb tarixçisi Kudəfi Qızılağac sakinləri haqqında xatirələrində yazır: "Sədaqət və səmimiyyətinə görə onlara heç kim çatmaz. Ancaq başlarına nə gəlirsə sadəlövhlüklərindən gəlir"

Az vaxt içərisində səyyah müşahidələrini aparmaqla yanaşı insanların davranış və rəftarlarına da biganə qalmayıb. Onun dediklərini indi də təsdiqləmək çox asandır. Qızılağac kənd (şəhər) sakinləri özlərinə məxsus bu mövqeyi indi də





qoruyurlar. Bu kənddə qonağa hörmət, Allahın Quranda buyurduğu: "Qonağı əzizləyin, hətta o kafər də olsa belə", kəlamını əsas tuturlar. Qızılağac qonaqsevənlər yeridir.

Digər səyyah İvan Brexov da Qızılağac haqqında olan məlumatlarını da yazır. O, Moskva dövlətinin zadəganlarındandır, əsli Kazanlıdır. 1614-1615-ci illərdə o, Stepan Afanaseyevlə birlikdə İrana gəlib səfirlikdə Tixonov və Buxarovun taleyi ilə maraqlanmağı qarşısına məqsəd qoymuşdur. 23 iyul 1614-ci ildə Brexov və Afanasiyev Moskvadan çıxıb Şamaxaya (16-18 oktyabrda) gəlmişdir. 23 oktyabrda onlar Tiflisdən 50 verst məsafədə yerləşən I Şah Abbasın düşərgəsində olmuşdur. 26 oktyabrda şah Abbasla söhbət etmiş və oradan Qızılağaca qədər gəlmişdir. Qızılağacda Tixonovun nümayəndəliyi ilə birləşib birlikdə dekabrın axırlarında Lənkərandan geriyə qayıtmışdır.

İvan Brexovun qeydlərində göstərilir ki, 26 dekabrda Şah Qızılağacdan Lyanqarana getdi. Onunla birlikdə dövlət nümayəndələrindən Mixaylovla birlikdə Lyanqarana gəlməyi tapşırdı. 27 dekabrda onlar şahın arxasınca Lyanqarana gəldilər. *(B.H.M.Talışlı, "Lənkəran", Bakı, 1990).*

Digər bir Rusiya hökumətinə mənsub olan Moskva dövlət zadəganı Mixail Nikitiç Tixonov 1613-1614-cü illərdə səfir kimi Aleksey Buxarovla birlikdə I Şah Abbasın yanına gedərkən, 1613-cü ilin 19 dekabrında Qızılağacda olaraq Şah Abbas tərəfindən səfirlikdə qəbul edilmişdir. Həmin günlərdə o, I Şah Abbasla Qızılağacdan Lənkərana gəlmişdir. *(B.H.M.Talışlı, "Lənkəran", Bakı, 1990, səh.27).*

Tarixdən məlumdur ki, I Şah Abbas Qızılağacda öz səfərətxanasını yerləşdirmişdir.

Buradan çox sadə şəkildə başa düşmək olur ki, I Şah Abbas Ərdəbildən birbaşa Qızılağaca gələrdi. Bu marşurut yaxın məsafə ilə həyata keçib. Yəqin ki, I Şah Abbas Ərdəbildən Burovor keçidi ilə gəlib Qızılağaca çıxıb, sonra Lənkərana gedib. Əgər əvvəl Lənkərana getdiyi qeyd olunsa idi, onda ehtimal etmək olardı ki, Astaradan Lənkərana, sonra Qızılağaca gəlib. O dövrdə at üstündə qısa məsafəni qət etmək həm at üçün, həm də sahibi üçün rahatlıq idi. Deməli, I Şah Abbas Qızılağacdakı düşərgəsinə gəlməmiş, başqa yerə getməzmiş.

Abbasi şahlarının tarixini yazan İsgəndər Bəy Münçi özünün "Tarixi-aləmarayi-Abbasi" adlı əsərində qeyd edib ki, I Şah Abbas (1587-1629) 1609-cu ildə "Şeyx Şəfiəddinin qəbrini ziyarət edib qayıtdıqdan sonra Qızılağacda ova çıxdı". O cümlədən, Həşim Kəlbiyev yazır: I Şah Abbas Gəncəyə səfər etdikdə də bu ərazidən keçmiş və mövcud məscidlərə ianə paylaması da tarixi yaddaşlarda qalmışdır. *(H.Kəlbiyev. həmin kitab, səh. 11)*

Digər bir mənbədə ASE-in ön cildliyinin 3-cü cildində 1614-cü ildə dekabrın 19-da Rusiya elçisi M.L.Tixonov I Şah Abbasla Qızılağacda görüşmüşdür. Qızılağac haqqında belə məlumatlar çoxluq təşkil edir. Mənim yazdıqlarım onlardan nümunələrdir. (ASE, III c. səh. 128). Qızılağacın əlverişli ərazidə yerləşməsi və özünəməxsus olan hövzəsi şahların burada qalması üçün maraqlı olub. Qızılağac haqqında IX-XIII əsr Ərəb səyyahlarının əsərlərində də məlumatlar vardır. Bu bir həqiqətdir ki, Qızılağac zəngin, qədim tarixə malik olan





yaşayış məskənidir. Bu qədimliyə aid olanlardan biri oradan keçən Səlyan, Göytəpə, Qızılağac və Astara yoludur.

Bəli, bu yol çox qədim tarixə malikdir: Bu yol Şərqlə Şimalı birləşdirən yeganə quru yolu olub. Həm də məsafə cəhətdən yaxın olub. O dövrlərdə İran ilə Bakı arasında əlaqə yaradıb. Həmin yola "poçt yolu" və bəzən də "ağ yol" deyərdilər. Əslində bu yol "İpək yolu" hesab edilir. İndi isə yaşlılar içərisində həmin yola "Poçt yolu" və ya "Ağ yol" da deyirlər. Bəzi tarixi mənbələrə görə bu yolu 1823-cü ildə tam rahat yol şəraitinə gətirib yetiriblər. Lakin başqa tarixi mənbələr isə bu tarixin çox qədimliyini göstərir. Həcc, ziyarət, ticarət məqsədi ilə şərqə gedənlər çox qədimdən bu yolla gediblər. Bu yolun Qızılağac şəhərinin tanınması üçün az xidməti olmayıb. Ona görə ki, Ptolomey, Heredot, Strobon kimi dahi şəxsiyyətlər Qızılığac şəhəri haqda öz əsərlərində xəbərlər veriblər. Keçmiş zamanlarda isə, Dövlət başçılarının o yerdə istirahət etməsi də həmin şəhərin və yolun qədim tarixindən xəbər verir.

Azərbaycanın coğrafi mövqeyi, o zamanlar dünya ticarət yolları mərkəzində yerləşməsi, onun iqtisadi inkişafında müəyyən rol oynamışdır. Akademik Məmməd Arif yazır: "Qədimdən kim Azərbaycan torpağından keçməmişdir, kim onun çaylarından, bulaqlarından su içməmişdir: parfiyalılar, romalılar, sasanilər, ərəblər, səlcuqlar, monqollar, türklər, iranlılar, o cümlədən Azərbaycanlılar özü" Əbu Abdullah Şeyxəli Baba Kuhi Bakuvi (933-1051) də bu torpağı qarış-qarış gəzənlərdən biri olub. Baba Kuhi birinci səyahəti zamanı Şamaxıdan Şərqin ən qədim mədəniyyət mərkəzlərindən biri olan Siraza gedir. Çox güman ki, o qədimdən məşhur olan Şamaxı-Cavad (indiki Sabirabad), Bərzənd - Təbriz yolunu seçmiş-

dir. Bu yol Cavaddan iki istiqamətə ayrılır. Birinci istiqaməti Kürün sol sahil boyunca Səlyana gəlir. Sonra Səlyan-Göytəpə-Qızılağac-Lənkəran və Astaradan keçib, Xəzər sahili boyunca Ənzəli, Rəşt və başqa şəhərlərə gedir. Çox güman ki, B.Kuhi bu yolu getmişdir.

Əfzəlləddin Xaqani Şirvani də (1120-1199) 1151-ci ildə Xorasana yola düşərək, həmin marşrutla Səlyan-Göytəpə-Qızılağac-Lənkəran, Astara və Ərdəbildən keçirdi. Bu yol yaxın olduğu üçün çox güman ki, Xaqani də bu yol ilə getmişdir.

Hacı Zeynalabdin Şirvani İraqdan İrana gəlir, onu cənubdan Şimala keçərək Gilan vilayətinin mərkəzi Rəşt şəhərinə gəlir, sonradan Talış dağlarını aşaraq 1796-cı ildə Lənkərana (o zaman Ləngərqunə adlanırdı) çatır. Şirvani Lənkəranda olarkən Sarı adası haqqında qiymətli məlumat vermişdir. Şirvani Muğan çölünə gedərkən Qızılağaca gəlir, bu yerlə tanış olandan sonra Muğana gedir. Qeyd etmək lazımdır ki, Azərbaycan əvvəllər coğrafi cəhətdən üç yerə bölünürdü. Kür çayından şimalda yerləşən ərazi Şirvan, Kürlə Araz arasında qalan sahə Aran (Arran), Arazdan cənubda olan vilayət Muğan adlanırdı.

Hacı Zeynalabdinin böyük xidmətlərin qiymətləndirmək hər bir yerin sakinlərinin borcudur. Tarixi keçmişi yaşatmaqda onun xidmətləri əvəzsizdir.

Dərbənd-Göytəpə-Qızılağac-Lənkəran-Astara-İran yolunun qədimliyini söylədim. Bu qədimliyə əsas Böyük səyyah Əbdürrəşid ər Bakuvinin (XIV əsrin ikinci yarısı və XV əsrin əvvəllərində yaşayıb) yazdıqlarıdır.








*Xəqanin səyahət xəritəsi*




*Nəsiminin səyahət xəritəsi*





Əbdür-Rəşid Ər Bakuvi Orta əsr Şərqinin tanınmış səyyahı, coğrafiyaşünası və astronomu olmuşdur. Bakuvi çox səyahət etmişdir. Bir çox ölkə və şəhərlərdə olmuşdur. Bakuvinin Qahirəyə belə səfər etməsini zənn edirlər. O vaxt Bakıdan Qahirəyə iki yolla getmək mümkün idi.

1-ci yol Bakı-Səlyan-Qızılağac-Lənkəran Astara-Ərdəbil Təbriz, Mionə, Zəncan, Həmədan, Bağdad, Qüds, Qahirə.

2-ci yol Şamaxı, Gəncə, Tiflis, Batum, Qara dəniz, Bosfor boğazı, Qahirə. Tədqiqatçılar 2-ci yolun yaxın olduğunu qeyd etsələr də, o yolun üzərində həmişə qanlı döyüşlər olduğu üçün Bakuvinin birinci yol ilə Qahirəyə getməsi fikrinin üstünlüyü göz qabağındadır. Bu tarixi yolun orta əsrlərə və ondan da daha qədim olmasına əsasdır.

İmadəddin Nəsiminin Səyahətlərə aid xəritəsinə baxdıqda gediş marşurutunun Göytəpə, Qızılağac, Astara, Ərdəbilə getdiyini də görmək olar. O dördə məhz yuxarıdakı adı çəkilən marşurutun yaxın olması buna əsas verir.

Xəritələri tərtib edənlər (Nurəddin Kərəmov) indiki dövrdə tanınan şəhərlərin adlarını qeyd edirlər. Əslində, indiki və keçmiş dövrdə də Qızılağacdan keçən yol öz varlığını qoruyub saxlamaqdadır. Ona görə də Lənkərandan qabaq Qızılağacın olduğunu yaddan çıxarmaq lazım deyil. İllər, yüz illər keçsə də belə bunu yeniləşdirmək olmaz. Çünki Antik dövrün qədim tarixini yazmaqla onu əbədiləşdirən yunan salnaməçisi Strabon iki min əvvəl Qızılağacın şəhər olduğunu öz dəsti-xətti ilə yazdığı qeydlərində təsdiq edir. Əgər tarixin atası Heredotun 2500 il bundan qabaq yazdıqlarına bələdçiliyimiz varsa, lakin ondan da qabaq tarixdə Qızılağacın şəhər kimi mövcud olması bir həqiqətdir. Çünki Heredot Qızılağac

şəhərini mövcud olan şəhər kimi görmüşdür. Şəhərin isə inşasına, eləcə də tərəqqisinə neçə illər vaxt lazımdır. Əgər Heredotdan qabaq tarix yazan olsaydı yəqin ki, Qızılağacın da haqqında yazacaqdı, tarixi qədimləşəcəkdi. Çünki Qızılağacın qədim tarixini öz daxilində qoruyan "Həzi təpəsi" vardır. Müxtəsər qeyd olunanlara istinad etməklə demək olar ki, Qızılağacın tarixi 2500 ildən çoxdur.

1846-cı ildə A.A.Bakıxanov da bu yol ilə İrana gedib. Yolun marşrutu Quba-Bakı-Səlyan-Qızılığac-Lənkəran-Astara-Ərdəbil olub. Mirzə Nəsrulla Bahar (1834-1883) XIX əsrin görkəmli şair və səyyahı olub. İlk səyahəti zamanı Şamaxıdan Məşhədə yola düşmüşdür. Onun üçün ən münasib yolu bu ardıcıllıqla qeyd edirlər.

Şamaxının Quşçu və Çaylı kəndlərindən, Böyük və Kiçik Hərəmi dağlarından keçib Hacıqabula, Səlyana, Qızılağac-Lənkəran-Astara-Ərdəbilə getmişdir.

1856-cı ildə Seyid Əzim Şirvani (1835-1888) də bu yol ilə Kərbəla və Nəcəf şəhərinə getmişdir.

Mirzə Ələkbər Sabir (1862-1911) Məşhəd ziyarətində olarkən şəhərdə vəba xəstəliyi başlayır və orada çox qalmayaraq bu yolla Tehran-Qəzvin-Rəşt-Ərdəbil-Astara-Lənkəran-Qızılağac-Səlyan-Şamaxıya qayıdır.

Abbas Səhhət (1874-1918) 1894-cü ildə Məşhədə 20 yaşında ikən bu yol ilə getmişdir. Hacıqabul-Səlyan-Qızılağac-Lənkəran-Astara-Ərdəbil marşrutu ilə hərəkət edib. Azərbaycanın qərb rayonlarına, İrana, Kərbəlaya, Həccə gedənlər, Ənzəlidən habelə Purman, Allahverdi, Cəbrail, Xarin, Barkin vətəkələrindən balıq və balıq məhsulları aparmağa gələnlər Bakıya taxıl, Yardımlıya, Lerikə, İrana Bakı nefti aparanlar





Qızılağacda qalmağı münasib bilirmişlər. Bu gediş dəniz vasitəsilə idi.

Abbasqulu Ağa Bakıxanov deyib:

***Ey Qüdsi, gözəldir öz məskənin,***
***Hər bir yerdən xoşdur sənin vətənin.***

Əziz oxucu xoşdur sənin kəndinin tarixindən söyləmək, elə isə "Poçt yolu" adlanan yola qayıdaq.

1927-ci ildə Göytəpə-Qızılağac-Lənkəran istiqamətindəki magistral yolun Qızılağac hissəsində təmir işləri aparıldı. Bu zaman hakimiyyətə qarşı çıxanlar yolun təmir edilməsini istəməyərək maneçilik törətdilər. Lakin həmin şəxslər tutularaq cəzalandırıldılar.

O vaxtlar Rusiya, hətta Bakı ilə gediş-gəliş yolu yalnız dəniz vasitəsi ilə mümkün idi. Gəmiylə Qızılağaca, 1922-cü ildən Port İliç limanına gəldikdən sonra fayton yolu ilə yalnız Qumbaşı, Boradigah, Ərkivan-Qala bazarı xətti ilə Masallı kəndlərinə getmək olardı.

Sovet hakimiyyəti illərində Masallı-Cil (Lənkəran kəndi) istiqamətində 2-ci asfalt yol çəkildi. Daha sonralar isə 1938-ci ildə Bakıdan cənub rayonlarına nisbətən qısa vaxtda çatmaq üçün hazırki Bakı-Astara magistral yolu çəkildi.

SSRİ hökuməti Cənub zonasının mühafizəsi üçün Qızılağac ərazisində hərbi təyyarələr üçün böyük sahədə tikinti apardı. 1949-cu ildə hərbi qarnizon poçt yolunun üstündə inşa edildi və o gündən yolun fəaliyyəti dayandı.

Qəsbkar XI Qızıl ordu da həmin yol ilə gedib. Onun keçdiyi yolda "Şkola" qabağında xatirə abidəsi qurulmuşdu.

Həmin abidə 1990-cı ildə sökülüb dağıdıldı.

## ŞAHLAR, SƏYYAHLAR, DÖVLƏT XADİMLƏRİ QIZILAĞACDA

Bir həqiqətdir dövlət başçısı bir şəhərə, kəndə gəlsə orda tərəqqi-inkişaf vardır. Qızılağac haqqında tarixi məxəzlərdə yazılanlar içərisində bu yerlərə çox hörmətli nüfuzlu şəxslərin gəlməsi barədə də çoxlu məlumatlar yazılı mənbələrdə öz əksini tapmışdır. İndi "gəlmək qonaqdan, yola salmaq ev yiyəsindən" xalq məsəlini əsas götürməklə biz də yazıların qonağı olaq. Görək bizi necə razı salır... Qızılağac öz təbiət lövhələri, mənzərəsi ilə yay və qış aylarında qonaq qarşılamağa ilk mövcud olduğu gündən başlayıb. Bu yerlərdən keçən insanlar burada dincəlib, buranın dəniz havasından udublar, bu yerdə bitən cürbə-cür nemətlərdən faydalanırlar.

Əvvəlki mövzulardan göründüyü kimi Qızılağac qədim yaşayış məskənidir. Bu yerin əlverişli iqlimi də ilin hər hansı vaxtında yaşayış üçün əhəmiyyətlidir.

Buradan keçənlər və dincəlmək üçün bura gələnlər bu yerin əlverişli, rahat olduğunu nəzərə alıb, bura biganə qalmayıblar. İstəyiblər ki, nə isə bir iş görsünlər. O cümlədən Hulaki Qazan Mahmud xan da bu əraziyə maraq göstərənlərdən olub.

Bütün bu əlverişli şəraiti nəzərə alan Qazan Mahmudxan 1295-1304-ci ildə öz şərəfinə Mahmudabad şəhərini inşa etdirdi. Mahmudabad şəhərinin haqqında müxtəlif rəvayətlər olduğu üçün onun dəqiq yeri məlum deyildir. Lakin məlum olmasa da Qızılağacla bağlı olduğu, Qızılağaca yaxın olduğu tarixi mənbələrdə təsdiqlənir. Əsgər Zahidov özünün "Muğan" adlı kitabında yazır: Bir sıra tarixçilər Azərbaycanın qə-





dim və orta əsr şəhərlərinin tarixi haqqında az da olsa məlumatlar vermişlər. Belə məlumatlardan biri də Mahmudabad şəhəri haqqındadır. Tarixi mənbələrdə göstərilir ki, Hulaki Qazan xan (1295-1304) Muğanda Xəzər dənizinin yaxınlığında Mahmudabad şəhərini tikdirmişdir. Bəs Mahmudabad Muğanın hansı yerindədir? Bu tərəddüdlər göstərir ki, şəhərin yeri haqqında bir sıra səhv və yanlış fikir yaranmışdır.

"Azərbaycan SSR-in coğrafiya atlasında" verilmiş "Azərbaycanın qədim və orta əsr maddi mədəniyyət abidələri" xəritəsində şəhər haqqında yanlış fikir öz əksini tapmışdır. Həmin Xəritədə Mahmudabad şəhəri Səlyan şəhərinin qərbində Kür çayı üstündə göstərilmişdir.

Tarix elmləri namizədi Əlisəfa Məmmədov "Xarabaşəhərdən səslər" adlı məqaləsində Azərbaycan tarixi muzeyinin salonlarından birində asılan divar xəritəsinə (bu xəritədə Mahmudabad şəhəri Kür çayının mənsəbinin şimalında göstərilir) və "Zəfərnamə" əsərinə əsaslanaraq, Cənub-şərqi Şirvan düzündə, Kür çayı mənsəbi yaxınlığında keçmiş Nordost-Qoltuq kəndi ilə Bəndovan burnu arasında göstərir. Akademik Z.Bünyadov "Azərbaycan Atabəylər dövləti" (1136-1225-ci illər) əsərində göstərir ki, Kür ilə Araz çayları arasında Kuştasif vilayəti, ondan aşağı Muğan vilayəti yerləşmişdi." *(Ə.Zahidov, Muğan, Bakı, 1999, səh.50-52).*

Mənim bu mövzuya müraciət etməkdə məqsədim odur ki, bu unudulmuş şəhər haqqında tədqiqatımda əldə etdiklərimi işıqlandırım bəlkə də gələcəkdə bu şəhər özünü maddi mədəniyyət abidələri ilə məlum edəcək. Küştasif haqqında Həmdulla Qəzvini yazır: Küştasif vilayəti dərya kənarındadar. Həmən şəhəri Küştasif Keyhanı tikdirib.Kür və Arazdan su ora

iki arx vasitəsilə tökülür. Orada çoxlu balıq və ipək istehsal olunur. Ə.Zahidov yenə həmin kitabda yazır: "professor C.İbrahimovun "Azərbaycanın XV əsr tarixinə dair oçerklər" kitabında göstərilir ki, Kürd tayfası içərisindən çıxmış Şərifxan Bidlisi adlı bir tarixçi Muğanın Mahmudabad, Səlyan mahallarında, Şirvan və Naxçıvanda Səfəvilərin canişini sifəti ilə işləmiş və o, Azərbaycanın ayrı-ayrı mahallarının iqtisadi, ticarət, vergi və s. haqqında iki cildlik "Şərəfnamə" əsərində göstərir ki, Mahmudabad və Səlyan mahalları (əlbəttə ki, ayrılıqda) olmuşdur. *(Ə.Zahidov, Muğan, Bakı, 1999, səh.52)*

Bütün bunlarla bağlı olan tarixi məlumatları mən də axtarıb aramağa başladım. Həmdulla Qəzvini "Nüzhətəl əlqülub" ("Qəlblərin əyləncəsi") əsərində göstərir ki, "Mahmudabad dərya kənarında Qazan xan tərəfindən tikdirilib". Eyniliyə bu məlumat Azərbaycan tarixi üç cilidliyin 1-ci cilidində yazılır: "Qazan xan Muğanda yeni şəhər salmağa başlamışdı. Bu Kaspi dənizi sahili yaxınlığında olan Mahmudabad şəhəri idi". Lakin nə Təbrizin inkişafı, nə də Mahmudabadın tikilməsi Azərbaycan şəhərlərinin ümumi ağır vəziyyətini dəyişdirmədi. Şəhərlərin bir qismi monqolların vurduqları dəhşətli ziyanlar nəticəsində uzun müddət dirçələ bilmədi, digər qismi isə yox olub getdi". *(Azərbaycan tarixi. 3 cildli, I cild, Bakı, 1961, səh. 207).*

Mahmudabad haqqında çoxlu sayda tarixi qaynaqlar olmasına baxmayaraq yenə də onun yeri dəqiq şəkildə qeyd olunmur. "M.İ.Şəmsi "Şərəf xan Bidlislinin Şərəfnamə əsəri kürd xalqının tarixi mənbəyi kimi" əsərinin 18-ci səhifəsində yazır ki, şah Şərəf xanı Səlyan Mahmudabad və Muğana əmr təyin edir. Deməli, Küştasif və Mahmudabad ayrı-ayrı yer ad-





larıdır ki, bunlar bir-birinin qonşusu ola bilər, amma bir yerdə ola bilməz". *(Bax: Ə.Zahidov, Muğan, Bakı, 1999, səh.52).*

İki şəhərin eyni ərazidə, kiçik sahədə yanbayan olmağı mümkün ola bilməz. Buna görə də Mahmudabadı başqa yerdə axtarmaq lazımdır... Bu məqsədlə çoxlu kitablara müraciət etdim. Həşim Kəlbiyev "Şilavar (Sievo) haqqında tarixi etnoqrafik oçerklər" kitabında yazır:" ... Bununla yanaşı Şilavar kəndi ərazisindəki keçmiş eyvanlı məscidin Astara, Ərçivan, Şıxəkaran, Xolmili, Lənkərandakı "Böyük bazar", Girdəni, Verəvül kəndlərindəki eyvanlı məscidlər eyniylə bu məscidin də ən azı XIV-XV əsrlərdə tikilməsini söyləməyə imkan verir.

Çünki həmin tarixi dövrdə Talış diyarını da addım-addım gəzən, islamı qəbul edib, məscidlər tikdirən Qazan Mahmudxan (1294-1304) karvan yolu üstündə olan bu kəndlərdən keçib, indiki Qızılağac ərazisində "Mahmudabad şəhərini tikdirmişdir". (H.Kəlbiyev. Şilovar (Silyo) haqqında tarixi etnoqrafik oçerklər. Bakı, 2003, səh 11). H.Kəlbiyev sözünü davam edərək yazır:"Səfəvilər dövründə həmin bu yol (Səlyan-Göytəpə, Qızılağac-İran: N.Q.) ilə Şah İsmayıl Şirvan səfərinə çıxmış və səfər zamanı Şeyx Zahid məqbərəsini təmir etdirmişdir. I Şah Abbas Gəncəyə səfər etdikdə də bu ərazidən keçmiş və mövcud məscidlərə ianə paylaması da tarixi yaddaşlarda qalmışdır. *(Haşım Kəlbiyev. "Şilavar (Şilvo) haqqında tarixi -etnoqrafik oçerklər", səh.11).* Göründüyü kimi Qızılağacın özünə məxsus tarixi keçmişi var. Burada da Mahmudabadın Qızılağac ərazisində olması təsdiqlənir. Azərbaycan Sovet Ensiklopediyasında oxuyuruq: "Tədqiqatçıların bir qisminin fikrincə Mahmudabad indiki Masallı rayo-

nunun ərazisində idi". (ASE, VI c. səh.395).

Bu faktın da müəyyən dərəcədə dəqiqliyi vardır. Çünki tarixçi Mir Yəhya Qəzvinin "Lübbət-təvarix" ("Tarixlərin özəyi") əlyazmasının (1341-ci il) 775 səhifəsinə, eyni zamanda İ.P.Petruşevskinin "XV əsrdə Azərbaycan dövlətləri" əsərlərinə əsaslanaraq professor Cəfər İbrahimov adını çəkdiyimiz əsərinin 76-cı səhifəsində yazır ki, 1468-ci ilin qış ayında Sultan Əbu Səid ordusunu Muğan-Mahmudabad - Qızılağac arasında yerləşdirir. Sultan Əbu Səidə Qızılağac bərgahına (Limana) ərzaq, yem və hərbi sursat göndərəcəkdir. Əvvəlki bölmələrdə Sara Aşurbəylinin yazdıqları ilə həmahəng olan bu faktlar özlüyündə Qızılağacla bağlı olmağı məncə düzgün və əsaslıdır.

İndi isə Qızılağacdan keçən karvan yoluna qayıdaq. Bu yol İran, Astara, Lənkəran, Qızılağac, Göytəpə, Səlyan, Bakı yoludur. Eyvanlı məsciddən biri də karvan yolu üstündə olan Qızılağac kəndindəki məsciddir. Bu məscidin də arxitektura oxşarlığı və qurluşu həmin məscidlərlə eynidir. Məscidin inşa edilməsi o tarixə aid ola bilər. Çünki buna yazılanlar əsas verir (N.Q). Qazan Mahmud xanın şərəfinə inşa edilmiş bir şəhərin harda olmağı hələ ki, məlum deyildir. Mahmudavar orta məktəbinin tarix müəllimi Ə.Əhmədov yazır: "Öyrəndik ki, kəndimizin adı qala sahibi Qazan xan Mahmudun adı ilə bağlıdır. Qala tikiləndən sonra xanın əmri ilə buraya ayrı-ayrı yerlərdən adamlar köçürülmüşdür. Onlar qalanın ətrafında yerləşdirildilər. Sonra da buraya köçürülənlərə Mahmud -avərd (avərd - farsca gətirmək mənasındadır) adı verilmiş, bu yer sonralar Mahmudavar adlanmışdır". *(Ə.Əhmədov. "Tarix, ictiamiyət, coğrafiya tədrisi" məcmuəsi. 1965, səh. 64)*





Mahmudabadın Mahmudavar yerində olması göstərilən əlamətlərlə uyğun gəlmədiyi üçün onu deməyi lazım bilirəm ki, indiki Mahmudavarı heç vaxt Xəzərin ləpələri döyə bilməzdi. Ona görə ki, Qazan Mahmud xan o şəhəri tikdirəndə Lənkərandan Mahmudavara qədər yerlərdə yaşayış məntəqələri mövcud idi. Bunu biz göstərilən xəritələrdən və tarixi məxəzdən bilirik. Mahmudabadı ancaq Xəzərin ləpələri Qızılağac ərazisində döyə bilərdi. İkinci isə Mahmudavar heç bir karvan yolunun üstündə olmayıb. Əgər yol karvanın istifadəsi üçündürsə bu zaman onun rahatlığı başlıca şərt bir növ möhkəm olmağındadır. Bizə də məlumdur ki, Şərqə gedən bütün karvanlar və ziyarətə, ticarətə gedənlər, Səlyan, Göytəpə, Qızılağac, Astara yolunun rahatlığını qoyub qeyri yolla gedə bilməzdilər. Səlyan Astara yolu qısa məsafəli olduğu üçün, karvan başqa yolla gedə bilməzdi. Onu da deyin ki, o dövrdə Mahmudavara gedən gərək hökmən Qızılağaca gəlib ordan keçməli idi. Mahmudabad tarixi mənbələrdə mövcud olmayan şəhərlər sırasındadır. Əgər onun qalıqları qalmış olsaydı, belə təqdirdə o tarixin səhifəsindən silinməzdi. Necə ki, başqa şəhərlər silinmədi. Səfəvilər dövründə həmin bu yol ilə Şah İsmayıl Şirvana, I şah Abbas Gəncəyə getmişdir.

Mahmudabad haqqında Həmdulla Qəzvini yazır: Mahmudabad kəndi isə dərya kənarında Qazanxan tərəfindən salınıb." Mahmudavar dərya kənarında yox, yüksək dağlıq ərazidə yerləşir.

Əldə olunan tarixi materiallarda burada çoxlu görkəmli şəxsiyyətlərin olması haqda məlumatlar Qızılağac ərazisinin özünəməxsus səfalı və əlverişli məkan olmağından xəbər

verir. O məlumatların birini öz kitabında xəbər verən Əbu Bəkir Tehranidir. Əbu Bəkir Tehrani özünün "Kitabi Diraibəkriyyə" əsərində Ağqoyunlu dövlətinin də qurucusu olan iki görkəmli tarixi şəxsiyyətin - Qara Yülük Osmanın (1403-1435) və Uzun Həsənin (1457-1478) siyasi və hərbi fəaliyyətini dolğun şəkildə əks etdirir. *(R.Şükürova "Kitabi diyaribəkriyyə"yə rəy)*. Əbu Bəkir Tehrani yazır: Qara qoyunlu hökmdarı Cahan Şah qışı Qızılağacda keçirtdi.

1448-ci ildə Qızılağaca gələn Cahan Şah yəqin ki, bu yerin şahlara layiq bir əlverişliliyini nəzərə aldığı üçün Qızılağacda qışı keçirdib. Əbu Bəkir Tehrani öz kitabında bir neçə dəfə Qızılağacın adını çəkir.

Kitabda Əbu Bəkr Tehrani yazır: "Qışı Sürməlidə keçirən İsgəndər Mirza Təbrizə doğru hərəkət etdi və şəhəri öz əlinə aldı. Qardaşı ilə çoxdan həlledici mübarizəyə hazırlaşan Cahanşah həmin qışı keçirdiyi Qızılağacdan Ərdəbilə getdi və oradan Sərab yolu ilə Təbrizə tərəf irəlilədi". *(Kitabi Diyarbəkriyyə. Bakı, 1998, səh.25)*.

Bu yazıdan görürük ki, Qızılağac ərazisində qışı keçirmək üçün nə qədər əlverişli şərait olub. Əgər rahatlıq üçün şərait olmasaydı Cahan şah orada istirahəti özünə rəva bilməzdi.

Həmin kitabın digər yerində, Azərbaycan ərazisini əlində saxlayan Cahanşah Mirzə Qızılağacda qışladı. *(Kitabi Diyarbəkriyyə. Bakı, 1998, səh. 86)* kimi xəbərlər tarixi baxımından Qızılağacın qədimliyindən, özünəməxsus fərqli əlamətlərindən xəbər verir.

"... Bu baharda İsgəndər paytaxtı olan Cahanşah Mirza da Qızılağac qışlağından Ərdəbilə gəldi". *(Kitabi Diyarbəkriyyə. Bakı, 1998, səh. 90)*.





"... (Əbu Səid) Rüstəmi (əsir) tutub hərəkət etdi və sürətlə Mehri çayından keçərək, Qızılağaca getdi". *(Kitabi Diyarbəkriyyə. Bakı, 1998, səh.257)*

Göründüyü kimi Qızılağac nə qədər strateji əhəmiyyətli yer olub, bu inkar edilməzdir.

Əbu Bəkir Tehrani "Kitabi Diyarbəkriyyə"də Sultan Əbu Səidlə Uzun Həsən arasındakı müharibədən də xəbər verir. Sultan Əbu Səidin Uzun Həsənlə müharibə apardığı yerin Qızılağaca yaxın olan ərazidə olduğunu qeyd edir. O cümlədən Sultan Əbu Səidin haqqında yazır: "Sultan Əbu Səid Mirzanın anasına hörmət göstərib icazə verdi ki, Sultanın meyidini hara istəyirsə, aparıb (dəfn etsin) və bundan ötrü ona lazımi vəsait və ulaqlar verdi. Xatun oğlunun cəsədini yükləyib Qızılağacdan çıxdı. Talışlar gəlib onu qarət etdilər belə ki meyidi çöllükdə atıb qaçdı. (Bunu eşidən) sahibqran əmr etdi ki, Əmir Əbdül Kərim Sədri zəncirdən azad etsinlər və o, Sultanın meyidini Xorasana çatdırsın". *(Əbu Bəkr Tehrani. Kitabi Diyarbəkriyyə. Bakı, 1998. səh. 263)*.

Buradan göründüyü kimi Uzun Həsənlə döyüş Qızılağaca aid olan ərazidə aparılıb. Necə ki, yuxarıda deyildiyi kimi Qızılağacdan çıxdı. "Talışlar gəlib onu qarət etdilər". Talışlar da Qızılağacla həmsərhəddir. Bütün bu və digər faktlar göstərir ki, Qızılağac Liman şəhəri olduğu üçün hadisələr orada cərəyan edir. Həmin kitabın digər yerində müəllif yazır: "Ərdəbil Qızılağac və Muğan bütün cağurlu tayfalar və qəbilələri ilə birlikdə əmir Əli bəyin irsi torpaqları idi. Cahanşah məğlub olan zaman Sahibqran onu öldürməyib aman vermiş" *(Ə.Tehrani. Kitabi diyaribəkriyyə. Bakı, 1998, səh. 278)* yenə də bu fakt Qızılağacın Ərdəbilə və Muğana gediş gəliş

üçün yaxın ərazi olduğunu göstərir. Ərdəbildən gəlib Qızılağaca, oradan keçib gedərmişlər Muğana. Burada əsas şərt yolun rahatlığıdır. Bu marşrut da Sultan Əbu Səidlə Uzun Həsənin arasında gedən döyüş yerini təsdiqləyir. Necə ki, əvvəlki mövzularda söyləmişik. Digər kitablarda da Qızılağacla bağlı hadisələr çərçivəsində bu əraziyə gələnlərin (hökumət başçılarının) adı açıqlanır. Məs. Uzun Həsən, Fərrux Yassar, Sultan Əbu Səid, Şah İsmayıl, Şah Abbas, Şah Cahan və başqaları. Şah İsmayıl şəxsiyyəti həmişə tarixdə Azərbaycan dilini dövlət dili səviyyəsinə qaldıran hökmdar kimi tanınır. Bunun təsdiqi üçün çoxlu sayda tarixi məlumatlar vardır.

Şah İsmayıl 1499-cu ildə 12 yaşında Astara mahalının Ərçivan kəndində qışı keçirir... 1500-cü ildə İsmayıl Lənkərana gəlir, oradan Muğana gedir. Həmin illərdə Astara-Səlyan yolu daha əlverişli olduğu üçün yəqin ki, Şah İsmayıl Qızılağaca biganə qala bilməzdi. Çünki ondan qabaq bu yerdə Şah Cahan qışı keçirmişdi. 1501-ci ildə aranda - Mahmudabadda keçirən Şahzadə İsmayıl Bakıya gəlir.

Səfəvi dövlətində XVI əsrin sonunda I Təhmasibin ölümündən sonra saray çəkişmələri oldu. (XVI əsrin II yarısı) oğlu Məhəmməd Mirzə (Xudavəndə) taxta çıxdı. Məhəmməd Xudavəndə Salman xanın tatarlar tərəfindən darmadağın edilməsi xəbərini eşitdikdə qışlamaq üçün dayandığı Qızılağacdan bir qrup əmrləri qoşunla təcili Molla Həsənli qəsəbəsinə göndərdi. Göründüyü kimi Qızılağac Cənub zonasında ən strateji əhəmiyyətli yer olub.

Y.Mahmudov yazır: 1507-ci illərdə naməlum İtalyan taciri də Azərbaycanda olmuş, onun Azərbaycanda olması Şah İsmayılın hakimiyyəti illərinə təsadüf edir. O, Şah İsmayılın Şi-





mali Azərbaycana hərbi yürüşü, iqtisadi, eyni zamanda bu ölkənin tarixi, mədəni inkişafı barəsində də bəzi məlumatlar verir. Məsələn, Qarabağda ipək istehsal olunmasından, Dərbənd qalasının möhtəşəmliyindən, Mahmudabadın Xəzər sahilində mühüm liman olmasından və başqa məsələlərdən danışılır. *(Y.Mahmudov. Səyyahlar Azərbaycana gəlir. Bakı, 1977. səh.118)*

Göründüyü kimi Mahmudabad Xəzər sahilində liman şəhəri olmaqla həm də öz gözəlliyi ilə, möhtəşəmliyi ilə seçilən şəhər olub. Bunu Cəfər Qiyasinin "Yaxın Uzaq ellərdə" kitabının "Azərbaycanda XI-XVII əsrlərin memarlıq silueti" bölməsində görmək olar: "XIII-XIV əsrlərdə tikinti sənəti inkişaf etmiş, memarlıq da hiss olunan üslub irəliləyişi olmuşdur. Yeni şəhərlər Mahmudabad, Sultanabad şəhərləri salınır."

Buradan görünür ki, orta əsrlərdə mövcud olan şəhərlərin tarixi müxtəlif cür söylənilir. Lakin Qızılağac olduğu kimi öz adını saxlayıb. Bu da onun qədimliyi üçün əsasdır.

XVII-XVIII əsrlərdə burada (yəni Qızılağacda) bir qala olmuş (qalanın torpaq altında 1,0-1,5 metr dərinliyində izləri qalır). Onun içərisində yarpaqları qızılı rənginə çalan böyük Hirkan Qızıl ağacı vardır. Şah Abbas burada Səfarətxanasını yerləşdirmişdir. Şahlar və dövlət nümayəndələri Lənkərana gələndə Şah Abbas həmin ağacın altında nümayəndələri qəbul edirmiş *(1613-cü ilin 19 fevralında I Şah Abbasın burada Rus dövlət zadəganı Mixail Tixonovu qəbul etməsi haqqında yazılı materiallar da vardır).*

Qızılağac ərazisində qala divarları indiki zamanda da qazıntı işləri apararkən aşkar olur. Bunu Qızılağac ərazisində qazıntı işləri aparan "ekskvator" sürücüsü Beytulla Əyyub

oğlu belə şərh edir: "Mən 30 ildən yuxarı Qızılağac ərazisində qazma işləri aparmışam. Qazıntı zamanı 1 metr və ondan da dərin torpaq qatında 20x20-yə, qalınlığı isə 0,5 sm. olan qırmızı kərpicdən hörülmüş eni 1 metrdən çox olan qala divarlarına rast gəlmişəm. O kərpiclərdən qazıntı zamanı kənd camaatı aparıb evlərində istifadə edirdilər."

Bu izlərin kəndin dörd tərəfində mövcud olmağı bir həqiqətdir. Çünki o qalanın divarları yenə də mövcutdur.

Azərbaycanın XVI əsr "qüzül dövrü" haqqında məlumat verən tarix elmlər doktoru Oqtay Əfəndiyev Şah İsmayıl Xətainin yaratdığı dövlətin xəritəsində talış vilayətinə daxil olan şəhərlərin içərisində Qızılağac şəhərinin adının göstərildiyi bildirilir. Göründüyü kimi Qızılağac 600 il əvvəl də şəhər adı ilə səslənirdi. Digər bir mənbədə isə Azərbaycan bəylərbəylik şəklində birləşdirilmiş, Zəncan, Ərdəbil, Xal-xal, Qaracavad, Taliş, Qızılağac, Lənkəran, Qızılüzən və Kür çayları arasında yerləşən geniş ərazini əhatə edirdi.

Bu yerlərin qədimliyindən xəbər verən başqa bir mənbə də Az. AEA Tarix İnstitutunun baş elmi işçisi Fəridə Məmmədovanın bizim eradan əvvəl IV əsrdən formalaşmağa başlayan Qafqaz Albanları haqqında verdiyi çox dəyərli məlumatdır.

F.Məmmədova bizim eradan əvvəl III əsrdə Albaniya haqqında verdiyi xəritədə bu ərazidə Qızılağac körfəzini göstərmiş və Viləş çayın Qızılağac körfəzinə töküldüyünü əks etdirmişdir. Deməli, həmin tarixdə yəni bizim eradan əvvəl Qızılağac adlı yaşayış sahəsinin olması bir həqiqətdir. Qızılağac keçdiyi tarixi proseslərə məruz qalsa da belə, adı qorunub saxlanılmışdır.





## QIZILAĞAC QORUĞU

Dünyada tanınan əsrarəngiz təbiət lövhəsidir, guşəsidir, salnaməsidir. Qızılağac qoruğu Lənkəran-Bakı dəmiryolu və şosse yolunun sağında Sarı yarımadasının sonunda yerləşən körfəzlə başlanır. Bu yerlərdə quşların məskən salmasının tarixi qədimdir. Lakin bundan qoruq kimi istifadə edilməsi təbiətsevərləri əsasən XX əsrin əvvəllərindən maraqlandırmışdır.

1913-cü ildə bir qrup rus aliminin təşəbbüsü ilə burada qoruq təşkil etmək nəzərdə tutulmuşdur. Lakin I dünya müharibəsinin başlanması işi ləngitmiş və təxirə salmışdır.

1926-cı ildə su quşlarının qışlamasını mühafizə etmək məqsədi ilə addım atıldı. Azərbaycan SSR Xalq Torpaq Komissarlığının göstərişi ilə burada hər cür quş ovlamaq qadağan edildi. Ovçuluq üçün sifariş yerinə çevrildi. 1929-cü il 3 iyunda SSRİ Xalq Komissarları Sovetinin qərarı ilə Dövlət qoruğu elan edildi. Bundan sonra qoruqda, nəinki ovçuluq, hətta təsərrüfat işlərinin bütün növlərini aparmaq qadağan olundu. Qızılağac qoruğu 38 dərəcə 58 dəqiqə və 39 dərəcə 20 dəqiqə şimal en dairəsi arasında yerləşməklə sahəsi hazırda 88,36 min hektardır. Okean səviyyəsindən 24-28 metr aşağıdır.

Qızılağac qoruğu böyük körfəzin bütün hissəsinin, kiçik Qızılağac körfəzinin Şimal və Şimal Qərb ovalığını təşkil edir. Qızılağac qoruğu necə yaranmışdır? Bir az əvvələ qayıdaq. Böyük Qızılağac körfəzi iki əsr bundan əvvələ qədər genişlənmiş dərin sulu körfəz olmuşdur. Bu körfəz Lənkəranla Muğan düzənliyini bir-birindən ayırmışdır.




*Qızılağac qoruğunun xəritəsi*





Çünkü o dövrdə körfəzə suyu çox olan çaylar axırmış. Belə çaylardan Viləş, Aquşə, Qumbaşı çaylarının axıtdığı sular körfəzin suyunu şirinləşdirir, balıqların və quşların yaşaması üçün gözəl şərait yaradırmış. Çayların gətirdiyi lil və meşə qırıntıları körfəzin dənizlə qoşulan yerində bir neçə ada əmələ gətirmişdir. Böyük və kiçik Külakin (Alı bulağı), Solonets, Baklan, İtdişi və Sarı adası. Bu adalar yarandıqca eyni zamanda onaların çıxıntıları olan dillər də əmələ gəlməyə başlamışdır.

Kürdili, Xaçdili, Lebyaji, Qaban dili, İvanov və Lopatin dilləri bu dövrlərdə meydana çıxmışdır. İllər keçdikcə Xəzərin suyunun azalması, səviyyənin enməsi ilə belə kiçik adalar, dillər birləşərək böyük saheli Sarı adasının yaranmasına səbəb olmuşdur. Sarı adası da bir hissədən vaxtaşırı quruya yaxınlaşmış, nəhayət 1939-cu ildə quru ilə birləşərək yarımadaya çevrilmişdir. Yarım ada Qızılağac körfəzini dənizdən ayıraraq qapalı hövzə-Böyük və Kiçik Qızılağac körfəzini əmələ gətirmişdir. Böyük Qızılağac körfəzi Kürdili vasitəsilə dənizdən ayrılaraq: 40,5 min hektar sahəni əhatə etmişdir. Körfəzin ən dərin yeri 2,5 metrdir. Onun qərbində Sarı yarımadası vasitəsilə ayrılan kiçik Qızılağac körfəzi yerləşir ki, sahəsi 15 min hektardır. 1956-cı ildə Sarı yarımadası cənub tərəfdən damba (süni bənd) vasitəsilə Port-İliç torpağı ilə birləşdirilmiş, nəticədə kiçik körfəz Xəzər dənizindən ayrılmış, buraya axan Qumbaşı və Viləş çaylarının suyunun təsirindən şirinləşmişdir. İndi kiçik körfəzin uzunluğu 16,7 km eni 6,7 km, dərinliyi 0,5-2,5 metrdir. Kiçik körfəz böyük körfəzlə üç süni kanalla birləşdirilir. Bunlar: Balıq keçirici, qəza və ötürücü kanallardır. Balıq keçirici və ötürücü kanalın vəzifəsi kiçik

körfəzə balığı ötürmək, qəza kanalı isə suyu müəyyən səviyyədə saxlamaqdır. Ötürücü kanallar qoruğun içərisində yerləşir. Balıq keçiricinin vəzifəsi balıqları kürü tökməkdən ötrü körfəzə ötürmək, bundan sonra onları və yetkin körpələri körfəzdən dənizə ötürməyə xidmət etməkdir.

Kiçik körfəzin şimalında, qoruğun qərb hissəsində Kalinovka limanı yerləşir. Ondan bir az yuxarıda Lopatin, Ərmənçay (iti gur axan çaya deyilir) və Ağquş axarları vardır. Onların ümumi sahəsi 10090 hektardır. Buraya Sələdçi, Ağquş və Viləş çaylarının qolu axır.

Qoruğun su tutumlarından başqa ətrafında quru hissəsi də vardır. Onun eni 3-4 km, uzunluğu isə 30 km-dir. Relyefi əsasən düzənlikdir. Bəzi az sulu yerləri vardır.

Qızılağac qoruğunun iqlimi aşağıdakı kimidir: orta illik temperatur +13⁰-14⁰S-dir. Yay aylarında, xüsusən iyul-avqustda yüksək temperatur +43⁰S-dir. Soyuq aylarda, yanvarda temperatur - 2,4-3,7⁰S-dir.

Bəzi illərdə körfəzdə mənfi 4-5⁰S soyuqlar bir-iki ay çəkir. Belə vaxtda körfəzin suyunun tamamilə və ya bir hissəsinin donması müşahidə olunur. Hətta bütün sahə buzla örtülür. Bu da quşların qışlamasını pisləşdirir, onları tələf edir. Məsələn 1924-25, 1934-35, 1968-69, 1971-72, 1972 və 1975-76-cı illərdəki sərt soyuqları buna misal göstərmək olar. Belə hallarda quşlar öz yerlərini dəyişirlər. 1970-ci ildən sonra quşların bəziləri Qızılağac qoruğundan köçmüş Qara dəniz, Dunay çayı sahillərində özlərinə məskən salmışlar.

Körfəzin florası da maraq doğurmaya bilməz. Rəngbərəng fiziki-coğrafi quruluşa, iqlimə malik. Qızılağac qoruğunda yarımsəhra, kol, çəmənlik, su-bataqlıq bitkilərinə təsadüf edilir.





Buranın florasında 310 növə, 189 cinsə malik 51 bitki ailəsi yaşayır. Qoruğun faunasına gəldikdə məməlilərin 23 növü, 273 növə qədər quş, 12 növ sürünən, 47 növ balıq yaşayır. Qoruqda 270-ə qədər quş növü var. Qızılağac qoruğunda 7 dəstəni əhatə edən 27 növ məməli heyvan yaşayır. Bunlardan ağ diş yereşəni (belazubka) və Zaqafqaziya kirpiləri səciyyəvidir.

Daşlıq dələsində qunduz ailəsindən olan porsuq, çay samuru və gəlincik də görmək olar.

Sürünənlərdən 12 növə təsadüf edilir. Bunlardan iki növ tısbağa (bataqlıq və Xəzər tısbağası) üç növ kərtənkələ, koramal, zolaqlı kərtənkələ biçimli ilanbaş kərtənkələciyə, yeddi növ ilana təsadüf edilir. Kor ilan, kələz ilan, gürzə, su ilanları və s. vardır.

Qızılağac qoruğu balıq faunasına görə hələ keçmişdən böyük ad qazanmışdır. Böyük Qızılağac körfəzində 41, kiçikdə 31 növ balıq yaşayır. Tarixi məlumatlara görə 1911-15-ci illərdə hər il onun sahilə yaxın yerlərindən 120 min sentnerə qədər balıq tutulurmuş. 1953-56-cı illərin məlumatında isə hər il orta hesabla 25 min sentner balıq ovlamışdılar. Tədqiqatlar müəyyən etmişdir ki, Qızılağac körfəzində əsasən külmə, çəki, çopa, durna balığı, qırmızı qanad, xəşəm, şamayi, naqqa, tikanlı balıq, okun, sıf və başqa balıqlar vardır.

Burada Cənub Xəzər balıq idarəsinin balıq yetişdirmə məntəqələri fəaliyyət göstərir. Hər il buraya 250-300 milyon fərd körpə balıq, xüsusən 50 milyon ziyad körpəsi buraxılır.

Əcdadlarının instinktlərinə sadiq qalan quşların bəziləri yenə də, Qızılağaca pənah gətirir. Burada hər il 270 növ müxtəlif növ quşlar yuva düzəldərək nəsil artımı qayğısına qalır.

Belə quşlardan sarı vağı, böyük baklanları, Misir vağını, turacı, qırmızı burun dalğıc ördəyini, Qara dəniz ördəyini, ispan sərçəsini göstərmək olar. Burada ölkəmizin və respublikamızın Qırmızı kitabına salınmış 20 növ quşa rast gəlirik: Qu quşu, qırmızı qaz, mərmər cürə, göydimdik, dövdaq, bəzgək, durna, sultan toyuğu, qızıl qaz, hər növ vağ və qara hacıleylək, qütan, turac, talış qırqovulu, boz kəklik, ərsindimdik qaranoz və başqaları.

Adi dovşanlara da rast gəlinir. Doqquz növ gəmiriciyə təsadüf edilir. Kiçik ərəbdovşanı, qara siçovul, adi meşə siçanı, çöl su siçanı, boz siçovul nisbətən çoxdur. Qoruğun ən böyük gəmiricisi bataqlıq qunduzu və nutriyadır. Hələ 1931-32-ci llərdə qoruğun kiçik körfəzinə artıb törəmək məqsədilə Nutriya buraxmışdılar. 1935-ci ildə qışın sərt keçməsiylə onların böyük sürüsü məhv olmuşdur. 1959-cu ildə 396 ədəd nutriya buraxılmış, onlar sürətlə artmışdır. 1969-70, 1971-72 və 1975-76-cı illərdə sərt soyuqlarda bunların bir çoxu qırılmışdır. Qalanları yenidən çoxalmışdır. Pəncə ayaqlardan burada az miqdarda Xəzər su itisi yaşayır. Dırnaqlılardan qoruqda təkcə qabana təsadüf edilir. Sayı təxminən minə qədərdir. Qızılağac qoruğunu tədqiq edənlər göstərir ki, 1924-25-ci illərdə baş verən şiddətli soyuqlarda körfəzin səthi buz təbəqəsi ilə örtülmüş vəhşi heyvanlar buraya ayaq açmışlar. Sarı adasına gedib özlərinə etibarlı yerlər seçib çoxalmışlar. Maraqlıdır, belə yırtıcılardan 1977-ci ildə çəkisi 36,5 kq olan erkək canavar öldürmüşdülər. İndi də buralarda bala canavara və iri fərdlərə təsadüf edilir. Çaqqal, tülkü, qamışlıq pişiyi çox olur.

SSRİ Nazirlər Sovetinin 27 dekabr 1975-ci il tarixli qərarına əsasən qoruğun ərazisi Xəzər körfəzi su bataqlıqı beynəl-





xalq qoruq elan edilmişdir. Qoruğun mövcud olduğu illər ərzində buradakı heyvanat və bitki aləmi həm qorunur, həm də onlar üzərində elmi-tədqiqat işləri aparılır. Son illər kiçik Qızılağac körfəzinin sularında lilləşmə prosesi güclənmişdir. Körfəzin sahəsinin 50 faizini qamışlıq basmışdır. Bunun nəticəsində su mənbəyi xeyli azalmışdır. Azərb. SSR Dövlət Plan və Respublika Dövlət Təbiəti Mühafizə Komitəsi hələ 1993-cü ilin aprel ayında Qızılağac Dövlət qoruğunun təbiəti mühafizə fəaliyyətinin yaxşılaşdırılması tədbirləri barədə qərar layihəsi hazırlamışdılar.

Qərar layihəsində Kiçik Qızılağac körfəzinin Qızılağac dövlət qoruğunun tərkibinə daxil edilməsi və qoruğun bütün quru sərhədləri ətrafında bir km enində mühafizə zonasının yaradılması nəzərdə tutulmuşdur. Həmçinin qoruq ərazisində bütün təsərrüfat obyektlərinin köçürülməsi göstərilmişdir.

Qızılağac Dövlət qoruğu elan olunmasının 50 illiyi 1979-cu ildə qeyd edilərkən Bakıda nəşr olunan "Гызылагачский Государственный Заповедник им С.М.Кирова" və 1988-ci ildə Leninqradda E.N.Qolovanov tərəfindən "Мир птиц" kitablarında qısa məlumat vermişdilər. 1988-ci ilin son aylarında səkkiz dəqiqəlik "Qızılağac" adlı telefilm çəkilmişdir.

Nəhayət deməliyəm ki, qoruğun adının mənşəyinə gəldikdə, söz əsl Azərbaycan mənşəlidir. Onun sahilində çox qədimdən Qızılağac şəhəri yerləşdiyi üçün bu ad ona verilmişdir.

## QIZILAĞACLI MUSA XAN

Tarixdə müəyyən səbəblər ucbatından bəzi şəxslərin fəaliyyəti düzgün əks etdirilməyib. O, cümlədən Musa xan da o şəxslərdən biridir. Musa xan Qızılağaclıdır. Öz bacarığı, səriştəsi, ağıllı, uzaqgörən siyasətinin nəticəsində talış xanlığının bünövrəsin qoymuşdur. Talış xanlığının tarixi onun adı ilə bağlıdır. Ona görə ki, hər hansı bir iş ilk yaradıcısının adı ilə bağlı olur. O, cümlədən tarixdə təsdiqlənir ki, talış xanlığının bünövrəsini Qızılağaclı Musa xan qoymuşdu. Bütün tarixi faktlara əsaslanaraq talış xanlığının əsasını Musa xanla bağlamaq bir həqiqətdir...

XVII əsrin sonu və XVIII əsrin əvvəllərində iran və ona daxil olan ölkələrdə iqtisadi və siyasi tənəzzül özünün son zirvəsinə çatdığı bir vaxtda Qərbi Avropa dövlətləri, həmçinin inkişaf etməkdə olan Rusiya yeni-yeni müstəmləkələr əldə etmək uğrunda var qüvvə ilə fəaliyyət göstərirdilər. Zaman getdikcə dünyanı bölüşdürmək uğrunda mübarizə daha da şiddətlənirdi. Belə bir zamanda zəif inkişaf etmiş ölkələr, xüsusilə hədsiz təbii sərvətə və böyük strateji, coğrafi mövqeyə malik Azərbaycan rəqabət edən böyük istilaçı dövlətlər arasında başlıca obyektlərdən biri idi.

Bu dövrdə Rusiyada iqtisadi, siyasi vəziyyət möhkəmlənmiş və onun beynəlxalq əhəmiyyəti daha da artmışdı. Müxtəlif kənd təsərrüfat malları ilə zəngin Azərbaycan inkişaf etməkdə olan rus manifaktura sənayesi üçün ən əlverişli xammal mənbəyi və satış bazarı ola bilərdi. Buna görə də çarizm onu rus manifakturasının bazasına çevirməyə çalışırdı. *(Q.B.Abdullaev, Azerbaydjan V-XVIII, səh.14).*





Azərbaycan eyni zamanda öz coğrafi mövqeynə görə (XVIII əsrin əvvəllərində), Rusiyanın şərq ölkələri ilə yaratmaq istədiyi iqtisadi və siyasi əlaqələr üçün əsas vasitə idi. Məhz buna görə də "... Rusiya dövlətinin Xəzər dənizində fəaliyyətinin artması bilavasitə həm hərbi-strateji nöqteyi nəzərdən böyük əhəmiyyət kəsb edir, həm də ticarət məsələləri ilə sıx surətdə bağlı idi" *(F.M.Əliyev, "XVIII əsrin birinci yarısı" səh.5)*

XVII əsrin sonu və XVIII əsrin əvvəllərində Qərbi Avropa müstəmləkəçiləri də Şərq ölkələrinin, o, cümlədən Azərbaycanın sərvətlərini öz əllərinə almağa çalışırdılar. Onlar müxtəlif ticarət şirkətləri təsis etmək yolu ilə bu ölkələri əvvəlcə iqtisadi, sonra isə siyasi cəhətdən asılı vəziyyətə salmaq niyyətində idilər. Qərb dövlətlərinin Şərq ölkələrində, o, cümlədən Azərbaycanda göstərdikləri fəaliyyət Rusiya mənafeyinə zidd olduğu üçün onu çox narahat edir.

Birinci Pyoturun başlıca məqsədi Zaqafqaziyada fəaliyyət göstərən Türkiyəyə mane olmadan, Zaqafqaziya və Xəzər dənizi sahillərinin türklər tərəfindən zəbt olunması təhlükəsinin qarşısını almaqdan ibarət idi. Bunun Rusiya üçün həm hərbi, həm də böyük iqtisadi əhəmiyyəti var idi.

Yuxarıda qeyd edilən tarixi şəraitlə əlaqədər olaraq, rus dövləti Xəzər sahili ölkələrinin işğalı uğrunda bir sıra ictimai-iqtisadi və siyasi tədbirlər həyata keçirməyə başladı. *(Q.B.Abdullaev,"Azerbaydjan" V-XVIII səh. 11-12).*

Yaranan əlverişli şəraitlə əlaqədar rus çarı I Pyotr (1722-ci ildə) Xəzər sahili ölkələrini işğal etmək üçün hərbi müdaxiləyə başladı. Bundan bir il·sonra türk qoşunları da Azərbaycanın bir sıra vilayətlərini işğal etdilər. *(İ.R.Petruşevski, "Oçerki po istorii" səh.84).*

Belə bir zamanda Azərbaycan xalqı da öz mövqeyini qoruyub saxlamaq üçün bütün vasitələrdən istifadə etmək əzmində idi. Əhalinin çox hissəsi çətin həyat tərzi keçirirdi. Hakimiyyətə xanlıqlar rəhbərlik edirdilər. Səriştəli, bacarıqlı xanların rəhbər olduğu yerlərdə əhalinin yaşayışı qənaətbəxş idi. Bəzi regionlarda isə xalq feodalların cəfası ilə üzləşirdi. O cümlədən cənub zonasında da qeyri-bərabərlik hökm sürürdü.

Tarixi mənbələrdə təsdiqləndiyi kimi XVI əsrin əvvəllərində Cənub zonası (Talış diyarı da) vahid Azərbaycan dövlətinin tərkibinə daxil olmuşdu. Səfəvi dövləti Azərbaycan ərazisini ayrı-ayrı inzibati ərazilərə (dövlət daxilində) bölmüş, idarəetmə işlərini feodalların ixtiyarına vermişdir. Odur ki, XVIII əsrin ortalarında Azərbaycan ərazisində tarixdə xanlıqlar adı altında yerli feodal dövlətlərinin əmələ gəlməsi bir sıra ictimai-iqtisadi və siyasi amillərlə əlaqədardır. Səfəvi dövlətinin inzibati bölgüsü və onun iqtisadi siyasəti xanlıqların əmələ gəlməsi üçün əsas amillərdən biri olmuşdur. Həmin sülalənin hökümranlığı dövründə İran imperiyasına daxil olan geniş ərazi kiçik və böyük inzibati bölgələrə bölünərək əmirlər, sultanlar və məliklər tərəfindən idarə olunması nəticəsində ölkə çıxılmaz vəziyyətə gəldi. Bu tənəzzül hər şeydən əvvəl öz əksini ölkənin ümumi geriliyində, əhalinin amansız istismarında, vergiləri dövlət xəzinəsinə verməDən imtina etməsində, feodalların hakimiyyət uğrunda apardıqları mübarizədə tapdı. Səfəvilər dövlətinin digər əyalətlərində olduğu kimi, Talışda da xalqın vəziyyəti acınacaqlı idi. Həmin çətin vəziyyətdən xalq çıxış yolu axtarırdı. Xalqın səbri tükənmişdi. Onlar həm İran şahlığına, həm də yerli feodallara qarşı mübarizəyə qoşuldular. Yerli feodallar yaranan çətinlikdən





isifadə etdilər. Onlar bütün təqsiri şah hakimiyyəti üzərinə atdılar. Özlərinə dəyə biləcək zərbəni uzaqlaşdıra bildilər. Bundan da yerli hakimlərin sərbəstliyinə imkan yarandı. Beləliklə də, diyar parçalandı. Talışın Lənkəran hissəsində Əmir Aqis, Qızılağacda Musa xan, Astarada isə Məhəmməd Hüseyn hakimiyyət başına gəldi. Bu parçalanma diyarı uçuruma gətirib çıxartdı. Vahid hakimiyyət uğrunda gizlin, gah da açıq mübarizə gedirdi. Bunlardan daha güclü Qızılağaclı Musa xan çıxdı. O, böyük qoşunla Lənkəran və Astaraya hücum etdi və Əmir Aqisi və Məhəmməd Hüseyni məğlub etdi. Məğlub edən kimi onların hər ikisini həbs etdi. Musa xan hakimiyyəti ələ alan kimi böyük qabaq görənliklə bir sıra tədbirlərə əl atdı. Belə ki, xanlığı Qızılağacdan Astaraya köçürdü. Astaranı daha əlverişli bilib Talış diyarı üçün mərkəz seçdi. Burada İranla əlaqə üçün imkan geniş idi. Digər tərəfdən də Talış vilayətləri ilə əlaqədə Astara daha münasib idi. Bu barədə Talış xanlığının ictimai-siyasi tarixinə aid əsər yazan Mirzə Əhməd Mirzə Xudaverdi oğlu özünün "Əxbərnamə"sində yazır: "Musa xan əvvəllərdə Astara mahalının sahibi idi. O, çox qüvvətli xan idi. Hətta şahın itaətindən (Nadir şah - N.Q.) belə bəzən boyun qaçırırdı. Astarada müstəqil hakim idi. O vaxt Astara mahalına Korqanrud, Dəşvənd, Əsalim, Dırığ və Zuvand daxil idi". *(Mirzə Əhməd Mirzə Xudaverdi oğlu Lənkəran və Talış ölkəsinə məxsus "Əxbərnamə" Azərbaycan EA. Tarix İnstitutunun elmi arxivi, ünvan: 3622 vər.21)*

Buradan göründüyü kimi Musa xan vahid xanlıqdan da qabaqa böyük nüfuz sahibi olmaqla bərabər həm də rəhbərlikdə təcrübəsi olan bir şəxs imiş. Məhz bu əlamətlərinə görə də o, şahlıq rejiminə də öz qüvvəsini göstərmişdir.

Musa xan 1727-ci ildə mərkəzi Qızılağacdan Astaraya köçürtdü. Bunun da səbəbi var idi. Birinci növbədə İranla əlaqə yaratmaqda Astara əlverişli coğrafi mövqedə yerləşirdi, digər tərəfdən isə Musa xan burada yerli hakimləri ələ almaqla öz hakimiyyətini qüvvətləndirmək arzusunda idi.

Mirzə Əhməd Mirzə Xudaverdi oğlu Talışın daha başqa əraziləri haqqında da məlumat verir. O yazır ki, "Talışın bir mahalı da Uluf idi. Uluf on iki parça kənddən ibarət idi. Uluf mahalı Astara mahalından geniş olmasa da heç də ondan geri qalmırdı. Uluf mahalının hakiminin 12 yerdə divanxanası var idi". Bir cəhəti də qeyd etmək lazımdır ki, ümumi düşmənə qarşı mübarizə sonrakı illərdə Ulufluları Astara hakimi Musa xana yaxınlaşdırmışdı. Bu birlik diyarın müstəqilliyi uğrunda mübarizəyə müəyyən qədər kömək etdi.

XVIII əsrin 20 ci ilərində Azərbaycanın bütün Xəzərboyu əyalətlərində yaşayan xalqların həyatında nisbətən dönüş baş verdi. 1722-ci ildə Rusiya dövləti Xəzərboyu əyalətlərə qoşun çəkdi. Bundan istifadə edən feodallar rusların gəlişini çox səmimi qarşılamış, Rusiya tərkibinə keçmək istədiklərini bildirmişdir. Bu arzu heç şübhəsiz ki, Rusiya imperiyasının, onun hakim qüvvələrinin, şəxsən I Pyoturun ürəyincə oldu. I Pyotr talış feodallarının istəyini xüsusi əmrə qanuniləşdirmiş, bu diyarı Rusiyanın tərkibində saxlamaq arzusunu bildirmişdir. Beləliklə 1722-dən 1732-ci ilə kimi bu diyar Rusiyanın tərkibinə daxil oldu. Həmin vaxt bu diyarda az da olsa sakitlik əmələ gəlmişdi. Bu başqa həmlələrdən onun qorunmasını təmin edirdi. Lakin xalqın əzab-əziyyəti heç də azalmırdı. Rusiyanın bu yerlərdə marağı var idi. Hər şeydən əvvəl o Türkiyə və İranla ciddi rəqabət aparırdı. Bu rəqabətdə qalib gəl-





mək üçün o nəyin bahasına olursa-olsun Xəzərdə mövqeyini möhkəmlətmək istəyirdi. I Pyotur yerli camaatın rəğbətini qazanmaq üçün Cənuba yürüşə başladığı gündən bütün qoşun hisələrinə qarətlə məşğul olmağı qadağan etmişdi.

Rus dövləti ələ keçirdiyi yerlərdə əmin-amanlıq bərpa etdi. Bakı, Səlyan və s. Xəzərboyu əyalətlərdə olduğu kimi, Lənkəranda da komendat idarəsi yaratdı. Həmin əyalətlərdə bir sıra hərbi və strateji əhəmiyyətə malik istehkamların tikintisinə sərəncam verdi. Bu barədə P.Q.Budkov yazır: "Rus qoşunları 1720-ci ildə Kəskər və Astaraya qədər gəlib çıxdılar. Rusiya hökuməti İran təhlükəsindən qorunmaq üçün qalalar tikdirmişdi. Belə qalalardan biri Astarada, digəri isə Qızılağacda, Lənkəranda idi" *(Budkov P.Q. Materialı dlya novoy istorii Kavkaza, 1722, po 1803 q. I cild, səh. 87).*

Uluf qədim tarixə malik olan yaşayış yerlərindən biri olub. Musa xan hakimiyyətə gələndən sonra vilayət iqtisadi cəhətdən xeyli möhkəmlənmişdi. Əkinə yararlı torpaq sahələri nisbətən iri feodalların əlində cəmləşmişdi. Vilayətin əsas şəhəri olan Lənkəran sənətkarlıq, ticarət şəhəri kimi formalaşmaqda idi. Musa xan çalışırdı ki, əhalinin vəziyyəti yaxşılaşsın. Lakin bəzi feodallar əllərində olan torpaq sahələrinin əkin-biçin işlərini aşağı təbəqənin əli ilə qururdular. Feodallar isə Nadirin göstərişinə əməl etməsə onları da təzyiqə məruz qoyacaq idi. Odur ki, Nadir şaha öz itaətini sübut etmək üçün Musa xan Şirvan hökmdarına məktub yazmış, onu Nadirə itaət etməyə çağırmışdır. O, həmçinin Azərbaycan və Dağıstanın başqa feodallarına da belə məktublar göndərmişdir. Bu Musa xanın onların arasında nüfuzlu olduğunu göstərirdi. Musa xan Nadir şah tərəfindən ordu toplamaq haqqında

fərman almışdır. Musa xan qorxurdu ki, ordu toplaya bilməyə, Nadirin etimadını doğrultmaya. Mötəbər sənədlərdən aydın olur ki, onun əzmkarlığı nəticəsində Musa xan İran qoşunu üçün 600 nəfərə yaxın rəiyyət səfərbər etmişdir. Nadir şah Azərbaycana ilk silahlı yürüş edənədək həmçinin türk və rus qoşunlarının 1735-ci ildə Azərbaycan, Dağıstan və Şərqi Zaqafqaziyadan tamamilə çəkilib getmələrinə nail oldu.

Bundan sonra Nadir şah 1736-cı ildə Muğana gəldi. Muğan ağsaqqallarının qurultayını çağırdı. Həmin məlum qurultayda özünü rəsmi şah olaraq elan etdi və şahlıq tacını başına qoydu. Muğan qurultayında Azərbaycanın bir sıra feodalları, hakimləri iştirak etmişdir. Həmin qurultayda Talış hakimi Musa xan, habelə Talışın feodallarından Seyyid Mir Abbas da var idi. Talış xanlığının tarixi məhz Seyid Mir Abbasdan başladı.(Bəs nə üçün Mir Abbasdan?).

Burada bir neçə əlamətləri yada salaq. Əvvəla Talışda xanlığın banisi Qızılağaclı Musa xan olduğu halda, nə üçün xanlığın tarixi Seyid Mir Abbasdan başlamalıdır? Onda Talışda vahid xanlıq yaradan, Talış xanlığının banisi hesab edilən Musa xanın xidmətləri necə olmalıdır? Musa xan Nadir şah kimi şəxsiyyətin müqabilində, yəni onunla münasibət saxlamaqda nə dərəcədə məharətli olduğu bizə məlumdur. Axı Musa xanın xidməti Talışda müstəqil xanlığın yaranması üçün əsas olmuşdur. Məncə, Musa xanın öz dövründə xanlıq üsul idarəsindəki təcrübə sonrakı xanlar üçün məktəb olmalıdır.

Seyid Mir Abbas tac qoyma mərasimindən sonra Nadir şahın yanında olmağından məharətlə istifadə elədi. Seyid Mir Abbas öz məharətinin həyata keçməsini görəndə Nadir şahın





yanında sözünün keçəcəyini bilirdi. Öz şəxsi mənafeyini hər şeydən üstün tuturdu.

XVIII əsrin 20-ci illərində Talış xalqı yeni fəlakətə düçar oldu. Bu da Rusiyanın Xəzər sahillərinə sahib olmaqlığı idi. Rusiya İranla müqavilə bağladı, 1722-32 illər ərzində Azərbaycanın Xəzər sahili hissələri Rusiyaya verildi. Bununla da rusların hakimiyyəti başlandı. Rusiya hökuməti Azərbaycanın Kaspi sahili vilayətlərində ticarəti, təsərrüfatı genişləndirmək məqsədilə fəaliyyətə başladı. I Pyotrun göstərişi ilə Talışda bir sıra istehkamlar tikildi. Həmin istehkamlar Lənkəran, Astara və Qızılağacda idi. Bu istehkamlar qurulandan sonra Cənub regionunda hərbi komandanlıq yarandı. İstehkamlardan, hərbi komandanlıqdan sonra əhali həddindən artıq istismar olunurdu. Gəlmələrin dilini bilməyən xalq kütləsi onların tələblərinin qurbanı olurdular. Belə bir aqır şəraitə dözə bilməyən yerli əhali İrandan kömək olunmasına ehtiyac duyurdular. Onlar İran şahına müraciət edib onun yanında oldular və İranın tərkibinə qəbul olunmaqlarını xahiş etdilər. Bu müraciətə İran biganə qala bilmədi. Şah Rus hökumətinə müraciət etdi və vaxtilə bağladığı müqaviləni qeyri qanuni hesab etdi. 1732-ci ildə Rəst danışıqlarında müqavilə bağlandı və Talış Rusiyanın təsirindən qurtararaq yenidən İrana tabe oldu. Bu tabeçilik Talışda əmin-amanlığı bərpa edə bilmədi. Ona görə ki, həmin illərdə İranda irtica illəri baş qaldırmışdı. Bu özünü Talışda da göstərdi. Nadir şah işğalçılığa başladı və vilayətlərin feodallarını müxtəlif vədlərlə öz tərəfinə çəkməyə başladı. Nadir şaha xidmət göstərən feodallar əhalini istismar edirdilər. Belə mühiti seyr edən Musa xan Nadir şahın qəzəbinə düçar olmamaq üçün ona itaət edəcəyinə vəd verdi və

əvvəlki kimi hakimiyyətini davam etdirdi. Nadir şah işğalçılığa böyük üstünlük verirdi. Bu işğalçılıq yürüşündə feodallar ona yaxından köməklik göstərirdilər.

Belə bir fakt məlumdur ki, Nadir şah Şirvan və Dağıstana yürüş edərkən, öz hakimiyyətini qorumaq xatirinə ona sadiq olan Musa xana Talışda qoşun toplamaq və bu yürüşə kömək etmək əmri verdi. Nadir şahın əmrinə Musa xan can-başla əməl etmişdi.

Mirzə Əhməd yazır ki, Musa xan öz işinin mahir bilicisi idi. Mir Abbas fürsətdən istifadə edərək oğlu Seyid Cəmaləddini, bacısı oğlu Mirzəbəyi də İran ordusunda xidmət etmək üçün qəbul etməsini Nadir şahdan xahiş etdi. Səid Əli Kazımbəy oğlu, "Cavahirnameyi-Lənkaran" əsərində yazır ki, Mir Abbas xanın oğlu, Mir Mustafa xanın atası olan Qara xanın əsl adı Cəmaləddindir. O, qarabuğdayı olduğundan dövlət adamları və ordu əmrləri *(Nadir şahın qoşunundakı əmrlər-N.Q ona Qara xan deyə müraciət edirdilər)*. Burada bir cəhəti qeyd etmək lazımdır ki, belə addım atmaqla 1732-ci ildə Seyid Mir Abbas bəyin başqa çarəsi yox idi. Ona görə ki, Seyid Mir Abbas bəy bir vaxtlar Rusiyaya inanıb ona meyl etmişdi. Elə ki, Rəşt müqaviləsi imzalandı Seyid Mir Abbas Rusiyaya olan inamını azaltdı və Nadir şaha inam bəslədi. Talışın bir çox feodalları böyük hərbi qüvvəyə malik olan Nadir şaha müqavimət göstərə bilməzdilər. Ona görə də onlar məcburiyyət qarşısında qalıb Nadirə itaət etməyə hazır olduqlarını ancaq sözlə bildirirdilər.

Əslində belə itaətkarlıq gözdən pərdə asmaq siyasəti idi. Belə siyasətlə hakim sinfin nümayəndələri öz malikanələrini, var-dövlətlərini və vəzifələrini qoruyub saxlayırdılar. Lakin





sonralar Nadir şah bu feodalların hiyləsini başa düşmüş, onları ciddi cəzalandırmışdır. Əldə olan məlumata görə Nadirin xudpəsəndlik siyasətinin qurbanı ola biləcəyini duyan Musa xan İran şahına etibar etməməyə başlamışdı. Həmişə İran pərəst olan, şahların rəğbətini qazanan Musa xan qəti hərəkət etməyə başladı. Talış hakimi Qızılağaclı Musa xan Lənkəran, Qızılağac və Astaraya gələn rus tacirləri ilə əlaqəyə girmiş, məktubla onlara müraciət edərək, Rusiyaya olan hüsn-rəğbətini bildirmişdir.

Arxiv materiallardan aydın olur ki, Musa xanın ardınca Talışın bir sıra feodalları da bu təşəbbüsdə idilər. Amma Talışın zəhmətkeş xalqı qəti şəkildə Rusiyaya inanmırdı. Onlarla yaxınlığı özləri üçün qəbahət bilir və günah sayırdılar.

İran şahı Nadir bundan duyuq düşmüş, Talış xanı Qızılağaclı Musa xanı ağır cəzalandırmışdır. Onun İrandan üz çevirib, Rusiyaya münasibətinə görə özünü, qardaşını və böyük oğlunu həbs edir. *(Firidun Əsədov. Talış diyarının keçmişinə bir nəzər. Bakı, 1993, səh.9-11)*.

Firidun Əsədov "Dar gündə arxa" kitabında yazır: "Başqa bir mənbədə qeyd olunur ki, Nadir şah Əfşar Astarada, Cavadda və Biləsuvarda qalxan üsyanı bəhanə edib Musa xanı həbs etmişdi" *(F.Əsədov, "Dar gündə arxa" Bakı, 1988 )*.

Buradan göründüyü kimi Musa xan Talış xanı olmağına baxmayaraq ətraf rayonlarında bir növ rəhbəri sayılırmış. Əgər belə olmasaydı Cavadda (Sabirabad rayonu), Biləsuvardakı qiyamın ona nə faydası ola bilərdi? Musa xan böyük şəxsiyyət olub. Onun uzaqgörənliyinin nəticəsində 1727-ci ildə Qızılağacdan xanlığı Astaraya köçürtdü. Astaranı xanlığın mərkəzi təyin etdi. Musa xan düşünürdü ki, xanlığın mərkəzi-

ni Astarada yerləşdirsə gələcəkdə yeni, əlverişli yaşayış məntəqələrini özünün nəzarəti altına keçirər və ərazilərini genişləndirər. Həmin vaxtlarda o qüdrətli basılmaz bir xan kimi tanınırdı.

Hətta o, İran şahına itaət belə etmək istəmədi. Musa xanın vaxtında Astarada olan Limir-Butəsər, Lənkəran, Zuvand, Uluf Mirənkuh, Drıq, Dəştvənd (Ərkivan), Muğan Ucarud (bura daxildir Adnabazar, Mirənkuh, Alar, Cüniddəşt, Dilaqardça hərəsi bir neçə kəndi əhatə edir), Ağtam (Ağdam), Bilharud daxil idilər. Həmin dövrdə Musa xan öz insani keyfiyyətləri ilə fərqlənən şəxs kimi tanınırdı. Musa xan Qızılağac xanı olan zamanlarda (təxminən 1725-ci illərdə) onun ərazisinə indiki Biləsuvar qəsəbəsinin içərisindəki körpüyə qədər olan yerlər daxil idi. O cümlədən keçmiş Qala-bazar yeri, (indi Masallı şəhəri - N.Q) Alvadı, Banbaşı və s. yerləri əhatə edən ərazilər Qızılağaclı Musa xana tabe idi. Çox maraqlı olar ki, şair-publisist Məmməd Kazımın "Mir Həsən xanın nəvələri" kitabında yazdıqlarına diqqət edək. Müəllif Masallı ərazisinə gəlib məskunlaşmaq istəyən Köylənli tayfası haqqında yazır: "Masallının yuxarı başı deyilən əraziyə köylənlilər Musa xanın hakimiyyəti illərində gəliblər. Özləri də Ərzurumun yaxınlığındakı Gər-Gər mahalından. O vaxt Seyid Mir Abbasın övladları hələ hakimiyyətə gəlməmişdilər və xanın iqamətgahı Qızılağacda qərar tutmuşdu. Qardaşlar olan Köylən xanla Səmid xanın çoxlu at ilxıları varmış. Onlar Musa xandan xahiş edirlər ki, bu yerdə yurd salmağa icazə versin. Musa xanın icazəsi ilə həmin bu Köylən məhəlləsini yaradırlar (Masallı Yuxarıbaş məhəlləsi – N.Q.). Deyilənə görə, həmin bu ərazidə kimsə yaşamırmış. Səmid xana isə indi-





ki Səmidxan ərazisini Musa xan verdi. Qardaş olan Köylən xanla Səmid xanın çoxlu at ilxıları varimiş. Onun birini də Musa xana bağışlayırlar. Köylənlilər hər sözün başında məsəl çəkirmişlər. Özləridə türk ləhcəsində "Məsəli","Masal" kimi işlədirmişlər. Ərzurumda əsasən Azərbaycanlılar yaşayırlar. Demək Masallı məsəl çəkənlər mənasını ifadə eləyir". (M.Kazım, Mir Həsən xanın nəvələri)

Nadir şah Musa xanı hakimiyyətdən kənar etdikdən sonra Talışın idarəsini özünün ən yaxın sərkərdələrindən biri olan Şirazlı İbrahim xana həvalə etdi. Mənbələrdən aydın olur ki, Şirazlı İbrahim Talışda olduğu zaman başı eyş-işrətə qarışdığından hakimiyyəti idarə etmək işlərini bir müddət başlı-başına buraxmışdı. Belə bir vəziyyətdən Seyid Mir Abbas bacarıqla istifadə etmişdir. Mənbələrdən aydın olur ki, Seyid Mir Abbas həddindən artıq siyasətçi və hiyləgər idi. O, mövcud vəziyyətdən səmərəli şəkildə istifadə etməyi bacarırdı. Akademik S.Qmelinin yazdığı kimi onun hakimiyyəti altında olan ərazinin hüdudu çox böyük idi. Belə ki, Talış dağlarından başlayaraq Muğana kimi geniş bir ərazini əhatə edirdi. Seyid Mir Abbasın hakimiyyəti çox çəkmədi, o, bir ildən sonra dünyasını dəyişdi. Seyid Mir Abbas Ərdəbilin Hiyr kəndindədir, Nadir Muğan qurultayında iştirak edəndə oğlu Qaraxan üçün xanlıq titulu almışdır. Onun yerinə oğlu Cəmaləddin - Qaraxan keçdi. Qaraxan özünü yerli göstərmək üçün Talışınski familiyasını götürdü. Bundan da Talışınski və Talışxanovlar yaranır. 1747-ci ildə Nadir şah vəfat elədi. Ondan sonra Azərbaycanda 18 xanlıq, 6 sultanlıq, 5 məliklik yarandı.

1722-ci ildə Talış xanlığı Rusiyaya, 1732-ci ildən Astarada olan Talış xanlığı İrana tabe oldu. Talış ərazisi müvəqqəti

olaraq Rusiyaya tabe olanda hətta bu vaxt Rusiya imperatoru I Pyotur Ərkivan və Qızılağacı Rus əyanlarından Bernard Aleksandroviç Kerçə bağışladı.

XVII əsrin axırında mövcud olan Talış xanlığı Azərbaycanda xanlıqlar əmələ gələndən sonra müstəqil oldu. Xanlığın ərazisi Azərbaycanın cənub-şərq hissəsini əhatə edirdi.

A.A.Bakıxanov "Gülüstani-irəm" əsərində yazır ki, həmin dövrdə Astara xanlıq mərkəzi olan Talış xanlığı adlanırdı və hakimi Talış xanı Musa xan idi.

Talış on bir nahiyədən ibarətdir. Asalım, Kürkənrud, Astara, Bulkic, Zübənd, Cayici, Lənkəran, Drıq, Ulut, Dəstvənd, Ucarud və Muğan. *(S.Ə.Kazımbəyoğlu Cəvahirnaməyi Lənkəran).*

Seyidəli Kazımbəyoğlu yazır: "iki yüz ilə yaxın tarixi olan "Tarixi-Cahannümayi-Türki" kitabında belə göstərilir ki, Lənkəran Xəzər dənizinin qərb sahilində Qızılağac şəhərindən bir az cənubda yerləşən bir qəsəbədir. Amma bu yerlərin ağsaqqallarının söhbətlərindən məlum olur ki, Lənkəran əvvəllər böyük şəhər idi, əhalisi də çox olmuşdur" *(S.Ə.Kazımbəyoğlu, Cəvahirnameyi Lənkəran 1869).*

Nazim Cəfərli "Lənkəran" kitabında yazır: "Musa xanın dövründə vilayət iqtisadi cəhətdən xeyli möhkəmlənmişdi. Əkinə yararlı torpaq sahələri nisbətən iri feodalların əlində cəmlənmişdi. Vilayətin əsas şəhəri olan Lənkəran sənətkarlıq ticarət şəhəri kimi formalaşmaqda idi. *(Nazim Cəfərli. "Lənkəran" (tarixi oçerklər), 1995).*

Qeyd etmək lazımdır ki, Rusiyanın himayəsi çox sürmədi. 1732-ci ildə İranla bağladığı Rəşt müqaviləsinə görə Rusiya Azərbaycanın Kür çayına qədərki Xəzərboyu əyalətlərindən





əl çəkmiş, həmin ərazini İrana qaytarmışdı. Əldən-ələ keçən Azərbaycan torpağında həmin yerlərdə yenidən şah üsul-idarəsi bərpa edildi. Bu illər İran tarixində qəti irtica dövrü idi. İranda şahlığı ələ keçirən Nadir, təkcə Azərbaycan deyil, bir sıra digər vilayətləri də işğal etmək niyyətində idi. O, müxtəlif vədlərlə yerli feodalları öz tərəfinə çəkir, onlara arxalanırdı. Nadirin şahlığı dövründə xalqın əzab-əziyyəti ikiqat artdı. Həmin illərdə Talışda bərk quraqlıq oldu. Bu kəndlərin vəziyyətini daha da ağırlaşdırdı. Nadir şahın Talışda soyğunçuluğu, xalqın şüurunda canlı təəssürat kimi qalmışdı. Bu talanlar nəticəsində əhalinin çoxu Muğana, Qarabağa, Şirvana, Bakıya və s. yerlərə qaçmışdı.

Onu da qeyd etim ki, Musa xan vilayətin mərkəzini Astara şəhərini təyin edəndən sonra Qızılağacdan çoxlu sayda adamlar dövləti vəzifələrə təyin olunduğu üçün Astaraya köçmüşlər. Sonradan orada məskünlaşmışlar. Onların varislərindən indiyə qədər Astarada yaşayırlar.

Hal-hazırda Astarada çoxlu sayda əsli Qızılağacdan olanlar vardır. Onlardan biri Şah ağacı kəndində Əliağa müəllimi göstərmək olar. Onun oğlu Maqsud müəllim Lənkəran universitetinin professorudur. Onların Qızılağacda əmisi uşaqları "Guzatlılar" adlanan tayfanın üzvləridirlər. "Quzatlılar" inək başı kəsmirlər və onlar digər tayfalar arasında mal başı kəsmiyən kimi tanınırlar.

O cümlədən, Lənkəranın Kiçik bazar adlanan məhəlləsində vaxtilə Qızılağacdan olanlar çoxluq təşkili edirdilər. İndi də orada onların çox hissəsi yaşayırlar. Tanınmış ziyalı Zəki Abbasov da qızılağaclıdır.

Rusiya ilə İran arasında razılaşdırılmış "Gülüstan" (1813-

ci il), Türkmənçay (1828-ci il) müqavilələrinə əsasən Azərbaycan əraziləri yarıya bölünərək Rusiya və İranın tabeliyinə keçirildi. Rus qoşunları yenidən cənub bölgəsində möhkəmlənmək üçün var qüvvə ilə çalışdı. Hətta rusları ukraynalılar köçürülərək Azərbaycanın müxtəlif ərazilərində məskunlaşdırıldı.

Bu isə Rusların Azərbaycanda müvəqqəti deyil, əbədi yerləşərək, hökümranlıq etmək siyasətindən xəbər verirdi. Elə də oldu, ruslar Azərbaycan torpaqlarında məskunlaşıb hökmranlıq etdilər. Ruslar hakimiyyətə gələndən sonra əvvəl komendant üsul idarəsi sonra isə qəza yaradıldı. Qəza Bakı quberniyasına tabe idi. Bütün göstəriş Bakı quberniyasından verilirdi. O müddətdən ta 1920-ci ilə qədər Masallı və onun kəndləri Lənkəran qəzasına daxil idi.

**Haşiyə:** 1922-ci ilə kimi Port-İliçin adı yerli camaat tərəfindən rus sözündən olan "pereval" adlanırdı.

"Pereval"-ın mənası aşırımlı keçid deməkdir. Bu ad ona Sarı adasına və Qızılağac körfəzinə su keçidi yolu olması ilə əlaqədar verilmişdir. 1940-cı ilə kimi Bakı-Lənkəran dəniz yolu ilə işləyən sərnişin paroxodları Port-İliçdə dəniz sahilində tikilmiş limanın körpüsünə yan alırdılar. 1941-ci ildə Bakı-Astara dəmir yolu işə düşdükdən sonra Port-İliçdəki dəniz-sərnişin limanı da istifadə edilir. XIV Ümumbakı Partiya komitəsinin qərarı ilə 1924-ci ildə V.İ.Leninin şərəfinə Port-İliç adlandırıldı. Bu münasibətlə V.İ.Leninə konfrans teleqram göndərdi. Həmin ildən Qızılağacdan Port-İliçə işləmək üçün gedənlərin sayı artdı.

**Haşiyə:** Sarı yarımadası Lənkəran rayonunda Xəzər dənizinin qərb sahilində, Lənkəran-Bakı dəmir yolu və şosse





yolundan, rayon mərkəzindən 17 km Şimalda yerləşir. Kiçik Qızılağac körfəzini Böyük Qızılağac körfəzindən ayırır. Şimal tərəfdən Qızılağac qoruğu ilə Cənub-Şərqdən Xəzər dənizi suları ilə, Qərbdən isə Port İliç torpağı ilə əhatə olunmuşdr. Tarixi çox qədimdir. Rus səyyahı A.Suxanov 1638-ci ildə burada olması haqqında IV kitabının 5-ci fəslində məlumat verib. 1917-1920-ci illərdə Azərbaycanda Sovet hakimiyyəti uğrunda mübarizə aparan Lənkəran inqilabçılarının müdafiə yeri olmuşdur.1929-cu ildən başlayaraq Xəzər dənizinin su səviyəsinin enməsi nəticəsində ada nisbətən böyümüşdür. 1956-cı ildə Sarı adası, Port-İliç şəhəri ilə torpaq yolla bəndlə birləşdirilmiş, və o ada şəklindən yarımadaya çevrilmişdir. Deyilənlərə görə ona bu ad torpağı, qumu sarı olduğu üçün verilmişdir. Adam Oleari da bu fikirdədir.

Hacı Zeynalabdin Şirvani (1780-1838) Sarı haqqında qiymətli məlumat verir. Sarıya aid bir sıra tarixi-coqrafi materiallar toplamış və öz əsərində işıqlandırmışdır.

## QIZILAĞAC İNQİLAB DÖVRÜNDƏ

1920-ci ilə kimi Qızılağac kəndində olan 17 min yerli sakin yavaş-yavaş kənddən uzaqlaşırdılar. Ona görə ki, limana qarşı rusların münasibəti kəskinləşirdi. 1-ci dünya müharibəsi və 1917-ci il burjua inqilabı da Qızılağacda öz təsirini göstərdi. Xəzər dənizi ilə Atlanta ittifaqına daxil olan general Denikinin qüvvələri Xəzərdə Qızılağacdan 3 km. məsafədə cəmləşdi. Dənizdən kəndi top atəşinə tutdular. İlk atılan top indiki 2 saylı məktəbin yaxınlığında Telli adlı bir qadının üstünə düşərək onu məhv etdi. Mərminin təsirindən həmin yerdə böyük çökəklik yarandı. 2-ci top xırda kolluğa düşür, Möhsi oğlu Həmidin dili orda tutulur (o yer Rəşid kişinin evinin yanıdır).

Denikinin gəmisindən atılan topu susdurmaq üçün Kalinovkadan bir təcrübəli topçu gətirirlər. O vaxt kəndxuda olan Kərbəlayı Ələkbər vəd verir ki, o topu susdursan sənə çoxlu hədiyyə verəcəyik. Trofim adlı şəxsin atası 1-ci dəfə topu istiqamətləndirir, ancaq hədəfi vura bilmir. Kərbəlayı Ələkbər "dayan doldurum" silahını dayayır onun kəlləsinə deyir bu dəfə onu susdura bilməsən, səni öldürəcəyəm. O şəxs elə istiqamət götürür ki, atdığı topdan çıxan mərmi Denikinin gəmisində düz topun lüləsindən keçir və gəmi məhv olur. Denikin və sağ qalanlar qaçır. Gəmi (barj) batır. İndi də batdığı yerdə gəminin qalıqları qalır. Bunu dənizçilər həmişə görüblər.

İnqilabdan əvvəl Qızılağac və ətraflarda Qoçu Məmməd adlı şəxsin igidliyi də bütün ətrafa bəlli idi. Hətta o Koba (İ.V.Stalin) ilə birgə qaçaqçılıq etmiş, Koba onun şəxsi qonağı olmuşdu. İndi də onun Stalinlə birgə (1902-ci il) çəkdirdiyi şəkil nəvəsində qalır. Stalinin onun qoçaqlığına ehtiyacı var idi. Lənkəran bankını çapıb talayandan sonra Qoçu Məmməd onu gəmi ilə Səlyana qədər apartdırır. Qoçu Məmmədin inqilabi fəaliyyəti ağsaqqallar tərəfindən söylənilir. Qızılağac kənd sakini, ziyalı Sudeyf Həsən oğlu Məlikov deyir: "Mənim atam Həsən Zülfüqar oğlu deyərdi: Məhərrəm ayında evimizin qabağındakı Zəncir təkkəsində (indiki ATS-in yerində) İmam Hüseyn (ə)-ın əza mərasimində iştirak edərdi. İçəriyə gələn əzadarların ayaqqabılarını Qulam Səfərov cütləyərdi. Birdən gördüm Qulam içəri daxil oldu, mənə dedi: Həsən, səni Qoçu Məmməd çağırır. Mən bayıra çıxdım. Qoçu Məmməd məni qaranlıqda durduğu yerdən səslədi, mən getdim onun yanına, gördüm onun yanında iki nəfər başqa şəxslər də var. Qoçu Məmməd mənə dedi: Həsən, mənim qonaqlarımı Səlyana apara bilərsən? Mən dedim: Qoçu Məmməd, dəniz çox qorxuludur, özü də nəzarət güclüdür gedə bilmərəm. Qoçu Məmməd dedi: Həsən, sənə təcrübəli gəmiçi olduğun üçün müraciət edirəm. Nə çox gəmiçi, özü də sən Səlyana getsən, nə qədər pul istəsən, verəcəyəm.

Mən qiyməti yüksək məbləğ dedim ki, o, razı olmasın və bu işdən əl çəksin. Qoçu Məmməd dediyim məbləği eşidən kimi, dedi razıyam, gəl kolluğun yanına (o yer indi kəndin qırağında, rəhmətlik Məmməd Ələkbər oğlunun evinin yanıdır). Mən razılıq verdim, gedib qonşum Əşrəf Balağa oğlunu yatağından durğuzdum, onunla Qoçu Məmməd deyən yerə getdik. Gördüm orda bizi Qoçu Məmməddən başqa iki nəfərdə gözləyir.



*Koba (İ.Stalin) və Qoçu Məmməd*

Qoçu Məmməd qonaqları mənə möhkəm tapşırdı. Biz gəmini suya saldıq, onlardan biri gəminin baş tərəfində əyləşdi. Dənizə gələrkən bizə verdiyi çantanı bizdən aldı. Gəminin baş tərəfində oturan şəxs çantaları öz yanında saxladı. Həmin şəxsin çiynində beşatılan tüfəng və belində mauzer markalı tapança vardı, o biri şəxs isə mənim yanımda əyləşdi. Mən onlara dedim: gərək siqaret çəkməyəsiz, ona görə ki, dənizdə xüsusi nəzarətçilər var, bizi görə bilərlər. Nəhayət gəlib Səlyana çatdıq. Həmin iki nəfərin biri özündə olan çantadan əlavə pul çıxardıb bizə verdi və dedi, mən Kobayam. Hər ikisi çantaları götürüb sahilə çıxdılar. Deyilənlərə görə həmin çantadakı pullar, Lənkərandakı bankdan götürülən pullar olub. Biz qayıdıb kəndə gəldik.





Qoçu Məmməd bizə razılığını bildirdi. Qoçu Məmmədin Məmməd adında (Şirin bala da deyərdilər) bir oğlu var idi, ixtisası müəllim idi". Südeyif Məlikov deyir ki, Məmməd müəllim Hacı Hüseyn evində mənə dərs deyib (Hacı Hüseyn evi Əhəqulunun evidir). İ.Stalin hakimiyyətdə olanda Qoçu Məmməd ilə olan dostluğa xatir onun oğlu Məmmədi öz yanına çağırtdırır. Lakin o vaxt kənd soveti M.Əlizadə onun yaşamadığı haqqında məlumat verir. Ancaq Məmməd müəllim yaşayırdı. Sonradan ikinci Dünya Müharibəsinə gedib qayıtmayıb. 1997-ci ildə Məmməd Qoçu Məmməd oğlunun İtaliyada yaşaması haqda kəndə xəbər gəldi... İtaliyada onun sağ qalıb-qalmamağı haqda məlumat əldə edə bilmədik. İnqilab illərində Qızılağac böyük əhəmiyyət kəsb edən yer idi. Ona görə də Bakıdan gəmi ilə gələn inqilabçılar burada məlumat alıb işə başlayırdılar. Qızılağac və Nikolayevka (Kalinovka) kəndlərinin sakinləri dənizdən sahilə çıxan Bakı sovetinin silahlı qüvvələrini duz-çörəklə qarşıladılar. Qızılağac və Nikolayevka (Kalinovka) kəndlərinin sakinlərindən təşkil olunmuş partizan dəstələri mart ayının 17-də Bakılı döyüşçülərlə birlikdə quldur dəstələrinə qarşı döyüşlərə başladılar.

Martın 20-21-də düşmənə ağır zərbələr endirildi. Mart ayının 30-da I və II Yeddioymaq kəndləri ətrafında gedən gərgin vuruşmalarda əksinqilabi qüvvələr, demək olar ki, tamamilə əzişdirildi və qənimət olaraq onlardan 2 pulemyot, çoxlu tüfəng və patron ələ keçirildi. Sovet silahlı qüvvələri düşməni cənuba - Lənkəran şəhərinə doğru sıxışdırmağa başladılar. 1918-ci il aprelin axırında və mayın 1-ci yarısında qəzanın 16 kəndi düşməndən təmizləndi. Qızılağac kəndinin sakinlə-

ri 1918-ci il aprelin 28-də keçirilən ümumi yığıncaqda Bakı sovetinin nümayəndəsinin məruzəsini dinlədikdən sonra belə qərar qəbul etdilər. "Biz Qızılağac icmasının kəndliləri Sovet hakimiyyətini həm mərkəzdə və həm də yerlərdə zəhmətkeş xalqın yeganə xilaskarı kimi tanıyırıq və xalq komissarları sovetinə tam etimad göstəririk... Bolşeviklərlə tam həmrəyik və sosialist ideyalarının həyata keçirilməsi işində var qüvvəmizlə onlara kömək edəcəyik. *("Известия Бакинского Совета" qəzeti, 22 may, 1918-ci il, №95).*

Qızıl ordunun silahlı dəstələrio dövrdə Qızılağac limanında sahilə çıxaraq başqa kəndlərə gedərmişlər. Dəniz nəqliyyatı ən sərfəli nəqliyyat idi.

1920-ci ilin may ayında XI Qızıl Ordunun ayrı-ayrı hissələri Lənkərana, həmçinin Ərkivana köməyə gəldilər. Qızıl Orduya Boradigah, Masallı, Ərkivan, Bədəlan, Türkoba, Nikolayevka, Qızılağac, Xırmandalı, Mahmudavar və digər kəndlərin də əhalisi kömək edirdilər. XI Qızıl Ordu döyüşçüləri əksinqlabi dəstələrə qarşı bir sıra müvəffəqiyyətli döyüş əməliyyatları aparırdı.

Azərbaycanda inqilabın ilk günlərində xalqın inqilabı proseslərə qoşulması üçün güclü təbliğat aparılırdı. Belə bir vaxtda Respublikanın hər yerində olduğu kimi Lənkəran qəzasında da buna biganə qalmayan yerli sakinlər inqilabı alqışladılar. Məhz bu münasibəti, Lənkəran qəzasının işini inqilab komitəsi bəyəndi və dəstək verildi. Lənkəran qəzasında baş verən inqilabi hadisələr görkəmli inqilabçı dövlət xadimi Nəriman Nərimanovun daima diqqət mərkəzində olmuşdur... 1921-ci ilin iyul ayında N.Nərimanov vaxt tapıb Lənkəran qəzasına gəlir. N.Nərimanovla birgə Böyükağa Talışlı, B.Mirsa-





layev, M.Qədirli (İsrafilbəyov) gəlmişlər. N.Nərimanov həmin gəlişi zamanı Masallıda olmuş, xalqın qarşısında çıxış etmişdir. N.Nərimanov gəmi ilə Qızılağaca gəldikdən sonra Masallıya getmişdir.

N.Nərimanov həmçinin Qızılağacda olarkən bu kəndə biganə qalmayıb. Qızılağacın, limanın böyük əhəmiyyətindən söz açmış və bu kəndə böyük ümid bəslədiyimi söyləmişdir. Bu barədə F.Əsədov N.Nərimanov haqqında yazılan məqalələrinin birində yazır: "N.Nərimanov Qızılağac limanından Qızılağac kəndinə, oradan da Prişibə (Göytəpəyə - N.Q) kimi dəmir yolunun çəkilməsinə böyük əhəmiyyət verirdi.

Göstərirdi ki, Lənkəran qəzasında dəmir yolu böyük fayda gətirə bilər. Təəssüf ki, həmin vacib işin təşkilinə qara qüvvələr mane oldular". (F.Əsədov. "Leninçi" qəzeti, 27 fevral, 1990-cı il).

Bütün bunlarla tanış olandan sonra həyata keçirilməyən bəzi işlərə görə insan təəssüflənir. Təəssüflənir ki, nə üçün iş görüləndə dar düşüncəli insanların sözünə baxılmalıdı? Nə üçün onların məfkurəsi, zehni, düşüncəsi xalqın tərəqqisinə, maneə olmalıdır? Həmişə belə qüvvələrə qarşı mübarizə aparmaq lazımdır. Görülən işlər isə xalqın mənafeinə xidmət edir. Xalqa xidmətində özünü kənara çəkən adamlara bizim cəmiyyətdə yeri olmamalıdır. Onların adı bizdən özləri bizdən olmayanlardır.

Qızılağac qədim liman şəhəri kimi şimalda və şərqdə tanınırdı. O cümlədən 1920-ci ilə kimi Həştərxan vilayətindən gedişgəliş daha çox olub. Liman şəhəri olan Qızılağaca dünyanın müxtəlif yerlərindən iş adamları gələrək fəaliyyət göstəriblər. Onlardan biri əslən ukraynalı olan Purman adlı iş adamı

olub. Purman (Pirman) mühəndis olub. İndiki Purman adlanan yerdə böyük vətəgə yaradıb. Tutulan balıq növlərindən alıcı təşkilatlara həm balıq, həm də balıq məhsulları satardı. Bu şəxsin vətəgəsində Qızılağacdan işləyənlər çox olub. Onlardan biri Bədəl kişidir. O deyirdi ki, Purman hətta ağ balıq da ovlatdırıb kürüsünü və ətini satdırardı. Balıqdan yapışqanı da istehsal edərmiş.

Əziz oxucu, dünya maraq dünyasıdır. O cümlədən bizim kəndin keçmişi də çox maraqlı faktlarla xatırlanır. O faktın biri Qızılağac ərazisində o dövrdə mövcud olan 3 km-dən çox uzunluğunda "vaqon" yoludur. Bu üçüncü nəqliyyat yolunu liman sahibləri alıcı təşkilatlara rahatlıq olmaq üçün inşa ediblər. Həmin yol limandan ta poçt yoluna kimi gələrmiş. Limandan gətirilən yükləri kiçik vaqonlara yükləyərmişlər. Vaqonların dartı qüvvəsi at, öküz və bəzən də yelkən olub. Uzun müddət və əsrlər keçməsinə baxmayaraq, vaqon yolundan əsər-əlamət olmasa belə yenə həmin yola el içində "Vaqon yolu" deyilir. O vaxt Qızılağacda adamların bəziləri neft ticarəti ilə məşğul olublar. Belə ki, Bakıdan gətirilən nefti xüsusi tutumlu qablara boşaldıb vaqon yolu vasitəsilə "poçt yolu"na gətirərmişlər. Vaqon yolu Azərbaycan Dəmir yolu tarixində ilk yoldan biridir. Onu da deyim ki, indiki Bakı-Astara dəmir yolu 1940-cı ildə qısa müddətə çəkilib başa çatdı. 1941-ci ildə istifadəyə verildi. Bu yolun Böyük Vətən müharibəsi illərində, aclıq illərində cənub zonasına çox xeyri oldu. Həmin dəmir yolu Qızılağac ərazisi olan Qasımlı stansiyasından keçərək kənd ilə Bakı arasında əlaqə yaradır. Həmin dövrlərdə Qızılağacın yerli sakinləri, təxminən 14 mindən çox idi. 1914-cü ilə kimi isə 17 mindən çox olduğunu söyləyirdilər.





Qızılağac ticarət üçün azad zona idi. Buna görə də kənardan çoxlu alıcılar gələrdilər. O alıcılara mədəni xidmət göstərməyi də Qızılağaclılar o vaxtlar özlərinə lazım biliblər. Həmin vaxtlarda indiki ATS-dən 40 metr aralı bazara kimi olan cərgədə ikimərtəbəli binalar olub. Keçmiş ağsaqqallardan bəziləri onları gördüklərini də söyləyirdilər. Birinci mərtəbədə dükanlar, ikinci mərtəbədə isə mehmanxanalar olub. Həmin dövrdə Xəzərin ərazisi kəndə yaxın idi. Dənizin ləpələri "Sadıq dayı diki" deyilən təpəni döyərmiş.

Bu dik kənddən 200 metr aralı olan bir yerdədir. Ağsaqqallardan, həmin dövrlərdə Həştərxana gedib-gələnlərdən eşitmişəm ki, Həştərxanda Qızılağac adında məhəllə də olub.

Birinci dünya müharibəsinə qədər Qızılağaca hər yerdən gələnlər olurdu. Müharibədən sonra bu əraziyə gələnlərin marağı azaldı. Sahibkarlar ehtiyat edərək sərmayə qoymadılar. Lənkəran qəzasında daxili ticarət getdikcə genişlənirdi. Lənkəran şəhəri, Xol-Təklə, Qala-Bazarı (Masallı) Qızılağac, Prişib, Boradigah, Astara və Lerik kəndləri qəzanın əsas bazası hesab olunurdu. Qəzada xarici ticarət də genişlənirdi. Bu ticarət başlıca olaraq dəniz vasitəsi ilə olurdu. Əsas ticarət limanları, Lənkəran şəhəri, Astara və Qızılağac kəndi idi. 1906-cı ildə Lənkəran limanı vasitəsilə kənara 1 milyon 306,661 pud, Astara vasitəsilə 1 milyon 234 min 128 pud, Qızılağac vasitəsilə 505,922 pud mal göndərilmişdir. Bu mallar düyü balıq, kürü, taxıl, tərəvəz, meşə materialları və bu materiallardan hazırlanmış müxtəlif şeylər idi" *(N.Əlizadə. Lənkəran qəzası zəhmətkeşlərinin Sovet hakimiyyətinin qələbəsi və möhkəmləndirilməsi uğrunda mübarizəsi tarixindən Bakı, 1963, səh.9.)*

Lənkəran qəzasında sovetlər uğrunda mübarizə Oktyabr İnqilabının təsiri altında xüsusi qüvvət və qüdrətlə genişlənməyə başladı. 1918-ci ilin yanvar ayında Lənkəran Qəzasının Xırmandalı, Boradigah, Qızılağac və digər kəndlərinin sakinləri torpaq komitəsi təşkil etdilər.

Bu komitənin vəzifəsi kəndliləri torpaq ilə təmin etməkdən ibarət idi. Eyni zamanda qəzanın zəhmətkeşlərinə kömək məqsədi ilə Bakı sovetinin silahlı qüvvələri 1918-ci il mart ayının 14-də Bakıdan gəmi ilə Lənkərana göndərildi. Bu hissələr mart ayının 15-də qəzaya gəlib, bolşevik təsirinin güclü olduğu Qızılağac və Nikolayevka (Kalinovka) ilə üzbəüz sahildən 3 km uzaqda dənizdə dayandılar.

**Qeyd:** Nikolayevkada (Kalinovka) olan ruslara qızılağaclıların əvvəlcə münasibəti çox pis olmuşdur. Hətta qızılağaclılar onlarla dava etmək dərəcəsinə çatmışdılar. Lakin dövrün nüfuzlu ağsaqqalı olan Kərbəlayi Əliəkbərin sözü öz təsirini göstərmişdir. Kərbəlayi Əliəkbər qızılağaclılara deyib: "Onu da bilin ki, ruslar Nikolayevdəki ruslarla qurtarmır. Əgər münaqişə yaratsaq Şimaldan gələn rusların qarşısında dayana bilmərik. Gəlin mehribançılığı üstün tutaq". O gündən Nikolayevkada olan ruslarla mehriban münasibət saxladılar. Kərbəlayi Əliəkbərin bu tövsiyəsi peyğəmbər (ə)-in ***"qonşu-qonşuya yaxınlıq etsə mömin olar"*** kəlamını xatırlatdı. İndi artıq Kalinovka kəndində ruslar demək olar ki yoxdurlar. Qalan 6-7 nəfər rus millətindən olanlardır, qocalardır. Kənd özü tamamilə azərbaycanlıların yaşayış məskənıdır.





## QIZILAĞACDA DÖYÜŞ ƏMƏLİYYATLARI

Qızılağac Liman şəhəri olduğu üçün inqilab vaxtında hadisələrin cərəyan etməsində əsas sahələrdən biriidi. Yazıçı Yusif Şirvan özünün "Buludlar dağılır" kitabında o hadisələri belə canlandırıb:

... Vəziyyəti belə görəndə Əkbərov Qızılağaca adam göndərməyi tələb etdi. Bu iş Davud xana tapşırıldı. Davud xanın rəngi dərhal qaçdı. Lakin çarəsiz qalıb beş atlı ilə oraya getməyə razı oldu. Səhər saat altıda poçt xtdmətçisi təşviş içərisində qərargaha gəldi.

- Qızılağacdan teleqram var... Əkbərov teleqramı ondan özü aldı, açıb oxudu və dərhal dinməzcə kresloya oturdu. Teleqram onun əlindən düşdü. O, gözünün işarəsi ilə onu Bayraməli bəyə göstərdi.

Bayraməli bəy teleqramı götürdü. Bu zaman Əkbərovdan başqa hamı onun başına toplaşdı. Teleqramda aşağıdakı sözlər yazılmışdı: "sahilə sağ-salamat çıxdıq. Qızılağaca vurduğunuz teleqramların hamısı bizə çatdı. Hər şey öz qaydasındadır. Tezliklə görüşəcəyik. Mirəli" bu xəbər elə bil hamının başına soyuq su tökdü. Ortalığa uzun bir sükut çökdü. Bu sükutu dili topuq vuran Əsgər xan pozdu.

- Bəs... bi-bi-biz... indi, nə edəcəyik?

Əkbərov dərhal ona cavab verdi:

- Şələ-küləmizi yığışdırıb qaçmaqdan başqa nə çarəmiz var ki?

Əsgər xan bu sözlərdəki istehzanın onun qorxaqlığına işarə olduğunu anlamadı. Əkbərov sonra ayağa qalxıb Mir Əsəd xanın yanına gəldi...

- Xan, beləcə oturub fal açmadan bir şey çıxmaz. Məncə seçilən adamlar burada qalsın, qalanları isə getsinlər və əmrə müntəzir olsunlar.

Mir Əsədxan, Sergeyev, baron Osten, Əkbərov və Bayraməli bəydən başqa salondakılar dağılışıb evlərinə getdilər. Əsgər xan salonu çox könülsüz tərk etdi. Salon boşalan kimi Əkbərov general Sergeyevə müraciət etdi:

- Hə general, indi qoç meydanıdır. Bir ildir ki, qoçaqlığımızdan dəm vururduq. Ay nə bilim hökumət belə gəldi, azadlıq belə getdi... indi görək nə edə biləcəyik?

Sergeyev qoltuq cibindən bir xəritə çıxarıb masa üzərinə sərdi. Otaqdakılar dərhal onun başına toplaşdı. Fikir mübadiləsi zamanı Əkbərov hiss etdi ki, baron Osten generaldan daha yaxşı yol seçmişdir. Baronun gəldiyi nəticə bu idi:

- Onlar şəhərə ancaq iki yolla gedə bilərlər. Bunun biri Qalabazarı Boradigah yoludur.

Biz gərək onları birinci yol ilə gəlməyə qoymayaq. Burada çoxlu yaşayış məntəqəsi var və kəndlilər asanlıqla onlara qoşula bilərlər. İkinci yol isə dəniz sahili ilə gəlir və burada yaxşı müdafiə xətləri yaratmaq olar. Bataqlıqlar ilə dəniz arasındakı dar sahə onların qabağını kəsmək və sonra oradaca asanlıqla məhv etmək üçün bizə imkan verər...

... Əkbərov Ostenin sözünü kəsdi:

- Baron, bunları biz də bilirik. Sən de görüm düşməni məhv etmək üçün nə təklif edirsən?

- Bircə şey: təcili olaraq Qızılağaca getməli, düşməni orada məhv etməliyik. Əgər oradan hərəkət etmişlərsə onları Boradigah tərəfə buraxmamalı və sahil boyunda, bataqlıqlar arasında əzməliyik. Əkbərov soruşdu:





- Bu işi kimə tapşıraq?

- Döyüşə biz özümüz rəhbərlik edəcəyik. Günü bu gün hərəkətə keçib düşmənin üstünü almalıyıq. Sergeyevdə bu fikirdə idi. O, Lənkərandakı silahlı qüvvələrin dərhal səfərə hazır olması haqda əmr verdi.

Ostenin ixtiyarında olan "Milli alay" vaxtında hazır oldu, Saturovun komandanlıq edəcəyi qüvvə isə əmri vaxtında yerinə yetirmədi. Bu zaman gah topların açarı tapılmır, gah pulemyotun döyüşə hazır olmaması müəyyən olurdu. Heç kəs bu zaman Saturovun bu işdə ciddi səhlənkarlıq etdiyini başa düşmürdü.

İnqilabçılara qarşı əməliyyata başçılığın ona yox, özünü müsəlmanlara yaxın dost hesab edən baron Ostenə və Sergeyevə tapşırılması Saturova çox toxunmuşdu. Ona görə hər kiçik imkandan istifadə edərək hazırlığı gecikdirir və pozurdu.

Bu məsələni hamıdan əvvəl baron Osten başa düşdü. O, gəlib vəziyyəti Əkbərova xəbər verdi.

- Bu daşnak köpək oğlu yenə bizə badalaq gəlmək istəyir, - deyə Əkbərov Sergeyevdən onu vəzifəsindən kənar etməyi tələb etdi. Sergeyev Saturovdan qorxduğu kimi Əkbərovdan və indiki müttəfiqi olduğu yerli xanlardan da çəkinirdi.

Ertəsi günü Saturov vəzifəsindən kənar edildi və onun yerinə Jukovski təyin edildi. Saturova isə qorxulu yerdə vuruşmalı olacaq başqa bir hissənin komandası tapşırıldı.

... Lənkərandakı hərbi qüvvənin dan yeri yenicə söküləndə şimala doğru hərəkət etməsi qərara alındı.

"Bakinets" gəmisi ilə Qızılağaca çıxan qüvvə dərhal Qızılağac və Nikolayevka kəndlərini tutmuş, Sergeyevin ora göndərdiyi zabiti poçt idarəsində əsir almışdı.

- Üç mühüm yol ağzında olan Qızılağacın alınması Lənkərandakı irtica qüvvələrinə böyük zərbə idi. Bu Muğandakı qüvvələr ilə Lənkərandakı qüvvələri bir-birindən ayırır, inqilabçılara isə Qumbaşı və Sara fəhlələri ilə bilavasitə əlaqə yaratmaqda imkan verirdi.

Şəhərdəki irtica qüvvələri hazırlığı davam etdirdiyi müddət ərzində inqilabçıların çoxdan hazırlıq görən silahlı qüvvələri də Boradigah tərəfdən keçib Qızılağac yanında Bakıdan gələn hissəyə qoşulmuş oldular. İndi inqilabçıların minə yaxın silahlı döyüşçüsü vardı.

İnqilabçılar Lənkərana doğru hücuma keçmək üçün hazırlıqla məşğul olduqları iki gün ərzində Ostenin başçılıq etdiyi qüvvə də gəlib Qızılağacın cənub və qərb tərəfindəki bir neçə yaşayış məntəqəsinə girmiş, Yeddioymaq, Qasımlı, Şıxlar kəndindəki bəylər də onlara qoşulmuşdu. Çoxdan bəri torpaq üstündə Nikolayevka (Kalinovka) kəndlərindəki ruslara düşmənçilik edən bəy və qolçomaqların təhriki ilə bu kəndlərin bəzi sakinləri də silahlanmışdı. Cümə günü tezdən şəhərdən gələn qüvvələr Qızılağacı top atəşinə tutdular. İnqilabçıların yalnız iki topu olduğu üçün onlar düşmən toplarını susdura bilmədilər. Düşmən qüvvəsi iki istiqamətdən hücuma keçdi. Jukovskinin başçılıq etdiyi hissə cənubdan, ikinci Yeddioymaq və indiki Təzəkənd tərəfdən hücum edərək Qızılağacı ələ keçirmək istəyirdi. Ostenin başçılıq etdiyi dəstə isə birinci Yeddioymaq və Qasımlı tərəfdən hücuma keçərək Nikolayevkanı almaq, inqilabçıları Qalabazardan və Muğandan ayırmaq məqsədini güdürdü. Bütün günü davam edən atışma ikinci gün xeyli şidətləndi. Arustamov və Salehin başçılıq etdiyi yerli inqilabçılar birinci Yeddioymaq yanında bir qədər geri çəkilib





düşməni irəli buraxdıqdan sonra hücuma keçdilər və günortadan az sonra inqilabçıların beş yüz nəfərlik dəstəsi düşmənin min nəfərlik qüvvəsini əzişdirdi və bir neçə kilometr geri çəkilməyə məcbur etdi. İrtica qüvvələri toplardan şiddətli yaylım atəşi açdılarsa da bu kömək etmədi. Yeddioymaq döyüşü inqilabçılarda qələbəyə böyük inam qazandırdı. Lakin bu zaman onlar ciddi bir çatışmazlıq da hiss etdilər...

Düşmən top və pulemyotlardan geniş istifadə edirdi. Onların isə iki kiçik topu vardı və döyüşün ilk saatlarında mərmiləri qurtarmışdı. Ayın səkkizində Privolnudan yüzə yaxın kəndli gəlib inqilabçılara qoşuldu. Bu isə vəziyyətə az təsir etdi. İnqilabçılar düşmənin xeyli üstün olduğunu açıqdan-açığa hiss edirdi. Odur ki, martın səkkizinci gecəsi Petrov xüsusi barkaz ilə Bakıya yola düşməli oldu.

Ayın doqquzunda Ostenin dəstəsi yenidən hücuma keçmək istədi. Lakin Bola Məmmədin öhdəsinə verilmiş kiçik bir dəstə Viləş çayı tərəfdən atəş açdı və onları mövqelərinə qaytarmağa məcbur etdi. Axşam üstü Jukovski bir batalyon kazakla dəniz sahilindən hücuma keçdi, lakin onu da asanlıqla geri qaytardılar. Əkbərov o axşam Sergeyevlə döyüş meydanına gəldi. İrtica qüvvələrinə dəyən ağır zərbə Əkbərovu dərhal qorxutdu. O, inqilabçıların xeyli az olduğunu bilirdi. Onların içərisində Bakıdan gələn iki zabit və Arustamovdan başqa hərbi biliyə malik olan da yox idi. Bəs onlar nə üçün iki minlik bir qüvvəni geri oturda bilirdilər?

Burada xəyanət ola bilməzdimi? Əkbərov bu münasibətlə xan ailəsindən olan bir zabitə müraciət etdi və onlan heç bir təmənnaedici cavab ala bilmədi.

Hamı yaxşı vuruşur. Amma mənə belə gəlir ki, rus soldat-

ları döyüşə bir o qədər də könüllə getmirlər.

- Bununda ki, qabağını almaq mümkün olmayacaq. Əkbərov yeni qüvvə vəd edib geri qayıtdı. O, gedib Astaradan sərhəd hissələrindən və yerli xanların rəiyyətlərindən yeni hərbi dəstələr düzəltdirmək fikrində idi. Lakin onun planı Lənkəranda bir o qədər də hüsn-rəğbətlə qarşılanmadı. Xanlardan heç biri öz rəiyyətindən silahlı qüvvə yaratmaq istəmədi.

O günü Əkbərovun məsləhəti üzrə Mirkazım axund və Bayraməli bəy Lerik tərəfə yola düşdü. Onlar gedib Lənkərandakı hadisələrdən xəbərsiz olan kəndlərdən silahlı qüvvə toplamalı idilər. Bu təşəbbüs pis nəticə vermədi. Həmin kəndlərin molla və hampaları onlara məmnuniyyətlə kömək etməyə razılıq verdilər. Biləsuvardan tutmuş Astaraya kimi dağ kəndlərində cihad elan edildi və martın ortalarında çaxmaqlı tüfəngdən tutmuş müasir alman, ingilis və Avstriya tüfənglərinə qədər müxtəlif silah növü ilə qurşanmış bir neçə yüz atlı Lənkərana gəldi.

Bakı komitəsi Lənkəran cəbhəsində əmələ gələn vəziyyəti müzakirə etdikdən sonra oraya ikinci dəfə kömək göndərməyi qərara aldı. Üç yüzə yaxın qızıl qvardiyaçı və Bakı fəhləsi "Jander" gəmisi ilə Qızılağaca yola düşdü. Bu dəfə onlar özləri ilə bir neçə top və pulemyot da gətirirdilər.

"Jander"in Qızılağac yanında sahilə yan almasından xəbər tutan düşmən ona mərmi yağdırmağa başladısa da, bu bir nəticə vermədi. Gəmi ilə gələn qüvvə gecə qaranlığında sahilə çıxarıldı. Toplar hələ ləpədöyəndə ikən lülələrini sahilə doğru çevirərək düşmən mövqelərini atəşə tutdular...





## DƏNİZ YOLU

Qızılağacda olan limana böyük yük gəmiləri, barjlar Rusiyadan taxta-şalban və digər zəruri məhsullar gətirərək Cənub Zonasının adamlarına yetirərdilər.

Dəniz sahilində o dövrdə taxta emal edən sex, balıq vətəgələri və digər xidmət sahələri mövcud idi. Qızılağaclı sahibkarlar gətirilən materialları müştərilərə satardılar. Bu yerdə olan liman bölgələr üçün əlverişli idi. Çünkü limandan yükü vaqon yolu vasitəsi ilə poçt yoluna çıxardıb rahat aparırmışlar. Görkəmli şair M.Hadinin bu fikri yadıma düşdü.

***Əmdiyim südlə içdiyim suyu mən***
***Borcluyam həm sənə, sevimli vətən***
***"Ey Vətən, ey zəmilərin gözəli***
***Mislini görmədim cahan gözəli***
***Ey mənim qibləgahım, vicdanım.***

Bəli hamı bu vətən torpağına borcludur. Bu borc ondan ibarətdir ki, onun tarixin biləsən. Dahi Koppenə görə dünyada olan on bir iqlimin doqquzu Azərbaycandadır. Onun yeddisi isə cənub zonasında. Əli Abdullah Şeyx Baba Kuhi Bakuvi (933-105) Şamaxıdan Şiraza gedərkən Kürün sol sahili boyunca Səlyana gəlir. Oradan Qızılağaca və Lənkərana, Astaraya, Rəştə gedir. Ehtimal ki, bu gediş dəniz nəqliyyatı ilə olub. Afanasiy Nikitin dəniz yolu ilə Mazandarana (1466-cı il) getmişdir.

## VİLƏŞ ÇAYI KƏNDİN İÇƏRİSİNDƏN KEÇİRDİ

Qədim Qızılağac kəndinin içərisində indi evlərin əhatəsində olan bir yer var. O yerin adı "Quru çay"dır. İndi də o cür adlanır. Bəs necə olub, bu yer belə adlanıb? Keçmişə nəzər salaq. Ağsaqqallar kəndin keçmişini həmişə xatırlayırlar. Mən də onların söhbətinə diqqətlə qulaq asıb qeydiyyat aparırdım. O cümlədən "Quru çay" əhvalatı öz tarixi ilə diqqəti çox cəlb edirdi. Adını eşitdiyimizin yaranma səbəbini də gərək öyrənək. Ad varsa, demək bu ad mövcud olana verilib.

***Bilsək əcdadının qədrini uca***
***Adın ləkələnməz dünya durduqca***
***Nə qədər ki, vardır əlində qüdrət***
***Kərəm sahibi ol, göstər kəramət.***
***(Sədi)***

Mərhəmət göstərib o söhbətləri edənlərə həyatım boyu minnətdaram. Onlar mənə böyük tarix söyləyiblər. Viləş çayı böyük çaylardan biridir. Tarixi mənbələrdə Viləş çayın adı eramızdan əvvəlki minilliklərdə çəkilir. Eramızın 90-168-ci illərində Ptolomey Xəzər dənizinin xəritəsini çəkərək Viləş çayının Qızılağac körfəzinə töküldüyünü göstərir. Viləş subtropik zonanın yeganə iri dağ çayıdır. Mənbəyini Yardımlı və Lerik ərazisindən, Talış Silsilə dağ yamaclarından götürür. Uzunluğu 115 km, hövzəsinin sahəsi 935 km$^2$-dir. Neçə-neçə billur dağ çeşməsinin, bumbuz bulaqların suyu birləşir, Viləşçay yaranır. Bu cür vəsf edilən Viləş kəndimizin içindən keçirdi. Ləmsə (Kalinovka) kəndinin qabaq hissəsindən onun istiqaməti Qızılağaca idi. Həmin vaxtlar da çay indiki "Quru





çay" adlanan yerdən keçərək, rəvayətə görə kəndin qiblə səmtində olan "Ülgə" adlanan körpüdən keçərək Xəzərə tökülərmiş. Digər rəvayətə görə çay kəndə "Quru çay"dan "Şkola" qabağındakı yolun yerindən axıb Həsəncan kişinin evinin arxasından keçərək dənizə tökülərmiş. Hər iki söyləyəndən biri düzdür: Məqsəd haradan keçməsindədir. Bəs nə səbəb oldu ki, çay istiqamətini dəyişdi. Yenə müdrik ağsaqqal sözünə ehtiyac var. Görək onlar nə deyir.

Ağaverdi Ağaəli oğlu, Seyid Rəsul, Həsəncan, Mir Musa ağa və s. əhvalatı belə söyləyərdilər.

Viləş çaylar içərisində ən şıltaq çaydır. Suyu gah çox olur, gah da az. Suyun az vaxtında kəndin kiçik yaşlı sakinlərindən biri suya düşərək boğulur. Bunu görən camaat gələcəkdə belə qurbanların çox olacağını fikirləşir. Odur ki, Məsim adlı ağsaqqal (bu şəxsin kənddə nəticələri çoxluq təşkil edir) məsləhət görür ki, çayın kəndə gələn axın istiqamətini dəyişdirsinlər. Məsim kişinin yeddi oğlu var imiş. Bu işi Məsim kişi öz üzərinə götürür və yeddi oğlu ilə Ləmsə (Kalinovka) kəndinin qabağından kəndə gələn çayın istiqamətini dəyişmək üçün çığır açırlar. Çayın kəndə gələn yerinə isə bənd vuraraq möhkəmlədirlər. Yay fəslində suyu az olan çayın axını məcrasını dəyişir, indiki istiqamətdə yol tutur. Əvvəl çayın axını olan yerə su gəlmədiyindən yerin adı "Quru çay" qaldı. Şair Mirkazım Aslanlı (Sarəng) Viləşə həsr etdiyi şeirdə deyir:

***Ax Viləş qəlbimdə qanlar tək***
***fəqanlar tək, Viləş.***
***... Könlümə lay-lay çalan sənsən***
***kamanlar tək Viləş...***

## QIZILAĞAC QƏBRİSTANLIĞI

Kənd qəbristanlığının çox qədim tarixi var. Qədimliyi üçün əsas Sultan pir ziyarətgahı və orada olan Kufi xətlə yazılan Sandıq tipli baş daşlarıdır. Ocağın sol tərəfində bir daş var. Ona əno (dalaq) daşı deyərlər. İnamı olanlar əvvəllər gəlib o daşın üstünə üzü aşağı uzanardılar. Bir neçə dəqiqədən sonra durub gedəndə, özlərini sağlam hiss edərdilər. Qəbristanlıq ərazisində qəbir qazanda hər yerdə köhnə qəbir əlamətləri görünür. Əvvəllər qəbristanlıq sıx qarağac meşəsi olub.



*Qəbristanlığın giriş hissəsi*

Hətta gündüz ora qorxudan girmək olmazmış. Çoxlu yırtıcı heyvanlar olarmış.







*Sultan Pir ziyarətgahı*



*Qəbristanlığın ümumi görünüşü*

Məhərrəm ayında qəbristanlıqda aşura mərasimləri keçirilir. Aşura günü kənar yerlərdən də bura çoxlu insanlar gəlir. Həmin günlərdə aşura mərasimi çox canlı təsir bağışlayır. Mərasim Sultan pir ziyarətgahının ətrafında tamamlanır. Qəbristanlığın ərazisi 3 hektardan çoxdur. Burada görkəmli din xadimləri, alimlər, seyidlər, o cümlədən kəramət sahibləri olan Sultan pir, Mir Həsən ağa, Mir Cəfər ağa kimi imanlı şəxslər də dəfn olmuşlar.

2004-cü ildə xeyriyyəçi Hacı Məhəmməd Nəsir qəbristanlığın girişindəki köhnə namazgahın yerində bu namazgahı inşa etdirdi. Namazgahı Asəf Cəfərovun layihəsi əsasında Füzuli, Ağaşirin, Cəmil Qurbanov qardaşları təmənnasız inşa etdilər.



***Bu namazgahı 2004-cü ildə Hacı Məhəmməd Nəsir oğlanları Namiq və Rasimin köməyi ilə inşa etmişdir.***





## KİÇİK HAMAM

Əvvəlki mövzularda Qızılağacın ticarət mərkəzi olduğunu qeyd etdim. Onu da bildirmək istəyirəm ki, bu kənddə iki hamam da olub. İkisi də eyni vaxtda fəaliyyət göstərirmiş.

Kiçik hamam bizim babamız "Kərbəlayı Nəsrullah hamamı" idi. Onun yeri indiki Mədəniyyət evinin giriş qapısının gün batanında idi. Hazırda onun yerində aptek, dəllək dükanı tikilib. Əsasən qış fəslində tez qızarmış, hamamın çimilən yeri yerin altında - 2 metr dərinlikdə imiş. Bir az odunla qızarmış. Böyük hamamdan fərqli cəhəti onun kiçik olması idi.

Bu hamamda kiçik axund Molla Abdulla təmizlikdən çıxıb qurulanan yerdə vəfat edib. Allah rəhmət eləsin. Hamam 1937-ci ildə sahibləri sürgün edildiyinə görə bağlanıldı. Baxımsızlıq ucbatından uçulub-dağıldı. 1949-cu ildə onun avadanlıqları sökülüb hərbi hissəyə aparılıb və orada hamam tikilib *(Məhərrəm müəllimin dediyinə əsasən)*. Hamamın quyusu son illərə qədər qalırdı.

## BÖYÜK HAMAM

Böyük hamam məşhur xeyriyyəçi Hacı Məmmədə məxsus idi. Tikilmə tarixi məlum deyil. Ancaq Hacının yaşadığı dövrlə götürülsə, 180 ildən yuxarıdı. Hamam gözəl memarlıq əsəridir. Özünə məxsus Şərq memarlıq üslubunda tikilib. İçərisində çoxlu sayda kiçik hücrələr, çimmək üçün fərdi və

ümumi salonları var. Qüsul etmək, və s. fərdi xidmətlər üçün hücrələr, xəlvətxanalar ümumi salonda da mövcuddur.

Deyilənlərə görə həmin hücrələrin hamısından istifadə olunurdu. Hamam çox gözəl qızma ardıcıllığına malikdir. Kürəxana yerdən 3 metr, hamamın çimilən yeri isə 2 metr dərinlikdə idi. Kürəxananın içərisinə odun yığılır və sonra yandırılırdı. Yanan odunun tüstüsü çimilən yerin altındakı boşluğu dövr edib bayıra çıxardı. Hətta ayaq qoyulan yer o qədər isti olardı ki, ayaq qoymaq olmazdı. Odun yanıb qurtarandan sonra kürəxanının ağzı kərpiclə hörülərdi ki, istilik bayıra çıxmasın. Bu hesaba kürəxanada olan istilik suyu və hamamı bir neçə gün isti saxlayardı.

Hamam həm də qədim şərq üslubunda şəriət tələbləri səviyyəsində tikilib. Peyğəmbər (ə) buyurub:" Hamamdan çıxandan sonra ayaqlara soyuq su tökmək bir neçə xəstəliyin müalicəsidir". Odur ki, çimilən yerdən çıxandan sonra qurulanan yerdəki çarhovuzun suyundan ayaqlara tökürlər.

Hər iki hamama qonşu kəndlərdən də gələrmişlər. Əhali çoxaldıqca böyük hamam növbəli şəkildə istifadə olunardı. Hamamın işləməyini xüsusi şeypur çalınması ilə bildirərdilər. Qonşu Yeddioymaq, Qasımlı, Kalinovka, Qədirli, Eminli, Qarğalıq və digər kəndlərdən bura yuyunmağa gələrdilər. Hamamın suyunu öz quyusu təmin edirdi. Quyudan suyu mancanaq ilə çəkib nova tökərdilər. Ordan su hovuza axardı. Su çəkən Cəfər adlı bir şəxs idi. Hamamçı isə Sadıq idi (Billə deyirdilər).







*XIX əsrin abidəsi Qədim hamam binası (Böyük hamam).*

1960-cı ildən sonra hamama müdür Yaqub Həmidovu təyin ediblər. O, yeni konstruksiyada qızdırıcılar qurdurdu və hamam mazutla işlədi. Rəhmətlik Yaqub Həmidov hamamı 40 ildən çox işlədib. İndi də onun oğlu Yaşar Həmidov işlədir.

## KƏNDDƏ DƏYİRMAN

Kənddə Quru çayın kənarında "Viniston" markalı mühərriki ilə işləyən od dəyirmanı var idi.

Bu dəyirmanın ilk müdiri Xəlil müəllim adlı gözəl xasiyyətli bir şəxs olub. Xəlil müəllim əslən iranlı olub. Ancaq Qızılağacı doğma torpağı bilirdi, o, Bakı şəhərində yaşayanda da qızılağaclılara qardaşlıq köməyini əsirgəməzdi.

Dəyirmanda çəkilən dənə haqq alardılar, o da dənin miqdarından asılı idi. İmkansızlar orda un çəkdirənlərdən kömək istəyirdilər. Bütün un çəkdirənlər orda olan imkansızlara pay verərdi. Dəyirmandan evlərə gecə vaxtı işıq verilərdi. Bu da bütün evlərin tələbatın ödəmirdi. Dən çəkdirmək üçün çox əziyyət çəkmirdilər. At arabası, əl arabası ilə dəni dəyirmana gətirərdilər. Bu dəyirmanda çəkilən undan bişirilən çörəyin iyi təndirdən xeyli kənara yayılardı. Sovxoz quruluşu dövründə də bu dəyirmandan istifadə olunurdu. Lakin dövlətin istehsal etdiyi undan mağazalara mütəmadi gətirilməsi dəyirmanda un çəkdirənlərin sayının azalmasına səbəb oldu və dəyirman fəaliyyətdən dayandı. Sonradan söküldü. Onun yeri Fərhad müəllimin evinin indiki yeridir. Son dəyirmançı İman kişi olub.





## KƏNDİN SU PROBLEMLƏRİ

Qızılağaca şirin su 1958-ci ilə kimi Kalinovka kəndinə 1909-cu ildə çəkilmiş quyulardan verilərdi. Belə ki, şirin su kənd ərazisindəki "Təmbəki" quyusuna, Müseyiblər quyusuna və "Şkola" qabağındakı quyuya gələrdi. Bu su kənd camaatının tələbatını ödəməzdi. Öküz arabası, at arabası ilə quyulardan su gətirib satardılar. Camaat nehrə, gürü, səhəng, vedrə ilə su daşıyardılar.

1957-ci ildə kənd camaatı Kalinovkadakı (Qızılağaca gələndə) yolun sağ tərəfində olan quyudan kəndə su çəkməyi qərara aldılar. İşin həcmi çox və ağır idi. Çoxlu işçi qüvvəsinə ehtiyac var idi. O vaxt qazma texnikası yox idi. Kənarlarda, Sarıda, Portda yaşayan qızılağaclılar da bir yerə yığışıb bu suyun kəndə gəlməsinə münasibətlərini bildirdilər. Onlar uzunluğu 3 km olan məsafədən suyu gətirmək üçün kömək etməyə söz verdilər. Boru çəkiləcək yerlər təsərrüfat hesabı ilə bölündü. Qazıntı aparmaq üçün hazırlıq görüldü. Bəzi yerlərdə 4-6 metr dərinliyində xəndəklər qazılırdı. Daşlı-çınqıllı yerləri lomla, külünglə qoparırdılar. Hər gün Port-İliçdən, Sarıdan 45-50 nəfər maşınla köməyə gəlirdi. 4 il müddətinə həmin iş hamamın yanındakı quyuda tamamlandı. Qara çuqun su boruları 200 mm diametrində olmaqla, uzunluğu 5 metr idi. O boruları da əl ilə qazılan yerə qoyaraq birləşən yerlərini kipləşdirirdilər.

Hərbi şəhərcik ərazində 3 quyu, kənd ərazində isə 7 quyu inşa edildi. Su quyulara gələndən sonra, camaat quyulardan suyu çəkib istifadə edirdilər. Kalinovkadakı quyulara su Ərkivandan "Mehdi" bulağından gəlirdi. 1970-ci ildə bulaqdan is-

tifadə edənlərin sayı çox olduğu üçün, su Kalinovkaya gələn borudan kəsildi. Sovxozun direktoru İbrahim Səlimov dövlət vəsaiti hesabına Ərkivandan su xətti çəkdirmək üçün böyük ərazi aldı, orada 9 ədəd quyu qazıldı. Suları bir-birinə birləşdirildi.

Su nasoslar vasitəsilə hündürlükdə qoyulan çənlərə vurulurdu su, yeni çəkilən xətt ilə Lürən, Gəyəçöl, Şıxlar, Yeddioymaq, Kalinovka kəndlərindən keçərək Qızılağaca gələn yolun sol tərəfi ilə "Kolxoz həyəti" deyilən yerə qədər gətirildi. Həmin yerdə böyük su çəni (başnya) qoydular. Suyu ora vurmaqla kəndə çəkilən yeni borularla paylayırdılar. Ordan da su hər şəxsin evinə çəkdiyi boru ilə həyətinə gəlirdi. Bir neçə il bu xəttdən istifadə olundu. Sonra su keçən kəndlərin adamları o xətti korladılar. Suyun Qızılağaca gəlməsi kəsildi. Abdullayev Əhməd Mirsaleh oğlu kəndin içərisində "Əzim diki" deyilən yerdə 100 metr dərinliyində artezian quyu qazdırdı. Ordan da su şor çıxdı. Su problem olaraq yenə də qalır. 1986-cı ildə "Viləş" tikinti idarəsi kənd yollarına və məhəllələrə şirin su xətləri çəkdi. Bura su Viləş çay dəryaçasında tikiləcək təmizləyici qurğuda təmizləndikdən sonra gələcəkdi. O da SSRİ dağılandan sonra yarımçıq qaldı. Onu da deyim ki, Əhməd Abdullayev respublika torpaq idarəsinə kənd ərazisində başqa quyular qazmaq üçün müraciət etmiş, bu zaman ona bildiriblər: Qızılığacdan 14 km. aralı ərazidə şirin su süxurları var. Qızılağac ərazisində şirin su çuxurları yoxdur. Ona görə də bundan sonra yeni artezian quyuların qazılmasına ehtiyac olmadı.





## RABİTƏ

Kənddə əvvəllər rabitə şöbəsi olmayıb. Qəzet və bağlamalar Kalinovka kəndindəki mərkəzi poçt şöbəsindən gətirilirdi.

1970-ci ildən sonra Rabitə şöbəsi yarandı. Sonradan 100 yerlik ATS quruldu. İndi isə müasir tipli ATS kənd camaatına xidmət edir. Kənddə əməliyyat kassası da fəaliyyət göstərir.

## MƏDƏNİ-MAARİF VƏ MƏİŞƏT İŞLƏRİ

Qızılağac kəndində 1957-ci ilə kimi qış klubu (1939-cu ilə kimi onun yerində daş təkkəsi var idi) səyyar kino nümayiş etdirmək üçün əsas bina idi.



*Keçmiş kənd klubu (daş təkkəsinin yeri)*

Sonra 1960-cı ildə məscidin həyətindəki köhnə mədrəsənin yerində voleybol meydançasını ləğv edib yay klubu tikdilər. Yayda kino orada nümayiş etdirilirdi. 1961-ci ildə Mədəniyyət evi tikilib istifadəyə verildi. Kolxoz və sovxoz idarə-

si orada yerləşdi. Kənddə 1964-cü ilə kimi kolxoz, 1964-cü ildən isə sovxoz fəaliyyət göstərmişdir.

1961-ci ildə kəndə Mingəçevir işığı verilməyə başladı. Hər evə sayğac qoyuldu, kənd camaatı işıqdan istifadə etməyə başladı.

1956-59-cu illərdə məktəbdə oxuyan şagirdlər özfəaliyyət dərnəklərində öz istedadlarını nümayiş etdirirdilər. Onlar S.Vurğunun "Vaqif", C.Məmmədquluzadənin "Ölülər" və s. əsərləri səhnələşdirirdilər. Bu tamaşalar qış klubuna bitişik kitabxana binasının həyətində icra olunardı. 1964-cü ildən sonra Məişət binası tikildi. Kəndin ictimai inkişafı yüksəldi. 1970-ci ildən sonra yeni tipli məişət binası istifadəyə verildi. İndi isə xüsusi dükanlar da fəaliyyət göstərir. Bir neçə yeməkxana və pavilyon var.

Kənddə 2 mərtəbəli kənd soveti binası kimi tanınan bina Masallı rayonunun mərkəzi bankı olub. 1924-cü ildə bank Masallıya köçürülüb. 1975-ci ildən sonra kəndin "Ülgə" ərazisində iri heyvandarlıq kompleksi tikildi.



*Mədəniyyət evi*






# Din xadimləri




## ŞEYX FƏTULLA AXUND

***Əgər bu elmi istəsən, əvvəl gərək bəndəçiliyin həqiqətini özündə axtarasan. Elmi əməl etməklə tələb et. Məsələləri başa düşməyi Allahdan istə ki, o da bunları sənə dərk elətdirsin.***

Şeyx Fətulla axund İsmayıl oğlu Bahadırlı 1837-ci ildə Qızılağac kəndində anadan olmuşdur. İbtidai təhsilini mollaxanada aldıqdan sonra atası İsmayıl kişinin arzusu və məsləhəti ilə Ərdəbil şəhərinə yola düşüb orada orta ruhani təhsili alıb. Ərəb dilinin qrammatikasını öyrənəndən sonra Nəcəf şəhərində ali ruhani məktəbinə daxil olmuşdur. Nəcəfdə 24 fənn üzrə elm öyrənən tələbələr şəxsi maraqlarından asılı olaraq biri fəlsəfəyə, digəri, fiqh elminə, bəzisi də astronomiyaya güclü meyl və maraq göstərirdi.

Şeyx Fətulla axundun ən çox sevdiyi elm astronomiya idi. Onu tanıyan yaşlı adamların söhbətləri yaddaşlardan-yaddaşlara ötürülüb bu günəcən gəlib çıxıb. Deyilənə görə Şeyx Fətulla axund şərqin böyük alimi Nəsrəddin Tusinin astronomik hesablama cədvəlinə mükəmməl bələd olduğundan orucluğun, məhərrəmliyin və ya Novruz bayramının, Qurban bayramının hansı gün olacağını bilmək üçün ətraf kəndlərdən də tanınmış alimlər ona üz tuturmuşlar.

Şeyx Fətulla da digər din xadimləri kimi maarifpərvər bir şəxsiyyət olub. Oğlu Şeyx Əsəd axund onun yolunu davam etdirmiş, ümid bəslədiyi tələbələrindən olmuşdur.

Şeyx Fətulla axund 1912-ci ildə 75 yaşında vəfat etmişdir.

Məzarı unudulmasın deyə qəbrinin üstə kiçik bir abidə tikilmişdir. Qızılağaclılar onun ruhuna yas mərasimlərində həmişə fatihə surəsi oxuyurlar.

Mən 15 il Xıl kəndində baş mühəndis işləmişəm. Orada olan dünya görmüş müdrik qocalardan Şeyx Fətulla axund haqqında çoxlu xatirələr eşitmişəm. Onlardan biri budur. Şeyx Fətulla axundla eyni dövrdə yaşamış Molla Mücrimlə dost olmuşlar. Molla Mücrim şeyx Fətulla axundun şəxsiyyətinə və elminə qibtə edərmiş.

**Haşiyə:** Hacı Mirzə Məhəmməd Hacı Əli oğlu (Mücrim) 1871-ci ildə Cənubi Azərbaycanın Ərdəbil mahalının Pilaçay kəndində anadan olmuşdu. Təhsilini Tehranda və Nəcəfdə almış, 25 yaşında dayısının dəvəti ilə Lənkəran qəzasının Öncəqala kəndinə köçüb gəlmişdir. Bir müddətdən sonra Molla Mücrüm Xıl kəndindən olan bir qızla ailə həyatı qurmuşdur. Xıl kəndinə köçərək ömrünün axırına qədər orada yaşamışdır. "Mücrim" (günahkar) təxəllüsü ilə farsca və ərəbcə şeirlər yazarmış. Onun yüzlərcə qəsidə, münacat, mərsiyə və rübailəri, şeirlə qələmə aldığı qısa hekayələri "divan" halında tərtib edilmişdir. O, 1915-ci ildə Xıl kəndində vəfat etmişdir.

Xıl ağsaqqalları deyərdilər: Molla Mücrim bütün şəri məsələlərdə Şeyx Fətullaha inanarmış. Deyirlər ki, Ramazan ayının əvvəl və axırını, qurban və novruz bayramı günləri haqda ondan məlumatlar alarmışlar. Molla Mücrim öz tərəfindən bir adam göndərərmiş Şeyx Fətullahın yanına Ramazan haqda məlumat öyrənsin. O isə deyərmiş ki, bu axşam niyyət axşamıdır və yaxud fitr axşamıdır. Əgər inanmasalar gələrlər





ayı qoltuğumun altından çıxarıb onlara göstərərəm.

... Bu söyləmələr həm Xılda həm də Qızılağacda tez-tez danışılardı. O dövrün tanınmış axundu ilə Şeyx Fətulla arasında müəyyən şəriət məsələlərinə görə narazılıqlar da olarmış. Onların arasında elmi soyuqluq əlaməti var idi. Səbəb də bu olub; Şeyx Fətulla bu ərazidə astronomiya üzrə kamil bilikli alim imiş. Axund Ərdəbilə gedəndə dövrün müctəhidinin xidmətində olur. Hal-əhvaldan sonra həmin axund müctəhidə deyir: Şeyx həzrətləri, Qızılağaclı Şeyx Fətulla özündən hökm verir. Müctəhid deyir ki, mən bilirəm ki, Şeyx Fətullah imandar, təqvalı, pəhrizkar bir alimdir. O heç vaxt şəriətə müxalif olmaz. Nə isə Müctəhid bir məktub yazıb göndərir Şeyx Fətullaha ki, məktubu alan kimi Ərdəbilə gəl, yol xərci mali imamdan ödəniləcək. Şeyx Fətulla Ərdəbilə gedir. Müctəhidin xidmətinə təşrif aparır. İçəri daxil olanda həmin axundu onun yanında oturan görür. Müctəhid hal-əhvalı soruşandan sonra deyir: Şeyx Fətulla, eşitdim özündən hökm verirsən. Şeyx Fətulla deyir ola bilməz. Başa düşür ki, bu sualla ona müraciət etməyi həmin axund lazım bilib.

Yenə deyər şeyx, bəs ay haqqında, Ramazanın əvvəli və axırı barədə hökm verirsən? Şeyx Fətulla deyir: Şeyx həzrətləri mən belə hərəkət edirəm. Ramazan ayında hər gün səhər axşam məsciddə mənə iqtida edib namaz qılırlar. Orucluğun əvvəl axşamında deyirəm, mən sübh namazına gəlməyəcəyəm. Sual edirlər: Şeyx, nə üçün gəlməyəcəksiniz. Cavab verirəm ki, mən bu axşam niyyət axşamı edəcəyəm.



*Şeyx Fətulla məqbərəsi.*

Ayın axırında da həmçinin axşam namazına gəlməyəcəyəm deyirəm. Sual edirlər nə üçün? Deyirəm ki, fitr axşamı edəcəyəm. Mənə inananlar əməl edirlər. Mən heç kəsi məcbur etmirəm.

Şeyx Fətulla ilə eyni sahə üzrə ixtisası olanlar da biri də Şeyx Əsədulla olub. Bir gün orucluq ayının daxil olması müxtəlif günlərə aid edilir. Şeyx Əsədulla gəlir Şeyx Fətullanın yanına və deyir: Şeyx Fətulla, eşitmişəm ki, bu gün oruc tutdurmusan? Şeyx Fətulla deyir: Şeyx Əsədulla, mən özüm buna əməl etmişəm, hətta həyat yoldaşıma da bu gün oruc tutmağa göstəriş verməmişəm. Şeyx Əsədulla bunu eşidəndən sonra görür ki, həqiqətən də Şeyx Fətulla öz edəcəyi işi başqasına məcbur etməyib.







***Bu məqbərəni 2004-cü ildə Axundun nəvəsi Mikayıl Təbib öz hesabına təzələmişdir.***

**Haşiyə:** Şeyx Əsədulla Axund 1871-ci ildə Seybətin kəndində anadan olmuşdur.

Ərdəbildə, sonra isə Nəcəfdə Ali Ruhani məktəbində təhsil almışdır.

Burada 24 fənn üzrə təhsilini başa vuran məzunlar öz vətənlərinə qayıtsalar da o iki ildə orda qalaraq əlavə təhsil alır. Şeyx Əsədulla Axund 1956-cı ildə 85 yaşında ikən Masallıda vəfat etmişdir. Məzarı şəhər qəbristanlığındadır.

Şeyx Fətulla axundun nəvə və nəticələri də ziyalı və alimdirlər.

## ŞEYX ƏSƏD AXUND

***Allah istədiyini dərəcələrə yüksəldir. Hər bilik sahibinin fövqündə ondan üstün bir bilici də vardır.***

Ruhani alim Şeyx Əsəd axund Şeyx Fətulla oğlu Bahadırlı 1893-cü ildə Qızılağac kəndində anadan olmuşdur. İbtidai dini təhsilini atası Şeyx Fətulla axunddan almışdır. Onun ilahiyyat elmlərinə marağını görən atası mükəmməl dini təhsil alsın deyə onu əvvəlcə Ərdəbil şəhərinə, sonra isə İraqın Nəcəf şəhərinə göndərmişdir. Ali Ruhani təhsilini başa vurandan sonra Şeyx Əsəd Şeyx Fətulla oğlu doğma Qızılağac kəndinə dönüb, burada fəaliyyətə başlamışdır. Dini moizələrlə yanaşı o, Qızılağacda mədrəsə açıb, həmkəndlilərinə yazıb-oxumaq öyrətmişdir.

Şeyx Əsəd axund göstərdiyi ayin, mərasimlər zamanı xidmətlərinə görə camaatdan pul almazmış. Əksinə şəxsi təsərrüfatından əldə etdiyi qazancla həm ailəsini dolandırır, həm də fəqir-füqəralara yardım göstərirmiş.

Otuzuncu illərdə bütün din xadimləri kimi Şeyx Əsəd də təqiblərə məruz qalmışdır. Həbsə alınmaq və Sibirə sürgün olunmaq qorxusundan müxtəlif yerlərdə gizlənmişdir. Bu qorxu və həyəcanlara dözməyən Şeyx Əsəd axundun ürəyi 1937-ci ildə dayanmışdır. Məzarı Qızılağac kəndinin qəbristanlığındadır.

Şeyx Əsəd axundun çoxlu nəvələri var. Oğlanlarından biri hal-hazırda sağdır. Nəvəsinin birinin adı Əsəddir. Əli-Bayramlı şəhərində hüquq-müfahizə işçisidir. Çox təəssübkeş və yerlipərəstdir. Əli-Bayramlı təhsil şöbəsinin müdiri Şükür





Hacıbala oğlu Qəribov deyir: Əsəd eşitsə ki, qonşu rayonlarda qızılağaclı var. Məni də götürüb həmin adamın yanına gedər, nə ehtiyacı varsa soruşar və kömək edər. Hətta qonşu Sabirabad rayonunun kəndlərində bir nəfər qızılağaclını da bu yolla tapıb onunla əlaqə yaratdı.

***Nə baban, nə atan, nədə ki özün***
***Bir yol getməmisiz günaha doğru.***
***Pak olub əməlin, düz olub sözün,***
***İndi yol almısan Allaha doğru.***

## MOLLA ABDULLA AXUND

***Nəfsin günahlardan təmizləyən şəxslər mütləq nicat tapacaqlar.***

Bu şəxsə kiçik axund deyərdilər. Şeyx Fətulla ilə eyni dövrdə yaşayıb Şeyx Fətullanı böyük axund, Molla Abdullanı isə kiçik axund adlandırırdılar. Molla Abdulla uzun müddət mədrəsədə şəriət müəllimi işləyib. 1885-ci ildə ilk iki sinifli məktəbdə, sonra 1896-cı ildə Mahmudbəy Mahmudbəyovun müdir olduğu "Şkola" məktəbində şəriət müəllimi işləmiş, 1897-ci ildə onu məktəbdə şəriət dərsi deməkdən uzaqlaşdırıblar. Sonralar mədrəsədə fəaliyyət göstərib. Daha sonra axundluq vəzifəsini icra edib. Şeyx Fətulla ilə eyni zamanda məsciddə oturub şəriət elmlərindən xalqı xəbərdar edərdilər.

Molla Abdulla indiki ATS-in yerində olan Zincir təkkəsin-

də məhərrəmlik mərasimi saxlayarmış və həm də təziyəsi deyərmiş.

Qış klubunun yerində olan Zincir təkkəsində də fəaliyyət göstərirmiş. Məscid həyətində Aşura günü şəbeh çıxarmağı təşkil edərmiş. Onun dərs dediyi adamlardan biri Zəhraxanım Əhməd qızı söyləyərdi ki, kiçik axund həmişə məsciddə olardı və şəri suallara cavab verərdi.

Molla Abdulla Kiçik hamamda çimib qırağa çıxıb qurulanan yerdə vəfat edib. Zəhraxanım Əhməd qızı deyərdi: Kiçik axundun çoxlu şagirdləri olub. Sonradan onlar da mollalıq ediblər. Kiçik axund Molla Abdulla qardaşı Molla Lətiflə eyni dövrdə yaşayıb və hər ikisi şəriət elmlərini tədris ediblər. Artıq onlar unudulmaq üzrə idilər. Mən bu kiçik həcimli yazıma onların xatırlanması və yad edilməsini özümə borc bilmişəm.





## AĞA MİR HƏSƏN AĞA

***Allah yolunda əziz və yaxın olan şəxslər onlardırlar ki təqvaları çox olur.***



Mir Həsən ağanın adı hər dəfə gələndə, hər dəfə ağanın Müqəddəs adıyla Cəddi çağrılanda Seyid Əzimin

***"Movti-cismanım ilə***
***sanma mənim ölməyimi,***
***Səyyida, ölmərəm, aləmdə***
***səsim var mənim".***

- misraları düşür.

El arasında Seyidlər bir-birinə əmoğlu deyirlər. Məncə bu ölməz misralar bütün seyidlərin ruhundan qopan müqəddəs kəlam, ürəkdən deyilən ilahi sözdür. Və bu ilahi sözün işığında adını eşidib, üzünü görmədiyim bir kəramət sahibi olan Ağa Mirhəsən ağa haqqında bir kitablıq söhbətlər dinləmişəm. Bu söhbətlərdə qədəm basdığım ocaqları şərəfləndirən Mir Möhsün ağa, Seyid Camal, Mir Tağı Seyidağa, Hacı Mir Heydər ağa, Seyid Mir Heydər, Seyid Sadıq, Mir Səmid, Mirzə Hüseyn ağa, Hacı Mir Hüseyn ağa, Hacı Mir Sultan ağa və çox mötəbər seyidlərimizin adları zikr olunub... Bu yazımda adları çəkilən və çəkilməyən, Cəddinin hikmətindən kömək umduğumuz bütün seyidlərimizə Allah təaladan rəhmət və savab diləyirəm. Allah onların müqəddəs cəddinə rəhmət eyləsin.

...Ağa və Seyid deyə müraciət etdiyimiz, adlarını hörmətlə və ehtiramla anıb, Cəddinə ümidlə pənah apardığımız bu mömün insanlar kainat sahibi Allahın rəsulu, dünyanın və axirətin seyidi həzrəti peyğəmbərimizin (s) nəslindən olanlardır. İmam Hüseyn (ə) yadigarlarıdır. 1868-ci ildə, İsfahanda dünyaya gələn, yeniyetmə yaşlarında Qızılağaca ata-baba ocağına qədəm basan Mir Həsən ağa Mir İbrahim oğlu əməlisalehliyi və səxavəti ilə öz adını ürəklərə nəqş etmişdir. Müqəddəs şəcərəsi yeddinci imamımız Museyi Kazımdan zinətlənən Mir Həsən ağa qəlbində daşıdığı İman Nurunu sınıq könüllərdən əsirgəməyib: Cəddi və duası ilə binəsiblərin imdadına çatıb, ocağına pənah gətirənlərin şəfa tapmaları üçün Uca və Qadir Allahdan yardım diləyib.

Cəddin bizə kömək olsun ağa. "Mömün o kəslərdir ki, namaz qılar. Verdiyimizi Allah yolunda sərf eləyər onlar... Onları rütbələr, məğfirətlər bol-bol ruzilər gözləyir. Rəbblərinin dərgahında... Yardım diləyirdiniz siz Rəbbinizdən... Mən sizə bir-birinin ardınca gedən min Mələklə yardım edərəm. (Quran, ənfal surəsi, ayə 8).

...Ağanın ulu babası Seyid Camalın məzarı Astarada ziyarətgaha çevrilib. Babası Mir Abdulla axund "öz dövrünün müctəhidi olub. (Allah hər ikisinə rəhmət eləsin) Onun Qızılağacda məskən salmasının maraqlı tarixçəsi var. Deyilənlərə görə, düz yeddi il idi ki, ardıcıl kənddə quraqlıq imiş. Bir dəfə axundun yolu bura düşür. Camaat deyir ki, ağa dua elə yağış yağsın! Həzrəti Əli Əleyhissəlam buyurur ki, hər kəs mömün adama dərdini desə, elə bil Allaha deyir... Və axundun duasından sonra həqiqətən də yağış yağır. Bunu görən adamlar Mir Abdulla axundu kənddən buraxmırlar.





... Axund Mir Abdulla Qızılağaclı Qubad bəyin qızı ilə ailə həyatı qurur. Bəy ona öz mülkündən ev verir. Mir Abdullanın oğlu Mir İbrahim burada dünyaya gəlir. Ailə qurur (Bu günə kimi bu ocaqda çalğı səsi eşidən olmayıb) Mir İbrahim İsfahanda dini təhsil alarkən fars qızı Ruqiyyə Soltanla siğə edilib... Mir Həsən ağa və bacısı Mir Səkinə dünyaya bu izdivacdan gəliblər.

Sağlığında müdrikliyi, kimsəsizlərə həyan durmağı, verilən nəzir-niyazları fəqir-füqəraya paylamağı ilə camaat arasında unudulmaz xatirələr qoymuş Ağa Mir Həsən ağa Mir İbrahim oğlunun əməlləri bu gün əfsanəvi hekayətlərin mövzusuna çevrilib...

Qapısına gələni naümüd qaytarmayan Ağa son tikəsini ehtiyacı olana verər, hətta əyninin paltarını belə soyunub biçarə fəqirlərə bağışlarmış. Həzrəti Əli öz müqəddəs kəlamlarında buyurur ki, hər kim fəqirlərə kömək etsə, Allaha kömək edər, hər kim onları incitsə Allahı incidər.

Haqqında danışılan hədislərdən...

Bir dəfə Mir Həsən ağanın yolu içməli su həsrəti ilə yaşayan bu kəndə düşür. Kənd əhli yalvarır ki, ağa cəddinə qurban olaq, suyumuz qəhətə çıxıb. Deyir ağa dua oxuyub, sonra üzünü camaata tutub deyir ki, məni qovun, harada yorulub yıxılsam, oranı qazarsınız! Elə də olur. Ağanın yıxıldığı yeri qazırlar, şirin su çıxır.

... 30-cu illərdə mömin adamların başı çox müsibət çəkib. Ürəklərində Allah xofu olmayanlar, ruhanilərimizi, Seyidlərimizi izləyib, çoxunu sürgünə göndərib vətəndən didərgin salıblar. Bir gün NKVD işçiləri MirHəsən ağani dini təbliğ etdiyi üçün günahlandırıb, maşınla harasa aparmaq istəyirlər.

Maşın yerindən tərpənmir. Ağanı düşürürlər.

Maşın işə düşür. Qərəz, bu möcüzə bir də təkrar olunduqdan sonra gələnlər: "Biz səni görməmişik" deyə kor-peşiman geri qayıdırlar.

"Dünyada Seyidlər vardır ki, duası ilə yanan zəmiləri söndürür!... Onların qəlbini sındıranlara pərvərdigar tərəfindən ən dəhşətli cəzalar qismət olur... Güllənin icadı möcüzə deyil. Möcüzə onu hədəfdən yayındıran Cəddin ağırlığındadır. (Hacı Azərin Hacı Mir Sultan ağanın xatirəsinə yazdığı "Behişt zəvvarı" kitabından)

... Mir Həsən ağa öz evində ata-baba ocağında məhərrəmlikdə, qədr gecələrində həmişə ehsan verərmiş. Mötəbər adamlar, hakim zümrə ağaya divarlarında quşlar yuva salan köhnə evini söküb, yerində təzəsini tikməyi məsləhət görərmiş. Ağa da cavab verərmiş ki, bəs sizin bu zavallı quşlara rəhminiz gəlmir? Nə qədər nəfəsim gəlir onların yuvalarından didərgin düşməsinə razı ola bilmərəm.

**"O ruzi ki, kifayət edər, bəsdir"**- Həzrət Əli (ə)

... Bir dəfə mətləbinə çatan bir şəxs ağanın ocağına nəzir etdiyi yanıbalalı inək gətirir. Mir Həsən ağa özünə və ailəsinə "ziyan" vuran adamın qəlbini sındırmaq istəmir. Soruşur ki, pulun var? - Bəli, ağa var! - deyə həmin şəxs dillənir. - Onda sən mənə beş-on manat ver!... Nəzir edən verir. Ağa deyir: Mən də bu inəyi yanı balalı verdim sənə, götür apar. "Allah yolunda az nəzir verənin savabı çox olar!"

***Yol daşını yol quşuna atma, qardaş, kərəm eylə...***

- Bu sözlər Şah Xətainindir.

Nəql edirlər ki, Mirhəsən ağa yolu çox vaxt pay-piyada gedərmiş. Rastına çıxan daşları götürüb, yolun kənarına





qoyarmış... Ağa yol adamı kimi, yol quşunun da bu daşlardan görməsini istəməzmiş... Ağa adamları günah işlərdən çəkindirər, onlara öz davranışı ilə ibrət dərsi verir, qəlblərində ədəb-ərkan çırağı yandırardı. Bir dəfə ağanı üstüaçıq arabasında aparan şəxs öz atını bərk qamçılayır, ürəyi soyumur, hələ bir söyür də. Ağa deyir, bala arabanı saxla! Və düşür. Deyir "Sür get! Mən piyada gedərəm"... Arabaçı peşimançılıqla dillənir ki, ay ağa olmaya xətrinə dəydim?" Ağa deyir ki, rəhmətliyin oğlu, bu at sənə nə pislik edib? Həm döyürsən, həm də söyürsən... Evinə suyu, otu ruzini atla gətirmirsənmi? Deyilənlərə görə həmin adam bu hadisədən sonra özü ilə qırmanc gəzdirməyi belə tərk edib. Masallı Qala bazarını gəzərkən və ya qonşu rayonlara gedəndə verilən nəzir-niyazları Mirhəsən ağa həmin anda kimsəsizlərə və imkansızlara paylayarmış.

Bir dəfə onunla uzaqdan gələn bir adam Ağanın səxavətindən və alicənablığından heyrətə gəlib deyir ki, Cəddinə qurban olum ay ağa elə et ki, heç olmasa günorta yeməyə pul saxla!

Müharibə illərində və ondan sonrakı dövrdə ağa ailə başçıları cəbhəyə gedib - qayıtmayan ailələrə, qaragünlülərə baş çəkər, onlara ərzaq paylayarmış.

***Aşiqəm, öz ömrümü sevdaya qurban vermişəm.***
***Qəlbimi şan-şan kəsib, eşqimçin ehsan vermişəm.***

- Bu qəzəl də həmyerlimiz şair-təbib ağamız Mir Kazım Aslanlı - Sarəngindir. - (Və el arasında Seyidlər bir-birlərinə əbəs yerə "Əmioğlu" demirlər) Allah sevgisindən böyük sev-

gi tanımayan, Aşiqi-Sadiq ağa! Ömrünü Cəddindəki Sevdaya qurban verməkdən usanmayan, Mir Həsən ağa! On dörd məsumi ümmətə bəxş edən, bu cahanı yoxdan var edən Pərvərdigar vurğunuydu: Mir Həsən ağa canında gəzdirdiyi ilahi sevgidən, İman nurundan Allah bəndələrinə ehsan verirdi... Ömrü tükənsə də baldan şirin tanrı eşqi, iman sevgisi qəlbində tükənmirdi. Əhli-beyt nişanəsi və pərvanəsi olan Mir Həsən ağa ömrünün müdrüklük çağında 1955-ci ildə - 87 yaşında haqq dünyasına qovuşub. Qızılağacda dəfn olunub. Yeri behişt olsun!

Mirhəsən ağanın haqqında yazmaq xoşdur. Həm də çətindir. Burada yazılanlar və yazmaq istədiklərimiz ağanın əməli-salehliyindən, kəramətindən bir zərrədir... Allah bizə bu unudulmaz və müqəddəs müsəlman kişi haqqında geniş söhbət açmaq imkanı nəsib elɛsin.

Və bir də bu çətin anlarda tez-tez dua edirəm ki, Ağanın cəddi bizlərə kömək olsun. Sanki qulaqlarımız ölməz Seyidin ilahi aləmdən mehriban səsi gəlir:

***"İçimiz də çölümüz də günahlarla dopdoludur"***

Dualarınız müstəcəb olsun, deyə günahlardan təmizlənin! Qoy mərhəmətli Allah günahlarımızı əfv eləsin. Qəlblərinizi iman duyğuları ilə barışdırsın.

Amin, ya Rəbb!





## MİR CƏFƏR AĞA

***Kişi öz qəlbində imanın şirinliyini dərk etmək üçün gərək dünyaya laqeyd olsun və heç maraqlanmasın ki, dünyanı yeyən kimdir.***



Mir Cəfər Mir Kərim oğlu 1895-ci ildə Qızılağacda anadan olub. Çox təqvalı, imanlı, xoş əhval-ruhiyyə sahibi olub. Əhval-ruhiyyəsi olmasına baxmayaraq nəfsi ağır olub. Hər kəs onun cəddini çağırsa nicat tapardı. Ağa Mir Cəfər çox hazırcavab və kəramətli ağa olub. Əsasən onun kəramətini görən adamlar indi də ürək dolusu danışırlar. Bir vaxt əkin sahələrini gəmiricilər korlayırmış. Ağaya müraciət edirlər Ağa həmin gəmiricilərin əlamətini soruşur. Sonra ağa deyir ki, bu bir bəladı buna ağanın gücü çatmaz. Ancaq bu bəlanı Allah dəf eləsin.

Ağaya kimi özlüyündə nəzir etsəymiş Ağa onu duyarmış. Səhər gedərmiş həmin adamın evinə deyərmiş: dünən mənə nəzir boyun alıb kasaya qoyduğun pulu gətir. Həmin adam deyərmiş: -Ağa nə bildün deyərmiş, mənə ilham edirlər.

Ağaya inəyin ətindən bir bud nəzir boyun olan adama ağa deyib: - beş manat ver qalanı sənin olsun.

Ağa söhbətə maraq göstərən olub. Bir gün onu Babakosa (Təzə kənd) kəndinə qonaq çağırırlar. Ağa özü ilə Dadaşbala

kişini aparır. Süfrə sərirlər. Allah verən nemətin süfrədə olan vaxtında Dadaşbala kişi deyir: - Ağa şor yeməz, Ağa ət yeməz, Ağa pendir yeməz. Nəhayət heç bir şeydən yeməyən ağa qonaq evindən çıxıb gələndə Dadaşbalanı tutur və onu vurmağa başlayır. Deyir ağa nə edirsən? Deyir: - Ağa ət yeməz, Ağa şor yeməz, Ağa pendir yeməz, Dadaşbala kötək yeyər.

Ağanı həmişə kənd camaatı həyətlərinə aparıb həyətbacanı, ev-eşiyi kiymələtdirərmişlər. Ağa həyətə girib üç-dörd dəfə tüpürərək oranı kiyməliyərdi və məhsul çox olardı. Ağanın oğlu Mir Abdulda ilanı ram etmək məharəti var idi. O vaxtlar kənd evlərində qızıl ilan çox olardı, ev sahibləri qorxudan evə girə bilməzdilər. Mir Abdul kişi bir dəfə ilanı çağırmaqla neçə metr uzunluğu olan ilan qıvrılıb yığılardı. O isə onu götürüb boynuna dolayardı. Cibinə qoyardı.

Əlihəsən Kərbəlayi Ağakişioğlu deyir. Bir gün anam rəfdə olan kasaların içində qızıl ilan görür, qorxur, gedib Ağa Mircəfəri gətirirlər. Ağa ilana üz tutub deyir. Ey Allahın heyvanı, buranı tərk eylə. Bir də buralara gəlmə. İlan rəfdən düşür. Rahatca çıxıb gedir bir daha oralarda ilan görsənmir.

Keçmiş günlərdə Mir Cəfər ağa vətəgədə işləyərmiş. Ağaya və ondan əlavə üç yoldaşına deyirlər gedin yovşanda olan kümənі söküb odun ocağını gətirin. Yoldaşları ağaya işin təfsilatını deyirlər. Dekabr ayı olsa da, hava günlü və isti idi. Ağa deyir: gözləyin gəlirəm. Ağa girir evinə, yoldaşları onu tələsdirirlər. O isə deyir: gözləyin gəlirəm. Nəhayət ağa bir kisə dolusu yükü atır belinə və deyir: indi gedə bilərik. Yoldaşları soruşur: Ay ağa, kisədəki nədir? Deyir: yorğan. Deyirlər: ay ağa, yorğanı neyləyirsən isti havadır. Deyir: lazım olar.





Biri o birinə deyir: Ağa səfih olub. Ağa bu sözü eşidir, əhəmiyyət vermir. Gedib yovşana çatırlar.

**Haşiyə:** Yovşan Qızılağac qoruğunda yer adıdır. Kənddən xeyli uzaqdır.

Sökəcəkləri kümənin yanına çatar-çatmaz hava dəyişir, qar tökür, soyuq başlayır. Ağa yorğana bürünüb uzanır o biri üç nəfər kümənin ağacını söküb yandırırlar ki, soyuq olmasın. Hərdən ağa yorğanın altından başını çıxarıb onlara istehza ilə deyərmiş: Ağa səfih olub.

Ağa Mir Cəfər bir gün bazara satmağa yanında cücəsi olan toyuq gətirir. O toyuğu alırlar. Səhər toyuq alanın oğlundan soruşur: toyuq neyləyir? Deyir: Ağa, dənləyir. Deyir: elə et ki, pişik cücələri dənləməsin a... Mən pişiyin əlindən satmışam. Zarafatyana ağanı yoxlamaq üçün ağanın toyuğunu oğurlayıb özünə satırlar. Üç dəfə bu iş təkrarlanır. Ağa pul verib alır. Ancaq satanlara elə münasibət bildirir ki, guya ağa bu toyuğu tanımır.

Sovet hökumətinin vaxtında, işsizliklə mübarizə dövründə ağanı altı ay məcburi əməyə cəlb edirlər. Kənd ərazisində əkiləcək üzüm tingləri üçün qazılan çaladan ağa da qazmalı idi. Ağa görür ondan qabaqda gedənlər bir neçə çala qazıblar. Ağa deyir: qazdınız? Deyirlər: bəli. Ağa çalanın birinə tüpürərək deyir: tufu mərəyə. Deyirlər o ərazidəki əkindən heç nə hasil olmadı. Bir nəfər Ağa Mir Cəfərə bir qoyun nəzr edir. Qoyun böyüyüb artır. Nəzr edən istəyir ki, o qoyunun əvəzində başqasını versin. Səhər ağa həmin şəxsi görən kimi deyir:"İstəyirsən qoyunu dəyişəsən, mənə əvəzində başqasını verəsən, o fikirdən yayın." Həmin adam görür mən ürəyimdə fikirləşdiyimi ağa bir gün sonra mənə dedi...

Ağa Mir Cəfəri o vaxtlar şam məclisinə dəvət edirdilər. Ağa təşrif buyurardı. Söhbət edərdi, uzun qarlı qış gecələrində bir gün ağa bizdə qonaq olur. Evi bizim evə yaxın idi. Bizim evin gün çıxan səmtində Məhəmmədin pələdində o vaxt kolluq olub. Ağa gedərkən əynindəki əba kola ilişir, ağa deyir: adə, burax! Görür buraxmır, əbanı əynindən çıxardıb qaçır evə həyat yoldaşı Kifayət xalaya deyir ki, məni soyundururlar. Deyir: ay ağa səninlə kimin nə işi. Ağa deyir: Əgər soymasaydılar əbam əynimdə olardı. Səhər yerindən durub bazara gedəndə görür əba kola ilişib qalıb orda. Sən demə ağanı soyunduran kol ağacı imiş.

Ağanın xoş təbəssümlü sözləri dərin məna kəsb edirdi. Ağa Mircəfər dünyaya məhəbbəti olan insanlara həmişə keçmişlərdən ibrət götürün deyirdi. Ağanın bu sözləri dahi Füzulinin aşağıdakı beytləri ilə səsləşir:

***Bu aləm kim, könül, qeydin çəkərkən möhnəti qəmdir,***
***Fəna sər mənzilin seyr elə kim, bir xoşca aləmdir.***
***Anıb tənhalığı qəbr içrə nifrət qılma ölməkdən ,***
***Təriqi-müns tutkin, hər ovuc torpaq bir aləmdir.***





## MİR KAZIM AXUND

***Bəndələr arasında alimlər,***
***Allahdan ən çox qorxandırlar.***



Mir Kazım Mir Məmməd oğlu 1888-ci ildə Qızılağacda anadan olub. Molla Əsəd ilə eyni dövrdə yaşayıb. Nəcəf şəhərində ali dini təhsil alıb.

Mir Kazım axund ali təhsil alandan sonra Qızılağaca gəlib. O həm Qızılağacda və həm də qonşu Hüseynhacılı kəndində eyni zamanda axundluq edib. Sovet hökumətinin dinə qarşı qoyduğu qadağaları əsas tutaraq o dövrdə kənd soveti tərəfindən təzyiqlərə məruz qalıb. Belə bir vaxtda o Qızılağacı tərk edərək həyat yoldaşının kəndinə Xoşçabanlıya pənah aparıb. Orada da bir neçə il gizli fəaliyyət göstərib. 1938-ci ildə Qızılağac kənd soveti işçiləri tərəfindən tutdurulub. Son taleyindən uzun zaman xəbər çıxmayıb. Nəhayət, 1954-cü ildə ölüm xəbəri gəlir. 1989-cu ildə bəraət verilib.

Onun yaşadığı həyətdə qaraca xəstəliyinə müalicə təsiri bağışlayan əlamət olub (ocaq olub). Göytəpə kəndindən qaraca xəstəliyinə tutulan atları ora gətirərmişlər. Atlar sağalarmış və aparармışlar. Mir Kazım axund söhbətlərinin birində de-

yib: Quranda bir ayə var kim bir xətt çəkib və xəttin üstünə çıxsa o ayəni oxusa göyə qalxar. Ani sükutdan sonra deyərmiş:

Əfsus ki, onu mən bilmirəm. Onu Peyğəmbər (ə) bilirdi.

Axund sakit təbiətli, xoş rəftarlığı ilə fərqlənən şəxs olub.

*Fələyin nə günahı. Fələk neyləsin buna.*
*Onun çarxını tərsinə döndərən bizik-biz.*
*İnsan oğlun çıxardıb cənnətin kənarına*
*Bir odlu cəhənnəmə göndərən bizik-biz.*





## AXUND MOLLA MİR MÖHSÜN AĞA MİR HƏSƏN OĞLU

***Qiyamətin günündə alimlərin qələmlərinin mürəkkəbi şəhidlərin qanı ilə bir ölçülər. Alimlərin qələmlərinin mürəkkəbi şəhidlərin qanından ağır gələr.***



Mir Möhsün ağa 1893-cü ildə Qızılağac kəndində dindar ailəsində anadan olmuşdur. Atası Ağa Mir Həsənin köməkliyi ilə dini biliklər qazanmış, sonradan Nəcəf şəhərində ali ruhani təhsili alır. Təhsilini başa vurub kəndə qayıdır. Onun təhsildən qayıdarkən qarşılanma mərasimi haqda yadda qalanları keçmiş qocalar belə nəql edərdilər.

Ağa Mir Möhsün təhsildən qayıdanda 200 metr uzunluqda yolu xalça kilim ilə döşəyərək onu təmtəraqlı surətdə qarşılayırlar. Hətta xüsusi atlarda zəvvarların onun müşahidə etməklərini də söyləyirlər. Həmin illərdə dindarlara qarşı amansız cəzalar tətbiq edilirdi. Ağa Mir Möhsün bu qorxudan özünü xilas etmək üçün ruhani qiyafəsini tərk edir. Dini yox, dünyəvi elmləri tədris edir. Ömrünün axırına kimi müəllimlik etdi.

Ağa Mir Möhsün çox təqvalı və pəhrizkar şəxs idi. Heç vaxt bazardan aldığı ərzaq məhsulunu açıq vəziyyətdə aparmazdı. Deyirlər bir gün onun yaşadığı ev od tutub yanırmış.

Camaat səsə onun həyətinə gələndə görürlər ki, aşağı mərtəbədə olan ot koması od tutub yanır, ağa isə bir zənbil kitabı evdən çıxardıb evinin qabağındakı nar ağacının altına tərəf gedir. Deyirlər: ay ağa ev yanır, sən isə arxayıncasına hərəkət edirsən. Ağa deyir: narahat olmayın inşallah yanmaz. Görürlər ağa zənbildən bir kitab çıxardıb oturduğu yerdə oxumağa başlayır. Camaat cəmlənərək təəccüblə yanğının sönməsinə tamaşa edirlər. Çox çəkmir yanğın özü özünə sönür.

Ağa Mir Möhsündən dini suallara dəqiq cavab alan dindarlar ona dini təbliğ etməyi məsləhət görürlər. O isə qorxudan bunu qəbul etmir. İbrahim Səlimov onu qorxudan uzaqlaşdırmaq üçün təsəlli verərmiş. Ağanın vəsiyyətinə əsasən məxsusi kitablarını onunla birgə basdırırlar. Hətta vəfatından sonra onun kitablarının içində müctəhidlik vəsiqəsi də tapıldığını deyirdilər. Mən ağanın şəklini almaq üçün həyat yoldaşı Sura xalanın xidmətinə təşrif buyurdum. İsrail müəllim və onun həyat yoldaşı Elmira ilə onun otağına daxil olanda 80 yaşdan yuxarı yaşı olan bu qoca qadın məni görən kimi Kərbəlayı Nüsrət, xoş gəlmisən. Dedim: ay Sura xala mən güman etməzdim ki, siz məni görən kimi tanıyasınız. Maşallah həm iti yaddaş və görmə qabiliyyətinə malik imişsiniz. Mən gəlişimin məqsədini dedim. O əlini göyə qaldıraraq dedi: ilahi şükür sizə. Dedim: Sura xala bu minnətdarlığı nəyə əsasən Allaha bildirdiniz. O dedi: Kərbəlayı Nüsrət, ona görə şükür eylədim ki, o cür gözəl ruhani haqqında maraq göstərib, onu yazı vasitəsilə xatırlayacaqsınız. Mən bilirdim ki, bu şəxsin elmi onun xatırlanmasına səbəb olacaqdır. Sura xala ağa haqqında gözəl təəssüratlar danışdı və hətta dedi: Ağa əyləşərdi ocağın altında, özü-özünə zümzümə edərdi bu sözləri.





***Demirəm vicdanı dar olur,***
***Hal bilən hal duyan bir sənətkar olur.***
***Xanalıq yaxşılıq yaşasa qoşa,***
***Səni də qaldırar çıxardar başa.***
***Götür ürəyimdən yaralı daşı,***
***Bəlalı olur insanın başı.***

Qonşu qadın demə bu sözlərə qulaq asırmış. Deyir: ay Ağa bərkdən de biz də eşidək. Ağa həmin qadının sözünü eşidən kimi ardını bir daha demir.

Mir Möhsün Ağa 1965-ci ildə vəfat edib. Qəbri Qızılağac qəbristanlığındadır.

## KƏRBƏLAYI HÜSEYNALI

***Bilin ki, elm çox oxumaq və çox öyrənməklə deyildir. Elm elə bir nurdur ki, Allah taala onu hidayət etmək istədiyi bəndəsinin qəlbinə əta edir.***



Kərbəlayı Hüseynalı çox zəhmətkeş və qayğıkeş insan olub. Heç bir təhsilə malik olmayıb. Nə yazıb, nə oxuyub. Həm yazanlar, həm də oxuyanlar dərəcəsində söhbətlər edərdi. Yazıb-oxuya bilməyən şəxs haqqında o dediklərimə təəccüb etməyin. İnsan yazıb-oxuyur, təkrarlayır, oxuduğu, yazdığı yadında qalsın. Ancaq Kərbəlayi Hüseynalıya Allah iti yaddaş bəxş etmişdi. Yazmadan, oxumadan eşidilənləri kəlmə-kəlmə, sətir-sətir yadında saxlayardı.

Qızılağaca Kəlbəhüseynli kəndindən mollalığa gələn Molla Sadıq axund deyib: ay camaat, Kərbəlayi Hüseynalı eşitdiklərini elə danışır ki, elə bil o əhvalatı özü söyləyib və iştirakçısı olub. Çox gözəl səlist tələffüzə, məharətli nitqə, cəlb edici məlahətli səsə malik olan şəxs olub. Bu istedadı ona bəxş edən Aləmlərin rəbbi idi.

Kərbəlayı Hüseynalı və oğlu İbrahim kişi də iti yaddaşlı insan idilər. Kərbəlayı Hüseynalı söhbətlərini dinləmək arzusunda olanlar çox idi. Onun rəvan, incə ardıcıl kəlmələri hamını özünə cəlb edərdi.





Kərbəlayı Hüseynalı əsasən Kərbəlayı Nəsrulla çayçısında çox söhbət edərdi. Həmin vaxtlar dünya görmüş qocalar onun söhbətlərinə qulaq asmaqdan doymazdılar.

O müdrük qocalar vaxtlarını hədər verməmək üçün Kərbəlayı Hüseynalının söhbətinə çox qulaq asmağı sevirdilər. Kərbəlayı Hüseynalı çox tutarlı tarixi faktlar əsasında söhbət edər və deyərdi: camaat mənim savadım yoxdur, ancaq eşitdiklərimi sizə söyləyirəm. Savadlı adamlar deyərmiş, Kərbəlayı əgər savadun olsa idi sən müctəhid olardın. Çünki sənin iti zehnin və yaddaşun var. Kərbəlayı Hüseynalı məscidin günbəzində azan da verərdi. Onunla yanaşı Lətif və Məmmədəli də azan deyən olublar. O vaxtlar vəfat edənin ölüm xəbəri əzan deməklə camaata çatdırılarmış. Bilərmişlər ki, vəfat edən var. Kərbəlayı Hüseynalı 117 yaşında Qızılağacda vəfat edib.

# Hacılar

Qızılağacda qədim dövrlərdən indiyə kimi Kərbəla, Nəcəf, Məşhəd, Kəbə ziyarətinə gedənlər çoxluq təşkil edirlər. Onlardan Hacı Nəzir Məmməd, Hacı Səməd, Hacı Tağı, Hacı Bədəl, Hacı Sadıq, Hacı Məmməd, Hacı Həsənağa, Hacı Rafiq, Hacı Məzahim, Hacı Badi Səba, Hacı Nazilə, Hacı Əlitahir, Hacı Davud və s. göstərmək olar

## HACI MİRZƏ HADI ZEYNALOV

***Ağıllı şəxslər sözləriylə elə işlər görürlər ki, həmin işləri qılınc və kötək gücünə götürmək mümkün deyil***

Bu şəxsiyyətin adı həmişə keçmiş müdrik ağbirçək ağsaqqallar tərəfindən tez-tez çəkilərdi. Onun Qızılağacda olan qohum-əqrəbalarından başqaları da onu yaxşı tanıyırdılar. İndi də Hacı Mirzə Hadı həyəti adlanan ərazidə ev-eşik quranlar onu yaxşılıqla yad edirlər. Hacı Mirzə Hadı 1850-ci ildə Qızılağac kəndinin Qərəymanlı (Qaramanlı) məhəlləsində anadan olmuşdur. 12 yaşında ikən artıq zəhmətə bağlı olan bu gənc öz validenylərinə kömək göstərməyi lazım bilmiş. Həmin yaş həddində ikən atası ilə dəniz kənarına gedən Hadı təsadüflə üzləşir...

Lənkərandan Qızılağac körfəzinə ov etməyə gələn Lənkəranda yaşayan əslən Rusiyadan olan sahibkar öz şikarına





güllə atmış, lakin onun gülləsi 12 yaşlı Hadıya dəymişdi. Rus taciri vəziyyəti bu yerdə görəndə Hadının atasından onun sağalmasına xidmət göstərmək üçün razılıq alır. Yaralı Hadını Lənkərana gətirir, onun üçün müalicə həkimləri təyin edir. Az vaxt içərisində Hadı sağalır. Rus taciri Hadidə olan müsbət keyfiyyətlərə görə ona kömək göstərmək qərarına gəlir. Hadi üçün rus, ərəb və fars dilini tədris edən müəllimlər tutur. Hadi savadı, səriştəsi, bacarığı ilə rus tacirinin etimadını qazanır. Tacir onu Lənkəranda saxlayır. Hadini özünə işlər müdiri və iqtisadiyyat işləri üzrə köməkçi götürür.

Hadi 30 yaşında ikən ticarət sahəsində məşhurlaşır. Lənkəran ərazisində olan meşələrdən palıd ağacını xammal kimi Rusiya şəhərlərinə Liman vasitəsilə göndərir, əvəzində şam ağacı alarmış.

Hadı Zeynalov az vaxt içərisində tanınaraq böyük imkan sahibi olur. O özü üçün Bakıda və Lənkəranda torpaq sahəsi alaraq mülk tikdirir. Lənkərandakı M.M. Hüseyn və Nizami küçələrinin kəsişdiyi yerdə Avropa stilində mülk tikdirmiş, həmin mülk 1970-ci ildə sökülüb yerində 3 saylı məktəb tikilmişdir.

Hacı Mirzə Hadı Böyük bazarda hamam tikdirmiş hal-hazırda o hamam indi də fəaliyyət göstərir. O, 1908-ci ildə Lənkəranın binalarını işıqlandırmaq üçün İngiltərədən dizel mühərriki gətizdirir və o mühərriklə 1950-ci ilə kimi şəhərin evləri işıqla təchiz edilərdi.

Hacı Mirzə Hadinin Petiqorskidə, Abbas tumanidə evi və torpaq sahəsi, Bakı Buxtasında Limanı və böyük anbarları var idi.

Nijni Novqorodda (Makaseyevski deyilən ərazidə)

mülkləri olub. Bakı şəhərində keçmiş Lenin Muzeyinin yerində idarəsi və yaşayış yeri olmuşdur. Hacı Mirzə Hadinin iki oğlu olub. Məhəmməd və Əhməd. Hal-hazırda onun nəticələrindən Lənkəranda yaşayanları da az deyil. Hacı Mirzə Hadının İran Astarasında da mülkləri olub.

Hacı Mirzə Hadının qardaşı oğlu, həm də yeznəsi Məşhədi Rasim Ağadadaş oğlu da tanınmış şəxsiyyətlərdən biridir. O, 1870-ci ildə Qızılağacda anadan olub. 10 yaşında ikən əmisi onu Lənkərana gətirib, öz himayəsində saxlayıb, onun savadlanmasına səy göstərərək istəyinə nail olaraq, ticarət işlərinə istiqamətləndirmişdi.

Hacı Mirzə Hadının qardaşı oğlu olan Məşhədi Qasım da əmisinin işini davam etdirmişdi. Onun da Bakıda mülkləri, limanları olmuşdur. Dövrünün ən varlı adamlarından biri olub, Lənkərandakı H.Əliyev küçəsi 17-də olan uşaq bağçası onun şəxsi evidir. Onun oğlanları Əli Muxtar və Ələsgər böyük nüfuz sahibi olublar. Əlimuxtar Zeynalov SSRİ Rəssamlar İttifaqının üzvü olub. Tətbiqi sənət üzrə onun əsərləri Lənkəran tarix müzeyində, Bakı tarix, incəsənət və Xalça muzeyində Daşkənd tətbiqi sənət muzeyində nümayiş olunur.

Ələsgər isə zərgər olub. Sankt-Peterburqda təhsil almışdır. 1916-cı ildə ömürlük sürgün edilib. Oğlu Məhəmməd gənc yaşlarında vəfat edib, onun iki oğlu qalıb. Biri Həbib, o biri isə Heybət adında.

Həbib əczaçı olub. Lənkəranda ilk apteki o təşkil edib və özü aptekin müdiri işləyib.

Həbibin oğlu Hacı Zeynalov 1941-cı illərdə yaranan tələbələr arasında "antisovet" təşkilatın üzvü olmuşdur. Antisovet millətçi gənclər təşkilatının ən fəal üzvü kimi 1948-ci il





oktyabrın 3-də 287 N-li order əsasında ADU-nun Şərq fakültəsinin V kurs tələbəsi Hacı Həbib oğlu Zeynalov həbs edilmişdir.

1948-ci il oktyabrın 14-də Hacı Zeynalova təqsirnamə təqdim olunur. "Hacı Həbib oğlu Zeynalov aşağıdakılarla ifşa olunur: Sovet hökumətinin əleyhinə düşmən mövqe tutaraq, antisovet təşkilatın üzvü kimi mütəşəkkil antisovet iş aparıb, Sovet hökumətinin əleyhinə fəaliyyətdə olub. Buna görə də o, Azərbaycan SSR CM 72-2 və 73-cü maddələri ilə işə müttəhim kimi cəlb olunsun".

Hacı Zeynalov həmin təqsirnaməni rədd edir və özünü günahkar hesab etmir. 7 dəfə dindirmə aparıldıqdan sonra 1949-cu il fevralın 4-də Hacı Zeynalov əlavə olaraq Azərbaycan SSR CM 21-64 maddəsi ilə ittiham edildi:

"İstintaq zamanı müəyyən olundu ki, Hacı Zeynalov öz antisovet əhval-ruhiyyə bünövrəsi üzərində duraraq, antisovet millətçi təşkilatına cəlb olunub. Bu təşkilat Azərbaycanı Sovet İttifaqının tərkibindən çıxarıb, müstəqil milli respublika təşkil etmək niyyətində idi. Hacı Zeynalov həmin təşkilatın fəaliyyətində aktiv iştirak edirdi."

Məhkəmə iclası 1949-cu il martın 21 və 22-də keçirildi. İclasın sədri Muradov, prokuror Ramazanov, vəkillər Hacıyev, Davıdov və Həsənov idilər.

Məhkəmə iclasının protokolu işin 458-477 vərəqələrini əsas tutur. Prokuror Ramazanovun çıxışı: Müqəssirlərə istinad edilən cinayəti kafi dərəcədə sübuta yetirilmiş hesab edirəm. Ona görə xahiş edirəm onları müqəssir bilib: Zeynalov Hacı 25 il azadlıqdan məhrum etməklə, 5 il seçki hüquqlarını almaq və əmlakı 100 faiz müsadirə olunsun.

Hacı Zeynalov repressiyadan sonra AEA-da fəaliyyətə başlamış, elmi katib işləmişdir. 1989-xu ildə Bakı şəhərində vəfat edib. Hal-hazırda Hacı Zeynalovun iki qızı Bakı şəhərində yaşayır. Maral və Məhruzə coğrafiya ixtisası üzrə elmi işçidirlər.

Məşhədi Qasımın qız nəvəsi Zahid Hacıbala oğlu Kərimov Neft Akademiyasında Maşın hissələri kafedrasının müdiri texnika elmləri doktoru, professordur.

Məcid Zahid oğlu Kərimov Azərbaycan respublikası Sənaye və Energetika Naziri texnika elmlər doktorudur.

1896-cı ildə Lənkəranda ilk kanalizasiyanı Hacı Mirzə Hadı çəkdirib. Hacı Mirzə Hadının Məryəm qızından olan Aptek Taci, Ələkbər və Töhfə dünyaya gəlmişdir.

Göründüyü kimi Azərbaycanın azadlığı uğrunda mübarizəyə qalxanların ikisi Qızılağaclılardırlar. Hacı Mirzə Hadının doğmalarından Lənkəranda yaşayan diş həkimi Qasım öz əcdadları haqqında geniş məlumata malikdir.





## HACI ƏLİ TAHİR İSLAM OĞLU (HACI QAFİL)

Əsl adı Əli Tahir olub. Qafil kimi məşhurlaşan bu gənc 1962-ci ildə anadan olub. Hələ 10 yaşında ikən qeyri-adi istedadlı bir gənc kimi məşhurlaşdı. O ağ kağıza əlini çəkməklə dayanmadan oxuyardı. Ondan sual ediblər ki, bəs bu kağızda yazı yoxdur, sən onu hardan oxuyursan? O isə deyərdi mənim üçün yazılıb. Çox gözəl səsə, məlahətli nitqə malik olmaqla, davranışı ilə fərqlənən bir gənc idi. İlk əvvəllər Quran oxumağı Babaş oğlu Musadan oyrənmişdi. İti hafizəsi və yaddaşı var idi.

Bədahətən özü nəzm deyərdi.

Onun kənd məclislərində əvvəllər Quran oxuyan, mərsiyə deyən, sonradan rövzəxan kimi fəaliyyəti hamının yadındadır. Xüsusən məhərrəmlik mərasimlərində öz məlahətli səsi və sözü ilə hər hansı bir dinləyicinin qəlbinə yol tapardı. Hətta iki saata qədər dayanmadan rövzə deyərdi və mərsiyə oxuyardı. Gözəl sinə mərsiyələri söyləyərdi. Onun məhərrəmlikdə özünəməxsus eşq və atəşin vurğunluqla məcxlis aparması çox cazibəli olurdu. Heç vaxt könül incitməz, qəlb sındırmazdı. Dörd dəfə Həcc ziyarətində olub. Həmişə həccdən gələndə çoxlu ehsanlar verərdi. Orucluq ayında iftar açdı keçirərdi, kimsəsizlərə köməklik göstərərdi. İki saylı orta məktəbə qış fəslində odun və soba alıb siniflərə qoydurardı. Hətta əlacı uşaqlar arasında həvəsləndirici mükafatlar təyin etdirər və öz hesabına ödəyərdi. Cavan olmasına baxmayaraq çoxlu dosttanış qazanmışdı.

2000-ciilədək Qızılağac kənd məscidinin rəisi, 2000-ci ildən ömrünün sonuna qədər Qafqaz müsəlmanları İdarəsinin

Cənub Zonası üzrə qazisinin birinci müavini işləmişdir. Hacı Əli Tahir 2002-ci il noyabr ayının 4-də vəfat etmişdir. Qızılağac qəbristanlığında dəfn olunmuşdur. Allah rəhmət eləsin.



*Hacı Əlihəsən və Hacı Qafil, Kərbəla ziyarətində.*





***Həyat bir dənizdir, bizsə gəmiyik,***
***Sən öz limanına can atdın qardaş.***
***Axır bir sahilə yetişməliyik***
***Sən əbədi ünvan yaratdın qardaş.***

***Arzular qoynunda yandın-alışdın,***
***Neçə çətin günlər, adladın-aşdın,***
***Gecəni gündüzə qoşub çalışdın***
***Özün öz ruhunu oyatdın qardaş.***

***Tay-tuşun gedərkən min cürə kefə,***
***Öz cavan ömrünü vermədin yelə.***
***Sən namaz üstündə gündə beş dəfə***
***Əlini göylərə uzatdın qardaş.***

***Çinar oldun kölgən düşdü hər yana,***
***Bürünmədin min sifətli bir dona.***
***Səndən kömək əli uman insana,***
***Möhkəm körpü idin - Siratdın qardaş.***

## HACI MEHMAN ƏBDÜL HƏSƏN OĞLU ƏBİLOV

*İnsan dünyada mal ilə, axirətdə əməli ilə tanınar.*



Xeyirxahlığı özü üçün adi iş bilən Hacı Mehman həmişə yaşayıb yaratmaq eşqilə çalışır. Onun xeyriyyəçi olmaqlığı ona baş ucalığı gətirir. Xeyirxahlığa həmişə dəstək verməsi onun həyat amalıdır. Atası kolxozçu, anası evdar qadın idi. Əbülhəsən kişinin ailəsində 1956-cı ildə evin son beşiyi olan bir oğlan doğuldu. Adını Mehman qoydular. Bu adın qoyulması bəlkə də o ailəyə bəxş edilən əlamətlər səbəb olmuşdur. Ona görə ki, yaxın və uzaq kəndlərdən Əbulhəsən kişinin çox qonaqları olub. Mehman - qonaq deməkdir: dərk edən ata oğluna ailə münasibətlərini qoruyub saxlayan valideyn kimi təsir bağışlayırdı. 7 yaşlı Mehman ilk dəfə məktəbə gedəndə ona dərs deyən müəllimlərin öyüd-nəsihətini eşidəndə, orta məktəbi bitirdikdən sonra da o hissləri qoruyub saxlayacağına və böyüklərin təlqin etdiyi yaxşılığa, xeyirxahlığa sadiq olacağına söz verdi. 1977-ci ildə hərbi xidmətdən sonra Xəzər Dəniz Gəmiçiliyi İdarəsində işə düzəldi. Gəmi ilə dünya ölkələrinə gedib dünya görüşünü həyat təcrübəsini çoxaltdı. Dənizlər keçdi, okeanların qoynunda ucu-bucağı görünməyən mənzərələrin şahidi oldu. Həmişə iş vaxtı





qurtaranda kəndə cəlib dincəlirdi. Lakin onda tam dinclik üçün sanki hələ maneələr mövcud idi və bunlar onu rahatlıq tapmağa qoymurdu. Odur ki, özündən böyük qardaşı Surətdini çağırar ona, deyərdi. Qardaş, bu mənim nəzir payım, payla seyidlərə, imkansızlara. Beləcə bu minval ilə Mehman yalnız nəzirlərini, ianəsini verəndən sonra rahatlıq, dinclik tapardı. Mehman 1990-cı ildən xeyirxahlığın, əltutmağın yeni istiqaməti üçün fikriləşdi. Nə edim ki, daha çoxlu adamlara əl tutum, kömək edim? Poliqrafiya sahəsində fəaliyyət göstərməyi qərara gəldi. Az vaxt içərisində mətbəə işçisi kimi məşhurlaşdı. 80 nəfər adamı işlə təmin etdi. İndi də başçılıq etdiyi "Elnur Eltide" firmasının təsisçisi və direktorudur. 2002-ci ildə Allah evinin ziyarətində olub. Kənddə bir neçə ailənin illik ehtiyacını təmin edir. Öz hesabına kənd qəbristanlığında xidmət göstərmək üçün işçi təyin edib. Kəndarası yolların daşla örtülməsini, 2 saylı orta məktəbin qış vaxtı odun ilə təmin edilməsi, Qurban kəsib paylamasını, Allah yolunda kənd məscidində ehsan verilməsi və s. onun vəzifə borcu kimi boynuna çəkdiyi qayğılardır. Hacı Mehman etdiyi bu yaxşılıqları Allaha xatirinə icra edir. Onun bu dünya həyatından istifadə edərək axirət üçün çalışmağı ona baş ucalığı gətirir. Bəli Hacı Mehman qonaq olduğu bu dünyaya bel bağlamır. O ancaq Allahın mərhəmətinə bel bağlamağı hər an özü üçün əsas götürür. Hacı Mehman iki övlad atasıdır, övladları orta məktəbdə təhsil alırlar. Hacı Mehmanı xeyirxahlıqda çoxlu-çoxlu işlər gözləyir.

## HACI YUSİF QƏLƏM OĞLU MƏMMƏDOV

*Zülümə düşənlərə yardım etmək, acizi fərəhləndirmək, böyük günahların kəffarəsidir*



1963-cü ildə Masallı rayonunun Qızılağac kəndində anadan olub. Orta təhsillidir. 1982—84-cü illərdə Moskva ətrafında hərbi xidmətdə olub. Əmək fəaliyyətinə 1985-88-ci illərdə 1 saylı avtobus parkında sürücü peşəsi ilə başlayıb. 1988-ci ildən 1992-ci ilədək 2 saylı avtobus parkında, 1992-99-cu illər arasında turizm avtobazasında çalışıb. Hazırda öz şəxsi avtobusunda turizm səfərləri marşurutu ilə işləyir. Ailədən gələn dini etiqadı Yusif Qələm oğlu çox uca tutur. Ailə başçısını itirmiş ailələrə, ehtiyacı olanlara imkan daxilində kömək edir.

Hacı Yusif 70 dəfə İranın Məşhəd şəhərindəki ziyarətgaha təmənnasız zəvvarlar aparmış, onları 8-ci iman Əli İbni Musa Rızanın dəfn olunduğu yerə və İranda olan digər ziyarətgahlarla tanış etmişdir. Onun idarə etdiyi "İkarus" markalı avtobus həmişə ziyarətçilərin istifadə etdiyi nəqliyyat olmuşdur. 3 övladı var.

Ziyarətləri: 1995-2001- Kərbəla, 1999-2005 Məşhəd, 2001, 2005 Məkkə.





## HACI AĞA DAVUD HACIƏLİ OĞLU ƏLİYEV

*Qəlbin ləyaqətli olmasının səbəbi, onun Allah zikrinə məşğul olmasıdır*



Hacı Əli kişini Qızılağac və qonşu kəndlərin sakinləri də yaxşı tanıyırlar. Onun ailəsində böyüyüb müstəqil həyata qədəm qoyan övladları da indi sayılıb-seçilənlər kimi tanınırlar. Bu ailənin oğlan və qızları ibadətləri, səxavətləri, xüsusiyyətləri ilə fərqlənirlər. Ailənin üzvü olan Sakit 2000-ci ildə öz hesabına kənd məscidinin həyətində dəstəmazxana binası inşa etdirmişdir. Ağa Davud da öz söy kökünə bağlı olan gəncdir. Anadan olduğu 1961-ci il sentyabrın ayının 20-dən ata-ana tövsiyələri, tərbiyəsi onun da qəlbində xeyirxahlığa məhəbbət oyatmışdır. Orta məktəbdə dərs alan Davudun elmə olan marağı ali təhsil almağına səbəb olmuşdur. O, Azərbaycan Politexnik İnstitutunun məzunu olan gündən, işlədiyi maşınqayırma zavodunda da kollektivin sevimlisi oldu.

Ali təhsil alandan sonra Bakı şəhərində yaşayan Ağa Davud hər il Orucluq, Qurban, Novruz bayramlarında anadan olduğu kəndə gələr, dini əhəmiyyət kəsb edən ainləri yerinə yetirər. 1994-cü ildə onun kənd məclislərində işlətmək üçün

vəqf etdiyi qab-qaşıqlar onun xeyirxahlığının ilk qığılcımlarından biri idi. Onun Məhərrəmlik ayında iştirak etməsi, kimsəsizlərə əl tutması yaddaqalan əməllərdəndir. Davud namaz qılmaqla mənəvi paklığa nail olmuşdur. Onun namaz qılması, oruc tutması yaşıdlarına böyük təsir bağışlamışdır. Dostları onu yamsılayaraq oruc tutdular, namaz qıldılar. İndi onun dostları namaz qılmaqda köməkçi hesab olunan Davuda böyük şəxsiyyət kimi yanaşırlar.

Davud ibadəti, itaəti, münasibəti nəticəsində həmyaşıdlar içərisində fərqlənən bir ziyalıdır.

Həmişə dini söhbətləri eşitməkdən təsirlənən Davud Allah evinin ziyarətində olmağı da arzulayırdı. Bu arzu onun mənəviyyatında güclü təsir bağışladığı üçün 2006-cı ilin yanvar ayında Həcc ziyarətində oldu. Həcc ziyarətindən qayıdandan sonra onu ziyarət edənlərə də Həccə getməklərini arzulayırdı: "Özünə rəva bildiyini başqasına da rəva bilən Hacı Davud Həcc ziyarətində görüdklərindən ürək dolusu söz açırdı.

Bəli, Hacı Davud qızılağaclı hacılar cərgəsində öz dəsti-xətti ilə tanınacaq. Çünki onun əməllərində həmişə müsbət keyfiyyətlər, yaxşı işlər başlıca amillərdən biridir.

Hacı Davud İslamı bilikləri ilə yüksəlişə nail olan şəxsiyyətdir.

Hacı Davud gözəl insan olduğu üçün əməlləri də gözəlliklərlə əhatə olunub. Öz övladlarının da namaz qılıb, oruc tutması onun birbaşa köməkliyi sayəsində olmuşdur. Hacı Davudun gələcək günlərdə nə edəcəyini özü bilir. Lakin əməllərindən hiss etmək olar ki, o gələcəyə yaradıcı baxışla getmək arzusundadır. Hacı Davuda işlərində uğurlar diləyirəm.






# Qızılağacda bir məktəb var...




## QIZILAĞACDA BİR MƏKTƏB VAR...

*Hər bir qab dolar, elmin qabı əksinə doldugca genişlənər*

1896-cı il fevralın 17-də Qızılağac kəndi haqqında tarixin yaddaşında bir səhifədə yazıldı. O səhifənin saf, şəffaf, ayna kimi parlaq olması nəticəsində ətrafa elm nuru bəxş olundu. Qızılağacda çox qədim zamanlardan elmə, maarifə, savadlanmağa böyük maraq olmuşdu. Çünki bu kəndə (şəhərə) vaxtı ilə gələn alimlər, səyyahlar, dövlət başçıları yerli sakinlərdə tarix boyunca böyük təsir hissi oyatmışdır. Məhz bunun nəticəsidir ki, valideynlər öz övladlarının savadlı olmasına cəhd edirdilər.



*1 saylı orta məktəb*

Kənd yerlərində mədrəsə səviyyəsində şagirdlərə bilik öyrədilirdi. Şagirdlər əvvəl Quranı, sonra isə ana dilinin əlif-

basını öyrənirdilər. Bu da şagirdlərin mənəvi cəhətdən formalaşaraq cəmiyyətə xeyir verə biləcək kadrlar səviyyəsinə çatdırırdı. Mədrəsələrin şəxsi adamlara məxsus olmasına baxmayaraq şagirdlərə pulsuz dərslər keçirilirdi. Həmin mədrəsələrdə yüksək tələbkarlıqla təlim-tərbiyə işinə fikir verilirdi. Mədrəsələr fəaliyyət göstərməklə yanaşı aşağı dərəcəli məktəblər də mövcud idi. Həmin dövrlərdə aşağı dərəcəli məktəblərdə dərs alan uşaqları mədrəsəyə qəbul edərdilər. Belə bir zamanda xalqın balalarının maariflənmə işini ancaq ruhanilər həyata keçirirdi. 1800-cü ildən etibarən mədrəsələrə böyük üstünlük verilmişdi. Orada dərs alan məzunlar müstəqil həyata qədəm qoyanda başqalarının da təhsil almağlarını tövsiyə edərdilər. 1800-1920-ci illər ərzində Masallıda və kəndlərində orta molla təhsili verən 25-dək mədrəsə fəaliyyət göstərmişdir. Həmin mədrəsələrin ucu Qızılağacda idi. Bu mədrəsələr 1830-cu ildən mollaxana və mədrəsə kimi fəaliyyət göstərirdi. Professor Mehdi Mehdizadə "Azərbaycan sovet məktəbinin tarixinə dair xulasələr" kitabında yazır: "Mollaxanalarda təhsil müddəti 5-7 il, mədrəsələr də isə 10-15 il sürürdü." O mədrəsələrə Molla Lətif, Molla Baba, Molla Hüseyn mədrəsələri deyirdilər. Həmin adları göstərilən şəxslər öz şəxsi mülklərindən mədrəsə kimi istifadə edərdilər. Oğlanlarla yanaşı qızlar üçün də mədrəsələr təşkil edilmişdir. Qızılağacda olan mədrəsələrdə oxumaq üçün qonşu kəndlərdən gələnlərin sayı çoxluq təşkil edirdi. Rusiyada baş verən güclü pedoqoji hərəkatın nəticəsində Çar hökuməti maarif sahəsində islahatlar keçirdi. 1864-cü il iyunun 14-də "İbtidai xalq məktəbləri haqqında əsasnamə" və həmin ilin 19 noyabrında "Gimnaziya və





progimnaziyaları" nizamnaməsi, 1863-cü il 18 iyununda ali məktəb nizamnaməsi təsdiq edildi *(Konstantinov, Medinski, Savayeva. İstoriya pedaqoqiki. M. 1959 s. 292.).*

XIX əsr Azərbaycan məktəb təhsili tarixində xalq məktəbləri adı ilə meydana gələn kənd məktəbləri xüsusi yer tutur. Bunlar ibtidai məktəblər olub, kənd ictimaiyyəti tərəfindən təşkil edilir və əhalinin vəsaiti ilə yaşayırdı. O, cümlədən həmin illərdə xeyirxah insanlar çalışırdılar ki, məktəblərdə Azərbaycan dilində dərslər tədris olunsun. Bildiyimiz kimi XVIII əsrin birinci yarısından etibarən rusların Azərbaycan ərazisinə gəlməsi başlandı. Azərbaycan kəndləri ilə qonşu olan rus kəndlərində Rus dilli sakinlər məktəb açdılar. Azərbaycan kəndlərində də məktəb açmaq üçün kənd camaatı böyük səy göstərirdi. B.Hüseynbalaoğlu və M.Talışlı yazır: "XIX əsrin 70-ci illərindən etibarən Azərbaycanlı rus kəndləri ilə bərabər, azərbaycanlı kəndlərində də rus dilində təhsil verən xalq məktəbləri yaradıldı. Bu dövrdə Lənkəran qəzasına daxil olan 58 kənddən 10-da (Həsilli, İncə, Novoqolovka, Provoslavni, Prişib, Qızılağac, Masallı, Mahmudlu) ibtidai xalq məktəbi açıldı." *(B.H. M..Talışlı. Lənkəran, səh. 97)*

Adları sadalanan kəndlərə nəzər etsək görərik ki, o yerlərdə ki, rus dilli xalqlar yaşayırdı, orada məktəblər açılıb və ona yaxın kəndin adamları da öz övladlarının elm öyrənməsinə çalışaraq məktəblər açırdılar. Həmin məktəblər rəsmi statuslu deyildirlər. XIX əsr Azərbaycan məktəblərini tədqiq edən görkəmli alim Hüseyn Əhmədov bu haqda maraqlı tədqiqatlar aparıb. Məktəblər barədə bu tədqiqatlar müəllifin böyük zəhməti gərgin əməyi nəticəsində həyata keçmişdir. Əvvəldə söylədiyimiz kimi Qızılağac əlverişli mövqedə ol-

mağına görə bura gəlib-gedənlər çoxluq təşkil edirdilər. Onlara yaxşı münasibət və qayğı göstərilirdi.

Qonaqsevən kənd camaatı onların rahatlığını təmin etmək üçün qonaq evləri tikib xidmətlərində durardılar. O, dövrdə xeyirxahlığı, qonaq sevərliyi ilə tanınan Xalıq Kərimov 1840-cı ildə iki mərtəbəli qonaq evi tikdirir. Gələn qonaqların rahatlanması üçün yaxşı şərait qurur. Sonradan 1885-ci ildə həmin binanı xalqın balalarının savadlanması xatirinə məktəbə çevirirlər. Həmin məktəbdə I və II sinif həcmində dərslər tədris olunurdu. Məktəbdə dərslər əsasən rus dilində keçirilirdi. Qonşu Nikolayevka (Kalinovka) kəndində 1860-cı ildə ruslar məktəb açmışdırlar. Bu məktəbdə əsasən rus dilli şəxslərin övladları oxuyurdular. O cümlədən, qonşu kəndlərdən olan azərbaycanlılar da orada oxuyurdular. Lakin azərbaycanlı oxuyanlar azlıq təşkil edirdilər. Nikolayevkada açılan rus məktəbində təhsil alan şagirdlərin bəziləri Azərbaycan məktəblərində rus dilində dərs deməyə icazəli idilər. Rus balalarının muasir elmləri oyrəndiklərini görən azərbaycanlılar onlardan geri qalmamaq istəmirdilər. Rus kəndləri ilə birgə Azərbaycanın bəzi kəndlərində də rus dilini, eləcə də muasir elmləri oyrədən xalq məktəbləri açılır.

1890-cı ildə Qızılağac kəndində olan məktəbə qonşu kəndlərdən oxumağa gələnlər ildən ilə çoxalırdı. Bunu görən kəndin qabaqcıl maarifpərvər şəxsləri öz hesablarına yeni sinif otaqları təşkil edirdilər. Onlardan biri xeyriyyəçi maarifpərvər ziyalı Ağabala 140 il bundan qabaq öz səyi nəticəsində yeni bina inşa etdirmişdi. Həmin binanı məktəbə çevirdilər (o bina indi köhnə "Şkola" adlanan məktəb idi). Məktəbdə dərs deyən müəllimlərdən böyük ümidlər gözləyən kənd icti-





maiyyəti məktəbə yaxından köməklik göstərirdilər. O dövr üçün əlamətdar olan bu işləri görən ziyalılar böyük əzmkarlıq ilə çalışır, tədrisin keyfiyyətinin artmasına səy göstərmişdirlər. 1894-cü ildə Qızılağac məktəbinin pedaqoji kollektivinin sayı artdı. Qızılağac kənd sakinləri məktəbdə dərs demək üçün Lənkəran, Bakı şəhərindən müəllimlər dəvət edirdilər. Onların dəvətini qəbul edib məktəbdə müəllimlik etmək üçün gələnlər də oldu. 1880-ci ildən Qızılağaclı müəllimlər şəriətdən, rus dilindən, ana dili və riyaziyyatdan dərs deyirdilər. Qızılağac məktəbində Mirzə Ağarəhim, Molla Əbil, Molla Abdulla, Molla Lətif şəriətdən dərs deyərdilər. Molla Abdulla və Molla Lətif qardaşları digər müəllimlər kimi əzmlə çalışardı. Qızılağacda qeyri-rəsmi fəaliyyət göstərən məktəbin hərtərəfli tədris proqramına malik olmamağı, qonşu kəndlərdən həmin məktəbə gələnlərin sayının çoxluğu nəticəsində Qızılağac məktəbinin dövlət tərəfindən status almasına da kənd camaatı səy göstərirdi. Həmin illərdə dərs deyən müəllimlərdən Ağarəhim müəllim rus dili tədrisində fərqli üstünlüklərlə sevilib, seçilən ziyalı idi. Məhz ziyalıların yerli camaatın təşəbbüskarlığı 1896-cı ildə (hakimiyyət illəri 1894-1917) Rus çarı II Nikolayın ənənəvi tac qoyma mərasimi qeyd edilən ərəfəyə təsadüf edirdi. Həmin tacqoyma mərasimi ümumrusiya əhəmiyyətli tədbir idi. Bu tədbir Rusiyanın hər tərəfində təntənəli surətdə bayram əhval-ruhiyyəsində keçirilirdi. Belə bir tədbirə hazırlıq görüldüyü vaxtda Qızılağaclılar və qonşu kəndlərin yerli sakinləri bu fürsətdən istifadə etməyi qərarlaşdırdılar. Qızılağaclılar fikirlərini qonşu kəndin camaatlarına da çatdırdılar. Qızılağac ziyalılarının səsinə səs verən Yeddioymaq və Hüseynhacılı - kəndinin elm

fədailəri istəyə nail olmağa çalışırdılar. Onlar təcili surətdə Qızılağac kəndində Qızılağac Yeddioymaq və Hüseynhacılı kənd camaatının iştirakı ilə 1895-ci ildə oktyabr ayının 20-də yığıncaq keçirdilər. Yığıncaqda iştirak edənlər Qızılağac məktəbinin rəsmi şəkildə fəaliyyət göstərməsini vacib bildilər. Yığıncağın gündəliyində duran məsələ - Qızılağac kəndində, rəsmi ibtidai məktəb açmaq-müzakirə edildi. Yığıncaq iştirakçıları tərəfindən qəbul edilmiş qərara dövlət tərəfindən Ərkivan starşinası və 450 nəfər kənd sakinləri imza atmışlar *(Azərbaycan MDTA, Fond. 309, iş N 717 a. 10, s.4.)*. Qərarda məktəbin fəaliyyəti üçün kəndlilərdən ildə 350 manat dövlət vəsaitinə pul köçürülməsi də göstərilirdi. Bütün bu deyilənləri nəzərə alaraq dövlət 1896-cı ilin fevral ayının 17-də rəsmi şəkildə Qızılağacda məktəb açmağa icazə verdi.



*Mahmud bəy Mahmudbəyov (1863-1923)*

Həmin vaxt məktəbə dövlət tərəfindən rəsmi şəkildə Qori Seminariyasının məzunu, əslən şamaxılı olan Mahmud bəy Mahmudbəyov (1863-1923) müdir təyin edildi. 1896-cı il fevralın 17-də Qızılağac kəndində təntənəli surətdə Mahmud Mahmudbəyovun sədrliyi ilə Qızılağac, Hüseyn Hacıllı və Yeddioymaq kənd camaatının nümayəndələrinin iştirakı ilə məktəbir açılış mərasimi keçirildi. *(B.Hüseynbalaoğlu, M.Talışlı. Lənkəran, Bakı , 1990, səh 97-98)*

M.Mahmudbəyovun açılışla bağlı çıxışından sonra Qızılağac və qonşu kəndlərdən açılış mərasimində iştirak edən nümayəndələr çıxış edərək, sevinclərinin həddi-hüdudu olmadıqlarını bildirdilər və məktəbin rəsmi status almasında onlara olunan bu töhfəyə görə aidiyyatlı orqanlara minnətdarlıqlarını bildirdilər. Az vaxt içərisində Qızılağac məktəbinin mövqeyi ərazidə yaşayanlar tərəfindən yüksək qiymətləndirildi. Bu nüfuzun, mövqeyin əldə olunmasında M.Mahmudbəyovun misilsiz xidmətləri olmuşdur. M.Mahmudbəyov az vaxt içərisində müəllim kollektivinin və əhalinin sevimlisi oldu. Bütün bunlara baxmayaraq məktəbin fəaliyyətində nöqsanların olmasına da səy göstərənlər az da olsa mövcud idi. Belə ki, bəzi şəriət müəllimləri əsas üstünlükləri dini biliklərin təbliğinə vermək istəyirdilər. Lakin gənc ziyalı M.Mahmudbəyov öz pedaqoji təcrübəsindən istifadə edərək dərslərin tədrisini tərtib edilmiş proqram əsasında keçirməyi tələb edirdi.





Belə tələbkarlığın müqabilində şəriət müəllimləri - mollalar dünyəvi fənlərin tədrisinə hər vasitə ilə mane olmağa çalışırdılar. Bu çalışqanlıq səmərəli fayda vermədiyi üçün, onlar uşaqların məktəbə gəlmələrinə mane törədirdilər və şagirdləri məktəbdən yayındırmağa çalışırdılar. Bu sahədə ən çox səy göstərən Şəriət müəllimi Molla Abdulla idi. Molla Abdullanın bu hərəkətlərindən duyuq düşən kənd camaatı məktəb direktorluğu qarşısında məsələ qaldırdılar. Məktəb direktorundan xahiş etdilər ki, Molla Abdullanın məktəbdən çıxmasını təmin etsin. Lakin o dövrdə müəllim kadrlarına böyük tələbat olduğu üçün onların məktəbdən çıxarılmasını direktor yox, yuxarı orqanlar həyata keçirirdi. Xalqın istəklərini nəzərə alan məktəbin direktoru M.Mahmudbəyov məktəbin tabe olduğu Bakı quberniyası və Dağıstan Vilayət Xalq məktəblə-

ri direktoruna raport yazdı. Yazdığı raportda məktəbdə baş verən hadisələr haqqında məlumat vermiş, yayınmada bir növ səbəbkar olan Molla Abdullanın müəllimlikdən azad edilməsini xahiş etmişdir. Qızılağac məktəbində tədrisin keyfiyyətini yaxşılaşdırmaqdan ötrü məktəbə ləyaqətli, təcrübəli, səriştəli, müasir inkişafa təkan verə biləcək şəriət müəllimlərinin göndərilməsini xahiş etmişdir.

O cümlədən Mahmud bəy Mahmudbəyov olunan müraciətlər barədə həmin məktubla Bakı quberniyası və Dağıstan Vilayət xalq məktəbləri direktoruna məlumat verdi. Məktubda M.Mahmudbəyov Lənkəran qəzasının Bütəsər, Küryədi, Andreyevka kəndlərindən olunan müraciətlərə əsasən həmin kəndlərdə məktəb açılmasını təklif edirdi. M.Mahmudbəyovun bu müraciətindən sonra Molla Abdulla müəllimlimlikdən xaric edildi. Onun yerinə isə Bakı şəhərindən ali dini təhsilə malik olan müəllim göndərilmişdi. Həmçinin onun müraciətindən sonra yuxarıda adları çəkilən kəndlərdə az vaxt içərisində məktəb açılacağı nəzərdə tutuldu. *(B.Hüseynbalaoğlu, M.Talışlı. Lənkaran, Bakı, 1990, səh.98).*

Molla Abdulla məktəbdən xaric edildikdən sonra mədrəsədə dərs dedi, həm də "Kiçik Axund" kimi fəaliyyət göstərdi. Mahmud bəy Mahmudbəyovun Qızılağac məktəbində göstərdiyi fəaliyyət nəticəsində şagirdlərin dərsə davamiyyəti artdı. Valideynlər də məktəb direktoruna mənəvi dayaq durdular.

Mahmud bəy Mahmudbəyovun səyi və bacarığı sayəsində məktəbdə davamiyyət artdı, təlim-tərbiyənin keyfiyyəti yüksəldi... 1896-cı ildə Qızılağac məktəbində 38 şagird təhsil alırdı. Məktəb tariximizin tədqiqatçısı professor Hüseyn Əhmədov





yazır: "Masallı kənd məktəbi Musaküçə, Digah və Masallı kənd camaatı, Qızılağac məktəbi isə Hüseyn Hacılı, Yeddioymaq və Qızılağac kənd əhalisi tərəfindən açılmışdır" *(H.Əhmədov "XIX əsr Azərbaycan məktəbi" 1985-ci il, səh. 102).*

Bu məktəblərin hər birinə bir hektar torpaq sahəsi ayrılmışdır. Həmin torpaq sahəsində yardımçı təsərrüfatı inkişaf etdirmək nəzərdə tutulurdu. Bundan əlavə Qızılağac məktəbi üçün isə o dövrdə yataqxana binası tikmək də nəzərdə tutulmuşdur. Məktəb tarixində Qızılağac məktəbinə bu böyük töhfə idi. Həmin yataqxana 1950-ci ilin axırına kimi mövcud idi. Yataqxana tikilməsi bu məktəbə kənardan oxumağa gələnlər üçün ən mühüm amillərdən biri hesab edilirdi.Qızılağac məktəbi üçün nəzərdə tutulan yataqxana başqa məktəblərdə nəzərdə tutulmamışdır.

1895-ci ildə Nikolayevka kəndindəki məktəbdə ən çox şagird təhsil alırdı. Burada oxuyan 123 şagirddən 62 nəfəri azərbaycanlı idi. Onu da bilmək lazımdır ki, Qori Seminariyasının məzunları olan M.Mahmudbəyov 1896-cı ildə Qızılağacda, Səmədbəy Acalov 1897-ci ildə Mahmudlu kəndində inqilaba qədərki ilk məktəbin əsasını qoymuşdurlar. S.Acalov Mahmudluda məktəb müdiri işləmiş, səkkiz şagirdə rus dili və hesabı öyrədib, onlara dünyəvi elmlərdən, klassiklərin əsərlərindən maraqlı məlumatlar vermişdir. Mahmudlu kəndi səhvən Mahmudavar kəndi kimi düşüb. Bu kənd vaxtilə Xırmandalı yaxınlığında olmuş, hazırda isə yoxdur. *(F.Seyidov, "Qori seminariyası və onun məzunları", Bakı, 1988, səh.171).*

Əvvəldə qeyd etdiyimiz kimi Qızılağacda qədim zamanlardan elmə, təhsilə maraq çox olmuşdur. Bunun biz tarixi ya-

zılarda şahidi oluruq. Belə ki, Səfəvi şahları, Qızılbaş əyanları I Şah İsmayıldan başlayaraq elm və incəsənətə hamilik edirdilər. Şah kitabxanaları, saray kitabları təşkil olunurdu. Kitab çapı Avropada və Rusiyada genişlənmişdi. Azərbaycanda isə kitab çapı işi çox zəif idi. Buna görə kitabların üzlərinin köçürülməsi işi geniş vüsət aldı. Bu işdə yüksək ixtisaslı xəttat və mirzələr var idi. Onlar yalnız Şah kitab evinin və ya feodal elm və incəsənət hamilərinin sifarişi ilə işləyirdilər.

1592-1596-cı illərdə Qızılağaclı Azəraycan xəttatı Əli Feyzi məşhur özbək alimi, şairi və dövlət xadimi Əlişir Nəvainin (1449-1501) seçilmiş əsərlərini Ərdəbil hakimi Fərhad xan Qaramanlının kitabxanası üçün köçürmüşdü. Bu dövrdə kitabların üzünün köçürülməsi geniş yayılmışdı. Əli Feyzinin yetişdirdiyi qızılağaclı xəttatlar da o dövrdə az olmamışdı.

Mahmud bəy Mahmudbəyovun Qızılağac məktəbində böyük xidmətləri olmuşdur. Onun səyi nəticəsində az vaxt içərisində şagirdlərin sayı 45-ə çatmışdır. O, 1898-ci ildən Bakı şəhərində işləməyə çağırlımışdır. Məhz onun xidmətlərinin nəticəsində Qızılağac məktəbi sonrakı illərdə öz inkişafını dayandırmadan uğurla fəaliyyət göstərmişdir.

Qızılağac məktəbində dərs alan şagirdlər, dərs deyən müəllimlər təhsil sahəsində ilk təşkilatçı qədirbilən ziyalı, elm fədaisi M.Mahmudbəyovu həmişə xatırlamaqdadırlar. Qızılağac məktəbinin 1900-cü ildən etibarən fəaliyyət dairəsi genişləndi. Artıq bu məktəbə ətraf kəndlərdə yaşayanlar ildən-ilə kütləvi şəkildə oxumağa gəlməyə başladılar. 1905-ci il Burjua demokratik inqlabı Azərbaycanda genişlənməkdə olan pedoqoji hərəkata böyük təkan verdi.

Azərbaycanın demokratik inqilabçı və mütərəqqi ziyalıları maarif və mədəniyyətin inkişafı ilə ciddi məşğul olurdular. Pedaqoji hərəkat geniş ictimai vüsət alırdı. Birinci rus inqilabından təsirlənən mütərəqqi demokratik ziyalılar dəstəsi Azərbaycanda məktəb, maarif və mədəniyyət məsələlərini geniş şəkildə müzakirə etməyə başladılar. Bunun nəticəsi idi ki, 1906-cı il avqust ayının 15-də Bakıda birinci Müəllimlər Qurultayı çağırıldı. 1907-ci il avqust ayının 25-də isə ikinci Müəllimlər Qurultayı çağrıldı. Hər iki qurultay Azərbaycan pedaqoji fikir tarixində və genişlənməkdə olan pedaqoji hərəkatda xüsusi rol oynadı. Burada günün ən vacib məsələləri müzakirə edilirdi. Ana dilində məktəblər açılması proqramların tərtibi, ana dilində dərs kitablarının yaradılması, müəllimin hazırlığı və s. məsələlər qurultay gündəliyində əsas yer tuturdu. XX əsrin əvvəllərində Azərbaycan maarifpərvərləri Nəriman Nərimanov, Mahmud Mahmudbəyov, Üzeyir Hacıbəyov və b. yeni məktəb uğrunda fəal mübarizə aparırdılar. Onların hərəsi öz fikirlərini "Rəhbər", "Molla Nəsrəddin" və s. jurnalarda açıqlayırdılar.

Üzeyir Hacıbəyov yazırdı: "Bizə türk məktəbləri - milli məktəblər lazımdır. Mən milli məktəb ona deyirəm ki, orada bütün elmlər öz ana dilimizdə tədris olunur. Əcəba, biz müəllimlər öz ana dilimizi mükəmməl bilirikmi? Biz yazıqlar hansı məktəbdə öz dilimizdə oxumuşuq? O ki, qaldı milli məktəblərimizə, onların sayı çox azdır... Yeni üsullu məktəblərdə şagirdlər ilk dəfə olaraq partalarda oturar və qələm, karandaşdan istifadə edərlər..." *(Üzeyir Hacıbəyov, əsərləri 4-cü cild, Bakı 1968.səh160).* Yeni üsulla məktəb açılması ciddi çətinliklərlə üzləşdi. Uzun müddət davam edən köhnə tədris metodundan əl çəkmək də asan deyildi.

1905-1907-ci il inqilabından sonra xalqın qazanmış olduğu hüquqlardan biri də ana dilində məktəb açmaq hüququ idi. XIX əsrin axırı və XX əsrin əvvəllərində Azərbaycan maarifpərvərlərinin ana dilində məktəblərin açılması uğrunda çəkdikləri böyük zəhmət 1918-1920-ci illərdə Azərbaycan Demokratik Cümhuriyyəti dövründə öz bəhrəsini verdi yetirilmişdir. Azərbayan məktəblərində ana dilində dərslər keçirilməyə başlandı. Bu müstəqil Azərbaycan dövlətinin ilk təlimin Azərbaycan dilində aparılması ideyasının həyata keçməsi üçün ilk xidmətlərindən biri idi. Azərbaycanın görkəmli maarifpərvərlərindən Mirzə Fətəli Axundov, Həsən bəy Zərdabi, Məhəmməd Tağı Sidqi, Sultan Məcid Qənizadə, Firudin bəy Köçərli, Nəcəf bəy Vəzirov, Rəşid bəy Əfəndiyev, Mahmud bəy Mahmudbəyov, Cəlil Məmmədquluzadə, Nəriman Nərimanov, Abbas Səhhət və başqaları yeni açılan məktəblərdə yeni keyfiyyətli dərs kitablarının olmasını tələb edirdilər...

M.Mahmudbəyovun "Türk əlifbası və ilk qiraət" kitabının 1918-ci ildə 14-cü çapı nəşr edilir. O, çoxlu sayda ana dilində dərs kitabları yazmışdır. Məhz onların səyi nəticə verdi, az zaman içində çoxlu sayda kitablar yazıldı. Onu da bilmək lazımdır ki, Azərbaycan məktəb tarixində "rus-müsəlman" məktəblərinin böyük rolu olmuşdur. Belə bir vaxtda Qızılağac məktəbin müəllim kollektivi yüksək dərəcədə dərsləri tədris edirdilər. Həmin illərdə Qızılağac məktəbinin məzunları Lənkəran və Bakı şəhərindəki yuxarı sinifli məktəblərə gedib dərslərini davam etdirirdilər. 1914-cü ildə I dünya müharibəsinin başlanması məktəblərin fəaliyyət dairəsinin genişlənməsinə mənfi təsir göstərdi. O vaxta qədər ra-





yonda olan məktəblərin sayı demək olar ki, sabit vəziyyətdə olmuşdu. 1917-ci il burjua inqilabına qədər demək olar məktəblər çox zəif şəkildə çoxalırdı. Onu da bilmək lazımdır ki, Lənkəran qəzasında o cümlədən Masallı rayonu da daxil olmaqla cəmisi 884 şagirdi olan 68 məktəb və 20 şagirdi olan iki mədrəsə var idi. Bu həmin dövrün ən aşağı göstərici hesab olunurdu. Lakin Böyük Oktyabr Sosialist İngilabı qalib gələndən sonra Sovet Hökuməti savadsızlığı aradan qaldırmaq üçün kütləvi şəkildə mübarizə yoluna qədəm qoydu. Qəzanın kəndlərində yeni məktəblər təşkil edildi. O cümlədən Qızılağacda mövcud olan məktəbdə 1920-ci ildə bir sinif də artırıldı. Həmin vaxtlarda 42 şagird təhsil alırdı.


*Mirzə İsa Tağıyev*
*1897-1967*

Mirzə İsa Tağıyev 2-ci, Mirzə Məhəmməd Tağı 1-ci, Lənkərandan olan Nəhməd Əmənov 3-cü siniflərdə dərs deyirdilər. Şagird çoxluğunu nəzərə alaraq 1921-ci ildə Qızılağac məktəbində bir sinif də artırıldı. Dörd sinifli məktəb oldu. 1921-ci ilin iyul ayında Azərbaycanın görkəmli dövlət xadimi, ilk maarifpərvər ziyalılardan biri olan Nəriman Nərimanovun Qızılağacda olarkən kənd məktəbində olması, müəllim kollektivi və kənd camaatı ilə görüşməsi məktəbin əfəaliyyətinə güclü təsir bağışlamışdır. Onun Qızılağacda olmağını keçmiş müdrik ağsaqqallar tez-tez xatırlayardırlar.

1920-ci ildən başlayaraq Qızılağac məktəbinin dərs deyən müəllimlərə ehtiyacı çox idi. Belə bir vaxtda Mirzə İsa Tağı-

yev və Mirzə Məhəmməd Tağı Kərimov rus dilindən dərs deməyə başladılar. Bunlar hər ikisi Qızılağacda 1896-cı ildən fəaliyyət göstərən məktəbin məzunları idilər. Sonralar bunlar müxtəlif fənlərdən dərs deməyə də icazəli oldular. Mirzə Məhəmməd Tağı və Mirzə İsa müharibə illərində Bakı şəhərinə köçdülər. Mirzə Məhəmməd Tağı indiki Neft Kimya Akademiyasında işlədi, dosent kimi fəaliyyət göstərdi. Rus dili kafedrasının müdiri oldu. Mirzə İsa Sumqayıtda orta məktəbdə dərs deyərdi.



*Mirzə Məhəmməd Tağı müəllim*

Məktəbə həmən illərdə qonşu kəndlərdən üz tutanların sayı çoxluq təşkil edirdi. Şagirdlər başqa yerə oxumağa getməsinlər deyə 1925-ci ildə Qızılağacda olan 5 sinifli məktəb fəaliyyət göstərirdi. Belə bir vaxtda Qızılağac məktəbinə dərs





demək üçün Bakıdan müəllimlər göndərildi. Onlardan biri əslən Bakılı olan Əzizağa müəllim Qızılağacla öz həyatın bağlamış, evlənib burada yaşamış sonra da Lənkərana köçmüşdür. Səlyandan Nuşirəvan, Ağarəhim adlı müəllim, Masallıdan Sədrə müəllim də olmuşdur. Həmin illərdə məktəbdə oxuyanlardan Mahmud Fətulla oğlu, Zəbi Qəribov və s. müəllimlərinin haqqında çoxlu məlumatları olduqlarını söyləyirlər. 1930-cu ildə Qızılağacdakı məktəb yeddi illik məktəbə çevrildi. Getdikcə Qızılağac yeddiillik məktəbi təhsil bazasını genişləndirmiş, yerli camaatın məktəbə, qayğısı artmışdır. Artıq demək olar ki, Azərbaycan dilində bütün dərslər tədris olunur, buna baxmayaraq xarici dillərə də maraq az deyildi. Qızılağaclı müəllimlər ordusuna ilk ali təhsilli qızılağaclı Mirzə Əhməd Şükürzadə həmin dövrlərdə başçılıq edirdi. Mirzə Əhmədin ali ruhani təhsili olduğu üçün ona Qazı Əhməd deyərdilər. Onun şagirdləri onun haqqında ürək dolusu söhbətlər açaraq fəaliyyətini yüksək qiymətləndirirdilər. Mirzə Əhmədlə yanaşı qoçu Məmmədin oğlu Məmməd də ali təhsilli müəllim idi, ona "Şirin bala" deyərdilər. Məktəbin inkişaf tempinin qarşısında sinif otaqları azlıq edirdi. Kənd sakinləri öz binalarını məktəb kimi xalqın balalarının ixtiyarına vermişdirlər. Onu da bilmək lazımdır ki, 1920-ci ildən 1938-ci ilə kimi Qızılağac məktəbinin məzunları o dövrdə yüksək dərəcədə elmə olan münasibətlərinə görə Respublikanın Ali məktəblərində ali təhsil almış və ən mühüm vəzifələrdə işləmişlər. Onlardan Mahmud Haşımov, Qulam Səfərov, Mirməmməd Abdullayev və s. göstərmək olar. 1938-ci ildə məktəbə orta məktəb statusu verildi. Bu zaman artıq məktəbin pedaqoji kollektivinin çox hissəsi demək olar ki, ali təh-

sillilərdən ibarət idi. O cümlədən əksəriyyət müəllimlər qızılağaclı idilər. 1930-cu ildə Nağıyev Ələkbər Hilal oğlu öz savadı və biliyindən başqalarının da faydalanmasını lazım bilmiş. Belə ki, o dövrü mətbuatda çıxışlar etməklə Azərbaycanda kolxoz quruluşunu, digər sahələri müntəzəm olaraq dövrü mətbuatda işıqlandırırdı. Bütün bu xidmətlərinə görə 20 sentyabr 1932-ci ildə "Azərbaycan kolxozçusu" qəzetinin mininci yubley buraxılışı ilə əlaqədar olaraq ona təşəkkür vərəqəsi göndərilmişdir.

Nağıyev Ələkbər müəllimlik etməklə yanaşı Ali məktəbin üçüncü kursunda tarix fakültəsində oxuyurdu. Bunu ona institut tərəfindən verilmiş 26.IV. 1939-cu il 08 saylı arayışda oxumaq olar. Nağıyev Ələkbər Azərbaycan komsomolunun XIV qurultayında 30 sentyabr 1940-cı ildə nümayəndə kimi iştirak edib. Onun qarşılanması barədə o vaxtkı "Yeni həyat" qəzetində şəkli və məlumat verilmişdir. Qızılağac məktəbi Səlyan-İran yolunun üstündə olduğu üçün Lənkərana işləyən müəllimlər bu məktəbdə olmağı özlərinə rəva bilərdilər. Qonşu Yeddioymaq kəndindən olan Teymur bəy Bayraməlibəyov Mahmud bəylə olan münasibətinə görə bir neçə dəfə Qızılağac məktəbində olmuşdur. Teymur bəy Bayraəlibəyov Qori seminariyasının ilk məzunlarından biri idi.

1906-cı ildə Qori Seminariyasının məzunu olan Müslüm Maqomayev Lənkaranda işləyirdi və bir neçə dəfə Qızılağac məktəbində olmuşdur. Hətta onun o vaxt Qızılağclı müəllimlərlə şəkil çəkdirməsi də buna sübutdur. Bakı şəhərindən Səməd Qəribi Qızılağaca köçürüldükdən sonra onun dostları ona dəyməyə gələrmişlər və məktəblə maraqlanırmışlar. Onlar-





dan Süleyman Rüstəmi, Əliağa Vahid, Mirzə Əli Möcüz kimi məhşur şairləri göstərmək olar. Bu barədə əsasən o dövrdə məktəblə bağlı olanların xatirələri, arxiv sənədləri də bunu təsdiqləyir.

Qızılağac kəndində ağır həyat tərzi hökm sürməsinə baxmayaraq kənd camaatı öz övladlarının məktəbdə oxumasında maraqlı idilər. Qızılağaclıların elmə olan böyük maraqlarının nəticəsidir ki, orta təhsil alanlar Ali məktəblərə üz tuturdular. Qızılağaclı Əli Əsgərov, Qulam Səfərov, Yusif Əliyev, Mirməmməd Abdullayev, Əliabbas Axundov, Abdulsəməd Abbasov, Mahmud Haşımov və s. göstərmək olar. Mahmud Haşımov qızılağaclı səhiyyə işçilərinin öndəridir. 1910-cu illərdə Ali təhsilli həkim idi. Sonradan ixtisasını dəyişib hüquqşünas olmuşdu. Onun oğlu İmran Haşımov da atasının peşəsinə - həkimliyə maraq göstərmiş, o da ali təhsilli həkim idi. 1938-ci iildən orta məktəb kimi fəaliyyət göstərən məktəbin 1941-ci ildə ilk buraxılışı Yeddioymaq, Hüseyn Hacılı və Qızılağac kənd ictimaiyyətinin iştirakı ilə oldu. Kəndlərin sakinləri orta məktəbin ilk qaranquşlarına xeyirdua söylədilər. Qızılağac orta məktəbini bitirənlərdən Seybə Nağıyev, Əbil Məmmədov, Qüdrət Məmmədov və s. cavanlar ali təhsil almağa yollandılar. Onlar hər ikisi ali təsilli əczaçı ixtisasına yiyələndilər. Qüdrət Məmmədov əlaçı şagird olub. Onun Qızıl medalla təltif olunmağa göstəriciləri var idi. Müəyyən səbəblərə görə verilməyib.

1941-ci ildə başlanan müharibə nəticəsində, məktəbin acınacaqlı dövrü başlandı, məktəb müəllimləri cəbhəyə yollandılar. Şagirdlərin dərsə davamiyyəti azaldı və məktəb yeddiillik təhsil tədrisinə keçirildi. Lakin, ölkənin müharibə şəra-

itində olmasına baxmayaraq məktəb fəaliyyətdə idi. 1945-ci ilin may ayının 9-da qələbə çalan ölkəmiz dinc quruculuq dövrünə qədəm qoymağa başladı. Yeddillik təhsil alan gənclər Masallıdakı orta məktəbdə təhsillərini davam etdirirdilər. Onu da bilmək lazımdır ki, Qızılağaclı uşaqlar bilik səviyyəsinə görə başqalarından üstün tutulurdular. O cümlədən riyaziyyat fənnini çox mükəmməl bilirdilər. Qocaman müəllim İman Həsənov deyərdi: "Qızılağaclı şagirdlər Masallıdakı orta məktəbdə oxuyarkən riyaziyyat fənni üzrə bilikli uşaqlar kimi tanınırdılar". Qızılağac kəndinə qonşu Qədirli, Qarğalıq, Xallıcallı, Hüseyn Hacılı, Kalinovka, Yeddioymaq, Təzə kənd, Qasımlı, Şıxlar kəndindən çoxlu şagirdlər oxumağa gəlirdilər. Lakin sinif otaqları azlıq edirdi. 1937-ci ildə sahibi sürgün edilən "Dəmirli məktəb" adlanan Hacı Məmməd evi də ikinci məktəb kimi fəaliyyət göstərməyə başladı. Yenə də sinif otaqları yenə də azlıq edirdi. Xeyirxahlığa qoşulan Əliabbas Axundov və Qulu Nəsrullayev öz atalarından qalan Lətif Abdullayevin, Məşədi Məmmədin evlərindən də sinif otaqları kimi istifadə etməyə icazə verdilər.

1951-ci ildən Qızılağacdakı yeddiillik məktəb orta məktəbə çevrildi. Lətif Abdullayevin evini kolxoz idarə binasına çevirdilər. Məşədi Məmmədin evini söküb kolxoz təsərrüfatında işlətdilər. "Şkola" adlanan məktəbin sinif otaqları saca azaldı. Belə olan vəziyyətdə kəndin qabaqcıl ziyalıları Ağaverdi Məmmədov, Məmmədbağır Salayev, Məhəmmədhəsən Həsənov, Ağabala Ağabalayev, Məryam Ələkbərova, Qələm Məmmədov, Rübabə Səmədzadə, Əhməd Ağayev, Nüsrət Kərimov və başqaları qaları böyük təşəbbüslüklə





"şkola" məktəbin də sinif otaqlarının sayının çoxalmasına səy göstərdilər. Kolxoz idarə heyətinin köməkliyi ilə əlavə dörd sinif otağı tikildi. Həmçinin Hacı Məmməd evi olan "Dəmirli məktəb"ində bir hissəsindən söküb şkoladakı sinif otaqlarını artırdılar. Məktəbə yaxın olan Əşrəf Həmidovun evindən də məktəb kimi istifadə olunmağa sahibləri razılıq verdi. 1951-ci ildə Qızılağac orta məktəbinə Yeddioymaqlı Cəfər Əzizov direktor təyin olundu. Qızılağac ərazisində hərbi şəhərciyin sakinləri olan rus dilli xalqın nümayəndələrinin ali savadlıları da Qızılağac orta məktəbində dərs ilə təmin edildilər. Onlar da rus dili və ədəbiyyatını tədris edirdilər. Qızılağac yeddiillik məktəbin sonra isə Masallı orta məktəbini bitirən məzunlar ali təhsil alaraq öz dərs aldıqları məktəbdə müxtəlif fənlər üzrə dərs deməyə başladılar. 1953-cü ildə məktəb direktoru qızılağaclı Kazım Həsənov təyin edildi. Cavan müəllimlərin məktəbə gəlişi nəticəsində tədrisin keyfiyyəti, təlim-tərbiyə işinin səviyyəsi artmağa başladı. Kazım Həsənov öz vəzifə borcunu yerinə yetirməklə məktəbin tədris keyfiyyətində böyük dönüş yaratdı. İlk növbədə müəllimlərin dərsə olan münasibəti, tələbkarlığı nəticəsində şagirdlərin bilik səviyyəsi artırdı. İstər Cəfər Əzizov, istərsə də Kazım Həsənovun xidmətləri əvəzedilməzdir. Müharibədən sonra Qızılağac məktəbinin ilk buraxılışı 1953-1954-cü tədris ilində oldu. Gənc müəllim Salman Abdullayev 1956-1957-ci tədris ilində məktəbə direktor təyin olundu.

Artıq hər tədris ilinin sonunda məktəbin onuncu siniflərini bitirən məzunlar böyük həvəslə, yüksək bilik dərəcəsi ilə Ali məktəblərə daxil olurdular. 1961-ci ilə kimi pedaqoji sa-

həyə məzunlar çox meylli idilər. Qızılağacda "Dəmirli məktəb" adı ilə adlanan digər təhsil mərkəzində ibtidai sinif həcmində dərslər keçirildi. Həmin məktəbin dördüncü sinfini bitirənlər orta təhsil üçün Qızılağac orta məktəbinə "Şkola"ya oxumağa gəlirdilər.

Qızılağac kənd orta məktəbinə qonşu kəndlərdən oxumağa gələnlər üçün yataqxana şəraiti 1896-cı ildə yaradılmışdı. Həmin (1951-64-cü illərdə) məktəb şagirdləri iki növbəli oxuyurdular. O cümlədən, məktəbdə ayrı-ayrı fənlər üzrə dərnəklər, həmçinin özfəaliyyət dərnəkləri fəaliyyət göstərirdi. Özfəaliyyət dərnəyində istedadlarını nümayiş etdirən orta məktəb şagirdləri artıq püxtələşərək böyük dinləciyi kütləsi qarşısında çıxışlar edirdilər. Onların səhnələşdiridikləri Səməd Vurğunun "Vaqif" mənzum dramı daha özünəməxsus yadda qalan bir xatirədir. Bu işdə həmin illərdə Qızılağac kənd klubunun müdiri, öz sənətinin bilicisi olan Kamil Abdullayevin də xidmətləri əvəzsiz olmuşdur. Səhnə tərtibatı, quruluş vermək məhz onun adı ilə bağlıdır. Onun komik danışığı və hərəkətləri dram əsərinin canlı təsir bağışlamasında böyük rol oynayırdı. 1957-ci ildə məktəbin sinif otaqlarını sayı onbeşə çatdırıldı.

Qızılağac kənd orta məktəbinə 1961-ci ilə kimi yeni-yeni müəllim kadrları, maarif nazirliyi tərəfindən göndərilirdi. Bunların əksəriyyəti respublikanın ayrı-ayrı regionlarından olan Ali təhsilli müxtəlif ixtisaslı müəllimlər idilər.







*Salman Abdullayev (1933-2001-ci il.)*

Əslən Füzuli rayonundan olan Cəlal, Masallının Hişgədərə kəndindən olan ər-arvad Soltan və Sona xanım, Səlyandan Allahyar, Ərkivandan Pərviz, Xurşud Qasımov, Xıldan Əfruz Məmmədov, Əbilqasım, Qazaxdan Həlimə Piriyeva, Qızılağacdan Mirhadı Abdullayev, Məmməd Nağıyev və s. müəllim işləmişlər. Bakı şəhərindən olan ingilis dili müəllimi Həzər, əslən Qızılağaclı olan Bakı şəhərində yaşayan rus dili müəllimi Rəfiqə, Xədicə və s. göstərmək olar. Gəlmələrdən biri az vaxt içərisində Qızılağaca qaynayıb-qarışan Yolçu İsmayıl oğul Piriyev olmuşdur. Əslən Qazax rayonunun aşağı Salahlı kəndindən olan Yolçu müəllim poeziyaya şagirdlər arasında böyük həvəs yaradaraq onlar- da şerə, bədii sözə diqqət aşılamaqda səy göstərirdi. Məhz bunun nəticəsi idi ki, həmin illərdə orta məktəb, şagirdləri dövri mətbuatda öz şerləri ilə çıxış edirdilər. Gənc yazarlardan: Əli Nəsirov, Sakit Ağabalayev, Sabir İbrahimov, Qulu Vəci oğlu, Sabir Abbasov, Şakir Abışov və başqaları məhz Yolçu Piriyevin yetirmələri idi. Yolcu Piriyev Bakı şəhərində yaşayan Qızılağacla münasibəti saxlamışdır. Onun oğlu İsmayıl Qızılağacda anadan olub. İndi tanınmış hüquqşünasdır. Qızılağac özfəaliyyət dərnəyinin üzvləri Şekspir yaradıcılığına müraciət edərək onun əsərlərini səhnələşdirirdilər. Eyni zamanda onu da deyim ki, Qızıla-

ğac orta məktəbində ikinci növbədə həmişə canlanma var idi. Məktəbin 5-ci sinif şagirdlərindən tutmuş 10-cu sinif şagirdləri üçün ayrı-ayrı fənnlərdən dərnəklər təşkil edilmişdi. Canlanmaya da səbəb məhz bu dərnəklər idi. Qızılağac orta məktəbində Olimpiadaya hazırlıq da böyük əhəmiyyət kəsb edən bir hal idi. Orta məktəb şagirdləri olimpiada da nümunəvi yerlər qazanırdılar. Dərnək rəhbərliyinin işi çox təqdirəlayiq idi. Ona görə ki, həmin gün keçilən dərsi şagird dərnək ərəfəsində öyrənirdi. 1950-ci ildən başlayaraq partiya və hökumət yenidən təhsilə böyük əhəmiyyət verirdi. Savadsızlığa qarşı mübarizə o dövr üçün ən başlıca vəzifə hesab olunurdu. Həmin dövrlərdə hətta evdar savadsız qadınlara da evlərə gedib yazıb-oxumaq öyrətmək üçün dərslər deyilirdi. Ölkənin hər yerində məktəblər üçün yardımçı sahələr ayrılmışdı. Məktəblərdə şagird istehsalat briqadası da fəaliyyət göstərirdi. Ali təhsil Nazirliyi ölkənin zavod, fabriklərində, xalq təsərrüfatının müxtəlif sahələrində, kənd təsərrüfatının müxtəlif sahəsində ixtisaslı kadrların olması üçün məktəblərdə peşə yönümlü ixtisasların keçirilməsinə qərar verdi. Orta məktəbin IX sinifindən bu fənlər tədris olunardı. Həmin sahələr üzrə peşə ixtisasları şəhadətnaməsi verilirdi. 1963-64-cü tədris ilində ölkə miqyasında bu işı genişləndirmək üçün orta məktəblər on bir illik təhsil sisteminə keçdi və peşə yönümlü ixtisaslar çoxaldı. Ümumiyyətlə, keçmiş SSRİ təhsil sistemində ölkə miqyasında vahid dərs proqramı tərtib olunmuş idi. Respublikada ehtiyac duyulan ixtisaslara nail olmaq üçün respublikadan kənarlara Qızılağacdan da oxumağa gedənlər var idi. Onlardan Bəylər Ağayev, Mehman Fətullayev, İlhamə Abışova, Fərhad Səfərov, İngilab Səfərov





və s. Qızılağac orta və ya on bir illik məktəbin məzunlarının demək olar ki, əkəsriyyətinin səsi ali məktəblərdən, orta ixtisas, peşə məktəblərindən gəlirdi. 1960-1985-ci illər ərzində Qızılağaclı məzunların 80 faizi ali və orta ixtisas məktəblərinə daxil olduqlarına görə həmin illəri Qızılağac məzunlarının bilik sahəsində intibah dövrü hesab olunur. İllər ötdükcə Qızılağac təhsil sistemi geniş vüsət alır və inkişaf edirdi. Bununla da Qızılağac ziyalıların potensiyalı il ildən çoxalırdı.

Qızılağac kəndində köhnə tipli məktəb binaları bir növbəli oxumaq üçün azlıq edirdi. Odur ki, bütün bunları nəzərə alaraq 1971-ci ildə "Şkola" adlanan məktəbin bazasında (onda bir saylı məktəb adlanırdı) 400 şagird yeri olan müasir iki mərtəbəli məktəb binası inşa edildi. Məktəbin geniş sinif otaqları və idman zalı şagirdlərin ixtiyarına verildi. İndi 1 saylı orta məktəbdə 694 şagird dərs alır. Onların tədrisi ilə 34 ali təhsilli və 20 ali orta təhsilli müəllim kollektivi məşğul olur. Məktəbdə 1956-cı ildən 2001-ci ilin yanvar ayının 11-nə kimi Salman Abdullayev direktor vəzifəsində işləyib. Məktəbə vaxtilə məktəbin məzunu olan Qarabağ şəhidi Sübhan Xəlilovun adı verilib. 1 saylı məkthəbin 1975 ildə bir qızıl medallı məzunu Səfərova Mailə Ayaz qızı olmuşdur. Həmin illərdə məktəbin direktoru Fazil Abbasov idi. Qızılağacda 1896-cı ildən fəaliyyət göstərən məktəbin məzunlarının səsi Ali tribunalardan, Ali kürsülərdən gəlir. Bu məktəbin yetirməsi olan Səfura Abdullayeva və Fatimə Sadıqova SSRİ Ali Sovetinin deputatı olmuşlar. Azərbaycan SSR Ali məclisinə İltifat Məmmədov, Ədalət Hüseynov, İbrahim Səlimov, Tükəzban Eynullayeva deputat seçilmişdirlər.

1950-ci ilə qədər məzunlar ən çox həkimlik və hüquq ixtisaslarına üstünlük vermişlər. 1950-70-ci illər ən çox müəllimlik və mühəndis ixtisasına meyl olub. İndi keçmiş SSRİ-nın hər yerində ali təhsilli qızılağaclı mütəxəssislər çalışırlar. O, cümlədən Respublikanın mərkəzi Bakı şəhərində müxtəlif vəzifələrdə çoxlu sayda Qızılağac orta məktəbində təhsil alanlar fəaliyət göstərirlər. İndi Qızılağac kəndində olan orta təhsil verən məktəblərin müəllim kollektivləri böyük əzimkarlıqla şagirdlərin təhsil almasına çalışırlar.

Qızılağac kəndindəki iki orta məktəbin məzunları hər il respublikanın müxtəlif ali təhsil məktəblərinə qəbul olunurlar. Məktəb həyatı günlərini keçirən, indi isə müstəqil həyatda fəaliyyət göstərənlər məktəbi unutmamışlar. Onlar buraxılışlarının 10, 20, 25, 30, 50 illiyini təntənəli surətdə məktəbdə qeyd edirlər. Əslində bu özü ən yaxşı tədbir kimi qeyd edilməlidir. Çünki onların bu tədbir keçirmələri gələcək nəsl üçün də örnəkdir.



*2 saylı orta məktəb*





1989-cu ildən Qızılağac kəndindəki "Dəmirli məktəb" adı ilə adlanan ibtidai məktəbin bazasını genişləndirmək üçün yaşayış evi kimi tikilən binanı məktəbin ixtiyarına verdilər və bu bina 2 saylı orta məktəb statusu aldı. 2 saylı orta məktəbdə 34 nəfər müəllim kollektivi şagirdlərin təlim-tərbiyəsi ilə məşğul olur. Onlardan 27 nəfəri ali, 7 nəfəri isə orta təhsillidir. Məktəbdə 400 nəfərə qədər şagird təhsil alır, 2 saylı məktəb istifadəyə veriləndən sonra "Dəmirli məktəb"in binası Hacı Məhəmmədin vərəsəsinə qaytarıldı. Bina söküldü. Ancaq unudulmasın deyə yerində bir mərtəbəli 3 sinifli bina tikildi. İndi orada ibtidai sinif həcmində dərs tədris edilir.

Hal-hazırda 1 saylı məktəbin direktoru Təvəkkül Nəsirov, 2 saylı məktəbin direktoru isə Vaqif Eynullayevdir.

# VİLAYƏT TEYMUR OĞLU ƏSGƏROV

***İman gətirənlər və yaxşı işlər görənlər behiştlikdir və orada əbədi olacaqlar***



Şəxsiyyətlərin insanlıq amalını qoruması, onların unudulmamasına səbəb olur. Mən 1930-cu ildən qabaq və sonrakı dövrlərdə müəllimlik edən müəllimlərimiz haqqında yaşlı adamlardan sorğu-sual etdim. Onlar tez-tez Vilayət Teymur oğlunun adını çəkirdilər. Bəs həmin müəllimin üstünlükləri nə olmuşdur? - sualını ondan dərs alan şagirdlərə cavab verəndə dedilər: Vilayət müəllim çox tələbkar və bilik öyrətmək üçün səylə çalışan müəllim idi. Vilayət müəllimin anası Nərgiz xalanı görmüşdük. O da öz zəhməti ilə çörək pulu qazanaraq övladlarını böyütmüşdür. 4-cü övladı olan Vilayətin elmə sahib olmaqlığında anası Nərgizin böyük xidmətləri olmuşdur.Vilayət iki illik Ali-orta ixtisas təhsili verən pedaqoji instituta qəbul olunmuşdu. 1938-ci ildə həmin məktəbi bitirən Vilayət Teymur oğlu Əsgərov Qızılağaca Azərbaycan dili və ədəbiyyat üzrə müəllim işləmək üçün göndərildi. Vilayət müəllimin şagirdləri olan Ə.Ağayev və başqaları onun haqqında ürək dolusu söhbətlər açırlar. Onun şagirdlərə olan münasibətini, qayğısını dərs tədris etməsini tərif edirlər. Bu xüsusiyyətləri O, artıq kənd camaatının böyük rəğbətini qazanmışdı. Anası Nərgiz xala oğlu Vilayət haqqında bu tərifləri eşidəndə sevincinin həddi-hüdudu olmurdu. Ona görə ki, zəhmətilə kömək göstərməyinə görə yanılmamışdı. Ana hiss edirdi ki, zəhməti bəhrə verib. Artıq bir neçə illik müəllim stajına malik olan Vilayət müəllim üçün məktəbdən yaxın bir yer yox idi. Yaxınlıq onun elm öyrətdiyi şagirdlərlə ünsiyyət tapmaq üçün körpü idi. Hər gün dərs dediyi uşaqlarla xudafizləşəndə sabaha uğurlar diləyərdi Vilayət müəllim...





Bu ardıcıllıqla günlər keçdi... Yay tətili başladı. Müəllim və şagird kollektivi doqquz aylıq gərgin dərs deyənlərdən sonra istirahət etməklə yanaşı yay işlərini görməyə başlamışdılır ki, 1941-ci ilin isti iyun ayının 21-də sarsıdıcı bir xəbər insanların bütün ümidlərinə, istəklərinə, arzuların həyata keçməsinə son qoydu. Məktəbdə, evdə qələm, çöl-bayırda müxtəlif əmək alətləri götürən əlləri silaha sahib olub, Vətən müdafiəsinə qalxmışdı. Əlindəki qələmi yerə qoyub:

***Bilsin ana torpaq, eşitsin Vətən,***
***Müsəlləh əsgərəm mən də bu gündən.***

deyən xalq şairi Səməd Vurğunun misraları, həmin dövrün əhval-ruhiyyəsini və mübarizəsini yaxşı əks etdirirdi.

Vilayət Teymur oğlu Əsgərov da qələmi yerə qoyub silaha sarıldı. Xidmət etdiyi hərbi hissədə də öz ziyalılığını saxladı. Ailələrinə məktub yaza bilməyən döyüşçülər üçün məktub yazdı. İki cəbhə arxa və ön cəbhələrlə körpü qurdu. Doğma vətəndən ayrı düşənlərin istək və arzuların qələmə al-

dı. Gözü yolda qalan valideynlərə müjdə xəbəri verən qaranquş oldu yazdığı məktublarla Vilayət. 1944-cü ildə Vətənin müdafiəsi uğrunda şəhid oldu. Cismani surətdə şəhid edilən bu ziyalı mənəvi cəhətdən ölməzliklə qovuşdu. Onu ölməz edən ömür müəllimlik ömrü oldu.

Vilayət müəllim kimi təlim-tərbiyə işinə bağlı, bu işə ömrünü, canın qoyan insanın həyatına arzu və istəkləri ürəklərdə qoyan müharibə son qoydu. Vilayətin də anasına başqaları tərəfindən məktub yazıldı. Vilayətin müharibədə əsir düşmə xəbərini eşidən ana böyük sarsıntı keçirdi. Ana oğul arzusuyla yola göz tiksə də Vilayət əbədi xatirələrdə yaşadı.





## MİR XƏLİL SEYİD HÜSEYN OĞLU HÜSEYNOV

*Ağıl ancaq haqqa itaət etməklə kamil olur*

Səxavətli, xeyirxah, yaxşı əməl sahibi olmaq hər insana xas olan əlamət deyil. Bəzi insanlarda bu əlamətlər elə kök salıblar ki, onlar mənəviyyatdan qidalanır, mənəviyyat bulağından su içdiyi üçün həmişə tər çiçək kimi təravətli qalır.



*Xəlil və Xədicə Hüseynovlar*

Dünyəvi yaşayışında nail olduğu bu xüsusiyyətlər vəfatından sonra da sahibini xatırladır və insanlara nümunəvi əlamətləri ilə təsir göstərir. Belə şəxslərdən biri də Vahid Azərbaycan torpağının Astara bölgəsində 1912-ci ildə anadan olan Hüseynov Mir Xəlil Seyid Hüseyn oğludur. Onun kiçik yaşın-

da ikən yazıb oxumağa meyli çox idi. Odur ki, İran Astarasına keçərək ilk təhsilini orada almışdır. 1931-ci ildə sərhədi keçərkən Şimala, Bakıya gəlmək istəmişdir. Sərhədi keçərkən əlində olan velosipedi və çamadana yığdığı zəruri mallarla yanaşı dərs kitablarını sərhədçilər onu tutan zaman müsadirə etmişlər. Müəyyən müddət saxladıqdan sonra onun nə məqsədlə Bakıya getdiyini öyrənmişlər. O, bildirmişdir ki, Bakıya təhsil almağa gedirəm. Həmin dövrdə onun bacısı da ailəvi Bakıda yaşayırdılar. Mir Xəlil Bakıya gəlir və bir müddətdən sonra Bakı Pedaqoji məktəbinə daxil olur. O, məktəbi bitirdikdən sonra rus dili müəllimi işləmək üçün Masallı rayonunun Qızılağac məktəbinə göndərilir. Bir neçə il Qızılağac yeddiillik məktəbində rus dili müəllimi işlədikdən sonra onu Masallı rayonunun Yeddioymaq kəndində məktəb direktoru təyin etdilər. Bir neçə ildən sonra yenidən Qızılağaca qayıdır. II Dünya Müharibəsinin ağrılı-acılı günlərində məktəbdə uşaqların və müəllimlərin sayı azalmağa başladı. Kənd zəhmətkeşlərinin vəziyyəti ağırlaşdı. Belə bir vəziyyəti görən Mir Xəlil kənd əhalisinə köməklik göstərmək üçün kolxozda bir sıra təşkilatı işləri görmək, kolxozçuların maddi vəziyyətini yaxşılaşdırmaq üçün rayon təşkilatları ilə əlaqə yaradır, kolxozçuların öz əməyi ilə əkib becərdiyi taxılın onlara verilməsinə çalışır. Bütün səy və bacarığını kənd zəhmətkeşlərinin rifah halının yaxşılaşmasına sərf etməyi özü üçün borc bilirdi. Həmin dövrdə qonşu Kalinovka kəndində Viləş çayının yaxınlığında Qızılağaca məxsus olan, qızılağaclıların işlətdiyi od dəyirmanının sökülüb Qızılağaca gətirilməsinə nail oldu. Bu iş böyük çətinliklə Xəlil müəllimin səyi nəticəsində mümkün oldu. Ona görə ki, rayon rəhbərləri bu işə razılıq vermir-





dilər. Lakin Mir Xəlil müəllimin hörməti, nüfuzu olduğuna görə onun sözünü eşitdilər, dəyirmanın sökülüb Qızılağaca gətirilməsinə icazə verdilər. O, öz hesabına və kəndlilərin köməyi ilə dəyirmanı sökdürüb Qızılağaca, Quru çayın sahilinə gətirmiş və orada dəyirman binasının tikilməsinə və avadanlıqların qurulmasına nail olmuşdur. Bununla da kəndlilərin un üyütmək üçün kənara getməyini aradan götürmüşdü. Dəyirman işə düşdükdən sonra dəyirmandan gələn gəlirin müəyyən hissəsini yoxsullara, əsgər ailələrinə, kimsəsizlərə paylayırdı. Xəlil müəllim dəyirmanın müdiri kimi fəaliyyət göstərməyə başladı. İlk dəfə olaraq ərazidə dəyirmana elektrik mühərriki gətirib kəndə elektrik işığı vermişdir. Kəndin əsas küçələrində və bir sıra evlərində elektrik lampaları yandırıldı. Müəllimlikdən çıxmasına baxmayaraq, kənd camaatı ona hörmət əlaməti olaraq Mirzə deyə müraciət edirdilər. O, bu ətrafda Mirzə Xəlil kimi məşhurlaşmışdı. Mirzə Xəlil 1953-cü ildə Bakıya ailəsi ilə birgə köçür. Bakı şəhərində yaşadığı müddətdə də Qızılağacla münasibəti qoruyub saxlamışdır. Qızılağaclılara öz köməkliyini əsirgəməmişdir. Məhz, bu münasibətlər nəticəsində Mirzə Xəlil indi də yad edilir, ruhu haqqında dualar oxunur.

Mirzə Xəlilin həyat yoldaşı Nəsirova Xədicə Şükür qızı 1920-ci ildə Lənkəranda anadan olub. Lənkəran pedaqoji məktəbin bitirəndən sonra Xəlil müəllim ilə ailə həyatı qurub və Qızılağacda müəllimlik fəaliyyətinə başlayıb. Xədicə müəllimə həmin dövrdə qadın savadsızlığını ləğv etmək üçün çoxlu zəhmət çəkmiş, onların savadlanmasına səy göstərmişdir. Xədicə müəllimə Bakı şəhərində də müəllim işləmiş və təqaüdə çıxmışdır. 2004-cü ildə vəfat etmişdir.

Xəlil müəllimin 4 övladı Qızılağacda anadan olub.

Böyük oğlu Cavid 1936-cı ildə Qızılağacda anadan olub, 1963-cü ildə Azərbaycan Dövlət Universitetinin tarix fakültəsini bitirmiş, daimi elmi işlə məşğul olmuş, onlarla elmi məqalənin, 3-4 kitabın və on cildlik Azərbaycan Sovet Ensiklopediyasının müəlliflərindən biridir. Hazırda Azərbaycan Siyasi partiyalar və İctimai Təşkilatlar Dövlət Arxivində şöbə müdiridir. Cavid Hüseynovun həyat yoldaşı Elmira Hüseynova tarix elmləri namizədi və Bakı Dövlət Universitetinin dosentidir. Qızı Hüseynova Nailə tarix elmlər namizədi, Bakı Dövlət Universitetinin müəllimidir. Xəlil müəllimin qızı Abdullayeva Mahirə ali təhsillidir, hazırda təqaüddədir. Onun iki qızı, bir oğlu var. Həyat yoldaşı Hamlet Abdullayev uzun müddət DİN-də işləmiş, podpolkovnik rütbəsində təqaüdə çıxmışdır. Mahirənin 3 övladı vardır. Böyük qızı Emilya Neft Akademiyasını bitirmiş, hal-hazırda Milli Elmlər Akademiyasında kiçik elmi işçidir. Qızı Sevinc də Neft akademiyasın bitirmiş öz ixtisası üzrə çalışır. Oğlu Abdullayev Elnur idmançıdır. Prezident Aparatı xüsusi mühafizə idarəsinin əməkdaşıdır və Bədən Tərbiyyə Universitetinin tələbəsidir. Mir Xəlilin oğlu Hüseynov Cəmil 1942-ci ildə Qızılağacda anadan olub. Bədən Tərbiyəsi İnstitutunu bitirib, Bədən tərbiyə texnikumunda müəllim işləmişdir.

Kiçik oğlu Emil gənc yaşlarında faciəli surətdə həlak olub. Mirzə Xəlilin bacısı oğlu Mir Yusif Mirhadıyev Azərbaycan Dövlət Universitetinin professoru və tarix kafedrasnın müdiri işləyib.

Onun oğlu Araz Mirhadıyev sənətşünaslıq üzrə alimdir, Amerika Birləşmiş Ştatlarında yaşayır.





## ZƏKƏRİYYƏ MƏŞƏDİ YUSİF OĞLU ƏLİYEV

***Elm ən böyük hicabdır***



İşin öhdəsindən gəlmək insandan qətiyyət, dözüm, səbr tələb edir. Heç vaxt axar su xarab olmadığı üçün insan da həyatda axar su kimi fəaliyyət göstərməlidir. Qarşıya çıxan çətinlikləri qabaqcadan görən adam çox ağıllı bir insandır. Ağıl, dərrakə sahibi olan şəxs hər hansı işin öhdəsindən çox asanlıqla gələr. Hünər və cəsarətinə görə başqalarına nümunə olar. Zəkəriyyə müəllim də bu nümunələrdən biri- dir.

Zəkəriyyə Məşədi Yusif oğlu Əliyev 1923-cü il aprel ayının 4-də Masallı rayonunun Qızılağac kəndində ziyalı ailəsində anadan olmuşdur. Kiçik yaşlarında ailəsi ilə birlikdə Bakı şəhərinə köçmüşdür.

Atası Məşədi Yusif Hacı Məcid oğlu Əliyev geniş dünya görüşünə malik, bütün həyatını xəstələrin sağlamlığına həsr etmiş həkim - alim, sözün əsl mənasında ziyalı bir insan idi və övladlarının kamil, layiqli bir vətəndaş kimi yetişməsində onlara həmişə örnək olmuşdur.

1929-cu ildə Bakıda məktəbə daxil olan Zəkəriyyə bir neçə ildən sonra, atasının Nuxaya (Şəki) təyinatı ilə əlaqədar olaraq burada təhsilini davam etdirməli olur.

1939-cu ildə məktəbi "əla" qiymətlə bitirib, Azərbaycan Sənaye İnstitutunun Energetika fakültəsinə imtahansız qəbul olunub.

1941-ci ildə Dünya Müharibəsi başladığından və atası cəbhəyə getdiyindən evin böyük övladı olduğu üçün ailəni dolandırmaq onun öhdəsinə düşür. Təhsilini yarımçıq qoyaraq Nuxaya (Şəki) qayıdır və Nuxa məktəblərindən birində fizika-riyaziyyat fənnini tədris etməyə başlayır. Eyni zamanda Nuxa 2 illik İnstitutunun Fizika-riyaziyyat fakültəsinə daxil olur.

1946-cı ildə Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Fizika-riyaziyyat fakültəsinin 2-ci kursuna qəbul olunur. İnstitutu bitirdikdən sonra öz xahişi ilə Masallı rayonununa təyinat alır və bir neçə il Masallı 1 saylı məktəbində Fizika-riyaziyyat müəllimi işləyir. Rayonda işlədiyi müddətdə rayon ictimaiyyəti, müəllim kollektivi və şagirdlər arasında böyük hörmət və nüfuz sahibi olmuşdur. Təsadüfi deyil ki, dərs dediyi şagirdlərin əksəriyyəti öz sevimli müəllimlərinin yolunu davam etdirərək fizika və riyaziyyat sahəsində mütəxəssis olmuşlar. Zəkəriyyə müəllim 1953-cü ildə Bakıya qayıdaraq müəllimlik fəaliyyətini davam etdirir.

1954-cü ildə ailə həyatı qurur.

1961-ci ildə Bakı şəhəri Xətai rayonu 194 saylı məktəbinə direktor təyin olunur və təqaüdə çıxana qədər həmin məktəbdə çalışır.





1995-ci ildə öz xahişi ilə xəstəliyi ilə əlaqədar olaraq təqaüdə çıxır.

50 illik müəllimlik fəaliyyəti dövründə çox sayda medal və Fəxri fərmanlarla təltif olunmuş, "Əla maarif xadimi" fəxri adına layiq görülmüşdür.

Zəkəriyyə müəllim 1998-ci il iyun ayının 7-də Bakı şəhərində vəfat etmişdir.

Onun 4 övladı, 8 nəvəsi var. Övladlarının hamısı ali təhsillidir. Oğlu Hacı Nadir şərqşünasdır. Qafqaz müsəlmanları idarəsində şöbə müdiridir.

# İMAN AĞAKİŞİ OĞLU HƏSƏNOV

*Səbri, həlimliyi və mülayimliyi olan şəxsin həm bu dünyada, həmdə o dünyada payı olar.*



İman müəllim haqqında yazmaq istərkən çoxlu təəssüratlar canlanıb dilə gəlir. Onun həm məktəb, həm də adi həyatı çox özünə məxsus təzadlarla doludur.

İman müəllimin adi kəndçi dili ilə dediyi sözlər hikmət və məntiqi ilə insanı düşündürməyə vadar edirdi. Onun misal çəkməyi, danışıq zamanı dinləyiciyə başa düşüləsi tərzdə sözü çatdırmağı özünə xas əlamət idi. Onun elmi zirvəsinin ucalığından danışmamaq olmaz. Çünki İman müəllim ixtisası üzrə karifey sayılırdı. Riyazi triqonometrik məsələləri və misalları heç bir çətinlik çəkmədən həll etməmişdən cavabın deyərdi, sonra həll edərdi.

O, 1931-ci ildə Masallı rayonu Qızılağac kəndində kəndçi ailəsində anadan olmuşdu. İbtidai təhsili Qızılağacdakı ibtidai məktəbdə almış, orta təhsil almaqdan ötəri Masallıdakı orta məktəbdə oxumuşdur. Orta məktəbi müvəffəqiyyətlə bitirən İman Həsənov 1950-ci ildə V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun riyaziyyat fakültəsinə daxil olmuşdur.

1954-cü ildə həmin institutu müvəffəqiyyətlə bitirmiş və





fizika və riyaziyyat müəllimi ixtisası üzrə müəllimlik diplomu almışdır. Təyinatla ucğar dağ rayonu olan Lerikə müəllim göndərilmişdir. 1961-ci ildə nəşr olunan "Azərbaycan məktəbi" jurnalının sentyabr nömrəsində "Şifahi vurma üsullarının öyrədilməsi təcrübəsindən" adlı elmi məqaləsi çap olunmuşdur. İman Həsənov Lerik rayonunda təyinat müddəti qurtarandan sonra Masallı maarif şöbəsinə göndərilmiş, əvvəl qonşu Yeddioymaq kəndində müəllim işləmiş 1960-cı ildən isə doğma kəndində müəllimlik fəaliyyətinə başlamışdır.

1963-cü il 3 aprel tarixində Azərbaycan SSR Maarif Nazirliyi və M.A.M.E.İ.İ.H.İ - respublika komitəsinin birgə kollegiya iclasının qərarına əsasən Maarif Nazirliyinin və - respublika Komitəsinin fəxri fərmanı ilə təltif olunmuşdur. 1966-cı ildə Azərbaycan SSR - müəllimlərinin V qurultayının nümayəndəsi olmuşdur.

1966-cı il sentyabr ayının 30-da Azərbaycan SSR Maarif Nazirliyi tərəfindən "Azərbaycan SSR Qabaqcıl Maarif xadimi" döş nişanı ilə təltif olunmuşdur.

1974-cü ildə ixtisas artırma kursunda dinləyici olmuşdur. İman Kərbəlayi Ağakişi oğlu mömin, imanlı, təqvalı bir şəxs idi. Hər gün beş vaxt namaz qılmaqla yanaşı Ramazan ayının orucunu tutardı, əhya saxlamaq tədbirlərinin fəal iştirakçısı olardı.

Gözəl insan olan İman, həm də qayğıkeş, mehriban ailə başçısı idi. O 2004-cü il sentyabr ayında vəfat etmişdir.

Onun Eldar və Bəhrəm adlı oğlanları atalarının dərs dediyi 1 saylı orta məktəbdə müəllim işləyirlər. Onlar hər ikisi APİ-nin məzunlarıdırlar. Bəhrəm müəllim riyaziyatçıdır. Öz fənninin mahir bilicisidir.

# MUSA ƏZİZ OĞLU ƏBİLOV

*Şərəf və düzgünlüklə yaşayan adam Allahın sevimlisidir.*



İnsanlardan bəziləri həyatda öz əməllərinin müqabilində xalq tərəfindən qiymətləndirilir. Belə insanlar vəfat edəndən sonra da el içərisində tez-tez onların əməlləri xatırlanır. Musa müəllim də bu xatirələr aləmində yadda qalan bir şəxsiyyətdir. Onunla kimliyindən asılı olmayaraq söhbət edən adam, ona bir ziyalı təsiri bağışlayan danışığın şahidi olurdu. Musa müəllim, öz yaşıdları içərisində də sevib-seçilən bir ziyalı idi. Onun müstəqil oxu vasitəsilə əldə etdiyi nəticələrə mən də şahidəm. O elmə, elmin bütün sahələrinə, marağı olan şəxs idi. Dünyəvi elmlərdən başqa dini elmləri də çox gözəl, məntiqli, məzmunlu şəkildə öyrənmişdi. 1980-ci illərdən sonra onun Quran oxumağının şahidi oldum. Musa Əziz oğlu Əbilov 1932-ci ildə Masallı rayonunun Qızılağac kəndində anadan olmuşdur. 1948-ci ildə əla qiymətlərlə Qızılağac yeddiillik natamam orta məktəbini bitirib və həmin ildə Azərbaycan Sənaye İnstitutuna imtahansız qəbul olunub.

Ailə vəziyyəti ilə əlaqədar təhsilini yarımçıq qoyub öz





kəndinə qayıdıb. Musa iş axtarmaq üçün çox narahat olmayıb. Çünki həmin dövrdə belə bilikli gənclərə böyük ehtiyac var idi. Odur ki, onu Qızılağac kənd orta məktəbində işlə təmin ediblər. 1952-ci ildə o Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Fizika-riyaziyyat fakültəsinə qəbul olunur. İnstitutu bitirdikdən sonra öz xahişi ilə Astarxanbazar (indiki Cəlilabad) rayonu Təklə kənd orta məktəbinə təyinat alır və fizika-riyaziyyat ixtisas üzrə müəllimlik fəaliyyətinə başlayır.

1961-ci ildən onu Masallı rayonunun Kalinovka kənd orta məktəbinə tələbnamə ilə tələb edirlər. Ömrünün axırına kimi həmin orta məktəbdə fizika-riyaziyyat müəllimi işləyib. Musa müəllimin dərs dediyi şagirdlərin səsi-sorağı respublikanın ali məktəblərindən, neçə-neçə xarici ölkələrin təhsil ocaqlarından gəlir.

Musa müəllim yeni sağlam nəslin yetişdirilməsində əlindən gələni əsirgəməyib, Vətəninə, xalqına layiqli vətənpərvər, savadlı şagirdlər yetişdirilməsində böyük xidmətləri olmuşdur.

Müəllimlik fəaliyyəti dövründə çox sayda Fəxri Fərmanlarla təltif olunmuş "Metodist müəllim", "Baş müəllim" fəxri adlarına layiq görülmüşdür. Musa müəllim 2001-ci il mart ayının 13-də vəfat etmişdir. Qəbri Qızılağac qəbristanlığındadır.

Musa müəllimi onun dərs dediyi şagirdlər həmişə yad etməklə ruhuna dualar oxuyurlar. Təvazökar, təqvalı, qayğıkeş insan olan Musa müəllim, həm də tələbkar idi. O maariflənmə sahəsində böyük xidmətlər göstərmişdir.

Onun şəxsi münasibətləri ilə müəllimlik münasibətləri fərqlənirdi. Kənd camaatı içərisində öz mövqeilə hər bir işdə

güzəştlərə üstünlük verən Musa müəllim sinifdə çox tələbkar idi. Onun şagirdləri bu xüsusiyyətləri müəllimində gördükləri üçün dərsə davamiyyəti və hazırlığı həmişə qoruyub saxlayırdılar. Danışıqlarında, söhbətində həmişə şagirdlərinə oxumağı, çalışmağı təkrarlayan Musa müəllimi indi vaxtilə onun tövsiyələrini eşidənlər tez-tez xatırlayırlar. Bəli, Musa müəllim xatirələrdə əbədi yaşayacaq bir müəllim idi.

Onun 3 övladı var: 2 oğlan, 1 qız. Övladlarının hamısı ali təhsillidir.





## İMAN RZA OĞLU MİKAYILOV

*Təvazökarlıq və ədəb*
*dinin əlamətlərindəndir.*



İman müəllim bir ziyalı kimi Cənub zonasında tanınan şəxsiyyətlərdən biridir. Onun elmə olan marağı, işgüzarlığı, səyi və təşkilatçılığı ona baş ucalığı gətirmişdir. İman müəllimin bir müəllim kimi iş təcrübəsi gənclər üçün nümunə olacaqdır. O, 10 noyabr 1939-cu ildə Lənkəran rayonunun Nərimanabad qəsəbəsində anadan olmuşdur. Atası Mikayılov Rza İsrafil oğlu 1908-ci ildə Qızılağac kəndində anadan olmuşdur. Rza kişi Qızılağacda gənclik illərində öz zəhməti ilə seçilərmiş və sevilərmiş. 1935-ci ildə Rza ailəsi ilə birgə Nərimanabad qəsəbəsinə köçmüşdür. İman Mikaylov 1955-ci ildə orta məktəbi bitirmiş, V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutuna daxil olur. 1960-cı ildə həmin institutu bitirmişdir. 1961-ci ildə Lerik rayonuna təyinat alan gənc İman müəllim tədris sahəsində əldə etdiyi bilikləri şagirdlərə çatdırmaq üçün böyük səy göstərmişdir. 1963-cü ildə onu Nərimanabad qəsəbəsindəki orta məktəbə müəllim təyin etdilər. İman müəllim artıq pedaqoji cəbhədə tanınan müəllimlər cərgəsində özünü sər-

bəst hiss edir. Tədrisin özünəməxsus incəliklərindən istifadə edən İman müəllim şagirdlərin sevimlisi olmuşdur. 1972-ci ilə kimi qəsəbə orta məktəbində işləyən İman müəllimin rayonda iş metodu yaymaqda idi. Qəsəbə məktəbinin şöhrəti artdı. Rayon maarif şöbəsi onu dərs dediyi məktəbdə direktor vəzifəsinə təyin etdi. 1983-cü ilə qədər bu vəzifədə işləyən İman məktəbdə təlim-tərbiyənin, tədrisin keyfiyyətinin artması üçün çox çalışdı. Onun bu işgüzarlığı məktəbdə tədrisin keyfiyyətinin artmasına səbəb oldu. 1983-cü ildə Rayon Partiya Komitə Bürosunun qərarı ilə Lənkəran şəhərindəki 7 saylı orta məktəbə direktor təyin edildi. Burada da o məktəb kollektivinin və şagirdlərin böyük qayğısını hiss etdi. İki il o məktəbdə direktor işlədiyi müddətdə məktəbin göstəriciləri artdı. Pedaqoji kollektivin tədris sahəsində çəkdiyi zəhmət nəticəsində məktəbin məzunlarından çoxu ali məktəblərə daxil oldular. 1983-cü ildə İman müəllimi daha məsuliyyətli vəzifəyə, Lənkəran rayon xalq maarif şöbəsinə müdir təyin etdilər. 1989-cu ilə kimi bu vəzifədə işləyən İman, rayon üzrə məktəblərin işinə böyük təsir göstərərək məktəblərin fəaliyyətini artırmışdır. 1990-cı ildən indiyə kimi Nərimanabad qəsəbə orta məktəbində direktor vəzifəsində işləyir. Məktəb rəhbəri olan İman müəllim, müəllimlərin və şagirdlərin sevimlisi, ən yaxın dostudur. İman müəllimin xidmətləri dövlət tərəfindən qiymətləndirilib.

2.11.1977-ci ildə ona "Qabaqcıl maarif xadimi", 27.11.1983-cü ildə "SSRİ maarif əlaçısı", 29.09.1988-ci ildə "Əmək veteranı" kimi fəxri adlar verilmişdir. O bir neçə dəfə Azərbaycan müəllimlərinin qurultayına nümayəndə seçilmiş, Lənkəran Xalq Deputatları Sovetinin deputatı (1985-90) olmuşdur. 1985-88-ci illərdə Azərbaycan KP Lənkəran şəhər Partiya Komitəsinin üzvü kimi fəaliyyət göstərmişdir. Azərbaycan Respublikasının Prezidentinin 18 mart 2000-ci il tarixli 302 saylı fərmanı ilə Azərbaycan Respublikasının "Əməkdar müəllimi" fəxri adına layiq görülmüşdür. Evlidir, bir oğlu, iki qızı vardır. İman Mikayılovun Qızılağaca olan münasibəti əvəzsizdir. Onun bir qızılağaclı kimi ata-baba yurduna bağlılığı ona üstünlük bəxş edir.





İman müəllim öz ata-baba torpağına bağlı bir ziyalıdır. O, həmişə əcdadlarının uyuduğu Qızılağacı ziyarət edir, doğmaları ilə hal-əhval tutur. Bu gün İman müəllim respublika səviyyəli ziyalılardan biridir. Onun mənalı həyat yoluna bələd olan hər hansı bir şəxs İman müəllimi imanlı, təqvalı, pəhrizkar, xeyirxah kimi tanıyacaq. Bu tanışlıq onun elmi fəaliyətində də öz əksini tapacaqdır. O, həmişə axtarışda olan, həmişə təhsil sahəsində yeniliyə səy göstərəndir.

Pedaqoji cəbhənin qocaman nüfuzlu ağsaqqal üzvü olan İman müəllimə yeni nəaliyyətlər arzulayıram.

## ŞÜKÜR HACIBALA OĞLU QƏRİBOV

*Allah tərəfindən artırılan nemət,bəndələr*
*Allaha şükür etsələr azalmaz*



Onu tanıyanların, yaxud onunla ilk dəfə tanış olanların hər hansı birindən soruşsan Şükür müəllim necə adamdır? Dərhal cavab verərlər: Böyük şəxsiyyətdir, qayğıkeşdir, mehribandır, səmimdir, doğma təsir bağışlayan bir insandır. Ensiklopedik biliyə malik olan ziyalıdır. Şükür Qəribov 08.08.1955-ci ildə Masallı rayonunun Qızılağac kəndində anadan olmuşdur. Atası Hacıbala kişinin həyat tarixçəsinə bələd olanlar onda olan xüsusiyyətlərin oğlu Şükür müəllimdə cəm olduğunu təsdiqləyirlər.

Hacıbala kişi uzun həyat təcrübəsinə malik olan ziyalıdır. II Dünya Müharibəsi iştirakçısıdır. 40 ildən yuxarı Qızılağacdakı kolxoz və sovxozda məsul vəzifələrdə işləyib. Səmimiyyəti özünün həyat amalı bilən Hacıbala kişi 1962-ci ildə Qızılağac orta məktəbinə oğlu Şükürün əlindən tutub gətirəndə sevincinin həddi-hüdudu yox idi. Şükür birinci sinifə qəbul olundu. Lakin onun yazıb-oxumağı müəllimlərin diqqətini cəlb etdi. Onlar Şükürə bunları hardan öyrənmisən? – deyə





soruşdular, - dedi: - atamdan. Bəli, atası Hacıbala kişi balaca Şükürə kiçik yaşlarında yazıb oxumağı öyrətmişdir. Həmçinin elmin fəzilətini, üstünlüklərini elm bəxş edən müəllimlərin xidmətlərini də oğluna söyləmişdir. Məktəb illərində Şükür fəal, çalışqan bilikli, nizam-intizamı gözləyən, böyük kiçiyin mövqeyini tanıyan, məktəbdə seçilib-sayılan şagird kimi bütün pedaqoji kollektivin hörmətini qazandı. 1972-ci ildə orta məktəbi əla və yaxşı qiymətlərlə başa vurdu. Kamal atestatını alıb sevinclə evlərinə gəldi. Onu təbrik etdilər... 1977-ci ildə daxil olduğu indiki Azərbaycan Dövlət Pedaqoji universitetini 1982-ci ildə bitirdi, təyinatla Masallı rayonun Kubin kəndinə müəllim işləmək üçün göndərildi

İki il orada müəllim işləyən Şükür müəllim, şagird və müəllim kollektivinin hörmətini qazandı. İki ildən sonra doğma Qızılağac orta məktəbinə dil-ədəbiyyat müəllimi təyin olundu. Bir vaxtlar dərs aldığı müəllimlərlə birgə elm tədris etdi. Sonradan Əli-Bayramlı şəhər 7, 8. 21, 18 saylı orta məktəblərində müəllim, direktor müavini və direktor vəzifələrində işlədi. Şükür müəllimin mənəviyyatında kök salan xüsusiyyətlər onun həyat yoluna işıq saçırdı. Bacarığı, təşkilatçılığı, tələbkarlığı, təvazökarlığı ilə tanınan Şükür müəllimə etimad göstərildi. Şəhər İcra Hakimiyyəti və Respublika Təhsil Nazirliyində Şükür müəllimin əməyini düzgün qiymətləndirdilər. Onu 1999-cu ildə Əli-Bayramlı şəhər təhsil şöbəsinə müdir təyin etdilər. İlk gündən Şükür müəllim təhsil şöbəsində işçilərin, məktəb direktorlarının və təhsil şöbəsinə aid olan məktəbəqədər təhsil müəssisələrinin fəaliyyətini yaxşılaşdırmağa çalışdı. Zəhməti öz bəhrəsini verdi. Şəhər məktəblə-

rində təlim-tərbiyə işlərinin, tədrisin keyfiyyətinin artması ildən ilə dolğunlaşdı. Şükür Qəribov Azərbaycan Təhsil Nazirliyinin Kollegiyasının 10 iyul 2003-cü il tarixli T-30/3 N-li qərarı ilə Fəxri Fərmanla təltif edildi.

Şükür müəllim səy və bacarığını şəhər təhsil sahəsinin inkişafına, təhsilin keyfiyyətinin yaxşılaşmasına, sərf edir.

Şükür Qəribov İtaliyada xüsusi kurs üzrə "təhsil meneceri" ixtisası almışdır. Şükür müəllim Əli-Bayramlıda yaşamasına baxmayaraq doğma Qızılağac kəndini tez-tez ziyarət edir. Kəndin bütün sahələrdə inkişaf etməsinə maraq göstərir.

Şükür müəllimlə söhbət edəndə xalqımızın inkişafıtəhsil barədə yeni-yeni kompüter sistemlərinin tətbiq olunmasına ehtiyac olması barəsində söhbətlər etmək olur. O əsil maarifpərvər ziyalıdır. Həyat amalı təhsilin inkişaf etdirilməsidir.

Ş.Qəribovun təşkilatçılığı, işgüzarlığı respublika Təhsil Nazirliyi tərəfindən qiymətləndirildi. Onu respublika Təhsil Nazirliyində məsul vəzifəyə irəli çəkdilər. O, yaradıcılıq ilə məşğul olan ziyalıdır. Onun görkəmli alim Akif Abbasovla həmmüəllifi olduğu "Elm, təhsil, mədəniyyət" kitab maarif işçilərinin böyük köməkçisinə çevrilmişdir.

Ailəlidir - bir oğlu, 2 qızı var.

Şair Mir Yusif Mir Nəsir oğlunun onun haqqında yazdığı şerində deyir:

***Ömrüm boyunca müəllim***
***Müqəddəs görünmüş mənə,***
***O, bir xilqətdir ki, ucadan uca***
***Min dəfə yazsam da çox azdır yenə.***





***Müəllim ömrünün gün çalarları,***
***Mənim misralanmış sözlərimdədir.***
***Cismi - mənimlədir onun vüqarı***
***Gözlərinin nuru gözlərindədir.***

***- O, kimdir? Öyrəndim Peyğəmbərimdən;***
***O, "ol"dur, o, sözdür, o iti qələm***
***Kimsənin önündə əyilməyən mən,***
***Müəllim önündə min yol əyilləm.***

***Gizlədə bilmirəm sədaqətimi,***
***Yox elə bir sevgi sevgimdən üstün.***
***Müəllimə olan məhəbbətimi,***
***Şükür müəllimə verirəm bu gün.***

## SƏMƏDAĞA MİRHƏMZƏ OĞLU ABDULLAYEV

*Həlimli olmaq böyük qabiləyə bərabərdir*



Atası MirHəmzə Səməd oğlunu Lənkərana bağlı edən onun ixtisası olmuşdur. Mir Həmzə Ali təhsil alandan sonra təyinatla Lənkəran şəhərinə göndərilmişdir. Doğma kəndində ata yurdu Qızılağacda qalan qardaşı Salman müəllim onun Lənkərana hər gün gedib gəlməyinin çətinliyini bilirdi. Odur ki, öz qardaşını Qızılağaclı Həbibulla kişinin qızı[illegible] ilə evləndirdi. Toydan bir neçə gün sonra Lənkəranda ev tutub gənc ailəyə orada yaşamağı məsləhət gördü. Baxmayaraq ki, Mir Həmzə Lənkəranda yaşayırdı, hər həftə həyat yoldaşı ilə birgə ata yurdunda olan böyük qardaşına baş çəkərdi. 1963-cü ildə bu ailənin ilki olan uşaq dünyaya gəldi. Salman müəllim ilə məsləhətləşdilər, uşağa ataları Mir Səmədin adını qoydular, Səmədağa.

Səmədağa hələ orta məktəbdə müəllimlərin diqqətini cəlb etmişdi. O, hazır-cavab, bilikli, çalışqan bir gənc kimi məhşurlaşdı. Oxuduğu Lənkəran şəhər bir saylı orta məktəbini bitirdi. O hələ məktəb illərində öz seçimini etmişdi. Əmisi





Salman müəllim, atası Mir Həmzənin riyaziyyat sahəsində bilikli olmasından xəbərdar idi. Orta məktəbi bitirdiyi 1980-ci ildə V.İ.Lenin adına Pedaqoji İnstitutunun riyaziyyat fakültəsinə daxil oldu. 1984-cü ildə həmin institutu müvəffəqiyyətlə bitirdi və təyinatı Lənkəran şəhər 9 saylı məktəbə verildi. Öz ixtisası üzrə müəllimlik fəaliyyətinə başladı. Həmin il ordu sıralarına çağrıldı. Ordudan tərxis olunandan sonra, 9 saylı məktəbdə pedaqoji fəaliyyətini davam etdirdi. 1990-cı ildə həmin məktəbdə tərbiyə üzrə direktor müavini vəzifəsinə seçilməsinə səbəb onun bacaracağı, təşkilatçılığı, yüksək insani keyfiyyətləri əsas olmuşdur. Bu vəzifədə işlədiyi iki il ərzində məktəbin çatışmazlıqları aradan qaldırıldı. Rayon Partiya Komitəsi, Rayon Maarif Şöbəsi onu 1994-ci ildə şəhərdəki 3 saylı məktəbə təlim-tərbiyə işləri üzrə direktor müavini vəzifəsinə köçürtdülər. Səmədağa müəllim burada da dərsin keyfiyyətinin yüksəlməsinə, uşaqların məktəbə davamiyyətinin yaxşılaşmasında çox zəhmət çəkdi. Zəhməti bəhrə verdi. Məktəb qabaqcıl məktəblərdən biri oldu. Pedaqoji sahədə böyük təcrübəyə malik olan Səmədağa Abdullayev 2002-ci ilin may ayında Sütəmərdov kənd orta məktəbinə direktor vəzifəsinə təyin edildi. Yeni dərs ilinin başlanğıcına qədər Səmədağa Abdullayev məktəbdə təmir və abadlıq işlərini tamamlatdırdı. Rayon İcra Hakimiyyəti Səmədağa Abdullayevin işlərini yüksək qiymətləndirirdi. Ona etimad göstərilib 2003-cü il 10 iyunundan Lənkəran şəhər təhsil şöbəsinin müdiri vəzifəsinə irəli çəkildi.

Onu da deyim ki, Lənkəran rayonunda ikinci qızılağaclıdır ki, təhsil şöbəsinin rəhbəri olub.

Yeni iş sahəsi təhsil şöbəsinə rəhbər təyin edilən S.Abdullayev çox işləməli, rayon təhsil şöbəsində əsaslı dönüş yaratmalı idi...

Artıq S.Abdullayev öz işi ilə Lənkəran ŞİH başçısının və respublikanın Təhsil Nazirinin diqqətini cəlb etdi. Təhsil Naziri M.Mərdanov 2004-cü ildə Lənkəran ŞİH başçısının yanında maarif yanı şurada təhsil şöbəsinin müdiri S.Abdullayevin "Azərbaycan Respublikası regionlarının sosial-iqtisadi inkişafı üzrə Dövlət proqramının yerinə yetirilməsi sahəsində" Lənkəran ümumtəhsil müəssisələrində görülmüş işlər və qarşıda duran vəzifələri barədə hesabatını dinlədi. Bir il ərzində görülmüş işlər qənaətbəxş qiymətləndirildi.

S.Abdullayev Lənkəran rayonunun ictimai-siyasi işlərində öz fəallığı ilə də fərqlənir. O, həmçinin Yeni Azərbaycan Partiyasının üzvü olmaqla YAP-ın ərazi təşkilatının sədri olmuşdur.

Bəli, insan soy-kökünə bağlı olanda həmişə oz adını doğruldur, nəslinin adını ucaldır. Abdullayev Səmədağa müəllim öz soy kökünə bağlı olan bir ziyalıdır. Əminik ki, Səmədağa müəllim ona tapşırılan vəzifəni əsil vətəndaş kimi layiqincə yerinə yetirəcəkdir. S.Abdullayev Xudaverdi Cavadovla "Lənkəran pedaqoqları" kitabının həm müəllifidir. Səmədağa müəllimə yeni-yeni yaradıcılıq nailiyyətləri arzulayırıq.







*1 saylı orta məktəbin binası*

## QIZILAĞAC KƏND 1 SAYLI ORTA MƏKTƏBİN MÜƏLLİMLƏRİNİN SİYAHISI

Mirmövsüm Abdullayev - Ali
Əlisa Əhmədov - Ali
Ağaverdi Məmmədov - Ali orta
Məmmədhəsən Həsənov - Ali orta
Razzaq Abbasov - Ali orta
Məmmədbağır Salayev - Ali
Elman Səfərov - Ali
Rübabə Ələkbərova Səmədzadə - P/orta
Rübabə Ağayeva - P/orta
Nüsrət Kərimov - Ali
Salman Abdullayev - Ali
Ağabala Ağabalayev - P/orta
Əhməd Ağayev - P/orta
İsfəndiyar Sadıqov - Ali
Ələkbər Nağıyev - P/orta
Məryəm Ələkbərova - P/orta
Nəsirov Təvəkkül - Ali
İbrahimov Qurban - Ali
Əhmədov Salman - Ali
Həsənov Eldar - Ali
Əliyev Hacıbala - Ali
Əsgərov Həbib - Ali
İmanov Kamil - Ali
Salayeva Balabəyim - Ali
Kərimova Dilşad - Ali
Abdullayev Aydın - Ali
Fətullayeva Şəhla - Ali
Xəlilova Səkinə - Ali
Həsənov İman - Ali





Məhərrəmova Tamara - Ali
Məmmədov Ağarəhim - Ali
Quliyeva İlahə - Ali
Həsənov Bəhrəm - Ali
Kərimova Ülkər - Ali
Həsənov Natiq - Ali
Məmmədov İsfəndiyar - Ali
Kərimov Məhəmməd - Ali
Kazımova Hədisə - Ali
Nəsirova Hökümə - Ali
Kazımova Züleyxa - Ali
Şirəliyeva Nuriyyə - Ali
Kazımov Eldar - - Ali
Məmmədov Məmməd - Ali
Həsənov Şahin - - Ali
Məhərrəmov Məhərrəm - P/orta
Ələkbərova Şəfiqə - P/orta
Ələmova Sona - P/orta
Ələmova Gülceyran - P/orta
Əliyeva Səbirə - P/orta
Əliyeva Xədicə —- P/orta
Fətullayeva Vüsalə — Ali
Məmmədov Əbil —— Ali

## QIZILAĞAC KƏND 2 SAYLI ORTA MƏKTƏBİN MÜƏLLİMLƏRİNİN SİYAHISI

Abbasov Fərhad Zeyanalabdin oğlu - Ali
Abbasov Fazil Zeynalabdin oğlu - Ali
Abışov Zakir Zəkəriyyə oğlu — Ali

Məmmədov Davud Mirsüleyman oğlu - Ali
Abdullayev Tahir Həsənağa oğlu — ——-
Əsgərov İsrail Rəzi oğlu ——-
Rəsulov Zikrulla Mahmud oğlu - P.orta

Ələkbərov Əhmədağa Miryəhya oğlu - Ali
Həsənova Nargilə Söbi qızı — Ali
Həsənov Əlizamin Əlihəsən oğlu — Ali
Sadıqova Dilbər Yunis qızı - Ali
Əliyeva Səmayə Dadaşbala qızı — Ali
Qəribov Niyyət Ayaz oğlu —- Ali
Eynullayev Vaqif Adil oğlu —- Ali
Sadıqov Əlisa Məmmədsadıq oğlu —- Ali
Axundova Şəhla Abdulla qızı —- Ali
Quliyeva Bahar Akif qızı —- Ali
Kazımova Xırda İzzət qızı —- Ali
Ələkbərov Hüseyn Əli oğlu —- P. orta
Əliyev Arzuman M.Hüseyn oğlu — P. orta
Məmmədov Qələm Həsən oğlu - P. orta
Hüseynova Ağabacı — P. orta
Məlikov Əzizağa Məmmədağa oğlu — Ali
Həsənov Raci Aslan oğlu — Ali
Həsənov Soltanağa Hüseyn oğlu —- Ali
Kərimova Güldanə İltimas qızı —- Ali
Əliyeva Səkinə Hadi qızı —- Ali






# *Alimlər*




# ӘLİZAMAN MÜSEYYİB OĞLU HӘSӘNOV

*Elm tükənməyən bir xəzinədir, ağıl əskilməyən, köhnəlməyən bir libas*



Xalqın rəğbətini, xüsusilə də məhəbbətini qazanmaq asan deyil. Tale adama yol açır, səy isə bu yolu davam etdirir.

İnsanlar içərisində elələri vardır ki, həyatının faydasını sahib olduğu sənətin incəliklərində görür. Öz sənətinin mahir bilicisi olmaq amalı uğrunda çalışır. Əldə etdiyi elmi nailiyyətlərdən xalqın faydalanması üçün çalışır. Vaxtilə Əlizaman Həsənov elmi iş üzərində işləyəndə o əmin idi ki, onun zəhməti axtarışı, xalq təsərrüfatı, kənd təsərrüfatı sahəsində böyük xeyir verəcək. Axtarışlar səmərəli nəticə verdi, uğurlu hesab edildi. Gənc alim Əlizaman Həsənov bununla kifayətlənmədi. Yeni-yeni nailiyyətlərin sorağına üz tutdu...

O, 1927-ci ildə Qızılağac kəndində anadan olmuşdur. 1934-cü ildə kənddə 1-ci sinifə daxil olmuş və 1944-cü ildə kənd orta (10 illik) məktəbini bitirmişdir.

Müharibə illərində müəllim çatışmamazlığı üzündən 1944-cü ildə orta məktəbi bitirənlər rayon maarif şöbəsinə toplanmış, rayon maarif şöbəsi tərəfindən ilkin yoxlamadan

keçirildikdən sonra onlardan 4 nəfərinin müəllimlik etməsi məsləhət görülmüş, o cümlədən, Həsənov Əlizamanı da Qarğalıq kəndinə müəllim təyin etmişlər. Qarğalıq kəndində 1944-1946-cı illərdə müəllim işləmişdir.

1946-cı ildə Azərbaycan Dövlət Universitetinin biologiya fakültəsinə daxil olmuş və oranı 1951-ci ildə bitirmişdir.

1951-ci ildən 1975-ci ilə kimi Azərbaycan Elmlər Akademiyasının Botanika İnstitutunda, əvvəlcə lobarant, kiçik elmi işçi, aspirant, baş elmi işçi, laboratoriya-Botanika muzeyi müdiri vəzifələrində çalışmışdır. 1959-cu ildə alimlik dərəcəsi biologiya elmləri namizədi adına layiq görülmüşdür.

O, 1955-1975-ci illərdə Azərbaycan Dövlət Qiyabi Pedaqoji və Azərbaycan Dövlət Pedaqoji İnstitutlarında və eləcə də Mədəniyyət və Kitabxanaçılıq texnikumunda müəllimlik fəaliyyəti göstərmişdir. 1975-ci ildən 1993-cü ilə kimi sahə institutunda - Azərbaycan Elmi-Tədqiqat Əkinçilik İnstitutunda baş elmi işçi vəzifəsində işləmişdir. Sahə institutunda işlərkən apardığı elmi işlərin nəticəsi olaraq əhəmiyyət kəsb edən bir neçə tətbiq işlərini həyata keçirmişdir.

O bitki anatomiyası sahəsində hazırlanmış respublikada ilk mütəxəssisdir və nəzəri işlərlə məşğul olmuşdur. Bu səbəbdən də onun nəzəri işlərinin nəticələri haqqında SSRİ-nin 50 illiyi ilə əlaqədar olan “Elmdə və texnikada olan inkişaf” adlı və Moskvada dərc edilmiş kitabda yazılar getmişdir.

O, öz sahəsi üzrə keçirilən, konfranslarda, sesiyalarda, simpoziumlar və seminarlarda məzmunlu məruzələrlə çıxış etmişdir.

Elmi fəaliyyətinin nəticəsi olaraq 1 kitab, kitabçalar və 60-dan çox elmi məqalələrin müəllifidir. O çoxlu miqdarda





qəzet səhifələrində müxtəlif mövzuya aid məqalələrlə çıxış etmişdir.

O, Botanika və eləcə də Kimya Cəmiyyətinin üzvüdür.

O, işlədiyi dövrdə öz sahəsi üzrə xarici alimlərlə daima əlaqə saxlamış və dərc etdiyi əsərləri ilə mübadilə etmişdir.

Həsənov Əli Zaman Müseyib oğlu “Əmək rəşadətinə görə” medalı ilə təltif edilmişdir.

O Əmək Veteranı adına layiq görülmüş və medalı ilə təltif edilmişdir. Həsənov Əli Zaman Müseyib oğlu 1994-cü ildən 1998-ci ilə kimi Abşeron Regional Səhmdar Su Cəmiyyətinin Bakı Su Kəməri İstehsalat İdarəsinin Mərkəzi Kimyəvi bakterioloji laboratoriyanın rəisi işləmiş.

Hal-hazırda o, Bakı Su Kəməri İstehsalat İdarəsinin baş texnoloqu vəzifəsində çalışır.

Onun 3 övladı - iki qızı, bir oğlu vardır. Onlar ali təhsilli mütəxəssislərdir və xalq təsərrüfatının müxtəlif sahələrində çalışırlar.

## FƏRMAN ALI OĞLU AĞABALAYEV

*İki şey var ki, sonu görünməz:*
*bilik və ağıl.*



İnsanlar içərisində elələri vardır ki, yaşadığı ömür müddətində öz amalını bəyan etməklə xatırlanırlar. Onların həyat amalından asılı olaraq xalq onları tanıyır, yad edir və unudulmurlar. Fərman Ağabalayev tərəqqiyə, uğurlara, yeni-yeni nailiyyətlərə çatmaq amalı uğrunda yaşayan bir qızılağaclıdır. Çünki onun Qızılağaca bağlılığı daha güclüdür. İlk dəfə ayaq qoyub yeridiyi torpaqdan o torpağın insanlara bəxş etdiklərindən faydalanıb. Özü də fayda vermək amalı uğrunda səy göstərdi torpağın yetirdiklərinin "həkimi" oldu. Məhz ilk dəfə Ali məktəbi bitirdikdən sonra doğma kəndin kənd təsərrüfatının inkişaf etməsi üçün əzmlə çalışdı. Sınaq əkinləri keçirdi. Kortəbii əkinçiliklə mübarizə apardı. Öz elmi bilikləri ilə az vaxt içərisində kolxoz idarə heyətinin və kənd camaatının hörmətini qazandı.

Ağabalayev Fərman Alı oğlu 20 may 1934-cü ildə Masallı rayonunun Qızılağac kəndində anadan olmuşdur. 1944-cü ildə Qızılağac kənd orta məktəbinin 1-ci sinfinə daxil olub,





1954-cü ildə oranı bitirərək orta təhsil almışdır.

1954-cü ildə Azərbaycan Kənd Təsərrüfatı İnstitutunun aqronomluq fakültəsinə daxil olub, 1959-cu ildə oranı müvəffəqiyyətlə bitirmişdir.

1959-1961-ci illərdə Masallı rayonunun Qızılağac kəndində Kalinin adına kolxozda baş aqronom vəzifəsində işləmişdir.

1961-1964-cü illərdə Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyinin Elmi-Tədqiqat Əkinçilik İnstitutunun aspiranturasında oxumuş, 1965-ci ildə "Cənubi Muğan zonasında üzvi və mineral kübrələrin şəkər və yem çuğundurunun məhsuldarlığına təsiri" mövzusu üzrə dissertasiyasını müvəffəqiyyətlə müdafiə etməklə elmlər namizədi adını almışdır.

1964-1965-ci illərdə Azərbaycan SSR Kənd Təsərrüfatı Nazirliyinin Heyvandarlıq məhsulları istehsalı və tədarükü Baş idarəsində yemçilik üzrə baş aqronom, 1965-70-ci illərdə həmin Nazirlikdə baş əkinçilik idarəsində yem bitkiləri üzrə idarə rəisi və Baş idarənin rəis müavini vəzifələrində işləmişdir.

1970-1973-cü illərdə Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyinin yemçilik, çəmənçilik və otlaqlar ,aş idarəsinin rəisi vəzifəsinə təyin edilmişdir.

1971-1973-cü illərdə Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyinin kollegiya üzvü olmuşdur.

1974-1984-cü illərdə Azərbaycan Respublikası Abşeron rayonunda S.Əliyev adına Ramana südçülük kompleksinin;

1984-1989-cu illərdə Abşeron rayonundakı Şurabad südçülük sovxozunun;

1990-1992-ci illərdə Abşeron rayonundakı Xırdalan süd-

çülük, tərəvəzçilik sovxozunun direktorları vəzifəsində işləmişdir. Sovxoz direktoru vəzifəsində işləyərkən Abşeron rayon partiya komitəsinin və təftiş komissiyasının bir neçə dəfə üzvü olmuşdur.

1992-ci ildən hal-hazıra qədər Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyində Otlaqlar şöbəsinin rəisi vəzifəsində işləyir.

45 ildir ki, respublikada kənd təsərrüfatının inkişaf etdirilməsi sahəsində fəal iştirak edir və bu sahədə lazımi tədbirlər hazırlayıb onların həyata keçirilməsinə nail olmuşdur.

Hökumətimiz tərəfindən onun əməyi yüksək qiymətləndirilmişdir. Çoxlu mükafatlar və ordenlərlə təltif olunmuşdur. 1974-cü ildə Azərbaycan Abşeron rayon Komitəsinin nümayəndəliyi tərkibində Bolqarıstan Respublikasında olmuşdur. Bir neçə dəfə Bakı şəhərində, Krasnodar vilayətində elmi konfranslarda və seminarlarda iştirak etmişdir. 100-ə qədər elmi məqalə və əsərin müəllifidir.

Həyat yoldaşı Aida Hümbətova Sarı qızı kənd təsərrüfatı elmlər namizədidir.

Oğlu Ağabalayev Şahmar Fərman oğlu iqtisad elmlər namzədidir.

Qızı Abbasova İradə Fərman qızı Bakı Dövlət Universitetini fərqlənmə diplomu ilə bitirib, Abşeron rayonu Xırdalan qəsəbəsində dil-ədəbiyyat müəllimi işləyir.





## ELMİDAR BƏBİR OĞLU ƏLƏKBƏROV

*Elimi öyrən, Çində də olsa.*



Elmidar Bəbir oğlu Ələkbərov 1941-ci ildə Qızılağac kəndində anadan olmuşdur. Qızılağac orta məktəbində təhsilini başa vuran Elmidar 1968-ci ildə Ağamalıoğlu adına Azərbaycan Kənd Təsərrüfatı İnstitutuna daxil olur. 1963-cü ildə müstəsna əla akademik müvəffəqiyyətlərinə görə ona fərqlənmə diplomu verilir. Masallı rayonunun sovxozlarında mütəxəssis kimi işə başlayır. İşin ağırlığı gənc Elmidarı qorxutmur. Özünəməxsus iş metodu ilə təsərrüfatların inkişaf etdirilməsinə kömək göstərir. Az vaxt içərisində rayon partiya komitəsi onu rayon kənd təsərrüfatı idarəsində işləməyi təklif edir. Elmidar bu işin ağır olmasını bilirdi, lakin özünə arxayın olan bu gənc mütəxəssis təklifi qəbul etdi. Burada biliyi, iş metodu ona kömək oldu. İşin öhdəsindən layiqincə gəldi. Onun işində əsl yaradıcı mütəxəssisin əlamətlərini görən görkəmli alim, dünyada tanınmış ümumittifaq Kənd Təsərrüfatı Elmlər Akademiyasının müxbir üzvü Zülfüqar Verdiyev onun xidmətlərin yüksək qiymətləndirmişdir. Zülfüqar Verdiyevin təşəbbüsü ilə o, Ağamalıoğlu adına

Azərbaycan Kənd Təsərrüfatı İnstitutunun elmi şurası tərəfindən vaxtından əvvəl aspirantura imtahanlarına buraxılır.

Ona göstərilən bu etimadı yüksək səviyyədə doğruldaraq aspiranturaya daxil olur. Təhsilini davam etdirmək üçün Sankt-Peterburqa (Leninqrada) yollanır. Orada bir neçə dünya akademiyalarının üzvü olan, məşhur professor V.Vokkenin rəhbərliyi ilə aspiranturanı müddətindən xeyli qabaq, iki il yarıma başa vurur. Alim kimi Respublika Kənd Təsərrüfatı Nazirliyində işə qəbul olur. Burada öz istedadı ilə fərqlənir. Gənc alimin yaradıcı baxışları rəhbərliyin diqqətindən yayınmır. Onu 1970-ci ildə Respublika Tədarük Nazirliyində Xalq Təsərrüfatının böyük əhəmiyyət kəsb edən yeni sahəsinə sənaye əsaslı yem istehsalına rəhbər təyin edirlər.

Burada o Baş idarənin rəisi vəzifəsinə qədər yüksəlir.

1980-ci ildə onu Sovet işinə - Azərbaycan Respublikası Nazirlər Sovetində işlə təmin edirlər.

Burada da o öz münasibətinə görə fərqlənir, onu Azərbaycan Kommunist Partiyası Mərkəzi Komitəsinə məsul işə keçirirlər. Özünün deməyinə görə, "Qaynar Qazan" fəaliyyəti dövründə başladığı doktorluq işini buraxmalı olur. Mərkəzin səlahiyyəti ali orqanlarında işlədiyi dövr, ona insanlarla ünsiyyət təcrübəsi, idarəçilik istedadı qazandırırmış, iqtisadiyyata qovuşdururmuş. Dözümlüyü, mətanəti, alovu qaynar qazanın sınağında yoxlanılır. Bu dövrdə ona bir sıra rəhbər vəzifələr təklif olunur.

Ələkbərov elmlər namizədi- alimdir. 20-dən çox əsərin müəllifidir. 1988-1991-ci illərdə Astara rayon Partiya Komitəsinin ikinci katibi, Aqrar Siyasət komissiyasının sədri, Xalq Deputatları Sovetinin Deputatı, Ümumittifaq sahə kordinasiya





şurasının üzvü olmuşdur. Hazırda o Azərbaycan Koorperasiya Universitetində elmi-pedaqoji fəaliyyətini davam etdirir. Dosentdir. Dövlət tərəfindən şərəf nişanı ordeninə, SSRİ Xalq Təsərrüfatı Nailiyyətləri Sərgisinin "Qızıl" medalına layiq görülmüşdür. Rus və ingilis dillərini mükəmməl bilir. Ailəlidir. Dörd övlad atasıdır. Ələkbərovun mətin dözümü, dolğun biliyi, aydın siyasəti vardır. Təkrar olunmaz həyat yoluna arxalanıb gələcəyə inamla baxır.

O əmindir ki, doğma Azərbaycan həmişə tərəqqi, yüksəliş yollarında öz xalqına əmin-amanlıq, xoşbəxtlik bəxş edəcək.

O doğma Qızılağacın da tərəqqiyə, yüksəlişə çatması üçün səy göstərməkdədir. O, Qızılağacın daha gözəl, daha firavan gələcəyinə xüsusi inam bəsləyir. Qızılağac xoş gələcəyə qoynunda bəslədiyi insanların zəhmətilə çatacaqdır. Onun qoynu müqəddəs ana qucağı kimi əzizdir. Gəlin dünyaya bəxş olunduğumuz yerin qədimliyini, tarixi şəxsiyyətlərini gələcək nəsillərə çatdırmaq üçün quruculuq işlərini çoxaldağın və ana yurdun qayğısına qalaq.

Bu işdə fəaliyyəti əsirgəməyin.

# ADİL TEYMUR OĞLU ƏSGƏROV

***Allahtala sizin simanıza və malınıza baxmaz, ancaq ürəklərinizə və əməllərinizə baxar.***



Haqqın, ədalətin, səmimiyyətin qorunması hər insana xas olan əlamət deyil. Elə insanlar var ki, həyata biganə münasibət bəsləməsinə görə bu üstünlüklərə sahib ola bilmir. Hər şey onun nəzərində müvəqqəti təsir bağışlayan əlamət kimi görünür. Lakin elə insanlar da var ki, onlar məhz həyatda yaşayışından başqalarının faydalanmasına çalışır. Bu insanlar insanlığı hər şeydən üstün tutaraq başqalarınında formalaşmasına böyük təsir göstərir. İstəyir ki, onlar da həyatda yaşamaqla yanaşı insanlıq naminə, həyata yeniliklər bəxş etsin. İnsan həyatda öz adını məhz yaxşı əməlləri ilə yaşadır. Onun əməlləri hər zaman onun üçün yaxşı sözlərin deyilməsinə səbəb olur. Böyük iradə - böyük dağ deməkdir. Böyük dağı isə yerindən tərpətmək çətindir. Hər bir şəxs ümumxalq tərifinə layiq görülürsə tərif olunana ölməzlik bəxş edir.

İnsanlar içərisində elələri də var ki, onların gördükləri dəyərli iş hamı görənlər tərəfindən böyük qiymətlə qiymətləndirilir, ehtiramla yad edilir. O, işlər ki, gözə çarpır, sanki o bir

saf incidir. Parlaqlığı, şəffaflığı isə digərlərində ona qarşı məhəbbət oyatmağa sövq edir. Elə şəxslərdən biri də öz zəhməti, biliyi, bacarığı sayəsində seçilib-sevilən Əsgərov Adil Teymur oğludur. O, 1930-cu ildə doğma, əziz, ana kimi istəkli, həmişə adı ilə fəxr etdiyi Qızılağac kəndində anadan olmuşdur. Kiçik yaşlarından atadan ayrılan Adil, qardaşı Mürüvvətin, anası Nərgizin himayəsində pərvəriş tapmışdır. Qardaşı Vilayət müəllimin Adilə olan məhəbbəti əvəzsiz dərəcədə çox idi. Odur ki, Adilin oxumasına istiqamət verir, onun elmin dərinliklərindən faydalanmağına çalışırdı. Adilin uşaqlıq yoldaşlarının onun haqqında söylədiklərini indi də eşidəndə insanı heyrətə gətirir. O heyrətamizlik, onun çətin illərdə hünəri, fəaliyyəti sayəsində həyata keçmişdir. Adil orta məktəbdə oxumaqla yanaşı, anası Nərgizə böyük köməkçi hesab olunurdu, bu gənc məktəbli başqalarına ehtiyaclı olmamaq üçün anasının təsərrüfat işlərinə yaxından köməklik göstərir, həm də sabahkı dərslərə hazırlaşırdı... İllər keçdi, kamal attestatı aldı. Adil üçün qarşıda böyük seçim dururdu. Hansı sənəti seçməli?

O, bilirdi ki, həyatda çoxlu-çoxlu sənət sahələri vardır. Hansı sənət daha insanlara xidmət etmək üçün əsasdır, vacibdir... Nəhayət, tikinti üzrə mütəxəssis olmağı qarşısına məqsəd qoydu. İxtisası üzrə mütəxəssis kimi həyatda fəaliyyət göstərməyə başladı. Onun mühəndislik sahəsində hörməti, nüfuzu günü-gündən artır, çoxalır... İşçilərinə olan münasibətinə görə hər an onların böyük ehtiramlarını hiss edirdi. Onun rəhbərliyi altında inşa edilən çox mənzilli yaşayış evlərinin keyfiyyəti də yüksək dərəcədə qiymətləndirilirdi. Öz işinin bilicisi olan Adil işçilərinə də yüksək tələbkarlıqla yanaşır və





onların işə məsuliyyətli olmaqlarına həmişə çalışırdı. Onun bu xüsusiyyətlərini, tələbkarlığını görən işçilər saf, əqidəli, etibarlı, işə məsuliyyətli insanlar olmaqla seçildilər. Adil artıq öz işinin axar-baxarlı olmasına əmin idi. Çünki onun səyi nəticəsində zərbəçi kollektiv yaranmışdır. Yer üzünə mühəndis Adilin cizgiləri əsasında yeni-yeni naxışlar vurulur. O naxışlı binalara yaşamaq üçün daxil olanlar isə binanın bu vəziyyətə gəlib çıxmasında əvəzsiz xidməti olan mühəndis və texniki işçilərə dualar edirlər.

Adil ixtisas-sənət seçməkdə yanılmamışdır. Ona görə ki, onun sənəti minlərlə insanın rahatlığına xidmət edirdi. O, xidmət mövqeyində durmağı özü üçün seçməkdə Adilin məqsədi yaşadığı ömür müddətində başqalarına fayda vermək üçün olmuşdur.

Adil hansı çətin texniki cizgilər olsaydı belə, onu asanlıqla başa düşür və yubanmadan işə başlamağa səy göstərirdi. Səy göstərirdi ki, evsiz-eşiksizlərə kömək etsin. Beləcə Adil Əsgərovun ömür kitabının səhifələrinə sətirlər yazıldı. Yer üzərində onun "ev tikməklə" yazdığı canlı və əbədi kitabın səhifələrini indi də oxumaq olur. Lakin bu oxunuş hamı tərəfindən mümkün olmur. O, oxunuşu bu yazılarla oxuyub başa düşmək, öz işinin mahir bilicisi olan ixtisaslı kadrın əməyinə verilən qiymət və yada salınması üçün əlamətdir. Adil haqqında yazmaqla qurtarmaq olmaz. Çünki onun həyatı o qədər özünə məxsus təzadlarla doludur ki, onu bu kitabda yazmaq imkandan kənardır. Buna baxmayaraq qayğıkeş insan olan Adilin əməyi unudulmamalı, onu gənc nəslə çatdırmalıyıq ki, onlar da bu şəxsiyyət haqqında məlumata malik olsunlar.

1959-cu ildən Adil Əsgərov ömrünün sonuna kimi öz sə-

nətini davam etdirdi. Adil həm də həyat yoldaşı Kafiya xanımla birlikdə 9 övlad böyüdüb ərsəyə çatdırmışdır. Onun oğlanlarından 3-ü, qızlardan 1-i ali təhsillidir.

Ziyalı atanın ziyalı övladları da ataları kimi xeyirxah, təəssübkeş, insanlıqla insana məhəbbət bəsləyən imanlı şəxslərdirlər.

Adil Əsgərovun ruhunun şadlığını övladları da həmişə öz münasibətləri ilə təmin edirlər. Çünki onlar saf, təmiz, büllur kimi parlaq mənəviyyat sahibidirlər. Böyük amallar sahibidirlər. Onlar ziyalı olsalar da belə hər kəsin dili ilə danışmağı bacarır, hər kəsə ziyalı təsiri bağışlayırlar. Bu yüksəklik, mövqe onlara Allah tərəfindən əzəldən bəxş edilən əlamətdir. Adil Əsgərovun hər övladının xeyirxahlıqla öz dəsti-xətti var. Onun məhz səyinin nəticəsi indi öz bəhrəsini vermiş, oğlanları da həyatda əsil xeyirxah, qayğıkeş, səxavətli bir insan kimi formalaşmışdır. "Adiloğlu" nəşriyyatı da məhz bu atılan addımları davam etdirir.

Nəşriyyatın rəhbəri Hidayət (Elman) Adil oğlu həyat amalında yeganə rahatlığı kiməsə Allah yolunda xidmət etməkdə görür.





## ƏLİABBAS LƏTİF OĞLU AXUNDOV

***İnsanlar elə bir sədəqə verə bilməzlər ki, öyrənilən, yayılan elmdən üstün olar***



Qızılağac kəndinin ilk ziyalı ruhanilərindən olan Lətif həm şəriətdən, həm də dünyavi elmlərdən dərs demiş və xalqın balalarına elm bəxş etmişdir. Elmli olan Lətif kişinin 1907-ci ildə bir oğlu dünyaya gəldi. Adını Əliabbas qoydular. Əliabbas məktəb partası arxasında oturmamışdan əvvəl atasından Quran oxumağı, yazmağı öyrənmişdi.

O, Qızılağacda ibtidai məktəbi bitirmiş, Bakı şəhərində orta təhsil aldıqdan sonra, Azərbaycan Sənaye İnstitutunun iqtisadiyyat şöbəsinə qəbul olunmuş və 1932-ci ildə institutu bitirərək respublika maliyyə nazirliyi sistemində işləməyə başlamışdır. Böyük Vətən müharibəsində ilk gündən son günə qədər döyüşən ordu sıralarında vuruşub və müharibəni Berlin şəhərində başa vurub. Onun xidmətləri yüksək qiymətləndirilmiş, ayrı-ayrılıqda səkkiz orden və medallar ilə təltif olunmuşdur.

Vətən müharibəsindən sonra o, yenə Respublika Maliyyə Nazirliyində rəhbər vəzifələrdə işləmişdir. Əliabbas Axundov öz işinin mahir bilicisi olduğu üçün onun başçılıq etdiyi kollektiv həmişə maliyyə sistemində fəxri fərmanla təltif

edilmişdir. Əliabbas Axundov Moskva Ali Maliyyə İnstitutunda sonradan təhsilini davam etdirmişdir. Bakı şəhəri Maliyyə İdarəsinin Dövlət Vergilər Şöbəsinə uzun müddət rəhbərlik edən Ə.Axundov tabeliyində olan işçilərə qarşı da çox tələbkar idi. Ə.Axundov rəhbər vəzifələrdə işləyə-işləyə eyni zamanda Bakı Maliyyə Texnikumunda gənc maliyyəçilərə öz elmini də tədris edirdi. Respublikanın gələcək maliyyəçilərinə maliyyənin əsaslarını öyrətməkdə öz bilik və bacarığını əsirgəmirdi.

O, ata-babasının yolunun davamçısı olmuşdur. Onlara məxsus olan iki mərtəbəli ata-baba evini kolxoza bağışlayır və uzun illər həmin binada kolxoz idarə heyəti yerləşib. Sonralar isə həkim məntəqəsi kimi istifadə olunub. Gözəl mütəxəssis, öz işinin bilicisi olan Əliabbas Axundov fərdi təqaüdə çıxandan sonra da onun Bakı Maliyyə İdarəsində işləməyini lazım biliblər. O ömrünün axırına qədər həmin vəzifədə işləmişdir. 1972-ci il avqust ayında Bakı şəhərində vəfat etmişdir. Qəbri Bakı şəhərindədir. Əliabbas Axundovun iki övladı vardır. Oğlu Zöhrab 30 ildən yuxarı Bakı şəhərindəki mayesiz transformatorlar zavodunun direktoru vəzifəsində işləyir. Əliabbasın atası Lətif haqqında məktəb bölməsində oxumaq olar.





## ƏHMƏD MİR SALEH OĞLU ABDULLAYEV

***Bu günü qənimət bil, sabah kimin olacağı bəlli deyil***



Xeyirxah insanlar heç vaxt unudulmur. Onları unutmaq özü də haqsızlıq hesab olunur. Allah Qurani Kərimdə: "Hər kəs misqalın zərrəsi qədər yaxşı iş görsə mükafatın alacaqdır" buyurmuşdur. Xeyirxah olmaq, insandan böyük iradə istəyir. O iradəyə sahib olanlardan biri də Əhməd idi. O çox hörmətli şəxslərdən sayılan Mir Saleh ağanın oğlu idi. Mir Salehin Qızılağac kəndində geniş imkanları olmuş, o imkan müqabilində başqalarına da köməklik göstərmişdir. Onun oğlu Əhməd xeyirxahlığı ilə seçilib-sayılan bir ziyalı idi. Əhməd 1943-cü ildə anadan olub (anası Qoçu Məmmədin qızı idi), 1960-cı ildə orta məktəbi bitirib. Həmin il Ali məktəbə daxil ola bilmədiyi üçün Bakı şəhərində işləməyə başladı. 1961-ci ildə Azərbaycan Politexnik Texnikumunun Avtomobil şöbəsinə daxil olmuş, 1963-cü ildə texnik-mexanik ixtisası alaraq Bakı şəhərindəki Ağır yük daşıma nəqliyyat müəssisəsində mexanik vəzifəsində işləmiş, işləyə-işləyə Politexnik İnstitutunun Avtomobil fakültəsini bitirərək, həmin idarəyə müdir təyin edilir. Mir Əhməd Abdullayevin təşkilatçılığı sayəsində Avtomobil təsərrüfatının göstəriciləri artmış və respublikada qabaqcıl Avtomobil təsər-

rüfatı olmuşdur. O az vaxt içərisində təsərrüfatın bütün işçilərinin hörmətini qazanmışdır. Avtomobil Nəqliyyatı Nazirliyinin rəhbərliyinin təşəkkür və fəxri fərmanlarına layiq görülmüşdür. Respublikanın əməkdar mühəndisi adını almışdır. Sonradan həmin Avtomobil müəssisəsinə respublikada olan bir neçə nəqliyyat müəssisələrini də tabe etdilər. Mir Əhməd öz səriştə və bacarığına, təsərrüfata rəhbərliyinə görə onu Avtomobil müəssisəsinin Baş direktoru vəzifəsinə irəli çəkmişlər və ömrünün axırına kimi o vəzifədə işləmişdir. Əhməd Abdullayevin Qızılağaca tez-tez gələrək kəndin problemləri ilə maraqlanması kənd ictimaiyyəti tərəfindən yüksək qiymətləndirilirdi. O, kəndin Muradxanlı məhəlləsində "Əzim Diki" adlanan yerdə 1985-ci ildə öz hesabına 100 metr dərinliyində artezian quyusu qazdırdı. Məqsədi kənd camaatının şirin su problemlərini həll etmək idi. Lakin həmin quyuya külli miqdarda xərc sərf olunsa da belə şirin su çıxmadı. Sonradan o Bakıda Kartoqrafiya İnstitutuna gedir. Qızılağacda şirin su olub-olmaması ilə maraqlanıb. Ona deyiblər ki, Qızılağacdan 14 km aralı məsafədə Şirin su mənbələri var. Ancaq Qızılağacda bu şirin su quyuları qazmağın əhəmiyyəti yoxdur. Odur ki, həmin iş dayandı. Əhmədin xeyirxahlığı onun xatırlanması üçün əsasdır. O hər ayda ən azı iki dəfə kənd qəbristanlığında öz ata babalarının ziyarətinə gələrdi. Onun gəlişi ehtiyacı olanlara fayda bəxş edirdi. Onun atası Mir Saleh kişi də xeyirxah insan olub. Onlara Xil kəndində məxsus olan torpaq sahəsini 1970-ci illərdə Xilin Becanlı məhəlləsində məscid tikmək üçün vəqf etmişdi. Mir Saleh və oğlu Əhməd indi də xatırlanır, yada salınır. Onların ruhlarının şadlığı üçün fatihə xeyrlər söylənilir. Allah rəhmət eləsin. Mir Saleh Qızılağacda Əhməd isə Sarı qəsəbəsində dəfn olunmuşdur.





## MƏSUMƏ YAQUB QIZI

***Səbr və dözümlə İman münasibəti baş ilə, bədən kimidir. Başsız bədənin faydası olmadığı kimi, dözümsüz imanın da faydası yoxdur.***



Bu şəxs haqqında indi Qızılağacda və ətraf kəndlərdə qısa məlumatı olanlar vardır. Vaxtilə 6 yaşlı qızın sonrakı taleyinin necə olmasını doğmaları da bilmirdi. Onun haqqında narahat olanlar da artıq Məsumənin Azərbaycanda olmamasına oyrəşmişdilər. Lakin unutmamışlar. Qəlbi kövrəldən həsrət yanğısını göz yaşı söndürürdü. İllər keçdi həsrətlə... Məsumə üçün də ayrılıq çox çətin olsa da belə, kiçik yaşlı olduğundan bu ayrılıq sanki onu çox narahat etmirdi. Ona görə ki, himayəsində olduğu adamlardan əsl doğma münasibətini görürdü. Öz doğma elindən-obasından ayrı düşən bu altı yaşlı qız uşağının heç xəyalına da gələ bilməzdi ki, illər, on illər keçər, doğma kəndi olan Qızılağaca - anadan olduğu torpağın, doğmalarının ziyarətinə gələr. Allah insan üçün qərarlaşmış ömür müddəti təyin edib. Hər hansı bir insan o müddət ərzində harada olursa-olsun yaşamalıdır. Məsumə üçün də kiçik yaşlarında həyat imtahanı başladı. O, imtahandan necə çıxacağı isə sonralar məlum olacaq... Məşhur hüquqşünas, həkim, ziyalı olan Həşimov Mahmudun qardaşı Yaqub Mahmudovun qızı Məsumə 1910-cu ildə Qızılağac kəndində anadan

olmuşdur. 1929-cu ildə müsavat fəalarına keçmiş SSRİ dövründə olunan təqiblərdən yaxa qurtarmaq üçün Yaqub qızı Məsuməni götürərək, qardaşı oğlu İmranla birgə İran sərhəddini keçir. İran Astarasında gizlənməyi qərara alır. Onların ələ keçməməsi xatirinə Yaqub Astarada yaşayan dostlarına qızının və oğlunun saxlamalarını xahiş edir. İran Astarasında olan şəxs qızılağaclı imiş. Özü isə qayıdır geri. Nəhayət İmran da təqib olunduğunu bildikdə sərhədi keçir və həbs olunur. İmranın həbsdən xilas olmağına o vaxtlar NKVD-nin sədri Əli Əsgərov kömək etmişdir. 6 yaşlı Məsumə o dövrdə Qacarlar sülaləsinə mənsub olan bir hərbçinin himayəsində qalır. Bu hərbçi öz ata-baba soy-kökünə bağlı olan insan olduğu üçün xeyirxahlığını da Məsuməyə bəxş edir... Məsumə 12 yaş həddinə çatanda həmin hərbçi ilə ailə həyatı qurur. Ondan üç oğul uşağı dünyaya gəlir. Məsumə Qacarlar sülaləsinə mənsub olan ailənin gəlini idi. O oxumağa həvəsli olduğu üçün Ali məktəbə daxil olur, fars dili və ədəbiyyatı üzrə müəllim ixtisası alır. Uzun müddət Tehran şəhərində müəllim işləyir. Eyni zamanda həyat yoldaşının vəfatından sonra övladlarının təlim-tərbiyəsilə məşğul olmaq üçün onun işi çoxalır. Bu çətinliklər Məsumənin fəaliyyətinə öz təsirini göstərir. Ana öz övladlarına da ali təhsil vermək üçün çox çalışır. Hər üç övladına Ali təhsilli mütəxəssis ixtisası almağa nail olur. 1979-cu ildən İranda baş verən inqilab zamanı Amerikaya köçür və orada yaşayır. Amerikadan iki dəfə 1991-1996-cı illərdə doğma Qızılağaca ziyarətə gəlib. Onun Amerikada olmağına baxmayaraq, Qızılağacla əlaqəni kəsmir, doğmaları ilə əlaqə saxlamaqdadır.

Oğlanları da Amerikada yaşayan yurddaşlarımız arasında tanınan şəxsiyyətlərdəndir. Məsumənin ana qədər sevdiyi bir yer var. Həmin yer doğulduğu Qızılağac kəndidir.





## ARİF BƏBİR OĞLU ƏLƏKBƏROV

***Hər şeyin bir əlaməti var, ağıllı adamın əlaməti düşünmək, düşünməyin əlaməti isə susmaqdır.***



Öz gənclik illərindən indiyə qədər zövqdə, səfada özünə məxsus yaşıdları içərisində fərqlənən Arif 1951-ci ilin sentyabr ayının 1-də Masallı rayonunun Qızılağac kəndində ziyalı ailəsində anadan olub. Anası Səmədzadə Rübabə 40 ildən yuxarı Qızılağac orta məktəbində müəllimə işləmiş, kənd zəhmətkeşlərinin fidan balalarına doğma dili, ana dilini öyrətmişdir. Rübabə müəllimə gözəl ziyalı, həm də qayğıkeş ana idi. Onun qayğısı sayəsində məktəb şagirdləri təlim-tərbiyə, bilik cəhətdən üstünlüklərə malik olublar.

Arif də o fidan balalarla birgə 1-ci sinfə qədəm qoymuşdur. VII sinifdən Lənkəran şəhərindəki internat-təmayüllü məktəbdə təhsilini davam etdirmiş, 1968-ci ildə X sinfi bitirmişdir.

1968-ci ildə qəbul imtahanlarını müvəffəqiyyətlə verərək D.Bünyadzadə adına Azərbaycan Dövlət Xalq Təsərrüfatı İnstitutuna qəbul olunmuş, 1972-ci ildə həmin institutun iqtisadiyyat şöbəsini bitirmişdir. 1972-ci il oktyabr ayından 1973-

cü ilin noyabr ayına kimi həqiqi hərbi xidmətdə oub. 1974-cü ildən 1980-ci ilə kimi Masallı rayonunun Nizami adına sovxozunda baş iqtisadçı vəzifəsində işləyib. 1980-ci ildən 1983-cü ilin noyabr ayının 30-na kimi Masallı rayon Partiya Komitəsinin təşkilat şöbəsində təlimatçı işləmişdir. 1983-cü ildən 1992-ci ilə kimi Yardımlı rayon daxili işlər idarəsində sosialist əmlakını dağıdanlarla mübarizə baş əməliyyatçısı, 1992-ci ildən yanvar 1993-cü ilə kimi Masallı rayon Polis Şöbəsində azyaşlılar və gənclərlə aparılan iş üzrə müfəttişliyin rəisi vəzifəsində işləmişdir. 1993-cü ilin yanvar ayından, həmin ilin iyun ayına kimi Masallı rayon Bələdiyyə Polis Şöbəsinin rəisi, iyun 1993-cü ildən iyun 1997-ci ilə kimi Cəlilabad rayon polis şöbəsində iqtisadi sahədə cinayətkarlara qarşı mübarizə üzrə əməliyyat müvəkkili, 1 iyun 1997-ci ildən aprel 2000-ci ilə kimi Masallı rayon Polis şöbəsində, iqtisadi sahədə cinayətkarlara qarşı mübarizə əməliyyat müvəkkili və sahə inspektoru vəzifəsində, 2000-ci ilin aprel ayından Biləsuvar Rayon Polis Şöbəsində təşkilatçı inspektor, baş inspektor işləmişdir. Hal-hazırda Biləsuvar Rayon Polis Şöbəsində Qeydiyyat və Şəxsiyyət vəsiqəsi qrupunun inspektorudur. Polkovnik leytenantdır. Üç övlad atasıdır.

Arifdə olan yaxşı xüsusiyyətləri saymağa ehtiyac duyulmur. Ona görə ki, onu tanıyanlar artıq tanımayanlara onun barəsində söyləyiblər. Arif tanınmağa və tanıdılmağa layiq ziyalıdır. Onun insani keyfiyyətlərinə aid olanlar özünə məxsus olsa da bunu kənardakı da dərhal hiss edir. Onun gözəl xasiyyəti bu dediklərimizə sübutdur.





## MİRTAĞI MİRƏLİ OĞLU ABDULLAYEV

*Vətəni sevmək imandandır.*



Atası Mirəli Abdullayev Masallı rayon olandan sonra mühüm vəzifələrdə işləmişdir. Həmin illər rayonun iqtisadiyyatnı inkişaf etdirməkdə öz biliyini və bacaracağını həyata keçirmişdir. Onun oğlu Mir Tağı 1949-cu ildə Masallıda anadan olmuşdur. Mir Tağı atasının Bakı şəhərində işə dəvət olunması ilə əlaqədar Bakıya köçmüşlər. Yeddiillik təhsilini Masallıda, orta təhsilini isə Bakı şəhərində almışdır. 1968-ci ildən Bakı Politexnik Texnikumunu, 1975-ci ildə D.Bünyadzadə adına Xalq Təsərrüfatı İnstitutunu bitirmişdir. 1975-ci ildən Bank sahəsi üzrə müxtəlif vəzifələrdə işləmişdir. "Dövlət Bank əlaçısı "nişanını xidmətlərinə görə qazanmışdır. 1999-cu ildən Azərbaycan Sənaye İnvenstisiya Səhmdar Kommersiya Bankının idarə heyətinin sədr müavini, 2001-ci ildə BUS bankın bir saylı Xətai filialında müdir vəzifəsində işləmişdir. Hal-hazırda Azərbaycan Sənaye İnvenstisiya Səhmdar Kommersiya Bankının idarə heyətinin sədr müavini vəzifəsini icra edir. 2004-cü ildə "Avropa Nəşr və Mətbu Evinin" müəyyənləşdirdiyi ilin ən yaxşı iqtisadçısı - bank işçisi diplomu ilə təltif edilmişdir. Hal-ğazırda Bakı şəhərində yaşayır. Mir Tağı ata yurdu olan Qızılağaca bağlı olan şəxsiyyətdir.

# RAFİQ İSA OĞLU ƏLİYEV



1948-ci il avqust ayının 26-da Qızılağac kəndində anadan olmuşdur. 1966-cı ildə Qızılağac on birillik məktəbin XI sinfini bitirmişdir. 1966-cı il Dadaş Bünyadzadə adına Xalq Təsərrüfatı İnstitutunun əmtəşünaslıq fakültəsinin ictimai iaşənin təşkili və texnologiyası ixtisası üzrə texnoloq-mühəndis ixtisasını almışdır. 1971-ci ildə institutu müvəffəqiyyətlə bitirmişdir. Həmin ildə Masallı şəhər ictimai iaşənin idarəsinin müdiri vəzifəsində işləmişdir. 1972-1974-cü illərdə həqiqi hərbi xidmətdə olmuşdur. 1974-cü ildə Bakı şəhərindəki Nəşriyyat idarəsinin xidmət sahəsinin şöbə müdiri vəzifəsində işləmişdir. 1976-1982-ci illərdə Bakıdakı "Ulduz" restoranının müdiri vəzifəsində işləmişdir. 1978-ci ildə Ukraynanın Xabaçovski İnstitutunun aspiranturasına daxil olmuşdur. 1980-ci ildə aspiranturanı bitirmişdir. Həmin il Melorasiya Nazirliyində fəhlə təchizat sahəsi üzrə rəhbər vəzifədə işləmişdir. 1995-ci ildən 1999-cu ilə kimi Rusiya Azərbaycan Ticarət Palatasının direktoru vəzifəsində işləmişdir. 1999-cu ildən hal-hazıra kimi həmin idarənin prezidentidir. Azad Sahibkarlar Cəmiyyətinin üzvüdür. Ailəlidir, 2 oğlu, bir qızı var. Hər üçü ali təhsillidir.







***Bu həkim məntəqəsi 2005-ci ildə inşa edilib.***

# ƏLİ ƏHMƏD OĞLU ƏSGƏROV

*Şərəf və düzgünlüklə yaşayan adam Allahın sevimlisidir*



Adı dillər əzbəri olan bu şəxsi indiki nəslin nümayəndələri görməyiblər. O şəxsi görməsələr də ata-babalarından onun adını eşidiblər. O adı eşidənlər bəlkə də ad sahibi haqqında məlumata malik deyillər. O cümlədən, mən özüm də adı eşidib məlumat bilməyənlərdən biri idim. Lakin çalışırdım ki, adı ilə məşhur olan şəxs haqqında geniş məlumata malik olum. Nəhayət, bu istəklərimi həyata keçirməkdə Mərhum Əli Əsgərovun qızı Tamilla xanım Tağıyeva mənə köməklik göstərdi. Mən Tamilla xanımla atası haqqında sorğu aparanda onun zahiri görkəmində qəm-qüssənin təsirlərini hiss edirdim. O isə mənə atası haqında müxtəsər məlumat verdi. Mən Əli haqqında ağsaqqallardan eşitdiklərimdən Tamilla xanıma danışdıqca şəhla gözündən bulud yağışı kimi yaş damcılarının axdığını gördüm. Sən demə bu göz yaşı qəm yox, sevinc təsirindən imiş. Mən Tamilla xanımın bu mövqedə özünü görməyinin səbəbini soruşanda dedi: Qardaş mən

elə bilirdim ki, atam Əli qızılağaclılar tərəfindən unudulub. Lakin Sizin danışdıqlarınızı eşidəndən sonra mən hiss etdim ki, yanılmışam. Atam 35 il bundan qabaq dünyasını dəyişsə də belə, yenə əməlləri onu yaşadırmış. Ona görə də mən kövrəldim... Mən isə dedim: Tamilla bacı, yaxşılıq elə bir əməldir ki, heç vaxt yaddan çıxmaz. Əgər insan unutqanlıq edib yada salmasa belə Allah onun yaxşılığının qiymətin verib. Bəli Sizin atanızın yaxşılığın həm xalq, həm də Allah qiymətləndirib. Tamilla xanım oturduğu yerdən ayağa durdu, dörd qat bükülmüş, rəngi saralmış bir qəzet gətirdi, mənə təqdim etdi. Qəzetdə qara hərflə bir nekroloqun yazıldığını gördüm. Bu Əli Əsgərovun vəfatı ilə əlaqədar 24 fevral 1970-ci ildə Sovet Kəndi qəzetində dərc olunan nekroloq idi. Tamilla bacı dedi: Bunu bir xatirə kimi saxlayıram. Mən də bu sözün müqavilində inşallah, bu xatirəni xatirələrdə yaşatmaq üçün qələmə alaram, təəssübkeş bir insanı gələcək nəslə çatdıraram.

Tamilla xanım atasının dövlət başçıları ilə birlikdə çəkdirdiləri şəkilləri gətirdi. Çəkilən şəkillərdə Əli Əsgərov duruşu, baxışı ilə seçilirdi...

Əli Əhməd oğlu Əsgərov 1911-ci ildə Masallı rayonunun Qızılağac kəndində zəhmətkeş kəndli ailəsində anadan olub. Kiçik yaşlarından zəhmətə bağlı olması gənc Əlini kənd təsərrüfatı üzrə təhsil almasına səbəb olmuşdu. Qızılağac kəndində ibtidai təhsil alan Əli 1930-ci ildə orta təhsil haqqında kamal attestatını Bakı şəhərində oxuduğu məktəbdən aldı. Bakı kimi böyük sənaye şəhərində olan institut və universitetlərə yox, məhz bağlı olduğu torpağın iqtisadiyyatın qaldırmaq üçün Kənd Təsərrüfatı İnstitutunun iqtisadiyyat fakültəsinə daxil oldu. 1934-cü ildə həmin institutu müvəffəqiyyətlə bitirərək təyinatla Masallıya göndərildi. Rayon Mərkəzi Statistika İdarəsinin müvəkkili, rayon maliyyə şöbəsinin müdiri vəzifəsində işlədi. 1930-cu ildə təşkil edilən Masallı rayon iqtisadiyyatını qaldırmaqdan ötəri Əli Əsgərov öz biliyini, bacarığını əsirgəməmişdir. Əli Əsgərovun xidmətləri rayon səviyyəsində məlum olduğu vaxtda Respublika rəhbərliklərinin də nəzərindən yayınmadı. Az vaxt içərisində rayon iqtisadiyyatında dönüş yarandı. Bu işdə Maliyyə şöbəsinin müdiri Əli Əsgərovun sonsuz xidmətləri göz önündə idi.





Odur ki, Respublika rəhbərliyi Əli Əsgərovu ən məsul vəzifəyə təklif edəndə gənc Əli etimadı doğruldaram deyə, razılıq verdi. Onu 1938-ci ildə Respublika Xalq Daxili işlər orqanında işə qəbul etdilər. Həmin illər elə çətin dövr idi ki, respublikada daxili və xarici cinayətkarlara qarşı mübarizə kəskin surətdə aparılırdı. Gənc Əli bu sahədə olan çətinliyi hiss edirdi. Lakin öz istedadına da arxayın idi. Belə bir şəraitdə Əli işə başladı. O Bakı şəhər milis idarəsinin müdiri işlədiyi müddətdə cinayətkarlığa qarşı qəti mübarizə apardığına görə bir neçə dəfə Daxili İşlər orqanlarının fəxri fərmanı ilə təltif olunmuşdur. 1950-ci ilə qədər Daxili işlər orqanlarında işləyən ƏliƏsgərovun xidmətləri indi də gənc kadrlar üçün örnəkdir. 1950-ci ildən başlayaraq kənd təsərrüfatının dirçəlməsi uğrunda ciddi maneələr qarşıya çıxdığı zamanda Əli Əsgərova daha məsul vəzifələrin birində işləməyi təklif etdilər.

Öz Vətəninə sədaqətlə xidmət edən Əli Əsgərov Respublika Kənd Təsərrüfatı Nazirinin müavini təyin olundu. Kənd təsərrüfatında təsərrüfat sahələrinin yenidən qurulması, əkilən bitkilərdən yüksək məhsuldarlıq əldə edilməsində Əli müəllimin xüsusi xidmətləri olmuşdur. Belə bir vaxtda bu bacarıqlı şəxsi partiya və hökumətin göstərişi ilə Naxçıvan Muxtar vilayətinə kənd təsərrüfatı naziri vəzifəsinə təyin etdilər. Naxçıvanda iqtisadi dirçəliş özünü göstərdi. Azərbaycanda 1964-cü ildə təşkil edilən Sovxozlar nazirliyinə yeni təcrübəli kadrları məsul vəzifəyə təyin edirdilər. O, cümlədən Əli Əsgərov da Azərbaycan SSR Nazirlər Sovetinin Baş Sovxozlar İdarəsində pambıqçılıq sovxozları şöbəsinin rəisi vəzifəsində fəaliyyət göstərməyə başladı. Əli Əsgərov Şəki şəhərindəki toxumçuluq sovxozunda direktor, Şamaxıda milis idarəsinin rəisi, Əli-Bayramlıdakı Qaraçala sovxozunda direktor vəzifələrində işləmişdir. İndi də həmin rayonlarda bu mehriban, qayğıkeş insan haqqında xoş sözlər söylənilməkdədir.

Bacarıqlı mütəxəssis, qayğıkeş insan olan Ə.Əsgərov ömrünün son vaxtlarında nazirliyin kənd təsərrüfatı Elmi və Təbliğatı Baş İdarəsində şöbə rəisi vəzifəsində çalışmışdır.

Partiya və hökumət 1939-cu ildən Sov.İKP üzvü olan Ə.Əsgərovun xidmətlərini yüksək qiymətləndirmişdir. O, 1955-1959-cu illərdə Azərbaycan SSR Ali Sovetinin deputatı olmuş, Qırmızı Əmək Bayrağı, Şərəf nişanı ordenləri, Azərbaycan SSR fəxri fərmanı və bir sıra medallarla təltif edilmişdir. Əli Əsgərov keçmiş Jdanov (indiki Beyləqan), Karyakin





(Füzuli) rayonlarında da məsul vəzifədə işləmişdir. Sevil Qazıyevanın bir növ himayəçisi olmuşdur.



O, həmçinin XVIII-ci partiya qurultayına nümayəndə seçilmişdir. O zaman böyük alim məşhur seleksiyaçı İmam Mustafayevlə əlaqəli iş birliyi həyata keçirərmiş. Mərkəzi komitənin I katibi Vəli Axundovun yaxşı mütəxəssis kimi hörmətini qazanmışdı. Azərbaycan Kommunist Partiyası plenum üzvü, Azərbaycan SSR rəyasət heyətinin üzvü kimi fəaliyyət göstərən Əli Əsgərov 1970-ci ilin fevral ayının 19-da dünyasın dəyişmişdi. Ələsgərov haqqında yazmaq üçün mövzular çoxdur, lakin bu kitabda onun haqqında bu qədər həyatının özünəməxsus anlarından xəbər verənləri söyləməklə kifayətlənirəm. Əli Əsgərovun bir qızılağaclı kimi təəssübkeşliyindən, Qızılağacla olan bağlılığından söz açmasam da, lakin onun bir qızılağaclı kimi ana torpaqa bağlı olmağı heç vaxt qızılağaclılar arasında yaddan çıxmayacaqdır.

Onun Bakı şəhər Milis İdarəsinin rəisi işlərkən qızılağaclılara olunan köməyindən, Şəkidəki taxılçılıq sovxozunun di-

rektoru olanda, Şamaxıda məsul vəzifədə işləyərkən etdiyi yaxşılıqlardan ürək dolusu danışan insanlara çox rast gəlmişəm. Ancaq Masallının Alışanlı kənd sakini olan Kərbəlayi Qulamhüseynlə olan bu əhvalatı bəyan etməyi özümə borc bilirəm. Kərbəlayi Qulamhüseyn deyir: "Müharibə illərində mən Şamaxıdakı kənd təsərrüfatı texnikumunda oxuyurdum. Vəziyyətin ağırlığı məni çox sarsıtmışdı. Ailə qayğısından çox uzaq idim. Texnikumda oxusam da belə ehtiyacım çox idi. Ayaqlarımdakı ayaqqabı, əynimdəki qalın qış paltarları istifadə olunmağa yararsız olsa da, onlara möhtac idim. Bir gün tətil günlərindən qayıdarkən özümlə Masallıda əkilən ağagülə düyüsündən 10 kq aparmışdım ki, satım ehtiyacımı ödəyim. Qulamhüseyn kişi deyir: Düyünü gətirib Şamaxıdakı bazarda satmaq üçün yerə qoydum. Soyuq hava şəraiti, üstü açıq bazar...

Bir nəfər düyünün haradan gətirildiyini soruşdu. Mən Masallının ağagilə düyüsüdür deyə, cavab verdim. Həmin şəxs dedi: Özün hardansan? Dedim Masallının Alışanlı kəndindən. Mənə dedi: düyünü götür, gəl dalımca. Nəhayət bir həyətə daxil olduq. Məni evə dəvət elədi. Tez paltarımı dəyişmək üçün tapşırıq verdi. Bir azdan mənim üçün qış geyimləri gətirdilər. Hamısı təzə. Mən paltarlarımı dəyişdim. Süfrə arxasında oturub doyunca yedim.

Həmin şəxs dedi: məni tanıyırsan? Dedim, xeyr. Divara gözüm sataşdı. Mülki paltarın asılqandan asıldığını gördüm... Sonra dedi: Mən qızılağacdanam. Adım Əlidir, soy-kököm Əsgərov. Şamaxı Milis İdarəsinin rəisiyəm. Arxayın ola bilərsən





ki, sən bir daha burada özünü qərib hiss etməyəcəksən. O gündən mənim bəxt ulduzum parladı.

İndi də Əli Əsgərovu o xüsusiyyətinə görə yad etməyə borcluyam.

Əslən İran Azərbaycanından olan, indi Təzəkənd kəndində yaşayan Vərəqə Gülalı oğlu deyir. Mən qaçaq yolu ilə SSRİ ərazisinə keçənlərdənəm. Bizi Qazaxıstanda, digər yerlərdə sürgündə saxlayandan sonra Azərbaycana gətirib Şəki taxılçılıq sovxozuna işləməyə apardılar. Bir gün sovxoz direktoruna müraciət elədim ehtiyacıma görə. O məndən sorğu-sual apardı. Mənə öz köməkliyini göstərdi və Təzəkənd kəndinə gəlməyimə kömək etdi. İndi də Molla Vərəqə o yaxşılığı unutmayıb.

Əli haqqında belə xatirələr çoxdur. Lakin bu kitaba yazmaq imkanım yoxdur.

Əli Əsgərovun mənalı həyat yolu qısa olsa da belə zəngin məlumatlarla doludur. Əli Əsgərov haqqında yazmaq onun ruhunun şad olunması üçün əsasdır. Çünki belə şəxsiyyətlər az-az həyata bəxş olunur. Onların həyat fəaliyyəti isə gələcək nəslə örnək olur. Bəlkə də Əli Əsgərovun öz mənalı həyat yolundan həyata keçirdiklərindən təkcə Qızılağaclılar yox, bütün Azərbaycan respublikasının vətəndaşları faydalanıblar. Ona görə bu dediklərimizi əsas götürməklə mən onun adının xatirələrdə yaşaması üçün bu yazını qələmə aldım.

Dahi Nizami demişkən:

***Dünyada böyüklük tapmaq istəsən***
***Al ələ qələmi, yaz böyüklərdən.***

Kitabda haqqında yazılan böyük şəxsiyyətlərə Allahın mərhəməti, inayəti olduğu üçün onlar ucalmışlar. Bu kitabın da oxucuya böyük təsir bağışlayacağına əminəm. Əminəm ona görə ki, haqq sevər insanlar özləri haqq rizasına bu şəxsiyyətləri yad etməklə onların ruhların şad edərlər. Bu yolda addım atan hər bir oxucuya Allah kömək olsun. Oxuyub dahi şəxsiyyətləri yada salsın və salamlaşsın.

Əli Əsgərov iki qız, iki oğul atası idi. Qızı Südabə elmlər namizədi, Tamilla isə Tofiq İsmayılov adına (intellekt) məktəb liseyində 28 ildir ki, Azərbaycan dili və ədəbiyyatı fənnini tədris edir.

Tamillanın iki qızı var. Səbinə anası ilə birlikdə eyni məktəbdə müəllim işləyir. O biri qızı İmayra Tağıyeva Azərbaycan Respublikası Ekologiya və Təbii Sərvətlər Nazirliyinin Milli Hidrometrologiya Departamentinin hidrometrologiya proqnozları bürosunun direktorudur. Əli Əsgərovun oğlanlarından biri Qeys vəfat etmiş, Elçin isə Bakı şəhərində yaşayır.





## İBRAHİM MƏMMƏD OĞLU SƏLİMOV

*Öz qədrini bilən hər bir*
*kimsəyə, ölüm qorxulu deyil*



Cəmi 68 il yaşayan adı-sanı respublikanın bir çox bölgələrində hörmət və ehtiramla çəkilən, zəmanəsinin ən yüksək vəzifə postlarına və dövlət mükafatına layiq görülən mərd, mübariz, qurucu bir insan olan İ.Səlimov dünyaya göz yumdu.

İ.Səlimov 1911-ci ildə Masallı rayonunun Qızılağac kəndində anadan olub. Kənd məktəbini bitirdikdən sonra kənd sovetinin katibi vəzifəsinə irəli çəkilib. Yüksək iş qabiliyyəti və səriştəsi nəzərə alınaraq o, az sonra Masallı rayon milis şöbəsinə pasportis vəzifəsinə irəli çəkilir. Bununla da İ.Səlimov vəzifə pilləsi ilə yüksəlişə qədəm qoyur. Az sonra həmin şöbədə pasport masa rəisi vəzifəsinə keçirilir.

Daha çox operativ işçi kimi diqqəti cəlb edən İ.Səlimov diqqətdən yayınmır. Respublikanın bir neçə rayonlarında təhlükəsizlik orqanlarında rəhbər işlərdə çalışır. 1939-cu ildə Ümumittifaq qiyabi Hüquq İnstitutuna daxil olur. Böyük Vətən müharibəsi başlanır. O təhsilini yarımçıq qoyur. Xalq da-

xili işlər komissarlığında onu qaynar nöqtəyə Cəlilabad rayon şöbəsinə rəis göndərirlər. İ.Səlimov burada həyatını dəfələrlə təhlükə qarşısında qoyur. İran ərazisində məskən salmış qaçaqçılara qarşı barışmaz mübarizə aparır.

Həyatına risk etmək İbrahim Səlimov üçün adi bir iş idi:

İki ildən sonra isə Qazı Məmməd rayon İcra Komitəsinin sədri, sonra Partiya Komitəsinin birinci katibi vəzifəsinə irəli çəkilir.



İ.Səlimov Masallı pasport masa rəisi işləyərkən (Şəkil 1939-cu ildə "Revolyusonnıy postda" qəzetindəndir)

Azərbaycan respublikasının Ali sovetinə deputat seçilir. Qazı Məmməddə böyük quruculuq işləri aparır. 1952-ci ildə Ali təhsil almaq üçün Ali partiya məktəbinə göndərilir. Burada da ona böyük etimad göstərirlər. Ali Partiya məktəbinin partiya komitəsinin katibi seçilir.

Partiya məktəbini bitirdikdən sonra 1956-cı ildə könüllü olaraq Qızılağac kəndinə kolxoz sədri vəzifəsinə göndərilir. İki il kolxoz sədri işlədikdən sonra 1958-ci ildə Masallı rayon İcraiyyə Komitəsinin sədri vəzifəsinə irəli çəkilir. İ.Səlimovun nüfuzu rayonda sürətlə artır. O rayonda baş verən neqativ hallara qarşı çıxır, dövlət əmlakını mənimsəyənlərə havadarlıq edən məmurlarla üzbəüz qalır. Nöqsanlara qarşı açıq mübarizə edən bu insan tezliklə siyasi terrora məruz qalır. Masallı rayon





İcraiyyə Komitəsi vəzifəsindən uzaqlaşdırılır. Yenidən kolxoz sədri təyin edilir. Siyasi terror və təqiblər səngimir. Kolxoza rayonun yoxlama komissiyası göndərilir. Yoxlamalar, çək-çevirlər başlayır. Qorxu və xof yaratmaq məqsədi başlayan bu yoxlamalar mübariz insan olan İ.Səlimovun iradəsini qıra bilmir.

O, yuxarı partiya və dövlət orqanlarına müraciət edir... Uzun mübarizələrdən sonra ona qarşı mübarizələrə son qoyulur...

İ.Səlimov bütün həyatını doğma kəndinin inkişafına həsr edir. Rayonun ən geridə qalan kolxozu tezliklə qabaqcıl kolxozlar cərgəsinə qaldırır. 20 il kolxoz sədri və sovxoz direktoru işləyir. 1979-cu ildə dekabrın 6-da vəfat etmişdir.

## ABI HÜSEYN OĞLU RƏSULOV

***Zənginliyin ən ucası istəkləri fəth etməkdir***



Ömrünün fəlsəfəsini ilk vaxtlardan düşünməyəndə, niyə və nə üçün yaşayırsan sualına cavab tapmayanda ömrü mənasız, məqsədsiz başa vururuq.

İlk gənclikdən bizə öyüd verən, düzgün yol göstərən olmayanda sonradan bu qayda ilə korkoranə həyatla vidalaşırıq.

Bundan fərqli olaraq bəzi qeyri-adi insanların nümunəvi ömrü, gənc nəslin həmişə yadında qalır, onlara örnək olur. Abı Hüseyn oğlu Rəsulov 1923-cü ildə Masallı rayonunun Qızılağac kəndində kəndli ailəsində anadan olmuşdur.

Kiçik, yeniyetmə yaşlarından o, Qızılağac kənd orta məktəbini bitirmiş, fəal və zirək bir fəhlə kimi əmək fəaliyyətinə başlamışdır.Müharibənin əvvəlində ön cəbhədə alman faşistlərinə qarşı vuruşmuşdur.

1945-ci ildə gənc və fəal bir vətəndaş kimi Moskva Balıq Sənaye İnstitutuna oxumağa göndərilmişdir. İnstitutu uğurla bitirdikdən sonra A.H.Rəsulov Lənkəran rayonunun N.Nərimanov adına balıq kombinatında bir sıra məsul vəzifələrdə işləmişdir.





Balıqçılıq sənətini gözəl bilən A.H.Rəsulov bu vaxt kombinatda direktor vəzifəsinə irəli çəkilir. 1953-cü ildə "MRS kolxozu"nun sədri təyin edilir. (İndiki Orta Kasa qəsəbəsində) 1957-ci ildə A.H.Rəsulov Port-İliç şəhər balıqçılıq istehlak cəmiyyətinin sədri təyin edilmiş və 1960-cı ilədək bu vəzifədə çalışmışdır.

1960-1963-cü illərdə A.H.Rəsulov Bakı şəhər ali partiya məktəbində oxumuş, oranı bitirdikdən sonra göndərişlə Lənkəran rayon partiya komitəsinin ümumi şöbənin müdiri vəzifəsində işləmişdir. A.H.Rəsulov 1967-ci ildə Lənkəran balıq konserv zavodunda sonra isə tərəvəz konserv zavoduna direktor işləmişdir.

1970-1983-cü illərdə Nərimanabad qəsəbə sovetinin sədri vəzifəsində işləmişdir və buradan da təqaüdlə getmişdir. 1994-cü ildə vəfat etmişdir.

O, işlədiyi bütün sahələrdə əməksevərliyi, qayğıkeşliyi, prinsipiallığı, həssaslığı ilə fərqlənmişdir.

Öz fəaliyyətində təşkilatçılıq qabliyyəti və yüksək iş keyfiyyətlərinə malik olduğunu göstərmişdir. İşgüzarlığı özünə və yoldaşlarına qarşı tələbkarlığı ilə nümunə olmuşdur.

A.H.Rəsulov həm də fəal ictimaiyyətçi idi. Onun xidmətləri "Şərəf Nişanı" ordeni və medallarla qeyd olunmuşdur.

Görkəmli ziyalı azəri xalqının sadiq oğlu sadə və təvazökar bir insan olan A.H.Rəsulovun əziz xatirəsi iş yoldaşları və onun tanıyanların qəlbində əbədi yaşayacaqdır. Onun mənalı həyat yolu, təşkilatçılıq, natiqlik istedadı və xalqa həsr etdiyi parlaq fəal iqtisadi və siyasi fəallığı gənc nəslə örnəkdir. Beş övladı var.

# ABIŞ DADAŞ OĞLU ABBASOV

***İnsan yaxşılığı ilə yad edilər***



Onun da indi xatırlanmasına səbəb olan öz doğma kəndinə və kəndçilərinə olan məhəbbəti idi. Xalqın işini öz işi bilmək, xalqının inkişafına nail olmaq gənc Abışın ən böyük arzusu idi. O, istək idi ki, onun işlədiyi bütün sahələrdə hörmətlə yad olunmasına səbəb olmuşdur.

O, 1906-cı ildə Qızılağac kəndində anadan olmuşdur. İlk təhsilini Qızılağacdakı ibtidai məktəbdə almış, sonra isə Lənkərandakı gimnaziyaya daxil olmuş, oranı bitirərək dövrünün savadlı şəxslərindən biri olmuşdur. O, ilk əmək fəaliyyətinə Qızılağac kənd yerli zəhmətkeş deputatlar sovetində başlamış və işlədiyi müddətdə rayon rəhbərliyi tərəfindən onun xidmətləri layiqincə qiymətləndirilmişdir.

Bacarıqlı, təşkilatçı işçi kimi onu 1946-cı ildə Masallı rayonundakı çörək zavodunun direktoru təyin edirlər. Abış Abbasovun işə olan məsuliyyəti, münasibəti bu ağır dövrdə öz işinin nöqsansız icra olunmasına böyük təsir göstərirdi. Buradan onu daha məsul bir vəzifəyə - Cənub zonası üzrə Cəlilabad, Masallı, Yardımlı, Lerik, Lənkəran meşə təsərrüfatları idarəsinin rəisi vəzifəsinə təyin etdilər. Abış Abbasov işlədiyi müddətdə meşə təsərrüfatını yenidən qurur və ondan gəlir mənbəyi kimi istifadə edənlərə qarşı gərgin mübarizə aparır.





Onun təklifi ilə cənub zonasında yeni meşə zolaqları salınır. Abış Abbasovun rəhbərlik etdiyi hər hansı bir təsərrüfatda o, özünü bacarıqlı bir rəhbər kimi göstərirdi.

Müharibədən sonrakı dövrdə bütün sahələrdə gerilik hökm sürürdü. Belə bir vaxtda 25 sentyabr 1950-ci ildə onu öz doğma kəndi Qızılağaca - Kalinin adına kolxoza sədr təyin edirlər. Onun səyi və təşəbbüsü kənd ictimaiyyətinə böyük inam bəxş etdi. Kənd sakinləri kolxozçularla birlikdə gerilikdən çıxmaq üçün əzmkarlıq göstərdilər.

Kənd təsərrüfatı sahələrinin alaqdan təmizlənməsində əl-ələ verdilər. Əldə edilən məhsuldan hər bir kolxoz üzvünə 8 kq taxıl məhsulu əmək gününə bölündü. Kənd camaatının güzəranı yaxşılaşmağa doğru gedirdi. Kəndə məxsus torpaq sahələrinə hər il Viləşin suyu axıb əkinləri məhv edirdi. Abış Abbasov belə bir təhlükənin qarşısını almaqdan ötəri çox vəsait tələb edən bənd vurma işi görməyi məsləhət gördü. Lakin buna kolxozun iqtisadi imkanı yox idi. Odur ki, o, respublika təşkilatları qarşısında məsələ qaldırdı. Həmyerlimiz Əli Əsgərovun köməkliyi ilə Viləş çayının qazılıb bənd vurma işinin görülməsinə nail olundu. İş tamamlandı, hər il labüd olan təhlükə aradan qaldırıldı. Kalinin adına kolxozun sədri olduğu müddətdə özünü bacarıqlı təsərrüfat başçısı kimi gös-

tərən Abış Abbasovun işini indi də xatırlayanlar çoxdur. O, kolxozçulara mənəvi dayaq duran bir şəxs idi. İmkansızlar üçün ev tikmiş, yol çəkmişdir. Kalinin adına kolxoza sədrlik edən Abış Abbasovu 1956-cı ildə Qızılağac dövlət qoruğuna şöbə müdiri təyin edirlər.

Qızılağac dövlət qoruğunda da bir sıra yadda qalan işlər gördürdü. Onun bu sahədə gördüyü iş qoruqdakı quşların qışlaması üçün əlverişli şərait yaratmışdır.

O, böyük ailə başçısı idi. Dörd oğlu və yeddi qız övladı var. Böyük oğlu Nasif Abbasov təcrübəli avtomobil mühəndis-mexaniki, Ədalət isə Dövlət Təhlükəsizlik Komitəsində məsul vəzifədə işləmişdir, ali təhsillidir.

Oğlu Həsən avtomobilçidir. Sənətinin bilicisidir.





## ŞAKİR ZƏKƏRİYYƏ OĞLU ABIŞOV

1950-ci il mayın 20-də anadan olmuşdur. 1967-ci ildə Qızılağac orta məktəbini bitirmişdir. 1968-1970-ci illərdə həqiqi hərbi xidmətdə olmuşdur. 1970-ci ildən əmək fəaliyyətinə başlamış, Qızılağacda Kalinin adına sovxozda fəhlə işləmiş. Sonradan Sumqayıt şəhərinə getmiş.

1972-ci ildən Sumqayıtda kimya zavodunda fəhlə, operator, sex və zavod komsomol təşkilatının katibi, sonradan Sumqayıt Şəhər Komsomol Komitəsinin katibi, şəhər partiya komitəsində təlimatçı, şöbə müdiri, Sumqayıt şəhər XDS icrayə komitəsinin sədri vəzifələrində işləmişdir. 1993-2000-ci illəri Sumqayıt şəhər icra başçısı olmuşdur.

S.M.Kirov adına ADU-nun filologiya fakültəsini, Ali partiya məktəbini bitirmişdir. Gənc yaşlarında bədii yaradıcılıqla məşğul olmuş, şeir və hekayələri rayon qəzetində dərc olunmuşdur.

## MƏŞHƏDİ YUSİF HACI-MƏCİD OĞLU ƏLİYEV

***Allah elm yolunu seçən insana behişt yolunu açır***



Öz tarixi keçmişi ilə şöhrət tapmış Qızılağac kəndi XX əsrə keçid illərində təhsil sahəsində də məşhurlaşan yaşayış məntəqəsi idi. Belə bir əlamətdar tarix ərəfəsində 1899-cu ildə Hacı Məcidin evinə bir xoşbəxtlik nəsib oldu. Allah Hacı-Məcid ailəsinə bir oğlan uşağı bəxş etdi. Ata-ana öz körpələrinə ad qoymaq üçün qərara gəldilər. Qurani-Kərimdə olan "Yusif" surəsindəki adı qoyaq. Çünki Yusif peyğəmbər hüsnü-camalı kimi özünə xas gözəlliklərə malik olan Allah bəndəsidir. Bütün üstünlükləri Yusifə Allah əta etmişdir. Oğlumuza da inşallah Allah üstünlük nəsib edər. Ad qoyuldu Yusif. Hacı-Məcid hələ kiçik yaş həddində olan Yusifi gələcəyin xeyirxah insanı olmasını arzulayırdı. Onu öz təlim-tərbiyəsi altında yetişdirməyə səy etdi. XX əsrin birinci onilliyində Hacı-Məcid oğlunu təhsil almaq üçün mədrəsəyə qoydu. Yusif az vaxt içərisində mədrəsədə islami biliklərə nail oldu. Oğlunun biliyinin dərs deyənlər tərəfindən təriflənməsini eşidən Hacı-Məcid dünyavi məktəbdə oxumaq üçün oğlunu Qızılağacda hələ 17 fevral 1896-cü ildə açılan məktəbin birinci sinfinə qoydu. Həmin məktəbdə təhsil alandan

sonra Yusifi Lənkərandakı 1 saylı gimnaziyaya apardı. Yusif biliyi ilə müəllimlərin diqqətini özünə cəlb etdi. Gimnaziyaya qəbul olundu. 1919-cu ildə həmin gimnaziyanı müvəffəqiyyətlə bitirdi. Bakı şəhərinə gedib təhsilini davam etdirməyi qarşısına məqsəd qoyan Yusif, hüquq ixtisasına yiyələndi 1928-ci ilədək məhkəmə orqanlarında müxtəlif vəzifələrdə işlədi. İşgüzarlığı, səriştəsi, biliyi onu təcrübəli hüquqşünas kimi dövrün hüquqçuları içərisində onu məşhurlaşdırdı. Bütün bunlara baxmayaraq Yusif ziyarətində olduğu 8-ci imamın mübarək kəlamlarının təsirini özündə dərk edib duyurdu. İnzibatçılıq onun xüsusiyyətlərinə xas olmayan əlamət idi. Həmişə narahatçılıq hissi keçirdən Məşhədi Yusif qərara gəldi, elə bir ixtisasa sahib olsun ki, orada imkansızlara öz köməkliyimi göstərsin. Nəhayət həkim olmağı qarşısına məqsəd qoydu. Çünki həmin dövrdə həkimliklə xalqın sağlamlığının keşiyində durmaq ən əsas vəzifələrdən biri idi. 1930-cu ildə Azərbaycan Dövlət Sənaye İnstitutunun tibb fakültəsinə daxil olaraq 1936-cı ildə oranı bitirdi, həkim ixtisası aldı. Məşhədi Yusif təyinatla həmin ildə Nuxa (indiki Şəki) şəhərindəki Vərəm əleyhinə Dispanserə baş həkim vəzifəsində işləmək üçün göndərildi. Sağlamlıq keşiyində durmağı özünə vətəndaşlıq borcu bilən həkim Məşədi Yusif az vaxt içərisində kollektivin dərin hörmətini qazandı. Ona müraciət edən xəstələrə mərhəmət, qayğı göstərdi. Şəki şəhər partiya komitəsinin, Respublika Səhiyyə Nazirliyinin həkim Məşhədi Yusifə göstərdiyi etimadla o Şəki şəhər Səhiyyə şöbəsinin müdiri təyin edildi. Böyük bir kollektivə rəhbərlikdə də həkim Məşhədi Yusif səy və bacarığını əsirgəməyib, səhiyyənin inkişafına böyük töhfələr bəxş etdi. Şəkidə işlədiyi 5 il müddətində həkim Məşhədi Yusif şəkililər üçün doğmalaşdı. Hamı onunla əsil xeyirxah insan kimi yaxınlıq edirdi.





Məşhədi Yusifin Azərbaycan səhiyyəsinin inkişafında böyük xidmətləri olmuşdur. Onun dərin biliyi, zəkası, axtarışları tibbi yeniliyin həyata keçməsinə böyük təsir göstərmişdir. Öz ixtisası üzrə apardığı tədqiqatlar nəticəsini göstərdi. 1956-cı ildə tibbi müalicə üsullarında etdiyi elmi yeniliklər səhiyyə sahəsinə tətbiq olunmaq üçün qəbul edildi. Məşəhədi Yusif Hacı Məcid oğlu tibb elmləri namizədi alimlik adına layiq görüldü. İşlədiyi illər ərzində (1949-1975-ci illər) Məşhədi Yusif Vərəm xəstəliyinin yeni müalicə yollarını tapdı. Vərəm əleyhinə dispanserin mütəxəssislərinə əsl atalıq qayğısı göstərdi. Dispanserin keçmiş SSRİ İttifaqında şöhrətlənməsinə nail oldu. Deməк olar ki, Respublika Vərəm əleyhinə Dispanserin yaradıcı banisidir. 1975-ci ildə artıq Respublika həkimləri təkmilləşdirmə institutunun vərəm əleyhinə kafedrasına dosent vəzifəsinə irəli çəkilən Məşhədi Yusif öz bilik və bacarığını öyrətməkdə həvəslə çalışırdı. Məşhədi Yusif 1980-ci ilə kimi həmin kafedranın dosenti vəzifəsində çalışmış neçə-neçə gənc kadrların biliyinin artırılmasında səy göstərmişdir. Onun dərs dediyi gənc kadrların sonradan respublikada öz ixtisasları üzrə təcrübəli həkimlər sırasında adları çəkildi. Onlara böyük qayğı göstərdiyi üçün indi də Məşhədi Yusifə minnətdarlıq edirlər. Qabaqcıl səhiyyə işçisi olan təcrübəli alimin əməyini dövlət qiymətləndirmişdirr. O, SSRİ Səhiyyə nazirliyinin fəxri fərmanı və SSRİ Səhiyyə Nazirliyinin "Əlaçı" döş nişanı ilə təltif edilmişdir.

Görkəmli alim, böyük şəxsiyyət, xeyirxah insan olan Məşhədi Yusif, həm də mehriban ailə başçısı idi. Onun 3 oğ-

lu iki qızı olub. 1980-ci ildə Məşhədi Yusifi tanıyanlar sarsıdıcı xəbər eşitdilər. Xəbəri eşidənlər bu şəxsə öz insanlıq borcunu yerinə yetirmək niyyəti ilə Bakı şəhərinə gəlib, dünyasın dəyişən gözəl insanı, alicənab şəxsi, xeyirxahlığı ilə də məşhurlaşan alimi son mənzilə yola saldılar... İnsan ömrü üçün bu son mənzil olsa da, əməlləri üçün son yox başlanğıcdır. Çünki belə insanlar cismən ölsələr də mənən qəlblərdə əbədi yaşayırlar. Onları qəlblərdə yaşadan ancaq həmin adamların insanlıq keyfiyyəti və insana olan məhəbbətidir.

Bəli, bu günkü gündə biz Qızılağaclılar üçün örnək olan Məşhədi Yusif məktəbindən faydalanaraq ibrət götürmək ən başlıca amildir.





## MUSA MİRMƏMMƏD OĞLU ABDULLAYEV

***Ey Allah sən bilirsən ki, (fəsada qarşı mübarizə və qiyamımız) səltənət üçün və dünya malı yığmaq üçün deyildir. Bizim qiyamımız sənin dininin həqiqi əlamətlərini göstərmək bəndələrin əmin-amanlıqda olmasına kömək etməkdir.***



*Musa Abdullayev həyat yoldaşı Şəfiqə və qızı Sona*

Musa Mirməmməd oğlu Abdullayev 1927-ci ildə soyuq, yağmurlu bir gecədə dünyaya gəlib. Onun anadan olduğu gecə də göydə ildırım çaxması, yerdə isə yağan yağışın təsirindən gur suların axması çoxlarını qorxuya salmışdı. Lakin bu

gecədə Mirməmməd də çox həyəcanlı və təlaş içərisində idi. Həyat yoldaşı Sonanın vəziyyəti üçün narahat idi. Gecələndiyi əmisi evinə ona şad xəbər gətirdilər. Ağa gözlərin aydın, oğlun oldu. Mir Məhəmməd ilk övladının dünyaya gəlməsindən şad oldu. Allaha şükür etdi. Uşağa Musa adı qoyuldu. Musa sözünün mənası isə su adamı, sudan tapılan olduğunu bilirdi Mir Məmməd. Odur ki, yağmurlu gecədə dünyaya bəxş edilən övladına o adı qoydu. Su aydınlıqdır deyiblər... Mir Məmməd Qızılağacın ilk ziyalılarından biri idi. Respublika Maliyyə Nazirliyinin tanınmış mütəxəssisi idi. Masallı Maliyyə şöbəsi vəzifəsindən onu Bakı şəhərində işləməyə dəvət etdilər. O gündən kiçik yaşlı Musa Bakı həyatını yaşamalı oldu...

Musa kiçik yaşlarında ikən atası Mir Məmmədin elmə olan marağından faydalanmışdır. Orta məktəbi bitirəndə artıq Musa gələcəyə böyük ümidlə baxırdı. Onun bu baxışları səmərəsiz olmadı. 1944-cü ildə Az.DTİ-na daxil oldu. İnstitutda fəal və əlaçı tələbə olan Musanın mövqeyini dərs dediyi müəllim və tələbə kollektivi artıq dərk etmişdilər. O, Azərbaycanın azərbaycanlılara məxsus olması barədə söhbətlər edir, dilimizin və dinimizin qorunması uğrunda çıxışlar edirdi. Məhz Musanın bu mövqeyinin nəticəsidir ki, o 1944-cü ildə Gülhüseyn Abdullayevin və İsmixan Rəhimovun yaratdıqları təşkilata üzv oldu. Bu o zaman bərk hay-kuyə səbəb olan antisovet "İldırım" təşkilatı idi.

Musa bu təşkilatın fəal üzvü oldu. Təşkilatın cəmi 8 üzvü var idi. Onun biri də Musa Abdullayev idi. Bu təşkilatın məqsədi bütün dünya mədəniyyətinin ən yaxşı nailiyyətlərinə öz ana dilimizdə nail olmaq idi. Təşkilatın yığıncağı üzv olan





şəxslərin evində keçirilirdi. 1948-ci il noyabrın 5-də Az.DTİ-nin tələbəsi Abdullayev Musa Mirməmməd oğlunun həbs edilməsi haqqında qərar çıxarıldı və noyabrın 11-də o, 402 nömrəli orderə əsasən həbs edildi. Abdullayev Musa izahat verdi ki: o, antisovet təşkilatına Rəhimov İsmixan tərəfindən cəlb edilib. Təşkilatın yığıncıqları Zeynalovun, Ələsgərovun və mənim evimdə keçirilirdi. Təşkilata mən 1944-cü ildə daxil oldum.

1948-ci il noyabrın 25-də Abdullayev Musaya izah olundu ki, o, uzun müddət antisovet millətçi fəaliyyətinə görə Azərbaycan SSR CM 72 m, 2 h və 73 m. ilə ittiham olunur. 1949-cu il fevralın 4-də o, əlavə olaraq, CM 21-64 maddəsi ilə ittiham edildi.

Məhkəmə iclası 1949-cu il martın 21 və 22-də keçirildi. Abdullayev Musaya 10 il azadlıqdan məhrum etməklə, 5 il seçki hüquqlarını almaq və əmlakını 100 faiz müsadirə etmək hökmü oxundu.

Müqəssirə son söz veriləndə Musa Abdullayev yüngül cəza təyin edilməsini xahiş etdi.

1949-cu il mart ayının 21-22-də Azərb. SSR Ali Məhkəməsinin Cinayət İşləri üzrə məhkəmə kollegiyası bağlı məhkəmə iclasında işə baxaraq... müəyyən etdi:

Abdullayev Musa antisovet, üsyançı təşkilatın aktiv üzvlərindən olmaqla İsmixan Rəhimov tərəfindən həmin təşkilata cəlb edilərək, gizli yığıncaqlarda iştirak etmiş və bir dəfə yığıncağın öz evində çağırılmasına icazə vermiş, təşkilata sadiq qalacağına and içmiş, üç gənci antisovet təşkilata cəlb etməyə səy etmişdir.

İsmixan Rəhimovun, Abdullayev Gülhüseyinin və Zeyna-

lov Hacının, Kamil Əliyevin, Vahidovun, Əsgərovun və Abdullayev Musanın məqsədləri Sovet Azərbaycanını SSRİ-dən ayırmaq və Azərbaycanda "Burjua milli respublikası" qurmaq olmuşdur.

Beləliklə, məhkumlar, o cümlədən Musa Abdullayev ən uzaq və sərt iqlimli dustaq düşərgələrində öz günlərini saymağa başladı.

1953-cü ildə martın 27-də SSRİ Ali Sovetinin "Amnistiya haqqında" fərmanı dərc olundu. 1955-ci ilin əvvəllərində məhkumların qohumları yuxarı təşkilatlara şikayət ərizələri yazdılar. 1955-ci il fevralın 14-də Azərbaycan SSR-in xüsusi işlər üzrə prokurorununu müavini belə bir qərar çıxarmışdı: "İstintaq və məhkəmə materiallarına əsasən, hesab edirəm ki, müttəhimlərin təqsiri sübut olunub və onlar düzgün məhkum olunmuşlar. Lakin həmin iş üzrə məhkum olanlar "İldırım" adlı antisovet millətçi təşkilatını təsis edib heç bir praktiki iş aparmayıblar, öz antisovet fəaliyyətləri üçün heç bir proqram tərtib etməyiblər və bunların fəaliyyəti söz-söhbətdən başqa heç bir şey olmayıb, məhkumların gəncliyini nəzərə alaraq hesab edirəm:

1. Rəhimovun, Abdullayev Gülhüseynin və Zeynalovun cəzası 10 il müddətinə endirilsin.

2. Əliyevin, Vahidovun, Ələsgərovun, Abdullayev Musanın və Rzayevin cəzaları beş il müddətinə endirilsin və 1953-cü il 27 mart tarixli "Amnistiya haqqında" fərmana əsasən, bunlar həbsdən azad edilsinlər, bunların seçki hüququ bərpa edilsin və məhkum adları üzərlərindən götürülsün.

1955-ci il aprelin 9-da "amnistiya haqqında" fərmanə əsasən, onlar həbs yerlərindən azad edilib, üzərilərindən məh-





kum adı götürüldü. 1955-ci ilin may ayında bütün məhkumlar həbs yerlərindən azad olundular.

1956-cı ilin iyulun 22-də SSRİ Ali Məhkəməsinin cinayət işləri üzrə məhkəmə kollegiyası Rəhimov İsmixanın, Abdullayev Gülhüseynin, Zeynalov Hacının, Vahidov Aydının, Ələsgərov Azərin, Abdullayev Musanın, Əliyev Kamalın və Rzayev Kamilin işlərində cinayət tərkibi olmadığı üçün Azərbaycan SSR Ali Məhkəməsinin 1949-cu il 21-22 mart tarixli hökmünü və həmin Ali Məhkəmənin 1955-ci il 9 aprel tarixli qərarını da ləğv etdi və onlar haqqında cinayət işi xətm olundu.

1956-cı ilin iyul və avqust aylarında "İldırım" adlı "antisovet millətçi gənclər təşkilatının üzvləri" bütün hüquqlarının bərpa edilməsi haqqında arayış aldılar.

Nəhayət, günəşin qarşısını kəsən qara buludlar çəkildi, günəş öz nuru ilə ətrafa işıq saçmağa başladı.

Günəş nuru kimi parlaq duyğu və düşüncə sahibi olan Musa Abdullayev də elmi fəaliyyətini davam etdirmək əzmi ilə səy göstərdi. 1944-cü ildə Tibb İnstitutuna daxil olan Musa 1958-ci ildə oranı əla qiymətlərlə bitirdi.

Musa Abdullayev çox böyük çətinliklərlə rastlaşsa belə Tibb İnstitutuna, əvvəl işlədiyi elm mərkəzinə işə düzəldi. Böyük səy göstərdi, elmi axtarışlarından xalqın faydalanmasına tələsdi. Az vaxt içərisində, təxminən 10 il ərzində tibb elmlər namizədi və doktorluq dissertasiyasını müdafiə edir, Azərbaycan ET Hemotologiya və Qanköçürmə institutunda görkəmli alim Fuad Əfəndiyevlə birgə çalışmağa başlayır. Elmi axtarışları davam etdirən Musa Abdullayevi ADTİ-də elmi katib vəzifəsinə irəli çəkirlər. Elmlər doktoru Musa Abdulla-

yevin institutdakı elmi kadrların yetişməsində böyük xidmətlərini görən rəhbərlik onu 1970-ci ildə kafedra müdiri vəzifəsinə təyin edirlər. Burada o öz səy və bacarığı, biliyi nəticəsində böyük bir kollektivin hörmət və nüfuzunu qazanır.

Musa Abdullayev böyük əhəmiyyət kəsb edən yazdığı elmi əsərləri ilə şöhrətləndi. Artıq onun elmi axtarışları dünya səhiyyə işçilərinin köməyinə gəldi. Onun yazmış olduğu "İngiliscə-Azərbaycanca tibbi lüğət" kitabı səhiyyə işçilərinin stolüstü kitabı olmuşdur. Professor Musa Abdullayev çoxlu sayda monoqrafiyanın həmçinin, Tibb Universitetinin tələbələrinin ən dəyərli dərs vəsaiti olan "Hərbi Səhra terapeyası haqda qeydlər" kitabı ilə tələbələr üçün böyük imkan yaratdı.

Musa Abdullayev 1979-cu ilə kimi Tibb universitetində kafedra müdiri vəzifəsində işlədi. Həmin ildə dünyasın dəyişdi. Onun xidmətləri dövlət tərəfindən yüksək qiymətləndirilmişdir. Azərbaycan səhiyyəsinin yüksək zirvəsinin fatehi olan Musa Abdullayev böyük insan, qayğıkeş ailə başçısı idi. Onun oğlu Oqtay və Fərman ata irsinə sədaqətli olaraq onun yolunu davam etdirirlər.

Bəli, dahi şairimiz Səməd vurğun demişkən:

***"Günəşi örtsədə qara buludlar***
***Onun günəş kimi bir qüdrəti var."***

Xalqın azadlığı uğrunda mübarizəyə qalxan Musa Abdullayevə Allah kömək oldu və o, dünya şöhrətli alim kimi tanındı. Lakin onun fəaliyyət göstərməsinə düşmən kəsilən qüvvələr isə unuduldu. Musa Abdullayevin ziyalı atası Mir Məmməd Abdullayev də ilk maliyyə işçilərindən biri olub. O,





Masallı rayon Maliyyə Şöbəsinin müdiri olmuşdur, sonradan da Şamaxı və Bakı şəhərlərində Nərimanov rayon Maliyyə Şöbəsinin müdiri və məhkumların əfv komissiyasının üzvü olub.

Mir Məmməd Abdullayevin xidmətləri təqdirəlayiq şəkildə qiymətləndirilmişdir.

Mir Məmmədin iş təcrübəsi maliyyə işçiləri üçün böyük məktəb olmuşdur... Oğlu Musa da, dünya şöhrətli alimlər cərgəsində öz yerini tutdu.

Musa Abdullayevi indi də Tibb Universitetində böyük hörmətlə yad edirlər.

## YUNİS MƏŞƏDİ-YUSİF OĞLU ƏLİYEV

*Elimindən fayda gələn alim,*
*min abiddən üstündür.*



Ata yolunu davam etdirmək, atanın adına layiq övlad olmaq tək-tək adamlara məxsus əlamətdir. Su öz keyfiyyətini süzüb keçdiyi torpaqdan götürdüyü kimi, insan da, yaxşı və pis cəhətləri doğulduğu mühitdən götürür.

Yünis atası Məşədi Yusifin xüsusiyyətlərini özündə qoruyub saxladığı üçün, hörməti və mövqeyi ucadır. Professor Yunis Əliyev sözün əsil mənasında Qızılağaclı ziyalılardan biri olmasına baxmayaraq respublikada tanınan görkəmli alimlərdən biridir.

Əliyev Yunis Məşədi-Yusif oğlu 1928-ci ildə Masallı rayonunun Qızılağac kəndində anadan olmuşdur.

1946-cı ildə Masallı rayonunun 1 N-li orta məktəbini əla qiymətlərlə bitirmişdir. Həmin ildə Azərbaycan Tibb Universitetinin "Müalicə-Profilaktika" fakültəsinə daxil olmuş və 1952-ci ildə əla qiymətlərlə oranı bitirmişdir.

Səhiyyə Nazirliyinin əmri ilə Dəvəçi raonunun Mərkəzi Xəstəxanasının Cərrahi şöbəsinə müdir vəzifəsinə təyin edil-





mişdir. 1957-ciilədək həmin rayonda Xəstəxananın baş həkimi işləmişdir. 1958-ci ildə Respublika Həkimləri Təkmilləşdirmə İnstitutunun Cərrahiyə kafedrasına həkim-cərrah-ordinator qəbul edilmişdir və 1960-cı ildə oranı bitirmişdir. Sonra hərbi xidmətə çağırılmışdır. 1965-ci ilə kimi Bakı şəhər qospitalında həkim-cərrah vəzifəsində işləmişdir və 1965-ci ildə tibbi xidməti mayor rütbəsi ilə ehtiyata buraxılmışdır. Həmin ildə Respublika Rentgenologiya-Radiologiya və Onkologiya İnstitutuna aspiranturaya daxil olmuşdur və 1968-ci ildə tibb elmləri namizədliyini müdafiə etmişdir. Həmin ildə Respublika Onkologiya Mərkəzinə baş elmi əməkdaş-dosent seçilmiş və 2005-ci ilə kimi Ümumi Onkologiya şöbəsində baş elmi əməkdaş -həkim cərrah işləmişdir. Bu müddətdə iki kitabı və 96 elmi məqaləsi respublika və xarici ölklərin jurnallarında çap edilmişdir.

1980-ci ildən 2005-ci il dekabr ayının 24-nə kimi həmin İnstitut Həmkarlar İttifaqının sədr olmuşdur.

1990-cı ildən 1995-ci ilədək Səhiyyə Nazirliyinin Baş Onkoloqu vəzifəsində işləmişdir.

1970-ci ildə SSRİ Səhiyyə Nazirliyinin "Əlaçı döş" nişanı ilə Fəxri Fərmanı və pul mükafatı ilə təltif olunmuşdur. Yunis Əliyev haqqında danışılan söhbətlərdən onun hansı xüsusiyyətlərə malik olduğunu dərk etmək olar. Üç övladı, dörd nəvəsi var. Hər üçü ata yolunun davamçısı, elmlər namizədidir.

Xeyirxax təvazökar, həmişə xoş əhval ruhiyyəsi olan Yunus neçə-neçə insanların sağlamlığı keşiyində durmuşdur. 2005-ci il dekabrın 24-də gözəl insan, böyük ziyalı Yunis Əliyev Bakı şəhərində vəfat etmişdir. Allah rəhmət eləsin.

## ÜZEYİR AĞAVERDİ OĞLU MƏMMƏDOV

***Atanın öz oğluna əvəssiz olaraq verdiyi, bağışladığı şeylərdən ən üstünü odur ki, onu gözəl tərbiyə etsin.***



Ziya-nur, işıqdır. Ziyalı ailəsində dünyaya gələn uşaqlar da o nurdan faydalanır, nurun qəlbə, cismə nüfuz etməsi böyük təsir bağışlayır. Dindar - ziyalı ata, hər gün ilahi zikirləri yuxuda olan övladlarının qulağına yetən Allah Əkbər sədası. Bu ailənin böyük oğlunun adı Üzeyirdi... Ataya, anaya, qohum-əqrəbaya uşaqlıqdan sevinc bəxş edən övlad. Ağaverdi müəllim öz övladları kimi başqalarının da övladlarının savadlı olmağını istəyirdi. Bu istək həmişə ata qəlbinə hakim olmuşdu. O, şöhrət ata, ana ömrünə xoşbəxtlik gətirdi. Hacı Üzeyir Ağaverdi oğlu Məmmədov 1933-cü ildə Masallı rayonunun Qızılağac kəndində anadan olmuşdur. O, 1949-cu ildə məktəbi bitirdikdən sonra həmin il N.Nərimanov adına Azərbaycan Tibb Universitetinin müalicə-profilaktika fakültəsinə daxil olub. 1955-ci ildə institutu bitirərək Tacikistan Respublikasının Ayni rayonunun Səhiyyə şöbəsinin müdiri, Leninabad şəhər xəstəxanasının baş həkimi kimi məsul vəzifələrdə işləmişdir. Ü.Məmmədov Leninabad vilayət Ali Sovetinin deputatı seçilmişdir. Nəhayət doğma yurda qayıtmış, 1959-60-cı illərdə Masallı şəhər xəstəxanasında cərrahiyə şöbəsinin müdiri, 1969-cu ildən 1972-ci ilədək Masallı rayon Səhiyyə şöbəsinin müdiri vəzifələrində çalışmışdır. Üzeyir Məmmədov 1965-ci ildə Aspiranturaya daxil olmuş və dissertasiya müdafiə edərək, tibb elmləri namizədi alimlik dərəcəsi adını almışdır.





Ü.Məmmədov hal-hazırda N.Nərimanov adına Azərbaycan Dövlət Tibb İnstitutunun Travmatologiya-ortopediya və Hərbi cərrahiyə kafedrasında dosent vəzifəsində çalışır. 2000-ci ildə Azərbaycan Respublikasının "Əməkdar həkimi" fəxri adına layiq görülüb.

Ü.Məmmədov 1999-cu ildə ölkəmizin prezidenti Heydər Əliyevin təşəbbüsü ilə Səudiyyə Ərəbistanı Kralının qonağı kimi müqəddəs Məkkə şəhərində Həcc ziyarətində olmuşdur.

Hacı Üzeyir iki mühüm əhəmiyyətli monoqrafiyanın, 60-dan çox elmi məqalənin müəllifidir. Hacı Üzeyir Məmmədovun oğlu Ceyhun Türkiyədə Azərbaycanın konsulu, oğlu Gündüz Xətai rayon İcra Hakiminin müavini, qızı Ülkər isə Tibb Universitetində müəllim işləyirlər.

Hacı Üzeyir həm də böyük xeyriyyəçidir.

O həcc ziyarətindən gətirdiyi Quranın surələri yazılan kasetlər cəmini və 9 ədəd Quran kitabını Qızılağac kənd Məscidinə vəqf etmişdir. O məscid divarına vurmaq üçün öz hesabına kitabə yazdırmışdır.

Xeyriyyəçi. öz ata irsinin davamçısı Alim Hacı Üzeyirə uzun ömür can sağlığı arzulayıram.

## CƏBRAYIL ƏLƏKBƏR OĞLU ƏLƏKBƏROV

***Öz biliyini başqalarına öyrət və başqalarının biliyini də öyrən. Beləliklə öz elimini möhkəmləndirib bilmədiyini öyrənmiş olarsan***



Məktəb illərindən elmə olan marağı onun gələcəkdə şöhrətlənməsinə səbəb olacaq bir əlamət idi. Cəbrayıl orta məktəbdə oxuyarkən daim dərs hazırlığına səy göstərməklə yanaşı dünya şöhrətli şəxslərin də haqqında yazılan ədəbiyyatlara tez-tez müraciət edirdi. Onun qəlbində elmə olan məhəbbəti orta məktəbdə dərs deyən müəllimləri yüksək qiymətləndirirdilər. Çünki Cəbrayıl sinif yoldaşlarından fərqli olaraq öz üzərində çox çalışırdı.

O çalışqanlığın öz faydasını verəcəyinə ümid bəsləyirdi.

1957-ci ildə Masallı rayonunun Qızılağac kəndində anadan olan Cəbrayıl sanki Məhəmməd peyğəmbərin (ə.s.) "Elmi öyrənin Çində də olmuş olsa" kəlamını əsas götürərək 1980-ci ildə Uzaq Şərqin Vladivostok şəhərindəki Tibb İnstitutuna qəbul olundu. Həmin institutu 1985-ci ildə müvəffəqiyyətlə bitirmişdir. O, elmə olan marağı nəticəsində Sverdlovsk şəhərindəki Ali kateqoriyalı cərrahiyyə üzrə internaturanı da bitirməyə nail olmuşdur. Artıq gənc həkim Cəbrayıl üçün qarşıda sərbəst seçim dururdu. O öz baxışları





və elmi təcrübəsi nəticəsində düzgün seçim etdi. Kurqan vilayətində yaşayan dünya şöhrətli həkim Q.A. İlizarova müraciət eylədi. Alim gənc cərrahın elmi potensialının müqabilində ona rəhbər olmağı özünə rəva bildi.

Cəbrayıl 1986-cı ildən Dünya şöhrətli alimlə ünsiyyət bağladı. İki il Kurqan şəhərində İlizarovun rəhbərliyi altında Travmatologiya və Ortopediya institutunda işlədi. Həmçinin 2 illik klinik ordinaturanı da müvəffəqiyyətlə bitirdi. 1991-ci ilin noyabr ayından Ə.Əliyev adına Azərbaycan Həkimləri Təkmilləşdirmə İnstitutunun travmotologiya klinikasında həkim-travmotoloq kimi fəaliyyətə başladı. Bacarıqlı həkim kimi tanınan Cəbrayıl neçə-neçə xəstələrə şəfa bəxş etdi. Elmin həddi yoxdur... Cəbrayıl da öz elmi işlərində əsil mütəxəssis olduğu ilə şöhrətləndi.

Üzvü olduğu ortopedik və travmotologiya cəmiyyətləri aşağıdakılardır:

1. SIKOT - Dünya ortopedi və travmotologiya cəmiyyəti üzvü
2. FROT - Avropa ortopedi və travmotologiya cəmiyyəti üzv
3. ASAMI - Dünya İlizarov sistemi uyğulama və gelişdirmə cəmiyyətinin üzvü
4. TOTBID - Türkiyə ortopedi və travmotologiya cəmiyyətinin fəxri üzvü
5. Rusiya ortopediya və travmotologiya cəmiyyəti üzvü.

Cərrahiyə əməliyyatı etdiyi ölkələr və verdiyi konfranslar:

1. Dünya ortopedi konqresi - SIKOT - Amsterdam, Hollandiya, 1996
2. Dünya konqresi - ASAMI - Hyuston, Texas AVD 1996, Amerika

3. Avropa ortopedi konqresi - EFORT - Barselona - İspaniya, 1997
4. Balkan ölkələri ortopedi konqresi - Saloniki - Yunanıstan, 1997
5. Ərəb ölkələri travmotologi konqresi - Doxa - Katar, 1998
6. Pakistan ortopedi konqresi - Karaçi, Lahor - Pakistan 1998
7. Dünya ortopedi konqresi - Sikot - Sidney - Melburn - Avstraliya, 1999
8. Ərəb ölkələri ortopedi konqresi - Cidde - Səudiyə Ərəbistanı, 1999-2001
9. Dünya İlizarov konqresi - Asami - Roma - İtaliya, 2001
10. Ərəb ölkələri ortopedi konqresi - Halep, Siriya, 2002
11. Ərəb ölkələri İlizarov toplantısı - Bahreyn, 2002
12. Dünya ortopedi konqresi - Sikot - S.Peterburq Russiya 2002
13. Asiya ölkələr ortopedi toplantısı - Cakkarta - İndoneziya, 2002

16 dekabr 1993-cü ildə onu Türkiyə Respublikasının İzmir şəhərində işləməyə dəvət etdilər. O gündən etibarən Azərbaycanlı gənc həkim qürbət diyarda sənətinin bilicisi kimi şöhrətləndi. Neçə-neçə ölkələrdə Azərbaycan bayrağı altında elmi mühazirələr oxudu. Neçə-neçə xəstələrə qızıl barmaqları ilə sağlamlıq bəxş etdi.

Elmi işini 2000-ci ildə Moskva şəhərində müdafiə elədi. Tibb elmlər namizədi adına layiq görüldü. İndi doktorluq müdafiəsinə hazırlaşır. Elə isə deyirəm: Dünya şöhrətli həkim, əllərin var olsun.





## FƏRMAN MUSA OĞLU ABDULLAYEV

***Zaman ikidir: Ya sənə yar olar, ya da sənin əleyhinə dönər. Yar olsa aldanıb qəflətə düşmə, əleyhinə olsa döz.***



O, Qızılağacla bağlı olmaqlığını özünün əməli işlərində doğruldur. Kollektivdə onun şəfalı əli, təmiz qəlbi, məntiqli söhbəti, alicənablığı, ona müraciət edən xəstələrə sağlam ruh bəxş edir. Onunla söhbətimdə Qızılağac inkişaf etməlidir, dedi. Bu inkişaf mərhələsinə təkan verənlərdən biri də özü oldu. 2005-ci ilin may ayında onun birbaşa qayğısı sahəsində Qızılağacda müasir tələblərə cavab verən yeni həkim məntəqəsi inşa edildi. Az vaxt içərisində istifadəyə verilən həkim məntəqəsi indi kənd camaatına xidmət göstərir. Bu işə Fərman Abdullayev özü marağ göstərirdi. Binanın müasir tələblərə cavab verməsi üçün çalışırdı. Professor tikintiyə baş çəkməyə gələndə ilk öncə ata-babalarının yaşadığı torpağa qədəm qoyanda, özündə rahatlıq hiss etdi. Babalarının uyuduğu qədim qəbrstanlığı ziyarət etdi. Ata yurduna baş çəkdi. İşləri tamama yetmək üzrə olan həkim məntəqəsinə gəldi. İşin sürətinə onun gəlişi böyük təsir göstərdi. İndi F.Abdullayevin adı Cənub zonasında sevilə-sevilə çəkilir. Onun elm zirvəsində daha yüksək nailiyyətlər qazanmağını arzu edirəm. Gənc

yaşlarında öz elmi nailiyyətləri ilə dünya səhiyyəsində öz dəst-xəttini yazan Fərman Abdullayevin bundan sonra da yeni-yeni naliyyətlər qazanacağına əminəm.

Fərman Abdullayev 1963-cü ildə Bakıda anadan olmuşdur. Orta məktəb illərində atası Musa Abdullayevin haqqında başqalarından eşitdikləri, onu atasının yolunu davam etdirməyə ilhamlandırdı. Fərman orta məktəbi əla qiymətlərlə başa vuraraq ADTİ-a daxid oldu. Universitetdə təhsil alarkən onun elmi fəaliyyətlə məşğul olmağa böyük marağı oldu. Tələbə elmi cəmiyyətinə üzv oldu. Öz elmi düşüncələri ilə fərqləndi, pedaqoji kollektivin hörmətini az vaxt içərisində qazanan Fərmana böyük ümidlər bəslədilər.

Fərman qardaşı Oqtay kimi ata irsinə, öz soy-kökünə bağlı olan ziyalı gəncdir. Bu gənc ömrünün 30-cu baharında professor adı ilə məşhurlaşdı.

Azərbaycan səhiyyəsinin beynəlxalq miqyasda şöhrət tapması üçün öz elmi araşdırmalarını davam etdirdi. F. Abdullayev insan sağlamlığı üçün qorxulu xəstəlik olan vərəmə qarşı yeni-yeni müalicə yolları və müayinə metodlarını səhiyyəyə bəxş etmişdir. F.Abdullayev gənc olmasına baxmayaraq, elm sahəsində, səhiyyənin inkişaf etdirilməsində yüksək nailiyyətlərə nail oldu. F.Abdullayev elmi rəhbərinin ən bacarıqlı, layiqli tələbələrindən biri idi. F.Abdullayevə böyük etimad göstərib onu respublika ET Ağ Ciyər Xəstəlikləri İnstitutunun direktoru vəzifəsinə təyin etdilər. Onun başçılıq etdiyi bu sağlamlıq ocağında 18 tibb elmləri doktoru və 19 tibb elmlər namizədi çalışır. F.Abdullayev bu böyük kolektivə rəhbərlik etməsinə baxmayaraq onun dünya ölkələrinin bu sahə üzrə





Akademiyaları ilə sıx əlaqələri var. O, Nyu-York Akademiyasının üzvüdür.

Onun başçılıq etdiyi bu səhiyyə mərkəzi respublika səhiyyəsində müstəsna rolu olan nüfuzlu tibb mərkəzidir. Alimlərin ağ ciyər xəstəliklərinə qarşı apardığı profilaktik mübarizəni gənc alim, institut əməkdaşları ilə birgə inamla davam etdirir.

F.Abdullayev Beynəlxalq Səhiyyə təşkilatının xətti ilə Masallıya 5000 nadir ağac hədiyyə etmişdir. Həmin ağaclar zəngin oksigen yaradan ağ ciyər xəstəliklərinin müalicəsində effekti olan evkalipt, şam, sərv, ağcaqayın, göyrüş, amorf, safora, palıd və s. kimi cins ağaclar idi. Həmin ağacların əkilməsində gənc professor 2001-ci ildə özü məşğul olmuşdur. Xüsusən, çox sayda ağacı özü əkmişdi.

Möhtərəm prezidentimiz cənab Heydər Əliyevin diqqət və qayğısı sayəsində Ağ Ciyər Xəstəlikləri İnstitutu beynəlxalq miqyasda nüfuzlu səhiyyə ocağına çevrilmiş, müasir maddi-texniki baza ilə təmin olunmuşdur.

Fərman Abdullayev vaxtilə Qızılağaclı Məşhədi Yusifin başçılıq etdiyi kollektivə rəhbərlik edir. Fərman öz atasının yolunu davam etdirməklə Azərbaycan səhiyyəsinə misilsiz töhvələr bəxş etmişdir.

Onun Qızılağaca olan münasibəti əvəzsizdir. Ata-baba yurduna, soy-kökünə bağlı olan gənc professoru qarşıda böyük nailiyyətlər gözləyir. Onun Dünya Səhiyyəsinə yeni istiqamət bəxş etməsi arzusundayam. Professor Musa Abdullayevin 42 yaşlı professor oğlu F.Abdullayevlə bütün Qızılağaclılar fəxr edə bilərlər.

# OQTAY MUSA OĞLU ABDULLAYEV

***Bilin ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər***



Ot kökü üstə bitər sözü Oqtay simasında öz təsirini təsdiqlədi. Oqtay da atası keçmiş SSRİ-də "Azadlıq uğrunda mübarizə aparan ilk qaranquşlardan biri olan qızılağaclı Musa Abdullayevin oğludur"

Oqtay Musa oğlu Abdullayev 1958-ci ilin mart ayının 27-də Bakı şəhərində, görkəmli tibb xadimi, qızılağaclı Musa Abdullayevin ailəsində dünyaya göz açıb. Oqtay Bakı şəhərindəki 45 nömrəli orta məktəbdə oxumuş, oranı müvəffəqiyyətlə bitirərək 1974-cü ildə Azərbaycan Dövlət Tibb İnstitutuna daxil olub. Öz biliyi və savadı ilə pedaqoji kollektivin və rəhbərliyin diqqətini cəlb etmişdir. Məhz onun bu mövqeyinə yüksək qiymət verilmiş, onu institutda işləmək üçün saxlayırlar. Oqtay üç il Qanköçürmə İnstitutunun Klinik və Donor şöbəsində işlədikdən sonra, 1984-cü ildə keçmiş SSRİ-nin Mərkəzi Hemotologiya və Qanköçürmə institutunun aspiranturasına daxil olub.

O, 1987-ci ildə disertasiya müdafiə edərək, yenidən Qanköçürmə institutunun klinik şöbəsinə qayıdaraq fəaliyyətə başlayır. Düşmən ermənilər torpağımıza hücum edəndə Oqtay da könüllü olaraq cəbhəyə yollanıb. Neçə-neçə yaralı əsgərin xidmətində dayanıb.





Həmin dövrdə mətbuat səhifələrində müntəzəm olaraq "Hərbi zonada səhiyyənin təşkili" "Azərbaycan ordusunun hərbi doktorinası" mövzusunda silsilə məqalələrlə çıxış edib.

1993-cü ildə səhiyyə Nazirliyinin göstərişi ilə Ankaranın Nümunə Xəstəxanası və Hacıtəpə Universitetində, İsrailin Texnion Universitetində ixtisası üzrə təkmilləşdirmə kursları keçib "Hemotologiya xəstəliyi və NLA" mövzusunda doktorluq disertasiyası müdafiə edib. QİÇS xəstəliyi əleyhinə hazırlanmış proqramın müəlliflərindən biridir. Azərbaycanca - ingiliscə tibbi terminlər lüğətinin müəllifidir.

1995-ci ildən etibarən "Tibb" jurnalında çalışır. Jurnalın məsul redaktorudur.

Oktay Abdullayev 1999-2001-ci illərdə Avstriyanın Yalsburg şəhərində keçirilən Hemotologiya üzrə seminarda Azərbaycanı təmsil edib. Ümumdünya Hemotoloqlar Cəmiyyətinin üzvüdür.

## NAMİQ ABDULSƏMİD OĞLU ABBASOV

*Öz düşüncəsini və dostluğunu səndən əsirgəməyən adamın sözündən çıxmamağa çalış*



Atası Abbasov Abdulsəmidin yolunu davam etdirməyi öz həyat amalı bilən Namiq orta məktəbi bitirdikdən sonra Azərbaycan Dövlət Tibb İnstitutuna daxil oldu. Oranı bitirərək ali təhsilli həkim ixtisasına yiyələndi. Atası Abbasov Abdulsəmid Məmmədhüseyin oğlu 1914-cü ildə Qızılağac kəndində anadan olub, yeddi illik təhsili Qızılağac kəndindəki məktəbdə bitirmiş, sonradan Bakı şəhərində orta məktəbi bitirərək Azərbaycan Dövlət Tibb İnstitutuna qəbul olunur. İnstitutu bitirdikdən sonra Masallı rayonundakı xəstəxanaya həkim işləmək üçün göndərilir. Bir neçə il həkim vəzifəsində işləyərək öz istedadı, biliyi, bacarığı və səmimiyyəti ilə həkimlər içərisində fərqlənmişdir. Onun bu xüsusiyyətlərini nəzərə alan Respublika Səhiyyə Nazirliyi onu Masallıda yeni təşkil edilən səhiyyə şöbəsinin ilk müdiri (1941-ci il) vəzifəsinə təyin edirlər. Abbasov Abdulsəmid səhiyyəyə başçılıq etdiyi müddət ərzində yatalaq xəstəliyi geniş yayılmışdı. Belə bir vaxtda gənc, ali təhsilli səhiyyə şöbəsinin müdiri Abdulsəmidin bu sahədə xidmətləri əvəzsizdir. Ona görə ki, bir tərəfdən tabe-





liyində olan işçilərin ehtiyaclarını ödəmək, digər tərəfdən isə ətrafı bürüyən xəstəliyə qarşı mübarizə aparmaq onun gündəlik vəzifəsi idi. Odur ki, az vaxt içərisində Abdulsəmid böyük əzmkarlıq göstərərək. Xəstəliyin yayılmasının qarşısını almağa nail olmuşdur. Abdulsəmidin bu işi Respublika Səhiyyə Nazirliyi tərəfindən qiymətləndirildi. Onu fəxri fərman və pul mükafatı ilə mükafatlandırdılar. Abdulsəmid 1944-cü ildə Masallı şəhərində vəfat etdi. Gənc həkimə hörmət əlaməti olaraq onun cənazəsini dövlət səviyyəsində rayon ictimaiyyətinin, səhiyyə nazirliyinin nümayəndələrinin, kənd camaatının iştirakı ilə orkestrin müşayiəti ilə qəbristanlığa aparıldı. Dəfndə böyük mitinq mərasimi keçirildi. Abdulsəmidin iki oğlanları Namiq və Nazim hər ikisi ali təhsilli həkim ixtisasına yiyələnmişlər. Namiq Abdulsəmid oğlu Abbasov 1941-ci ildə anadan olmuşdur. Namiq 1992-ci ildə Kiyev şəhərində akademik P.Q.Yanovski adına Elmlər Akademiyasının Elmi Tədqiqat Döş Qəfəsi Cərrahiyyəsi institutunda doktorluq dissertasiyasını müdafiə edib tibb elmləri doktoru dərəcəsini almışdır. Namiq öz elmi işlərindəki tibbi naliyyətlərlə şöhrətləndi. Onun məsul vəzifədə işləməsini məsləhət gördülər. N.Abbasovu Azərbaycan Respublikası Ağ Ciyər Xəstəlikləri İnstitutuna professor təyin etdilər. 1994-cü ildən hal-hazıra kimi həmin institutda işləyir.Hal-hazırda Tibb institutunda kafedra müdiridir. Gənc tibbi kadrların hazırlanmasında əməyinə görə 2 dəfə Nazirlər kabineti tərəfindən Fəxri Fərmanla təltif edilmişdir. Anası Validə xanım uzun müddət Qızılağac kəndində müəllim işləmişdir.

Ailəlidir, 3 övlad atasıdır. 2 kitab, 70 yaxın elmi metodiki əsərlərin müəllifidir. O, dünya şöhrətli alimlərdən biridir. Fəaliyyətində uğurlar diləyirik.

# FAZİL KƏRİMBALA OĞLU KƏRİMOV

*Allahı yad etmək ünsiyyətlərin açarıdır*

O, 1938-ci ildə Qızılağac kəndində anadan olmuşdur. 1964-cü ildə ADU-nun biologiya fakültəsini bitirmiş, bioloq-zooloq ixtisasına yiyələnmişdir.

1964-1968-ci illərdə Qızılağac dövlət qoruğunda baş elmi işçi vəzifəsində işləmişdir. Eyni zamanda, 1961-1971-ci illərdə qonşu Kolinovka orta məktəbində biologiya-kimya müəllimi işləmişdir.



1971-2001-ci illərdə Masallı rayon mərkəzi xəstəxanasında kliniki-diaqnostika laboratoriyada müdir vəzifəsində işləmişdir.





Həmin illər ərzində elmi-tədqiqat işləri ilə məşğul olmuşdur. Bir neçə elmi məqalənin və bir ixtiranın müəllifidir.

İxtirası uşaq və böyüklərin sağlamlığına müsbət təsir göstərən və elmdə analoqu olmayan bir maddədəir. Təbii müalicə vasitəsi olan ixtira millətin genefondunun saxlanılıb qorunmasına, bir sıra xəstəliklərin müalicəsinə kömək göstərir. İxtirasının adı "Fitobakterin"dir. "Fitobakterin" körpə cücələrin sağlam böyüməsinə, ölüm faizinin altı dəfə azalmasına, həmçinin cücələrin çəkisinin iki dəfə artıq olmasına müsbət təsir göstərir. Fazil müəllim təbabətə vurğun düşmüş zooloq alimidir.

O, həmçinin İslamda xidmət göstərməyliyi ilə fərqlənən alimdir. Namaz qılır, oruc tutur, dini kitabları mütaliə edir. Fazil Kərimov məhz bu xüsusiyyətləri ilə həmyaşıdlarından fərqlənir.

Mehriban ailə başçısı olan Fazil müəllimin iki oğlu, iki qızı var. Qızı Ülkər kənd məktəbində müəllimədir. Elmin enişli-yoxuşlu yolunda addımlayan Fazil müəllimə uğurlar diləyirəm.

# MAHMUD MƏHƏMMƏD OĞLU HAŞIMOV

***Kim müsəlmanlara ziyan gətirən şeyləri onların yolundan kənar edərsə, savab iş görmüş olur. Savaba nail olan cənnətə gedər***

Mahmud Haşımovun həyat yolu onun həmişə xatırlanması üçün səbəb oldu. Adı indi də çəkiləndə eşidənlər, onun üzünü görməyənlər belə onu yaxşılıqla yad edirlər. Burada "gəlmədim ki, özüm qalam, gəldim ki, izim qala" - deyən, şairin sözləri yada düşür. Mahmud 1882-ci ildə doğma kəndi olan Qızılağacda doğulmuşdur.

O vaxtlar Qızılağacda fəaliyyət göstərən məktəbdə dərs almış, dövrünün adamları içərisində öz şəxsi münasibətləri ilə fərqlənmişdir. Mahmudun çar Rusiyasının tabeliyində olan ərazilərdəki insanların ağır həyat tərzindən, yaşayışından məlumatları var idi. Odur ki, xalqa xidmət etməyi özünə vacib bilib, ali təhsil almağı qarşısına məqsəd qoydu.

Məqsədinə nail olan Mahmud həkim ixtisasına yiyələndi. 1910-cu ilə kimi doğma ocaqda tibbi müalicə və müayinələri həyata keçirtdi. Nəhayət, Mahmud Bakı şəhərinə köçmüş, orada həkimlik etmişdir. 1910-cu ildə Bakıda olarkən gördüklərindən nəticə çıxardaraq öz ixtisasını dəyişmək qərarına gəlir. Çünki həmin illərdə insanların hüququnu müdafiə etmək, sağlamlıq kimi əhəmiyyət kəsb edirdi. Odur ki, həkim Mahmud hüquqşünas olmağı qarşısına məqsəd qoydu. Ali təhsilli hüquqşünas olub, xalqının hüququnu müdafiə etməyə

başladı və 1915-ci ildən Bakı şəhərində müxtəlif vəzifələrdə işləməyə başladı. 1917-ci ildən isə onun hüququ bilikləri onun şöhrətlənməsinə səbəb oldu. Mahmud Haşımovun bacarıqlı hüquqşünas olması 1918-ci ildə yaradılan Azərbaycan Demokratik Respublikasının rəhbərlərinə məlum idi. Odur ki, onu Respublika prokurorluq orqanlarında məsul vəzifəyə təyin edirlər. Gənc Azərbaycan Respublikasının qurulmasında onun da əməyi təqdirə layiq idi. Mahmud Bakıda işləməyinə baxmayaraq, həmişə Qızılağac və qızılağaclılar ilə maraqlanırdı. Belə ki, 1917-ci il burjua inqilabı zamanı Qızılağacdakı işlərin qızılağaclılara mənfi təsirlərinin olmaması üçün məlumatlar, göstərişlər verərmiş. Mahmud Haşımov öz işinin mahir bilicisi olduğuna görə Azərbaycanda Sovet hakimiyyətinin ilk illərindən ondan istifadə etmişlər. Onu Respublika Hərbi Prokurorluğunda məsul vəzifəyə təyin etmişlər və 1924-cü ildə müəmmalı şəkildə vəfat etmişdir.

Mahmud haqqında dünya görmüş müdrik qocaların çoxlu təəssüratlarını eşitmişəm. Bütün onun haqqında danışılanlardan, onun əsil insan, xeyir əməl sahibi olduğunu hiss edirsən. Deyilənlərə görə, Mahmud qızılağaclılardan Bakı şəhərində kimi görsəydi, onunla oturub söhbət edərmiş. Hətta bir gün öz iş yoldaşları ilə Bakı küçələrindən keçərkən Mahmud qızılağaclılardan görən kimi yoldaşlarından ayrılıb onlarla söhbət etmiş, onlara lazımi köməklik göstərmişdir. Eşitdiyimə görə deyərmiş: "qonşu Nikolayevka kəndindəki ruslarla mehriban olun, onları dost kimi qəbul edin."

Bunu ona görə məsləhət görürmüş ki, o dövrlərdə müəyyən qüvvələr ruslara qarşı çıxırmış.





Qızılağaca olan onun münasibəti haqqında çoxlu söhbətlər eşitmişəm. Belə insanların unudulmasını bizə bağışlamazlar. Çünki əsl vətənpərvər idi. Onun həyat yolu bir məktəbdir.

Mahmudun oğlu İmran da Ali təhsilli həkim olub. Uzun müddət Bakı şəhərində xəstəxananın baş həkimi vəzifəsində işləyib. 1986-ci ildə vəfat etmişdir. Qardaşı Yaqubun bir qızı Məsumə, indi ABŞ-da yaşayır. Ali təhsillidir. 3 oğlu var ki, onlar da ali təhsillidirlər.

## BABA MƏŞƏDİ ƏLİHEYDƏR OĞLU FƏTULLAYEV

*Səbri, həlimliyi olan adama*
*Allah kömək olar*



Xoşbəxt o şəxsdir ki, onu yaxından tanıyanlar tərəfindən hər zaman həm sağlığında, həm də dünyasını dəyişəndən sonra Allahın rəhməti ilə yad edilir.

Belə şəxslərdən biri 1922-ci ildə Masallı rayonunun Qızılağac kəndində anadan olmuş Fətullayev Baba Məşədi Əliheydər oğludur. Sovetlərin ilk hakimiyyəti dövrü beş-on baş mal-qarası olan ailə başçıları tutulur, ailə üzvləri isə incidilirdi. Ailə üzvlərini və özünü bu hədəfdən qorumaqdan ötrü qızılağaclı Məşədi Əliheydər ailə üzvlərini Sara adasına (II Nərimanabad), bir müddətdən sonra isə Bakı şəhərinə aparmağa məcbur oldu. Demək olar ki, Məşədi Əliheydərin oğlu Babanın bundan sonrakı həyatı Bakı şəhəri və Azərbaycanın digər bölgələri ilə bağlı oldu. Gənc yaşlarında bir çox çətinliklərlə üzləşən Fətullayev Baba Bakı şəhərində ailə həyatı qurmuşdur. Azərbaycan Dövlət Universitetinin hüquq fakultəsinə qəbul olmaqla 1949-cu ildə oranı bitirmişdir. Azərbaycan Respublikasının Ali məhkəməsində və bir sıra rayon məhkəmələrində məhkəmə hakimi vəzifəsində işləmişdir. Vəzifədə olduğu





müddətdə harada olursa-olsun, doğma Qızılağac kəndi ilə teztez maraqlanar, kəndə baş çəkməyi unutmazdı. Onu yaxından tanıyanların söyləmələrinə görə insanlara yaxşılıq etmək, Baba Məşədi Əliheydər oğlunun təbiətində ən mühüm amil idi.

Hazırda Qızılağac kəndində yaşayan oğlu Fətullayev Aslanın atası haqqında xatirələrindən: -Bir gün atam işdən qayıdanda hiss etdik ki, qanı qaradır. Anam bunun səbəbini soruşduqda, atam əlində tutduğu və parçaya bükülmüş bağlamanı ona uzadıb dedi ki, təmiz bir yerə qoysun. Sonra o bildirdi ki, bu gün səhər xırda xuliqanlıq işlərinə baxırdı. Bir nəfər Tovuz rayonunun dəmiryolu vağzalında sərxoş vəziyyətində tutulmuş və hərəkətlərinə görə cəza almaq üçün məhkəməyə gətirilmişdir. Həmin adamdan alınıb, götürülən bağlama da müqəddəs kitabımız "Quran"dır. Tutulan adamın ifadəsinə görə bu rayona mollalıq etməyə gəlmişdi. Təsadüfi adamlar mollalıqla çörək qazanmaq meylindədirlər.

...İstirahət günü atam evdə idi. Tovuz rayonunda yaşadığımız mənzilə bir qadın gəlib, atamla görüşmək istədi. Onun gəlişinin səbəbini soruşduqda qadın ağlaya-ağlaya bildirdi ki, oğlu bu il orta məktəbi Qızıl medal ilə bitirib, ali məktəbə daxil olmaq üçün Bakı şəhərinə getmək istəyir. Lakin yol pulları yoxdur. Atam lazımi köməkliyi etdi. Düzü atam bu hadisədən sonra bir müddət çox qəmgin və fikirli gəzdi. Sonradan eşitdik ki, həmin qadının oğlu əla qiymətlə Tibb İnstitutuna qəbul olub. Bu xəbəri eşidən atamın sevincinin həddi-hüdudu yox idi. Çünki o bir gəncin inkişaf etməsinə köməklik göstərdi. Fətullayev Baba Tovuz rayonunda məhkəmə hakimi işlədiyi dövrdə 1968-ci ilin aprel ayında 46 yaşında qəfildən vəfat etmiş, məzarı Bakı şəhərindədir.

Allah rəhmət eləsin!

## SABİR HEYDƏR OĞLU CƏFƏROV

*Əgər möminsinizsə, Allaha təvəkkül edin!*



1931-ci ildə anadan olub. 1939-cu ildə Qızılağac kənd orta məktəbinin 1-ci sinifinə daxil olmuş, 1947-ci ildə isə Masallı rayon Digah kəndindəki orta məktəbdə təhsilini davam etdirmişdir. 1949-cu ildə həmin məktəbi 10-cu sinifini bitirmiş, həmin ildə Bakı Dövlət Universitetinin hüquq fakütəsinə daxil olmuş, 1954-cü ildə həmin fakültəni bitirmişdir. 1954-cü ildən Respublikanın ayrı-ayrı rayonlarında prokurorluq orqanlarında müstəntiq vəzifəsində işləmişdir. 1959-1965-ci illərdə isə Əli-Bayramlı şəhər prokurorluğunda baş müstəntiq işləyib. 1965-ci ildən 1970-ci ilə kimi Biləsuvar rayonunda, 1970-1975-ci ilə kimi Zəngilan rayonunda, 1975-1991-ci ilə kimi isə Kürdəmir rayonunda prokuror və prokuror köməkçisi işləyib. Hal-hazırda təqaüddədir. O işlədiyi müddətdə özünü bacaraqlı işçi kimi göstərmiş, SSRİ və Azərbaycan SSR Prokurorluğu tərəfindən dəfələrlə mükafatlandırılmışdır. SSRİ Ali Sovetinin fərmanı, "Lenin" ordeni və "Əmək Veteranı" medalı ilə təltif olunmuşdur.





## QULU MƏHƏMMƏD OĞLU NƏSRULLAYEV

***İnsanlar dünyanın övladlarıdır, onlar analarını sevdikləri üçün məzəmmət olunmazlar***



O, 1895-ci ildə Qızılağac kəndində anadan olmuşdur. Kiçik yaşlarında ikən kəndin din xadimlərindən təhsil almış, Ərəb əlifbası ilə yazıb-oxumağa nail olmuşdur. Atası Məşədi Məhəmməd oğlunda elmə olan həvəsi gördükdə onu kənddə mövcud olan ibtidai məktəbdə oxutmuşdur. İbtidai təhsilini müvəffəqiyyətlə başa vurub, sonra Bakı şəhərinə gedərək orta təhsil almağa başlayır. Birinci Dünya müharibəsinin başlanması ilə əlaqədar olaraq təhsilini başa vura bilmir. Bakı şəhərində işləməyə başlayır, lakin öz biliyini artırmaq üçün müxtəlif kitabları mütaliə edirdi. O, 1922-ci ildə Bakı şəhərindəki Sənaye İnstitutunun hüquq şöbəsinə daxil olur. 1927-ci ildə oranı bitirib, hüquqşünas kimi işə başlayır. Əvvəllər, 1955-ci ilə kimi respublikanın müxtəlif rayonlarında müstəntiq vəzifələrində işləmişdir. 1955-ci ildən məhkəmə sistemində işə dəvət edilir. Bakı şəhərində bir neçə dəfə məhkəmə sədri vəzifəsində işləmişdir. 1964-cü ildən vəkillər kollegiyasında sədr və məsləhətçi vəzifələrində işləmişdir. Əməyi dövlət tərəfindən qiymətləndirilmiş və mükafatlandırılmışdır. O, 1967-ci il de-

kabr ayının 15-də Bakı şəhərində 72 yaşında vəfat etmişdir və orada dəfn edilmişdir.

Qulu Nəsrullayevin Xanım adlı qızı 1922-ci ildə, Ümbülbani 1923, Tahirə 1925-ci ildə anadan olmuşlar. Hər üç qızı ali təhsilli tibb işçiləri idilər. Qızı Ümbülbəni Nəsrullayeva uzun müddət Biləcəri çağırış məntəqəsində həkim komissiyasında, Respublika Mərkəzi Xəstəxanasında isə ömrünün sonuna kimi işləmişdir. O, burun, boğaz və qulaq həkimi idi. Ümbülbəni 2004-cü ildə oktyabr ayında Bakı şəhərində vəfat etmişdir. Üç övladı var.

Qulu Nəsrullayevə məxsus olan ev ikimərtəbəli olubdur. O ev bizim indiki evin günbatan səmtində olub. Həmin evi Məşədi Qulu xalqın istifadəsi üçün vermişdir. Həmin binanın aşağı mərtəbəsində olan üç otaq həkim məntəqəsi, ikinci mərtəbəsindəki üç otaq isə məktəb kimi istifadə olunmuşdur. Qulu Nəsurullayev hüquqşunas kimi ömrünün sonuna qədər xidmət göstərmişdir.

Qulu Nəsrullayevin Qızılağacla bağlı günləri az olsa da belə Bakı şəhərində Qızılağaclılarla tez-tez görüşərək onlarla kənd haqqında söhbətlər edərdi. İndi belə insanları xatırlamaq özü də bir xeyirxahlıqdır.





## XANLAR CƏFƏR OĞLU ƏLƏKBƏROV

***Təkəbbürdən çəkin, çünki, kimin qəlbində bir zərrə qədər təkəbbür olsa, cənnətə daxil olmaz***



Qızılağac kəndində sovet hökumətinin ilk günlərində peşə yönümlü ixtisaslara maraq göstərən gənclər çoxluq təşkil edirdi. Onlardan biri də Ələkbərov Cəfər olmuşdur. Cəfər Masallı rayonunun 1930-cu ildə yaradılan ilk avtomobil sürücüsüdür.

Cəfər kişini o dövrdə sahib olduğu peşə cənub zonasında məşhurlaşdırdı. Masallı rayonunun ilk avtomobil sürücüsü Cəfər kişiyə təkcə Masallıda yox, Lənkəran və Cəlilabad, Astara, Lerik, Yardımlıda, Biləsuvarda bu sahəyə marağı olan gənclər müraciət edərək peşəsini onlara da öyrətməyi xahiş

edirdilər. Az vaxt içərisində Cəfər kişi çoxlu sayda gənclərə öz peşəsini öyrətdi. Xüsusi kurslar təşkil edərdi. Həmişə səfər edənləri səhər tezdən salamlayan Cəfər kişi, idarə etdiyi avtomobili işə salarkən Allahı yad edir və yola düşərdi. Cəfər müəllimi Lənkərana sürücülük peşəsini öyrətmək üçün işə dəvət etdilər. Orada işlədi və orada məskunlaşdı. Onun övladları elmə maraq göstərməyi ən üstün amil hesab etmişlər, müxtəlif sənət sahibi olmaq arzusu ilə yaşayırdılar. 1950-ci ildə anadan olan Xanlar dünya miqyaslı tanınmış şəxsiyyətlərdən biri oldu. Rusiya Baş Prokurorluğu Rəhbər Kadrların Təkmilləşdirilməsi İnstitutunun prorektoru, hüquq elmləri doktoru, professor ədliyyə general-mayoru Xanlar Ələkbərov bu minvalla şöhrətləndi. Gənclik illərindən həyatını Rusiya ilə bağlayan Xanlar Ümumittifaq Hüquq İnstitutunu bitirərək milis orqanlarında müxtəlif vəzifələrdə çalışıb. Uzun ayrılıqdan sonra vətənə qayıdan X.Ələkbərov bir müddət Azərbaycan Polis Akademiyasının elmi işlər üzrə rəis müavini kimi ölkəmizdə yüksək ixtisaslı polis kadrlarının hazırlanmasında yaxından iştirak edib. Hazırda general X.Ələkbərov İnstitutdakı elmi fəaliyyəti ilə yanaşı Rusiya Dövlət Dumasının eksperti, Rusiya Ali məhkəməsi, Elmi Məsləhət Şurasının da üzvüdür. 150-dən artıq elmi əsərin, 10 sanballı monoqrafiyanın müəllifi olan professor Ələkbərov respublikamızda iyirmidən artıq hüquqşünas alimin elmi rəhbəri olub. Azərbaycanla Rusiya Federasiyası orqanları arasında bağlanmış müqaviləyə görə ölkəmizin rəhbər prokurorluq işçiləri onun çalışdığı instituta təkmilləşdirmə kursları keçməyə göndərilir. Xanlar Ümumrusiya Azərbaycanlıları Konqresinin yaradıcıla-





rından biri kimi bu qurumda Azərbaycan diasporunun konstitusiya və vətəndaşlıq hüquqlarının qorunması ilə məşğul olur. Rusiyada yaşayan soydaşlarımızın inzibati orqanlarla səmərəli əlaqəsini təmin edir. 2001-ci ildə Bakıda keçirilən Dünya Azərbaycanlılarının I qurultayının nümayəndə heyətində təmsil olunurdu. Xanlar Ələkbərov Qızılağacla fəxr edən bir şəxsiyyətdir. Mütəmadi Qızılağaca gələr, doğmaları və kənd camaatı ilə görüşər, hal əhval tutar. O, həm də xeyriyyəçidir. Böyük Vətən Müharibəsi veteranlarına bir neçə dəfə köməklik etmişdir. Xanlar Cəfər oğlu Ələkbərovun gələcək işlərində uğurlar diləyirəm.

# ƏSƏD AĞABABA OĞLU FƏTULLAYEV

*Yaxşı əməllərdə təkidli olun.*



Vaxtilə Qızılağac və ətraf kəndin adamları bu adı daşıyan şəxsə çox ehtiyacları var idi. Çünki Molla Əsəd 25 il Nəcəf şəhərində ali dini təhsil almışdı. Müsəlmanlara Quran və şəriət elmlərini çatdırırdı. İndi də Molla Əsəd haqqında xoş təsir bağışlayan söhbətlər eşidirik. Öz ata-baba soy-kökünə bağlı olan Əsəd Ağababa oğlu Molla Əsədin nəvəsidir. Xof və qorxular içində yaşayan Molla Əsəd 1938-ci ildə dünyasın dəyişdi. Oğlu Ağababa bir neçə ildən sonra sənaye sahəsində işləmək üçün Əli-Bayramlı şəhərinə pənah gətirdi. Orada Neft sahəsində işlədi, öz sənətinin mahir bilicisi oldu. 1963-cü ildə Ağababanın ailəsinə Allahın mərhəməti ilə bir oğlan uşağı bəxş olundu. Atası Əsədin adın bu uşağa qoydu. Əsəd orta məktəbi bitirdi, ali təhsil aldı. Hərbi xidmətdən sonra Respublika Daxili İşlər Nazirliyində işə düzəldi. Polis orqanlarında xidmət göstərdi. Onun işgüzarlığı, bacarığı rəhbərlik tərəfindən yüksək qiymətləndirildi. Əsəd öz peşəsinin yüksək dərəcəli mütəxəssisi olmaq üçün 1990-cı





ildə Rusiyada xüsusi təyinatlı ali əməliyyat məktəbinə imtahan verdi. Həmin məktəbi 1994-cə ildə müvəffəqiyyətlə bitirdi. Həmin ildən (1994-cü il) Əsədi DİN-in Cinayət axtarışı və mütəşəkkil cinayətkarlığa qarşı mübarizə idarəsində işə qəbul etdilər. Həmin idarədə 2005-ci ilə kimi müxtəlif vəzifələrdə çalışdı. 2005-ci ildə elmə yüksək marağı olan Əsəd baba irsinə sadiq qalmağı elmi fəaliyyəti ilə xalqa xidmət etməyi hər şeydən vacib bildi. Odur ki, istefaya çıxdı. Hal-hazırda polis mayoru rütbəsilə istefaya çıxan Əsəd Moskvada elmi fəaliyyətlə məşğuldur.

Əsəd çox sadə təsir bağışlayan bir ziyalıdır. Öz ata-baba yurduna, soy-kökünə bağlı olan bir şəxsdir. Onun Qızılağaca mütəmadi gəlişi dediklərimi təsdiq etmək üçün əsasdır. Əsədlə söhbət zamanı onun dedikləri insanı düşüncəyə və təəssübkeşliyə vadar edir.

Mənimlə söhbət zamanı yanında olan 12-13 yaşlı bir oğlan uşağın göstərdi. Dedi: düzdür, biz müəyyən səbəblərə görə doğma kəndimizə gedib-gələ bilmirdik. (həmin vaxtlarda cənub zonası sərhəd ərazisi olduğu üçün gediş-gəliş çətin idi - N.Q.)

Kəndimiz haqqında atamdan və əmimdən eşitdiklərimizi bilirdik. Lakin on beş ildə mən vaxt tapanda gördüyün kimi gəlib-gedirəm. Bu oğlumu da həmişə gətirib əcdadının uyuduğu müqəddəs torpaqla tanış edirəm. Ona Əliyusif dayıdan eşitdiklərimi də söyləyirəm. Düzü mən bu yaşda olanda Qızılağacı onun kimi tanımırdım, indi oğlum Qızılağacı tanıyır, həm də qəlbində bu doğma torpağa böyük məhəbbət var.

Əsəd ziyalıdır, o bilir ki, insan üçün doğmaların nə qədər böyük əhəmiyyəti var. Hər hansı qızılağaclı ona doğmadır və əzizdir. Əli-Bayramlı şəhərində polis orqanlarında işləyərkən ətraf rayonlarda yaşayan qızılağaclıları axtarıb tapar və onlarla yaxın münasibət qurardı. Əsəd haqqında yazmağı bu deyilənlərlə tamamlamaq olmaz. Çünki bu dediklərim onun həyata münasibətinin zərrələridir. Mən əminəm ki, Əsəd bir ziyalı kimi babaları Şeyx Fətulla, Molla Əsəd kimi elmin yüksək zirvəsinin fatehlərindən biri olacaq. Bu yolda ona uğurlar diləyirik.





## FƏXRƏDDİN MİRZƏAĞA OĞLU ƏBİLOV



1951-ci il sentyabr ayında Bakıda anadan olmuşdur. Atası Mirzəağa öz dövrünün tanınmış xeyriyyəçisi Məşhədi Fərəcullanın oğludur. Məşhədi Fərəculla 1940-cı ildən ailəvi Bakıya köçmüşdür. Onlara məxsus olan Qızılağacdakı evi xalqın ixtiyarına vermişlər. Həmin evdən uzun müddət məktəb və məscid kimi istifadə olunmuşdur. Mirzəağa əmək fəaliyyətinə dəmir yolu sahəsində başlamış, ömrünün axırına kimi bu sahədə işləmişdir. Fəxrəddin Əbilov orta məktəbi əla qiymətlərlə bitirmişdir. Dadaş Bünyadzadə adına Xalq Təsərrüfatı institutuna qəbul olunmuş, oranı da fərqlənmə diplomu ilə bitirmişdir. Sonradan daxili işlər orqanında işə düzəlmiş, işləyə-işləyə Daxili İşlər Nazirliyinin nəzdində olan Polis Akademiyasını bitirmişdir.

Uzun müddətdir ki, Bakı şəhərindəki Nəsimi bölgə mühafizə idarəsində hal-hazıra kimi rəis vəzifəsində işləyir. Polis polkovnikidir. Fəxrəddin işlədiyi müddətdə rəhbərlik tərəfindən yaxşı təşkilatçılığına görə dəfələrlə mükafatlandırılmışdır. Qızılağaclı olmağı ilə fəxr edəndir. O, həmçinin xeyriyyəçiliyi ilə öz babasının yolunu davam etdirir.

Fəxrəddinə gələcək işlərində uğurlar diləyirəm.

# QULAM NƏCƏFQULU OĞLU SƏFƏROV

*Səbr etmək şücaət və mətanətdir*



İnsanın qazandığı onun hörmətidir. Belə insanlara xalq böyük ümidlər bəsləyir. Ümidləri doğruldan insanlar isə dahi şəxsiyyətlərdirlər. O şəxsiyyətlər cərgəsində Qulamın da öz yeri vardır.

O, 1907-ci ildə Masallı rayonunun Qızılağac kəndində kəndli ailəsində anadan olmuşdur. Hələ kiçik yaşlarında ikən atası vəfat etmiş, hətta atasının üzünü belə yadda saxlaya bilməyən Qulam ana qayğısı və nəvazişi ilə gün-güzaran keçirdib. 1917-ci ilə kimi anasının və böyük qardaşı Əyyubun himayəsində olan kiçik yaşlı Qulam əməyə bağlanmış, gücü çatası tərzdə işlər görərdi. İ917-ci ildə anası vəfat edəndən sonra qardaşı Əyyubun qayğı və nəvazişində olan Qulam təhsil almaq üçün çox can atırdı. Ona görə ki, ibtidai məktəb təhsili olan Qulam gələcəyini elmlərə sahib olmaqda görürdü. Məktəbdə oxuduğu illərdə Qulam qardaşı ilə birlikdə ayrı-ayrı şəxslərin əkin sahələrində gözətçilik edərdilər. 1920-ci ildə Azərbaycanda Sovet hakimiyyəti

qurulan dövrdə kənd məktəbinə daxil olan (onda Qızılağacda ilk beşillik məktəb açılmışdı) Qulam həmin məktəbdə xidmətçilik də edərdi. Dərsdən sonra sinif otaqlarını silib, süpürüb sabah üçün təmizləyərdi. Özünün 1960-cı ildə yazdığı qısa tərcümeyi halında bu faktları sadalayan Qulam Səfərov həyatının acınacaqlı anlarını qeyd etməklə Allahın köməkliyi ilə haradan hansı mərtəbəyə qalxdığını unutmadığını bildirmək istəyirdi. 1924-cü ildə məktəbi yeddi illik sinif həcmində bitirən Qulam təhsilini davam etdirmək üçün Bakı şəhərinə gəlir. 1924-üc tədris ili üçün qəbul imtahanları keçirilib qurtardığına görə heç bir məktəbə daxil ola bilmir. Bakı hərbi prokurorluğunda xidmətçi işləyir. Qulamın işgüzarlığını, yüksək bacarığını görən rəhbərlik onu 13 yanvar 1925-ci ildə Hərbi prokurorluğun göndərişi ilə Azərbaycan Hərbi Kadrlar yetişdirən məktəbə oxumağa göndəriblər. 1925-ci ildə komsomol sıralarına qəbul edilən Qulam Səfərov 1927-ci ildə məktəbi bağlandığına görə təhsili yarımçıq qalıb. 1927-ci ildən Sov.İKP-nin üzvü olan gənc Qulamı Tiflis şəhərindəki Piyada Qoşunlar məktəbinə təhsilini davam etdirmək üçün göndərirlər. 1928-ci ildə həmin məktəbdə təhsilini tamamlayan kimi o, hərbi hissələrin birinə rota komandiri kimi, Zaqafqaziya Dövlət Sərhəd Qoşunları sədrinin sərəncamına göndərilir. Həmin vaxt onu Lənkəran sərhəd qoşunları dəstəsinə siyasi işlər üzrə rəis müavini vəzifəsinə təyin edirlər. 1929-cu ilə kimi bu vəzifədə işləyən Qulamı siyasi biliklərinə, döyüş xidmətinə və bacarığına görə 1929-cu ildən komendaturanın rəis köməkçisi vəzifəsinə irəli çəkirlər. Artıq Qulam Səfərov





baş qərargahda tanınmış, xidməti vəzifələrinin müqabilində rəhbərliyin hörmətini qazanmışdır. Belə bir ixtisaslı kadra ehtiyac olduğu bir vaxtda 1931-ci ildə Cəbrayıl sərhəd qoşunları dəstəsinin rəisi vəzifəsinə təyin edilir. 1934-cü ildə Moskva şəhərindəki Daxili İşlər Xalq Komissarlarının Ali Sərhəd məktəblərinə göndərilir. 2 il həmin məktəbdə təhsil alan bu gənc 1936-cı ildə həmin məktəbi bitirdi və baş leytenant rütbəsi aldı. 1936-cı ildə yenidən Cəbrayıl Sərhəd dəstəsinin rəisi vəzifəsinə göndərildi. 11 il həmin dəstədə işləyən Qulam Səfərova 1939-cu ildə mart ayında Naxçıvan Muxtar Vilayətinin Sərhəd dəstəsinin komendaturasına qərargah rəisinin müavini vəzifəsində işləmək üçün təyinat verildi. 1940-cı ildə Azərbaycan SSR Daxili İşlər Xalq Komissarlığında, 1940-cı il may ayının 10-da Şamaxı şəhər Xalq Komissarlarının Daxili İşlər Şöbəsində, 1941-42-ci ildə Astara şəhər şöbəsində müxtəlif vəzifələrdə işləmişdir. 10 may 1942-ci ildən 402-ci atıcı diviziyasında baş sahə rəisi təyin edilib.

Böyük Vətən müharibəsi dövründə aktiv iştirakına görə "Qırmızı Ulduz" ordeni ilə, iki dəfə "Döyüş xidməti" medallarına, nümunəvi xidmətlərinə görə "Qafqazın müdafiəsi uğrunda" medalına, 1941-45-ci il Almaniya üzərində qələbəyə görə medallarına layiq görülmüşdür. 1945-49-cu illərdə Jdanov rayon (indiki Beyləqan), 1949-cu ildən Vartaşen (indiki Oğuz) rayon XKDİ şöbəsinin rəisi olub.

Qulam Səfərovun mənalı ömür yolu şəxsi münasibətləri onun xatırlanması üçün əsas olmuşdur. Qulam Səfərov həm

də el ağsaqqalı və böyük ziyalı idi. O, Bakı şəhərində yaşasa da belə, yenə də qəlbi Qızılağacda sanki çırpınırdı. Qızılağac və qızılağaclılar onun üçün bir vəhdaniyyətlik, bir qardaşlıq, bir amal idi. Çünki Qulam Səfərov çəkdiyi o sıxıntılı günləri həmişə göz önünə gətirər, çətinliyin nə olduğunu xatırlayardı. Bakı şəhərində rast gəldiyi qızılağaclılarla çox söz-söhbətlər edib, onlara lazım gələndəköməklik göstərərdi. Qulam Səfərov eşitdiyimə görə ilk adam imiş ki, Bakı və onun ətraf rayonlarında yaşayan qızılağaclıların ev ünvanını yığıb toplamış, onların bir-birinin xeyir-şər işlərində iştirak etmələrini təmin edərmiş. Bu bəlkə də indiki dövrdə adlanan "cəmiyyət" birliyi imiş. Qulam Səfərov ömrünün sonuna qədər Bakı şəhərində yaşasa da belə Qızılağaca mütəmadi gəlib, doğmalarını və kənd camaatını yoxlayarmış. Onun dörd övladı olub - bir qızı, 3 oğlu.

Oğlu Elman Səfərov Qızılağac kənd orta məktəbində tarix müəllimi, qızı Tamilla isə rus dili müəllimi işləyiblər. Hal-hazırda Qulam kişinin çoxlu nəvə və nəticələri var. Qulam Səfərovun şərəfli həyat yolu bugünkü gənclik üçün örnəkdir.

Milli təhlükəsizlik işlərində xidmətləri olan polkovnik-leytenant Qulam Nəcəfqulu oğlu Səfərov 1972-ci ildə vəfat etmiş. Qəbri Qızılağac kəndin qəbirstanlığındadır.

Bəli hörmətli oxucu, Qulam Səfərov öz səyi və bacarığı nəticəsində o çətin yolları keçmiş, Allahın mərhəməti sayəsində yüksəlmişdir. Qulam Səfərovu tanıyanlar onun haqqında çoxlu məlumatlara malikdirlər. O bir qızılağaclı kimi birlik amalı uğrunda fəaliyyət göstərən ziyalı idi.





## SEYFULLA MUSTAFA OĞLU MƏMMƏDOV

*Zəfər keçsə də, nəticə geciksə də,*
*səbir mütləq zəfər çalacaq*



O, 1924-cü ildə Masallı rayonunun Qızılağac kəndində anadan olmuşdur. 1933-cü ildə Qızılağac kəndində ibtidai təhsil almış, 1938-ci ildə ailə vəziyyəti ilə əlaqədar olaraq Port-İliç qəsəbəsinə köçmüşdür. Seyfulla Port-İliç orta məktəbində təhsilini davam etdirmişdir. 1944-cü ildə müharibə illərində gəncləri arxa cəbhəyə səfərbər edəndə, S.Mənımədov da Bakı şəhərinə səfərbər edilmişdi. Onu Bakı şəhərindəki Montin adına zavoda çilingər vəzifəsinə işə cəlb edirlər. Öz işgüzarlığı nəticəsində S.Məmmədov fərqlənmiş, zavod rəhbərliyi tərəfindən əməyi qiymətləndirilmişdir. Onun 1945-ci ildə zavod komsomol komitəsinin təşəbbüsü ilə o vaxtkı Bakı Maşınqayırma Texnikumunun Avtomobil Nəqliyyatı şöbəsinə göndərmişlər. Həmin texnikuma daxil olub və oranı 1949-cu ildə fərqlənmə diplomu ilə bitirmişdir. Texnikumu bitirdikdən sonra Azərmaş nəqliyyat idarəsinə göndərilmiş, orada mexanik və baş mexanik vəzifələrində çalışmış-

dır. 1952-ci ildə Azərbaycan Respublikası Dövlət Təhlükəsizlik orqanına daxil olmuş və Tbilisi şəhərində iki illik hərbi məktəbə göndərilmiş, leytenant rütbəsi almışdır. Məktəbdən onu Qazaxıstan Respublikasına təyinatla işə göndərmişlər. O Qazaxıstan Respublikasının Dövlət Təhlükəsizlik orqanlarında 3 il işləmiş, 1957-ci ildə Dövlət Təhlükəsizliyi orqanlarında işləmək üçün Bakı şəhərinə göndərilmişdir. Azərbaycan Respublikası Dövlət Təhlükəsizlik Komitəsində onu Lənkəran rayonunun təhlükəsizlik idarəsində işə təyin edirlər. S.Məmmədov 1983-cü ilə kimi Lənkəran rayon dövlət təhlükəsizlik idarəsində müxtəlif vəzifələrdə işləyərək, mayor rütbəsi alır. 1983-ci ildə təqaüdə çıxmışdır. S.Məmmədov 1959-cu ildə ailə həyatı qurmuşdur. Onun həyat yoldaşı əslən Lənkərandan olan uzun müddət Respublika Dövlət Təhlükəsizlik orqanında işləmiş, Cəfərli Tağının qızı Tamara xanımdır. Tamara xanımdan iki oğlan övladı olmuşdur Cavid və Fikrət.

Cavid Kazan universitetinə daxil olmuş, oranı bitirmiş sonralar sərhəd qoşununda işləmiş və səhhəti ilə əlaqədar olaraq təqaüdə çıxmışdır. Oğlu Fikrət isə ordu general-mayoru idi.






# Qızılağaclı yazıçılar




Məhəmmədhəsən Nəccar və Səməd Qərib irsini yaşadan Qızılağacın şairləri söz xəzinəsinin saf inci çələngini ləyaqətlə daşımaqdadırlar. Qızılağac kənd sakinləri içərisində yazıçılar az olmamışdır. Belə ki, onlar öz poetik yaradıcılıqlarını davam etdirməklə Azərbaycan poeziyasına töhfələr bəxş etmişdirlər.

Onlardan ən məhşurlarından Allahverdi Zeynalov, Qulu Vəcioğlu, Hacı Məhəmməd Nəsir, Beytulla Əliyev, Şahin Musaoğlu, Mikayıl Təbibi, Rais Aydınoğlu, Abdulqəfər Cabbarov və s. göstərmək olar. Onlar təbiətin lövhələrindən, fəsillərin dəyişməsindən, dövrün şəxsiyyətlərindən, günün vacib məsələlərindən ürək dolusu söz açaraq vətənə bağlı bir vətəndaş olduqlarını yazılarında təcəssüm etdirirlər. Məhz onun nəticəsindəndir ki, onlar ilhama gələrək öz ürək sözlərini qələmə almışlar. Allahverdi Zeynalov (Alovlu) 8 müxtəlif adlı kitabın müəllifidir. Qulu Vəcioğlu və Hacı Məhəmməd Nəsir Qulamhüseyn oğlu hərəsi üç kitabın, Rais Aydınoğlu, Beytulla Əliyev, Şahin Musaoğlu, Mikayıl Təbib hərəsi bir kitabın müəllifidirlər. Şahin Musaoğlu həm şair, həm də gözəl bəstəkardır. Hərbi Vətənpərvərlik mövzusunda yazdığı şeirlərin musiqisini də özü bəstələyib. Şahinin 30-dan çox bəstələdiyi mahnılar Respublika teleradiosunun "Qızıl fond"una daxil edilmişdir. Qızılağac yazarları içərisində gənc nəslin nümayəndələri də vardır. Onlardan Aydın Əbilovu, Elşən, Rais Nərimanovları, Arzuman Əliyevi, Tahir Cabbarovu göstərmək olar. Qızılağac bir saylı orta məktəbdə təşkil olunmuş, "Səməd Qərib" ədəbi məclisinə çoxlu sayda gənc yazarlar üzv olmuşlar. Ədəbi məclisə rəhbərlik edən təcrübəli, gözəl pedaqoq öz elmini kamil bilən dil-ədəbiyyat müəllimi

Balabəyim Salayevanın xidmətləri misilsizdir. Onun xidməti sayəsində gənc yazarlar püxtələşərək poeziya sahəsində öz istedadlarını nümayiş etdirirlər. Artıq demək olar ki, istedadların üzə çıxması üçün Səməd Qərib ədəbi məclisinin böyük köməkliyi olur. Bədahətən şeir deyənlər də az deyillər. Azərbaycan poeziya məktəbinin yetişdirdiyi şairlər sırasında onların öz dəsti xətləri vardır.

Qızılağac kənd poeziya həvəskarları gündən-günə, ildən-ilə zəngin yaradıcılıq təcrübəsinə malik olurlar.

Onların bu sahədə xidmətləri öz nəticəsini artıq göstərməkdədir. İndi ondan çox poetik düşüncələri ilə, yazdığı kitablarla tanınan müəlliflər ordusu yaranıb.

Bütün yazarlara uğurlar diləyirəm.

## USTA MƏMMƏDHƏSƏN NƏCCAR

Usta Məmməd Həsən Rəhim oğlu Nəccar 1837-ci ildə Qızılağac kəndində anadan olmuşdur. Atası yoxsul bir kəndli idi. Nəccar mollaxana təhsili almışdı. Gəncliyində dülgərlik sənətini çox sevdiyinə görə özünə "Nəccar" təxəllüsünü götürmüşdür. (mənşəcə "Nəccar" sözü ərəbcə dülgər, xarrat deməkdir). Nəccar şair kimi tanınsa da ömrünün sonuna qədər pərəstiş etdiyi dülgərlik sənətindən ayrıla bilməmişdir. Məhz buna görə o ədəbi məclislərdə "Usta M.Həsən Nəccar" adı ilə tanınmışdır. Nəccar Lənkəranda "Fövcül-Füsəha" ədəbi məclisinin ilk üzvlərindən biri olmuşdur. Bu ədəbi məclisin şagirdlərindən olan Usta Hüseynqulu Şuri bununla əlaqədar şeirlərin birində yazır:





"Qasiru, Səid, Acizu, Fəttah ilə Nəccar Sadiqu, Əziz-cümləsi fövcül-füsəhadır". Nəccar gəncliyində atası ilə Qızılağacdan Lənkərana köçmüş, burada məşhur nəccarların yanında şagird işləmiş və bu sənətin incəliklərinə yiyələnmişdir. O, Lənkəran şəhərindəki məscidlərin taxta işlərini görmüş və Mirəhməd xanın malikanəsində dülgərlik etmişdir. Nəccar Lənkəran qəzasında məşhur bir xarrat kimi tanınmışdır. Sənəti ilə əlaqədar olaraq xalqla həmişə yaxından təmasda ola bilmişdir. O, rəiyyətin həyat və məişətini əks etdirən satirik şeirlərinin birində deyir:

***"Bu təqsirlər bilmirəm kimdədir.***
***Rəiyyətdə, yainki hakimdədir***
***Qaranquş yuvası kimi tiksən ev***
***Səni axtarırlar bütün evbəev***

***Əgər xiştxamdan tikə birisi***
***Yəqin bil boğazdan çıxar dərisi.***
***Birisi qamışdan çəkə bir hasar***
***Yığılıb hamısı başından basar.***

Usta M.Həsən Nəccar ədəbi məclisdə gözəl qəzəllər, mürəbbe və satirik şeirlər müəllifi kimi tanınmışdır. Nəccar M.Qasirlə yaxın dost olmuşdur. Nəccarın ilk tətqiqatçısı olan respublikamızın əməkdar müəllimi MirHaşım Talışlı Lənkəranda çıxan "Leninçi" qəzetinin 2 dekabr 1962-ci il tarixli sayında Nəccar haqqında ilk dəfə məlumat vermişdir. M.Talışlı bu barədə yazır: "O vaxt şairin oğlu Usta Rəhim sağ idi. Mən ondan atasının öz əli ilə yazdığı şerlərindən ibarət kiçik

bir dəftərçə aldım. Şair haqqında dəqiq və maraqlı məlumatları həm bu dəftərçədən, həm də oğlu Usta Rəhimdən öyrənmişəm". Bu gün M.Talışlının şəxsi arxivində M.Nəccarın yaradıcılığına dair nümunələr saxlanılır. Lakin Nəccarın şeirlərinin çox hissəsi müxtəlif səbəblərdən itib-batmışdır. M.Nəccar 1917-ci ildə Lənkəran şəhərində vəfat etmişdir. 1987-ci ildə "Yazıçı" nəşriyyatı tərəfindən çapdan çıxmış "Poetik məclislər" kitabında "Fövcül-füsəha" ədəbi məclisinin tanınmış şairləri haqqında qısa məlumatlarla yanaşı onların yaradıcılığından nümunələr də verilmişdir. Nəccar haqqında (səh 103-104) verilən bioqrafik məlumatlarda səhvən şairin doğulduğu yer Qızılacağ kəndi deyil, Lənkəran göstərilmişdir. Bununla yanaşı burada şairin anadan olduğu tarix də səhv verilmişdir.

Nəccar 1917-ci ildə 80 yaşında vəfat etmişdir. Deməli şair kitabda səhvən verilən 1819-cu ildə deyil 1837-ci ildə anadan olmuşdur. Fikrimizin sonunda M.Talışlının şəxsi arxivindən əldə etdiyimiz M.Nəccarın öz lətafətini bu gün də saxlayan bir qəzəlini oxuculara çatdırmaq istəyirəm.

*Bilməm nə etmişəm yenə mən yarə təzədən,*
*Məndən küsübdür, ram olub əğyarə təzədən.*
*Ərz eylədim təbibə ki Allah rizasına,*
*Bax görginən nə olub bu bimarə təzədən.*

*Tutdu təbib nəbzimi, fəryad edib dedi:*
*Eşqə düşüb, haray, bu biçarə təzədən.*
*Yusif cəmalınam, məni salma bu möhnətə.*
*Qorxum budur ki, mən çəkiləm darə təzədən*





*Gəldi bahar, açdı gülü Laləzarlar,*
*Şurə gəlibdu, bülbülü-gülzarə təzədən.*
*Axır o nazlı canına qurban olum sənin*
*Təcil elə, yetir özünü yarə təzədən*
*Al canımı, qurtar məni dərdi fəraqidən,*
*Bir busə lütf eylə bu Nəccarə təzədən.*

## SƏMƏD QƏRİB

Səməd Qərib (Səməd Hüseyn oğlu İmanverdiyev), əsrin sonu və XX əsrin əvvəllərində yaşayıb-yaratmış şairlərimizdəndir. O, Bakının Çəmbərəkənd deyilən yaşayış məntəqəsində təxminən 1886-cı ildə anadan olmuşdur. Erkən yaşlarında dini təhsil almaqla bərabər, şeirlər yazmağa başlamış, poeziyaya xüsusi maraq göstərmişdir. XX əsrin əvvəllərində Bakıda neft sənayesində çalışan fəhlələrin ağır vəziyyəti, şəhər zəhmətkeşlərinin məşəqqətli həyatı Səməd Qəribi mübarizəyə sövq etmiş və qohumlarının dediyinə görə böyük qardaşı Əliheydərlə şəhərdə dəfələrlə "şuluqluq" etdiyinə görə çar çinovniklərinin təkidilə Qızılağac kəndinə uzunmüddətli sürgünə göndərilmişdir. O ömrünün sonuna kimi Qızılağacda yaşamış, burada bərbərlik etmiş, şair qəzəlxan kimi tanınmışdır. Onun "Qərib" təxəllüsünü qəbul etməsi, sürgün olunması, qürbətdə yaşaması ilə bağlıdır. Biz S.Qəribin əlimizə keçən şeirlərindən bunu bir daha duyuruq. Onun qəzəllərində Bakı həsrəti, zəmanədən şikayət, bədbinliklə dolu motivlər aydın nəzərə çarpır.

S.Qərib qəzəllərinin birində deyir:

*Fani dünyada, yarəb, olmadı bu xəstə könlüm şad*
*Həmişə eylədim əfğan, dərd əlində dad.*
*Üzüm gülməz, ürək xəndan ola asudə zülmətdən*
*Müsibətlər çəkən canım edər bu qüssədən fəryad...*

S.Qəribin peşəkar qəzəlxan olması şəksizdir. Məhəbbət mövzusunda olan qəzəllərində o, klassik ədəbiyyatımızın özündən əvvəlki tanınmış nümayəndələrinin ən yaxşı ənənəsini davam etdirməklə bərabər, fərdi yaradıcılıq üslubuna də sadiq qalaraq orijinallığı, öz dəsti-xətti olmuşdur.

Səməd Qəribin Bakıda çoxlu şair dostları var idi. Xüsusilə Əliağa Vahid və Mirzə Əli Möcüz, Səməd Qəribin ən yaxın dostları olmuşdur və onlar dəfələrlə Qızılağaca gəlmiş, S.Qəriblə görüşərək onunla əlaqə yaratmışlar.

Xalqımızın istedadlı oğlu S.Qərib 1928-ci ildə Qızılağac kəndində vəfat etmişdir.

Nəql olunur ki, acı taleyindən gileyli olan şair vəfat edərkən yaxın qohumlarından xahiş edir ki, onu kənd qəbristanlığının girişindəki yolun üstündə dəfn etsinlər. Bu işin münasib olmaması və gələcəkdə onun qəbrinin itə biləcəyi söylənildikdə Səməd Qərib bədahətən demişdi:

*"Göyərməz qəbrimin torpağı, yüz min bahar olsa*
*Açılmaz qəlbi məyusun küllü dünya laləzar olsa*
*... Qəribin qəbrini ayaqlar altında qazın, xoşdur,*
*Ayaqlar altında qalsa da dəxi payimal olmaz.*

Şairin vəsiyyətinə əməl olunur.

Təəssüflə qeyd edək ki, bu gün Qızılağac kənd qəbristanlı-





ğının köhnə qapısının girəcəyində olan Səməd Qəribin qəbrini çoxları tanımır. Kənd əhalisi isə vaxtilə bu yerdə yaşamış və ömrünü burada başa vurmuş şairdən xəbərsizdir.

S.Qəribin şeirinin taleyi də özünün taleyi kimi acıdır. Belə ki, onun əsərlərinin çoxu itib-batmış, iyirmidən artıq qəzəli isə respublika Əlyazmalar İnstitutunda saxlanılır. Səməd Qərib adı müasirlərimizə az bəlli olan, irsi unudulmuş şairlərdəndir. Fərəhli haldır ki, Cəfər Rəmzi İsmayılzadə Abşeron torpağında göz açmış şairlərin şeirlərindən ibarət çap etdirdiyi "Deyilən söz yadigardır" (B.1981, səh. 260-264) toplusuna S.Qəribin də qəzəllərindən ibarət nümunələr daxil etmişdir. Bunu yalnız ilk addım kimi qiymətləndirmək olar. Məncə unudulmaz və nakam şairimiz Səməd Qəribin həyat və yaradıcılığı lazımi səviyyədə öyrənilməli, adı isə əbədiləşdirilməlidir.

***Olmaz cahanda eyləyən əfqan mənim kimi***
***Möhlət əsiri, halı pərişan mənim kimi.***
***Bülbül fəqanı tərk elədi, çəkdi güldən əl***
***Çün görməmişdi xanəsi viran mənim kimi.***

***Bir dərdə düşmüşəm, yanıram yoxdu çarəsi.***
***Heç kafər olmasın ürəyi qan mənim kimi.***
***Od tutdu, yandı hicr oduna könlümün quşu***
***Pərvanə ya rəbb olmaya suzan mənim kimi.***

***Dad ey fələk, əlindən olubdur qara günüm.***
***Düş dərdə, tapma dərdinə dərman mənim kimi.***
***Etmə, Qərib nalə qəmi-eşqə, səbr qıl***
***Çox dərdü-qüssə, möhnəti hicran mənim kimi.***

**Haşiyə:** Bu boşluğu aradan götürmək üçün Qulu Vəci oğlu ilə məsləhətləşdik ki, nə edək? Nəhayət qərara gəldik ki, nakam şairin qəbrini müəyyən edib, onu bərpa etdirək. Biz bu haqda söhbətlər aparırdıq. Mən bir gün Qızılağac kənd sakini Əliş Məmmədəli oğlunun hüzr məclisində bu haqda söz açdım. Bu zaman Bakıda yaşayan həmyerlimiz Fərhad Əbülhəsən oğlu qəbirüsütü bütün işlərin görülməsini öhdəsinə götürdü. Səməd Qərib ana tərəfdən onun qohumudur. Allaha çox şükürlər olsun ki, bu xeyirxah iş yaxşı insanların köməyi nəticəsində tamamlanıb başa çatdırıldı. Başdaşına isə şair Qulu Vəcioğlunun Səməd Qəribə həsr etdiyi "Vəsiyyət" şeirindən aşağıdakı bir bəndi yazdırdıq:

***Qəbrin qazılsa da ayaqlar altda,***
***Sən unudulmayıb yenə var oldun.***
***Yazıb yaratdığın getmədi bada.***
***Şair, nəsillərə yadigar oldun,***
***Sən unudulmayıb yenə var oldun.***





## HACI MƏHƏMMƏDNƏSİR QULAMHÜSEYN OĞLU

***Bilin ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər***



Allah insanı öz istəkli bəndəsi xəlq edib. İnsana həyatda öz köməkliyini göstərməklə onu kamil bir insan kimi görmək istəyir. Lakin insanların hamisi bu üstünlüyə nail ola bilmirlər. Ola bilməməyin də səbəbi dünya məhəbbətinin onun qəlbində yer tapmasıdır. Elə insanlar da var ki, onlar dünya yaşayışından faydalanmaqla axirəti üçün çalışır. Bu xüsusiyətli insanlara həmişə həyatda qibtə olunub və olunacaqdır.

Hansı sənət sahibi olmaq əsas deyil. Hansı işi görmək əsasdır. İş var insanı həmişə xatırladar, sahibinə başucalığı gətirər. Sahibinə xeyir bəxş edər.

Bu əlamətlər hər hansı bir insanda varsa onun varlığı, həyatı, davranışı başqaları üçün ülgüdür. Elə insanlardan biri də Hacı Məhəmməd Nəsir QulamHüseyn oğludur. O, 1931-ci ildə Nərimanabad qəsəbəsində Qızılağaclı Qulamhüseyn Məhəmmədhüseyn oğlunun evində dünyaya bəxş göz açıb.

Qulamhüseyn ailəsinə Məhəmmədin gəlişi sevinc, baş ucalığı, şöhrət gətirdi. Əvvəllər heç kəs fikirləşməzdi ki, öz

əməyi, səyi, bacarığı ilə öz yaşıdları içərisində fərqlənən Məhəmməd Qulamhüseyn oğlu bu böyüklükdə şöhrət çələngini əcdadının və özünün başına qoyacaq. Sən demə soy kökünə, vətənə, ata-baba yurduna qəlbən bağlı olan Məhəmməd buna nail olacaqmış. Bu da Allahın insana olan mərhəmətindən və lütfündəndir. Kiçik yaşlı Məhəmmədin uşaqlıq illəri çox acınacaqlı, sıxıntılı olsa da, o heç vaxt tanrının qismət payından umudunu kəsməmişdir. Atası Qulamhüseyn müharibə meydanlarında düşmənə qarşı vuruşanda balaca Məhəmməd də doğmalarına isnişmiş, onların nəfəsini duymuşdur. İllər keçdi, Məhəmməd həyata müstəqil qədəm qoydu. O, peşə məktəbinə daxil oldu. Peşə məktəbində məktəb müəllimlərinin tədris etdikləri fənləri layiqincə öyrənməyə səy göstərdi. İki ilə oxuduğu peşə onun dolanışığı üçün təmin edici təsir bağışladı. Kiçik qardaşına da himayədar oldu. 1950-ci ildə ordu sıralarına çağrıldı, hərbi təlim-məşq proseslərində iştirak etdi. Hərbin sirrlərin öyrəndi. Üç ildən sonra ordu sıralarından tərxis olundu. Öz ixtisası üzrə işləməyə başladı, ailə həyatı qurdu, tanrı ona bəxş etdiyi övladlara ata oldu. Övlad təlim-tərbiyəsi ilə müntəzəm məşğul oldu. Özü isə ixtisasını artırıb mühəndis olmaq istəyirdi. Bu istək onu 1970-ci ildə Astarxan şəhərindəki Balıq texnologiya institutuna apardı. Həmin institutun Energetika fakultəsinə daxil olub, 1976-cı ildə oranı bitirərək mühəndis-energetik ixtisasına yiyələndi. Ali təhsilli Məhəmməd öz ixtisasının kamil bilicisi kimi ətraflarda məşhurlaşdı. Mənəviyyatında yer tapan xeyirxahlıq hissləri özünü biruzə verdi. Çalışırdı ki, həmişə başqalarına kömək əlini uzatsın. "Əl tutmaq Əlidən qalıb" kəlamı onun həyat amalı olduğu üçün bütün varlığı ilə xalqa xidmət etməyə həmişə ha-





zır olduğunu biruzə verirdi. Gözəl səsə malik Məhəmməd Azərbaycan muğam janrına dərindən bələddir. Onun hərdən yavaş-yavaş zümzümə etməsini görənlər də bunu təsdiqləyirlər. O həmçinin uzun müddət mərsiyəxanlıq etmiş, Əhli-beyti vəsf edən mərsiyələri özünə məxsus ahənglə oxumuşdur. İnsan bağlı, sirli bir aləmdir. Onun sirri gizli olsa da belə, həmin sirr birdən aşkar olur. Sahibinə başqalarından məhəbbət oyadır. Şair-qəzəlxan, mühəndis Hacı Məhəmməd Nəsir həqiqətən bağlı boğça timsalında imiş. Onun "Haqqın səsi" kitabı işıq üzü görəndən sonra Hacı Məhəmməd dünyası aşkar oldu. Sən demə qəlbi məhəbbət hissləri ilə döyünən Hacı Məhəmməd ürək sözlərini şairanə vəsflə tərənnüm etmiş, qələmə almışdır...

Hacı Məhəmməd şəxsiyyətinin bir titulu da xeyriyyəçilikdir. Onun xeyirxahlığını saymaqla qurtarmaq olmur. Bəzilərini sadalamamaq insafsızlıq olardı. Ona görə ki, bəlkə başqaları onun işindən ibrət götürəcək, onlar da xeyirxahlıq çələngini sinəsinə taxacaqlar. Hacı Məhəmmədin Nərimanabad qəsəbəsində Məscid tikməsi, qəbristanlıq ətrafını öz hesabına mişar daşından hasara alması işləri xeyirxahlıq qığılcımları idi. Allah yolunda xidmətlərini, ilahi evinin ziyarətində olması ilə həmahəngləşdirmək istəyirdi. Bu istək 1997-ci ildə həyata keçdi. Məhəmməd öz həyat yoldaşı mehriban və qayğıkeş ana olan Maisə xanımla birgə Allah evinin ziyarətində oldular. Hacılar doğma Nərimanabadda böyük təntənə ilə qarşılandıar. Hacı Məhəmməd gördüklərin tərənnüm edərək pişvaza gələnlərə xəbər verdi. Onun şairlik istedadının xəbərçisi isə 2001-ci ildə işıq üzü görən "Haqqın səsi" kitabı oldu. Kitab əldən-ələ, şerləri isə dildən-dilə gəzdi. Hacı Məhəm-

məd poeziyasının qayəsi ana torpağa məhəbbət, insanlığa hörmət, insanlara hürriyyət bəxş edir. Onun yazdığı "Qızılağac" şeiri ata-baba yurduna məhəbbətinin tərənnümüdür. O məhəbbətin ki, o soy kökə bağlıdır. Şair "Qızılağac" şeirində:

*Ey ağalar, bir fikir var könlümdə,*
*Yadıma düşübdür adı kəndimin,*
*Adı Qızılağacdır, torpağı boldur,*
*Qəlbimdən getməyir dadı kəndimin.*

*Xəzərin sahili, Viləşin sonu,*
*Bahar vaxtı geyib yam-yaşıl donu,*
*Xəlqi türk soyludur, təmizdir qanı,*
*Boldur əti, quşu, yağı kəndimin.*

*Bir neçə qəbilə yaşayır orda,*
*Kəndini qoymazlar heç zaman darda,*
*Qonağa hörmət var hər zaman orda,*
*Toylu-mağarlıdır günü kəndimin.*

*Orda yaşamışdır Qızılağac xanı,*
*Bu fikri öyrənib-yazanı hanı?*
*Allah bəxş eləsin belə oğlanı,*
*Yazsın tarixini bir gün kəndimin.*

*Köküm Abışlıdır, soyum Nəsirli,*
*Məhəlləm batırlı, əlim gəlirli,*
*Çıxsa ov etməyə Qızılağac əhli,*
*Çoxdur ov etməyə yeri kəndimin.*





*Alçalı, Cınqırlı, Muradxanlısı,*
*Bəllidir bizə də Qərəymanlısı,*
*Bəylər məhəlləsi adlı-sanlısı,*
*Vardır təmiz eli, yurdu kəndimin.*

*Sovet quruluşu dağıtdı kəndimi,*
*Yarandı bir yerdə Port-İliç kəndi,*
*Biz köçdük Sarıya, onda ada idi,*
*Hər yanı dağıldı xəlqi kəndimin.*

*Qızılağac qoruğu dünyada məşhur,*
*Toxuna bilməyib ona heç bir qurd,*
*Analar doğurlar pələng tək oğul,*
*Qeyrətin qoruyub daim kəndimin.*

*Veribdir Vətənə çoxlu zabitlər,*
*General, polkovnik, həm də şəhidlər,*
*Alimi, yazarı çoxdu, ay ellər,*
*Fəxri yaraşığı adı kəndimin.*

*Xəzərə körpüdür, sahili boldur,*
*Çəkilən oradan mərkəzi yoldur,*
*Vətən torpağıdır, məhsulu boldur,*
*İndi uzaqdadır yolu kəndimin.*

*Nəsir deyir: biz dağıldıq hər yana,*
*Lənət olsun bizi yurdsuz qoyana,*
*Qurban olum bu tarixi yazana,*
*Qoy yaşasın daim adı kəndimin.*

- deyərək, Qızılağaca olan məhəbbətini bir daha izhar edir.

Hacı Məhəmməd poeziyanın vurğunudur. Bədahətən dediyi qəzəllər və şeirləri eşidəndə onun dediklərini dərk etmək üçün adamı düşünməyə vadar edir. Bir tərəfdən bu yaş həddində olmaqlığı, bir tərəfdən isə axıcılıqla misraları deməyi onun əsil yaradıcı bir şair olduğundan xəbər verir.

Hacı Məhəmməd Nəsirin canlı bir "arxiv" kimi tarixdən, ədəbiyyatdan, digər-digər elm sahələrindən verdiyi xəbərlər onun ensklopedik biliyindən xəbər verir. O, mütaliyəni çox sevir. Mütaliyə etdiyi kitabları dost və tanışlara da oxumağı məsləhət görür, lazım gəldikdə qısa məzmunun söyləyir. Ömrünün ahıl çağında Hacı Məhəmməd Nəsirin dünyagörüşü, dünyaya baxışı, insanlara münasibəti onu yaşıdları içərisində fərqləndirir. Hacı Məhəmməd Nəsir yaşayıb iz qoyan insandır. Onun qoyduğu izlə neçə-neçə insanlar keçəcəklər. Hər keçənlər onu yad edəcəklər. Görəsən, insan üçün bundan yaxşı nə ola bilər? Məncə onun Qızılağac qəbristanlığında tikdirdiyi namazgah xeyirxahlığına bir nümunədir. Namazgahın möhtəşəmliyi, incə zövqlə inşa olmaqlığı xeyriyyəçi insana ölməzlik adıbəxş etmişdir. Hacı Məhəmmədin qəlbində istəkdir ki, onu həyata keçirtdi. Doğma kəndinə namazgahı töhfə verdi.

Elə yerdə ki, o yerin həmişə ziyarətçiləri var. O doğma kəndində mövcud olan qədim tarixli "Sultan Pir" ziyarətgahının yerləşdiyi qəbristanlıqdır. Onun tikdirdiyi möhtəşəm, əzəmətli bina namazgah, ora daxil olan hər bir insana bu sözləri yada salmağa vadar edəcəkdir.





***Əzizim bizim qala,***
***Gəzməyə bizim qala.***
***Gəlmədin özüm qalam,***
***Tikdim ki, izim qala.***


Rasim Nəsirov

Hacı Məhəmməd Nəsir tarixin yaddaşında izini qoydu. İllər, min illər keçsə də belə o iz itməz, Hacı Məhəmməd Nəsir yad edilər.

Hacı Məhəmməd Nəsir türkçülüyə dərindən bələd olan bir ziyalıdır. Azərbaycan klassiklərinin Nizami, Füzuli, Nəsimi, M.Ə.Sabir S.Ə.Şirvani və s. həyat və yaradıcılığından faydalanan bir ziyalıdır. Hacı Məhəmmədin böyük oğlu Rasim (1955-ci ildə anadan olub) əcdadlarının uyuduğu torpağa bağlı olan bir gəncdir.

Onunla söhbət edəndə Qızılağac kəndində boya-başa çatmış bir gənclə elə bilki söhbət edirsən. Onun Qızılağaca məhəbbəti ən güclü məhəbbətdir. O, ali təhsili olan hüquqşünasdır. Qarabağ müharibə veteranıdır. Hal-hazırda Respublika Daxili İşlər Nazirliyinin Polis Akademiyasında müəllim işləyir. Polkovnik-leytenantdır. Ailəlidir. 2 qızı, bir oğlu var. H.M.Nəsirin ikinci oğlu Namiq Nəsirov da ali təhsillidir. (1958-ci ildə anadan olub).


*Namiq Nəsirov*

1980-ci ildə Azərbaycan Neft Kimya İnstitutunu bitirmiş, Astarxanqazprom istehsalat birliyinə işləməyə göndərilmişdir. Orada direktor müavini vəzifəsinədək yüksəlmişdir. 1998-ci ildə Saratov Hüquq Akademiyasını bitirmişdir. Nyu-York və London şəhərlərində ixtisas kurslarında olub. 2002-ci ildən iş adamıdır. Namiq də Qızılağac və qızılağaclılara bağlı olan bir gəncdir. Hacının oğlu Rauf Həştərxan Balıqçılıq İnstitutunu bitirib, Nazim Ryazan Hərbi Avtomobil məktəbini bitirib, hərbçi zabitdir.

Tofiq Murmanski Balıqçılıq sənayesi Akademiyasını və Həştərxan Ali hüquq məktəbini bitirib iş adamıdır. Natiq də ixtisasca mexanikdir, iş adamıdır. Onlar da ata-baba soy-kökünə bağlı olan gəncdirlər. Namazgahın tikintisinin ilk günündən Namik və Rasim Qızılağaca mütamadi gələrək tikintiyə köməklik etmişdilər. 2004-cü ildə may ayında onların sponsorluğu ilə mənim "Qızılağac dünən və bu gün", Hacı Məhəmməd Nəsirin "Haqqın səsi" kitabının təqdimat mərasimi Qızılağac 2 saylı orta məktəbində keçirildi. Həmin təqdimat mərasimindən fraqmentlər Azərbaycan televiziyası (AzTV-1 ) ilə 17 dəqiqə nümayiş etdirildi.





# ŞAHİN MUSA OĞLU ƏBİLOV

***Əməllərin dəyəri onların məqsəd və nəticəsiylə ölçülür***



Ziyalı ailəsində 1963-cü ilin iyul ayının 11-i əlamətdar gün oldu. O gün Musa müəllimin, Həbibə bacının sevincinə qohum əqrəba da şərik oldular. Hamı eşidənlər dünyaya gələn körpəyə görə bu ailəyə göz aydınlığı verirdilər. Ailənin ilk övladı olan bu oğlan uşağına qohum-qonşuların qanı qaynadı, onu əzizlədilər. Uşaq qığıltısı, uşaq çılğınlığı valideynlərə sanki rahatlıq bəxş edirdi. Hər gün dərsdən gələn ata övladına özünəməxsus nəzərlə diqqət edir, onun vəziyyəti ilə maraqlanırdı. Hələ gənc ananın xüsusi qayğı ilə bəslədiyi uşaq günü-gündən böyüyüb boy atırdı. Adı Şahin olduğu üçün bəlkə də şahin təbiətli olmağı oğluna rəva bilərdi. Lakin kiçik yaşlı Şahin məktəbə gedənə qədər bir məktəb də keçmişdi. O məktəb valideynlərinin məktəbi idi. Musa müəllim Şahini öz elmini öyrənməyə (yəni, riyaziyyatçı olmağa) istiqamətləndirirdi. Şahin 1970-ci ildə qonşu Kalinovka kənd orta məktəbinin I sinfinə qəbul

edildikdə öz sinif yoldaşlarından bilik və əxlaqi keyfiyyətləri ilə fərqləndi. Məktəb illərində Şahin böyük çalışqanlıq göstərdi. Bəlkə də bu gələcəkdə onun qazanacağı uğurlar üçün zəmanət idi. Hər gün məktəbdən evə gələn Şahin günorta yeməyini yeyəndən sonra müxtəlif fənn dərnəklərinə gedərdi. Gün ərzində müəllimlərindən əldə etdiyi biliyi artırmaqla yanaşı, zehni yorğunluğu aradan qaldırmaq üçün musiqi ilə də məşğul olurdu. Öz fəaliyyət dərnəyinin qarmon, tar, skripka bölmələrində fəal iştirak edərdi. Artıq Şahin göstərilən çalğı alətlərində xalq musiqisi və muğamatlarını sərbəst ifa edirdi. 1980-ci ildə Kalinovka kənd orta məktəbini əla qiymətlərlə başa vurub müstəqil həyata qədəm qoydu. Həyatda qədəmin mübarək olsun gənc məzun. Musa müəllim və Həbibə ana oğlanlarına hansı ixtisasa yiyələnmək istəyirsən? - deyə, müraciət etdilər. Orta məktəbdə bütün fənlərdən əla qiymət alan Şahin suala fikirləşmədən cavab verdi. Mən də babam Məşədi Yusifin sənətinin davamçısı olmaq istəyirəm. Burada deyiblər, könül sevən göyçək olar. Orta məktəb məzunu Əbilov Şahin Musa oğlu elm mərkəzi olan Bakı şəhərinə gəldi. Sənədlərini N.Nərimanov adına Tibb İnstitutunun Müalicə-profilaktika fakultəsinin qəbul komissiyasına təqdim etdi. Deyirlər dövlətdə dəvə, övladda nəvə. Qayğıkeş ailə başçısı olan babası Məşhədi Yusifin xidmətinə Şahin təşrif buyuranda baba onu can kimi bağrına basdı. Hal-əhval tutdu. Sonra dedi: Şahin, bala, çoxdandır səni görmək üçün burnumun ucu göynəyirdi. Nə yaxşı ki, gəldin. Şahin həmişə baba qayğısı duyurdu. Öz fikrini babasına bildirdi. Sənədlərini instituta verdiyini dedi. Babası ona uğurlar dilədi. Avqustun birində ilk imtahan verən Şahin əla qiymət aldı. Əla qiymət almasını da-





yıları Yunis və Zəkəriyyə, xalası Həqiqət, böyük nənəsi təbrik etdilər. Avqustun 22-də tələbə bileti ilə Qızılağaca gəldi, Ata və anası ilə birgə qohum-qonşular da onu təbrik etdilər. Sentyabrın birində institutun giriş qapısından daxil oldu. 1987-ci ildə institutu müvəffəqiyyətlə bitirib ali təhsilli həkim diplomu ilə çıxdı. Təyinatla Biləsuvar rayon Mərkəzi xəstəxanasının "Təcili Yardım" şöbəsinə həkim göndərildi. Həmin ildən 1991-ci ilədək həmin xəstəxananın təcili yardım şöbəsinin müdiri vəzifəsində çalışıb. 1988-ci ildə İran İslam Respublikasına ezam olunub və həkimlik fəaliyyətinə başlayıb. Azərbaycandan gələn gənc həkimə İrandan çoxlu sayda xəstələr müraciət etdilər. Həkimdən gördükləri mərhəməti və xidməti iranlılar yüksək qiymətləndirdilər. İşgüzarlığı və bacarığını yerindəcə qiymətləndirilib. Gilan ostanın xarici işlər idarəsi və səhiyyə idarəsi onu diplomla təltif edildi. Ezamiyyət müddəti qurtardıqdan sonra doğma Bakıya qayıtdı. 1991-ci ildə Bakı şəhərindəki Qədirli adına Hövzə xəstəxanasının Diaqnostika şöbəsinin Ultra səslə müayinə həkimi təyin etdilər. Orta məktəbdə olduğu kimi, institut özfəaliyyət dərnəyində fəal iştirak etmişdir. 1990-cı ildən baş qaldıran Qarabağ müharibəsi şair, bəstəkar, həkim olan Şahinin də ağrıyan yeri oldu. Vətən müdafiəsinə gedən əsgərlərdə əzmkarlıq, mətinlik, mübarizlik hisslərini gücləndirmək üçün yazdığı "İgid əsgər möhkəm dayan" hərbi vətənpərvərlik mahnısının sözləri və musiqisi də Şahin Musa oğluna məxsus idi. Həkim Şahin 1992-1994-cü illər I Qarabağ savaşına getdi, müharibədə iştirak etdi. Döyüş meydanında yaralananlara öz şəfalı əlini uzatdı. Ön mövqedə olanları isə yazdığı hərbi vətənpərvərlik mahnılar ilə ruhlandırırdı.

Həkim Şahin Musaoğlu az vaxt içərisində çoxlu sayda mahnılar yazdı. Şahin Musa oğulunun yazdıqları Şəmistan Əlizamanlınıngözəl ifasında qəlblərə nüfuz etdi.

Şahin Musa oğlunun yazdığı mahnılardan "İgid əsgər möhkəm dayan" əsəri orta məktəbin 4-cü sinif "Ana sözü" dərslik kitabına salınmışdır.

"İgid əsgər möhkəm dayan", "Cənab Leytenant", "Səma Şahinləri", "Əsgər marşı", "Birinci batalyon", "And içirik", "Çağırır Vətən", "İstiqlal marşı" əsərləri Müdafiə Nazirliyi Silahlı Qüvvələrinin Şəxsi heyətinin mənəvi psixoloji toplumuna salınmışdır. (səh 82-96). Şahin Musa oğlu "İgid əsgər möhkəm dayan" şeirlər kitabının müəllifidir.

Şahin Musa oğlu dövri mətbuatda şeirləri və publisistik yazıları ilə tanınmışdır. 30 (otuzdan çox) hərbi vətənpərvərlik mövzusunda yazdığı mahnıların sözlərinin və musiqisinin müəllifidir. 12 mahnısı Azərbaycan Teleradiosunun "Qızıl fond"undadır. Jurnalistlər birliyinin və Azərbaycan Yazıçılar birliyinin üzvüdür. "Tibbi xəbərlər" jurnalının baş redaktorudur. Gənc həkim, bəstəkar, şair Şahin Musa oğlu öz işinin mahir bilicisidir. İşlədiyi Xəzər Hövzə xəstəxanasında bacarıqlı həkim kimi tanınır. Şair, bəstəkar Şahin Diaqnostika cihazlarının mahir bilicisi kimi respublikada tanınmış həkimdir. Şahin babası, dayısı kimi xəstələrə nümunəvi xidmət göstərməklə tanınır. Şahin həm də gözəl ailə başçısıdır. İki övlad atasıdır. Biz həmişə efirdə Şahin Musa oğlu adın eşidəndə nə isə yeni bir mövzu ətrafında danışacağına əminik. Qədim Qızılağac torpağının ətrini duyub, o torpaqda boya başa çatıb. Yaradıcılıq amalı uğrunda var qüvvəsi ilə çalışan Şahinə uğurlar diləyir, ona yeni-yeni nailiyyətlər arzulayırıq. Unikal





ölçüyə malik olan həkim Şahin Musa oğluna biz Qızılağaclılar böyük ümidlər bəsləyirik. Çünki Şahin Musa oğlunun nail olduğu sahələr həmişə insanlara böyük xeyir bəxş edir. Elə isə mən də deyirəm: Çox hörmətli Şahin Musa oğlu, əlindən gələn işlərin həyata keçirilməsində sənə uğurlar diləyirik.

Sənin gələcəkdə yaradıcılıq sahəsində böyük uğurların bir qızılağaclı kimi hamının sevinci və uğurlarıdır. Şəfalı əlindən neçə-neçə xəstələr şəfa, qələmindən çıxan yazılarla isə neçə-neçə qəlblərə yol tapır. Sənə yeni zirvələrdə fateh olmağı arzulayıram.

# MƏŞHƏDİ ALLAHVERDİ HÜSEYN OĞLU ZEYNALOV

*Elə söz var ki, zərbədən daha təsirlidir.*



Allahverdinin həyat tarixçəsinə poeziya vasitəsi ilə bələd olanlar çoxdur. O, tanınmaq üçün yox, tanıtmaq üçün yazan şairlərdəndi. O yerləri tanıdır ki, o yerlərin müxtəlif növ barlı-bərəkətli nemətləri var. O yerləri tanıdır ki, o yerlər gözəl təbiət mənzərəsinə malikdir... Şair Allahverdi Alovlu öz poetik düşüncələri ilə oxucunu düşündürən şairdir. Ömrünün ahıl çağında yazıb-yaratmaq eşqilə qəlbi döyünən qələm sahibi Allahverdi Alovlu 1933-cü ildə Qızılağac kəndində kəndli ailəsində anadan olmuşdur. 1941-ci ildə Qızılağac natamam orta məktəbinə daxil olmuş, 1948-ci ildə həmin məktəbi əla, fərqlənmə şəhadətnaməsi ilə bitirib, həmin ildə Masallıda 1 saylı orta məktəbə daxil olmuşdur. 1952-ci ildə həmin məktəbi əla qiymətlə bitirərək Azərbaycan Sənaye İnstitutuna daxil olmuşdur. 1957-ci ildə həmin institutun qazın, neftin daşınması, saxlanması, nəqli və istismarı üzrə mühəndis mexanik ixtisasına yiyələnmişdir. 1957-ci ildə təyinatını Əzizbəyov rayonunda Qaz idarəsinə veriblər. Həmin idarədə az vaxt müddətində rəis vəzifəsinə təyin edilmişdir. Həmin ildə Sov. İKP-nin sıralarına qəbul olunmuşdur. 1959-cu ildə Kommunal Təsərrüfat Nazirliyinin göstərişi ilə onu Lənkəran şəhər Qaz İstismar İdarəsinə rəis vəzifəsinə təyin edirlər. Həmin vaxtlarda cənub zonasında qaz haqqında heç bir anlayış yox idi. İdarəyə rəis təyin edilən gündən gənc mühəndis xüsusi kurslar təşkil edir, qaz sənayesində işləmək üçün sənətkarlar yetişdirir. Gənc mühəndis idarə müdiri A.Zeynalov qonşu Puşkin (indiki Biləsuvar), Cəlilabad, Masallı, Lerik, Yardımlı və Astara rayonları üzrə şöbələr yaradır. 1968-ci ilə kimi həmin vəzifədə işləmişdir. İran İslam Respublikasından Azərbaycana qaz verilməsi ilə əlaqədar olaraq Lənkəranda 4 saylı Qaz Tikinti Quraşdırma İdarəsi yarandı. A.Zeynalovu bacarıqlı mütəxəssi kimi həmin idarəyə rəis təyin edirlər.





O, 1972-ci ilə kimi həmin vəzifədə işləməklə Masallı, Astara, Lənkəran rayonlarında qazlaşdırma işini başa çatdırmış, rayonların əhalisinin mavi qazdan istifadə etməsinə nail olmuşdur. 1972-ci ildə Moskvaya tabe olan cənub magistral qaz kəmərləri idarəsində şöbənin rəisi, qaz xəttinin paslanmaya qarşı mühafizəsi üzrə rəis, 1977-ci ildə Port-İliç qəsəbəsində yerləşən Lənkəran rayon Qaz İstismar İdarəsinin rəisi vəzifəsinə təyin edilir. 2002-ci ilə kimi bu idarəyə başçılıq etmiş, 2002-ci ildə təqaüdə çıxmışdır.

O, işində heç bir nöqsanlar olmadan, təhsil müddətilə birgə Qaz sənayesi sahəsində 50 illik təcrübəyə malikdir. Əmək veteranıdır.

İndi YAP-ın üzvüdür.

Mühəndis A.Zeynalov yaradıcı ziyalılardan biridir. Onun dövrü mətbuatda yazdığı şerlər mütəmadi dərc etdirilirdi. Artıq yaradıcılığı ilə fərqlənən Allahverdi Alovlu məhsuldar şairlər cərgəsində öz yerini görürdü. Odur ki, 1980-ci ildən onun yaradıcılığının carçısı olan şerləri çoxları əzbərləmiş, şairin əməyinə oxucular qiymət vermişlər. 1989-cu ildə ilk kitabı nəşr edildi, kitab uşaqlar üçün yazılmışdı. "Alim şahmat oynayır" kitabı kiçik oxucuların sevincinə səbəb oldu. Həmişə ana qayğısı duyan şairin 1992-ci ildə ikinci kitabı - "Ana qəlbi" nəşr olundu. 1993-cü ildə "Haqqın qılıncı", 1999-cu ildə "Yüz yaşa azdır, min yaşa azdır Azərbaycanda", 2002-ci ildə "Sənin tək məni sevən hanı?", 2004-cü ildə "Eşq oldu, sevgi oldu, Sevda oldu əməyim", 2005-ci ildə "Ürəyim görünməyir hələ çoxuna" kitabları işıq üzü gördü. Hal-hazırda səkkizinci kitabı "Cəsur insan" romanı üzərində işləyir" roman həmyerlisi Qulam Məmmədovun həyatından bəhs edir.

Şair şeriyyatında vətəni, anadan olduğu kəndi, yaşadığı Lənkəranın təbiət lövhələrini vəsf edir. Ona bu sahədə ilham bəxş edən xaliqini də tərənnüm edir. İnsanları Allahın varlığına sövq edir.

*Allahın adı ilə başladım, işə*
*Gecə-gündüz sığındım mən o günəşə.*
*Allah verdiyi can heç vaxt sola bilməz,*
*Allah verdiyini heç kəs ala bilməz.*





*Onun varlığından ürəyim alıb nur*
*Yeri, göyü, günəşi yaradan odur.*
*Odur qoca qəlbimə qüdrət verən*
*Odur kor gözlərimə düz yol göstərən.*
*Allahın qüdrəti ağlasığmazdı inan*
*Tək odur bizlərə ürəkdən, candan yanan.*
*Onu dərk etməz ağıldan kəm, nitqi lal*
*Gözə görünməzdi, buvarlıq cəlal.*
*Allahdan başqa Allah yoxdur, bunu bil,*
*Danış deməsə, danışmaz ürək dil.*
*Ey insan! O vardı sən qəbul et, inan!*
*Yaddan çıxarma gəl, onu, sən heç zaman.*
*Ürəyimə güc, ilhamı verən odur*
*Alovlunu şeirə gətirən odur.*

## QULU VƏCİ OĞLU MƏMMƏDOV

***İnsanın bütün kamalı dini öyrənmək acı hadisələr qarşısında səbirli olmaq və güzəranının ölçüsünü saxlamaqdır***



Dünyada hər kəs bir ömür yaşayır. Gərək ömür payını elə yaşayasan ki, ötən illərə nəzər saldıqda təəssüflənməyəsən. Həyatda faydalı ömür sürdüyünü hiss edib ürəkdən sevinəsən. Doğrudan da hər bir ömrün görünən və görünməyən tərəfləri vardır. Şair Qulu Vəcioğlunun da ömrünə nəzər salsaq görərik ki, həyatının görünən tərəfi onun sadə tərcümeyi-halıdır. Ömrünün görünməyən tərəfi isə onun ömürlüyü olan şeirlərdir. Q.Vəcioğlunun şeir dünyası ilə tanışlıq onu gözümüzdə ucaldır, bizə daha doğma edir.

Qulu Vəcioğlu (Məmmədov Qulu Vəci oğlu) 1947-ci ildə Masallı rayonunun Qızılağac kəndində anadan olmuşdur. 1956-1965-ci illərdə orta məktəbdə oxumuşdur. 1965-ci ildə Azərbaycan Kənd Təsərrüfatı İnstitutuna daxil olmuş və 1970-ci ildə İnstitutu bitirərək mühəndis ixtisası almışdır. Ordu sıralarında hərbi xidmətdə olmuşdur. 1970-1973-cü illərdə sovxozda mühəndis kimi əmək fəaliyyətinə başlamışdır. 1973-cü ildən isə Masallı rayon kənd təsərrüfatı və rayon aqrar sənaye birliyində baş mühəndis vəzifəsində çalışmışdır.





1999-2004-cü illərdə ilk Qızılağac Bələdiyyəsində sədr müavini işləmişdir. Dövri mətbuatda bir sıra şeirləri çap edilmişdir. İlk şeiri tələbəlik illərində institutun "Kadr uğrunda" qəzetində dərc olunmuşdur.

Q.Vəcioğlu "Ürəyimin ağrıları", "Yolum" və "Şanlı ömürdən notlar" şeir kitablarının müəllifidir. Onun ilk şeirlər kitabı olan "Ürəyimin ağrıları" 2001-ci ilin yanvarında "Kür" nəşriyyatında işıq üzü görmüşdür.

"Yolum" və "Şanlı ömürdən notlar" kitabları isə "Adiloğlu" nəşriyyatında nəşr olunmuşdur. Ailəlidir. Bir qızı, bir oğlu var. Həyat yoldşı Salayeva Balabəyin Məmmədbağır qızı S.Xəlilov adına Qızılağac kənd 1 saylı orta məktəbdə dil-ədəbiyyat müəllimi işləyir. Ali kateqoriyalı müəllimdir.

Qızı Məmmədzadə Həbibə Bakı Dövlət Universitetinin filologiya fakültəsini bitirmişdir. Hazırda Bakıda yaşayır. Oğlu Məmmədzadə Araz kənd təsərrüfatı işində çalışır. "Nərgiz" kəndli-fermer təsərrüfatının üzvüdür.

Şair Qulu Vəcioğlu ömrünün dövlətimizin müstəqil dövrünə aid yeni bir dünyasını yaşayır və yaradır.

Qızılağac kəndinin sakinləri içərisində özünəməxsus mövqeyi olan bir ziyalıdır. Onun islami bilikləri öyrənməyə marağı öz səmərəsini vermişdir. İndi o, Quran oxumaqla mənəvi paklığa sahib çıxmışdır.

Biz də ona yeni-yeni sənət uğurları və sevincləri diləyirik.

Azərbaycan xalqının mənəvi sərvəti sayılan xalq musiqisi və muğamları hər bir Azərbaycanlı üçün həmişə doğmadır. Əsrlərin min ilərin süzgəcindən keçən saf-büllur kimi şəffaf olan musiqi xəzinəmizin müxtəlif çalarlarından bəhrələnənlər onu yaşatmış, bu günkü günə gəlib çıxmasında musiqiçilərin böyük zəhməti sayəsində mümkün olmuşdur.

Qızılağac kəndi keçmiş zamanlarda xalq musiqimizin incisi olan muğam və mahnı bölmələrini öz məharətli səsi ilə ifa edən çoxlu el sənətkarı yetişmişdir. Onlar klassik Azərbaycan Muğam ifaçılarının yolunu davam etdirərək xalq musiqimizi öz məlahətli səsləri ilə ifa etməklə geniş dinləyici kütləsinin rəğbətini qazanmışlar.

Onlardan Məşhədi Mirzə Xəlil,Bağı Ələkbərov, Qulamhüseyn Məhəmmədhüseyn oğlunu göstərmək olar. Onların yaşadığı dövrdə ən məşhur muğam ifaçısı Seybətinli Mir İslam Rəfiyev muğam sahəsində böyük şöhrət qazanmışdır. Odur ki, bu üç musiqi sevərlər, muğam bilicisi Mir İslamdan bir ustad kimi istifadə etmişlər. Mir İslamın rəhbərliyi altında onlar muğam ifa tərzinin incəliklərinə nüfuz etmişlər. Sonradan özləri ayrı-ayrılıqda mahir ifaçı kimi şöhrətlənmişlər. Ecazkar səsə malik olan bu üç muğam biliciləri haqqında söhbət edən öz dövrünün yaşıdlarından keçmiş qocalar deyərdilər: Bağının, Qulamhüseynin, Mirzə Xəlilin hərəsinin musiqi aləmində öz yeri vardır. Bağı, Qulamhüseyn, Mirzə Xəlil öz çalarları ilə yadda qalan el sənətkarları idilər.

Qulamhüseynin incə səsindəki məlahət bir cazibə qüvvəsi idi. Dinləyiciyə eşitməklə məhəbbət bəxş edirdi.

Qızılağac kəndində indi də musiqi sahəsində tanınmış el sənətkarları az deyildir: Əlibəndə İsayev, Avtandil Əliyev, Ağamusa Ələkbərov və s.

Musiqi bütün sənət sahələrindən fərqlidir. Musiqi insan qəlbinə nüfuz edən, xalqın istək və arzularını tərənnüm edən və onların estetik zövqünü inkişaf etdirərək, sağlamlığına xoş təsir bağışlayan bir sənətdir.

Bu sənət üzrə Qızılağac kəndində yaşlılar və ali təhsil almış gənclər diqqəti cəlb edir.

1925-ci ildən 1960-cı ilə kimi xanəndəlik sənəti ilə Bağı İbrahim oğlu Ələkbərov, tar musiqi alətində Xəlil Abdullayev zona üzrə yeddi rayonun və kəndlərinin toy məclislərində geniş şöhrət qazanmışlar. Xəlil tar çalmaqla bərabər müğənnilik də edirdi. Onun şirin, məlahətli səsi dinləyicilərə xoş təsir bağışlayırdı. 1960-70-ci illərdə Bakıda Mədəni-Maarif Texnikumunu və İncəsənət İnstitutunu, indiki mədəniyyət və incəsənət akademiyasında Ağamusa Əhəd oğlu Ələkbərov aktyor və tar ixtisası üzrə, Tapdıq Musa oğlu Məmmədov aktyorluq sənəti üzrə təhsil almışlar. Ağamusa orta və ali təhsil almağla bərabər, əsgəri xidmətdə olarkən nəfəsli alətlər "orkestr"ində musiqi sənətini inkişaf etdirmişdir. O, əsgəri xidmətindən və təhsil aldıqdan sonra 3 il Qızılağac kənd Mədəniyyət evində, 1971-ci ildən 1978-ci ilə kimi Masallı rayon Musiqi Məktəbində direktor vəzifəsində işləmişdir.

Bu taleyin xoş təsadüfüdür ki, vaxtilə rayon uşaq musiqi məktəbinə rəhbərlik edən Ağamusa müəllimi oğlu Azər Əhədzadə əvəz etmişdir.







*Ağamusa və Azər ifa zamanı*

Azər Əhədzadə 13 il Masallı rayon incəsənət məktəbində tar ixtisası üzrə dərs deyib. 1995-ci ildən məktəbin direktoru vəzifəsində işləyir.

Ağamusa müəllimin ailəsində musiqiyə həvəs həmişə güclü olub. Azər və onun bacısı Zülfiyyə Üzeyir Hacıbəyov adına Azərbaycan Dövlət Konservatoriyasının bitiriblər. Qardaşı Azad Sumqayıtda Musiqi Texnikumunu bitirib. Hələ bu nüfuzlu ailəyə gəlin gələn Ülkər Əhədzadə də Konservatoriyada ali musiqi təhsili alıb.

Qızılağac kəndində musiqi alətində çalan bir neçə musiqiçilər də vardır. Əlibəndə İsayev klarnet, Avtandil Əliyev qarmon, Rəşid, Mülayim nağara, İ.Rza zurna, balabanda xalq musiqisini ifa edirlər. Bu ifaçılar bir neçə rayonda və kəndlərində toy məclislərində iştirak ediblər.

Qızılağac kəndində toy məclislərinin keçirilməsində Əli-

bəndə və Avtandilin böyük zəhmətləri vardır. Xüsusi olaraq Əlibəndənin çaldığı klarnet, kənd adamlarının zövqünə daha xoş təsir bağışladığı üçün onu çox sevir və ona böyük məhəbbət bəsləyirlər. O, kənd adamlarının bütün işlərində fəal iştirak edir.

Özünü xeyriyyəçilikdə xidmət göstərən bir şəxs kimi tanıtdırmışdır.





## BAĞI İBRAHİM OĞLU ƏLƏKBƏROV

*Həqiqət iki gözlü sübh işığıdır*



Cənub zonasında yaşayan insanlara Allah tükənməz nemətlər bəxş etmişdir. Bu ətrafın özünə məxsus qaynar, dupduru çeşməli bulaqları, axarlı-baxarlı çayları olduğu kimi adamlarının da valehedici, cazibəli səsləri də vardır. Bu yerlərin təbiətinə gözəllik bəxş edən Allah, bəndələrinə də gözəl səs vermişdir. Onların bəziləri bu səsdən faydalanaraq ondan xalqın faydalanması üçün də xidmətlər göstərmişdir. XIX əsrin axırı XX əsrin əvvəllərində xalq musiqisinin incəliklərinə bələd olan gözəl musiqişünaslar, xanəndələr, məddahlar öz ifa tərzləri ilə xalqın etimadını qazanmışlar. O, cümlədən Qızılağacda o el sənətkarları yetişmiş və xalq mahnı, muğam və təsniflərinin mahir ifaçılarından biri olmuşlar.

Onlardan biri də Ələkbərov Bağı İbrahim oğludur.

O, 1906-cı ildə Masallı rayonunun Qızılağac kəndində məşhur el sənətkarı olan İbrahim kişinin evində anadan olub. Bağı uşaqlıq illərindən atasının sənətinə maraq göstərmiş, o da taxta işləri görən sənətkar olmağı özü üçün peşə seçmişdir.

Atası İbrahim kişi kiçik yaşlı Bağıya xırda alətlərlə yonqu işi görmək tapşırığını verərdi. Bir gün İbrahim kişi gördü 10-15 yaş həddində olan Bağı iş görə-görə dodağının altında züm-zümə edir. Kənardan durub qulaq asdı gördü, oğlunda gözəl ifaçılıq məharəti var. Bağının yanına İbrahim kişi çatan kimi Bağı züm-züməsini kəsdi. Ata oğluna əhsən-əhsən deyərək, əlin onun kürəyinə vurdu. O gündən etibarən Bağıda olan səs qonum-qonşuya bir cazibə qüvvəsi təsiri bağışladı. Ətraf kəndlərin toylarında, el şənliklərində çıxışlar etdi.

Masallının Seybətin kəndindən olan mahir muğam bilicisi Mir İslam Rəfiyevdən sənətin sirlərin öyrənməyə başladı. Dövrün məşhur muğam ustalarının məclislərində iştirak edərək, məlahətli səsi ilə onların rəğbətini qazandı. Məşhur muğam ustası Canəli Əkbərovun atası Xanəli Əkbərovla dostluq əlaqəsi saxlayan Bağı sənətdə də püxtələşdi. Mahir muğam ifaçısı kimi tanındı. Müstəqil surətdə toyları idarə etdi. Onun toy məclislərində oxuduğu növbə-növ muğam dəstgahları dinləyicilərin ürəyincə oldu. Gözəl səsə, məlahətli ifa tərzinə malik olan Bağının səsin çox uzaq məsafədən eşitmək olurdu. O elə bir dövr idi ki, nə gücləndirici, nə də mikrafon var idi. Həmin dövrlərdə Bağının səsi o avadanlıqları əvəz edirdi. Bağı ömrünün sonuna kimi bağlı olduğu, vurğunu olduğu sənətin davam etdirirdi. Onun mənalı həyat yolu onu sənətin zirvəsinə qaldırdı.

Bağı 8 övlad atasıdır. Oğlu Zöhrab dörd dəfə Həcc, Kərbəla ziyarətində olub. Bağı Ələkbərov 1990-cı ildə vəfat edib. Qəbri Qızılağac kənd qəbristanlığındadır.





## QULAMHÜSEYN NƏSİROV

*Sizdən ən yaxşısı Quranı öyrənib və öyrədəndir*



Vaxtilə öz yaşıdları içərisində seçilib-sayılan, dost və tanışların həmişə isti nəfəsini duyan Qulamhüseyni hamı tanıyırdı. Xəzərin sahilində qərarlaşan anadan olduğu Qızılağac kəndində 1906-cı ildə dünyaya qədəm qoyan Qulamhüseyn kiçik yaşlarında ikən ata qayğısı, ana nəvazişi görmüş, ilk eşitdiyi kəlmə atası Molla Məhəmməd Hüseynin azan vaxtı dediyi Allahu Əkbər olmuşdur. Molla Məhəmməd Hüseyn öz məlahətli səsi ilə hər gün beş vaxt azan, iqamə deyib, namaz qılanda kiçik yaşlı Qulamhüseyn onu yamsılayaraq dediklərini özü-özlüyündə təkrarlayırdı. Atası oğlunda olan bu münasibəti gördükdə sevindi. Sevincini gizlədə bilməyən ata oğlunu qucağına götürüb bərəkallah, dedi. Günlər, aylar, illər keçdikcə Qulamhüseyn atasından Quran oxumağı öyrəndi. Atasının istifadə etdiyi dini kitablara maraq göstərirdi. Klassik Azərbaycan şairi Qumru Dərbəndinin "Kənzil Məsaibin"i oxuduqca istedadını biruzə verirdi. Artıq 15 yaşı olanda Qulamhüseyn Məhərrəmlik mərasimində gözəl, cazibədar səsi ilə əhli beyti tərənnüm edən mərsiyələr oxuyurdu. Qulamhü-

seyndə özünəməxsus səs çalarları olduğu üçün o dövrün muğam ifaçılarının diqqətini cəlb etdi. Həmin dövrlərdə məşhur olan Mir İslam Rəfiyevdən muğam ifaçılığı sənətini öyrəndi. Öyrəndiyi xalq muğam və mahnılarının gözəl ifaçısı kimi şöhrətləndi. Qulamhüseyni tanıyanlardan indi də onun hər iki sahədə olan xidmətlərindən ürək dolusu danışırlar. Onların dediklərinə görə Qulamhüseyn mərsiyə və qəsidə söyləyərkən o qədər yanıqlı tərzdə oxuyarmış ki, onun dinləyiciləri qeyri-ixtiyari göz yaşı töküb ağlayarmışlar. Qulamhüseynə xalqın ehtiyacı toy məclislərində də var idi. Odur ki, o öz dövrünün mahir muğam biliciləri ilə tez-tez görüşər, muğam ifaçılığında onlardan bilmədiklərini öyrənərdi. Qulamhüseyn öz dövrünün mahir sənətkarları ilə toy məclislərində muğam ifa edərək dinləyicilərin dərin rəğbətini qazanmışdı. Xanəndə Bağı, Lənkəranlı Xanəli ilə tez-tez toy şənliklərində iştirak edərdi. Qulamhüseyn 30-cu illərdə sürücülük peşəsinə də yiyələnmişdi. Onun bu sahədə xidmətlərindən söz-sözü çəkəndə, çox danışılır. Qulamhüseyn 1929-cu ildə ailə həyatı qurmuşdur.

Böyük oğlu Məhəmmədi də uşaq ikən urfani biliklərə istiqamətləndirmişdir. Oğlu Fəyyaz da ata yolunu davam etdirməyi özü üçün şərəf saymış, öz məharətini həyata keçirmişdir. Qulamhüseyn 1941-ci ildə ikinci dünya müharibəsinə səfərbərliyə alınmışdır.

1943-cü ildə cəbhədən oğluna məktub yazmış, döyüş bölməsindəki xidmətlərindən söhbət açmışdır. Məktubun sonunda isə "darıxmayın, inşallah görüşərik" -deməklə, məktubu tamamlamışdı. O hərbi sursat daşımaq üçün təyin edilmiş maşında sürücü işləyirdi. Hətta həmin maşınla yaralıları da daşıdığını məktublarında qeyd edirdi.





1943-cü ildə axırıncı məktubu Kırım cəbhəsindən gəlmişdi. O, yazırdı: "əgər sağ-salamat qalsam, sənə yenə də məktub yazaram", deyə məktubunda vəd vermişdi. Lakin sonradan daha məktub gəlmədi... Oğlanları Məhəmməd və Fəyaz atası haqqında müharibədən sağ qayıdanlardan kimdən sordularsa da heç bir məlumat ala bilmədilər. Ata həsrəti ilə ayrılığa mübtəla oldular. Oğlu Fəyaz dünyasını dəyişən ana qədər ata yoluna göz dikmişdi.

İndi də ata həsrəti ilə narahat Hacı Məhəmməd rahatlığı atası haqqında həyata bəxş etdiyi xeyirxahlıqda tapır. Atası haqqında axtarışların davam etdirməsinə baxmayaraq Hacı Məhəmməd özünün şairlik məharətindən o axtarışları nəzmə çəkmiş, qəlbinin dərinliklərindəki məhəbbəti qələmə almışdır.

***Ey yıxan qəlb evimi, axtarıram qəbrini mən,***
***Əlli beş il də keçir, tapmayıram canım, ata.***
***Bu fələk böylə gətirdi nə bəladır başıma,***
***Ayırıb körpəliyimdən səni, ey qanım ata.***
***Daima yad eləyər surətini rəhmət ilə***
***Böyük övlad kimi Nəsir Məhəmmədin ata.***

Ata həsrəti, ata ayrılığı şairin poeziyasında özünə böyük yer qazanmışdır. Belə bir məhəbbət Hacı Məhəmməd şəxsiyyətinə xoş olan ən üstün və başlıca cəhətdir.

Arzu edək ki, bütün övladlar da ataya qarşı hacı Məhəmməd Nəsir kimi məhəbbətli olsun.

## XƏLİL MUSEYİB OĞLU ABDULLAYEV

*Allah istədiklərini ucaldar*



Abdullayev Mirzə Məşədi Xəlil Molla Museyb oğlu 1919-cu ilin iyun ayının 20-də Masallı rayonunun Qızılağac kəndində anadan olmuşdur. Xəlil dünyaya gələndə babası Kərbəlayı Abdullanın sevincinin həddi olmadı. Fərəhini gizlədə bilməyən Kərbəlayi Abdulla bu uşağın təlim-tərbiyəsi ilə özüm məşğul olacağam dedi. Baba öz körpəsini qucağına alaraq sağ qulağına azan, sol qulağına iqamə dedi. İlk dəfə Allahu Əkbər sədasını eşidən körpəyə ad qoydular: Xəlil. Sən demə bu uşaq gələcəkdə öz ailəsinin qohum-əqrəbasının yox, bütün Azərbaycanlıların dostu olacaqmış... Dövrünün mömün, nüfuzlu ruhanisi olan Kərbəlayi Abdulla Xəlilə islami biliklərin mühüm qaydalarını öyrədirdi. Məhz bu məşğələlər onun namaz qılmasına və klassik şairlərin mərsiyyələrini öyrənməsinə səbəb oldu. Məşhədi Mirzə Xəlil on yaşından məsciddə mərsiyə oxumuş, təziyələrdə iştirak etmişdir.

Uşaq ikən musiqiyə böyük maraq göstərmiş, dövrün mahir musiqiçisi Mir İslam Rəfievdən təlim almışdır. Mir İslamdan muğam musiqisinin incəliklərinə bələd olmaq üçün Xəlil





çox yollar öyrənmişdir. Muğamın ifası üçün ona ilahinin bəxş etdiyi məlahətli səs də böyük üstünlüklər qazandırmışdır.

Məşhədi Mirzə Xəlil doqquz yaşında ikən gözləri çiçək xəstəliyindən tutulmuş və o, ömürlük dünya işığına həsrət qalmışdır. Sonralar Mirzə Xəlil deyərmiş ki, Tanrı bəlkə rəva görməyib ki, pis sifətləri, pis işləri görüm. Gözlərimin əvəzində Allah mənə iti hafizə, ağıl, dərrakə verib. Allah özü bilən məsləhətdir.

1928-ci ildən sovet qurluşunun varlılara qarşı amansız mübarizəsinə Kərbəlayi Abdulla da məruz qaldı. Kərbəlayi Abdullanı, o vaxtın "Allahsız knişkəsini" cibində gəzdirənlərin təqibi ilə kənd içərisində, xalqın gözü qarşısında tutub dövlət məmurlarına təhvil verdilər.

Həmin hadisədən sonra Xəlilin atası Molla Müseyib Qızılağacdan bir vasitə ilə çıxıb Bakı şəhərinə pənah gətirmiş, orada ömürlük məskən salmışdır.

Molla Museyib "Təzə Pir" məscidində işləmişdir.

Məşədi Mirzə Xəlil on iki yaşında olarkən Bakıdakı korlar üçün təşkil edilmiş məktəbə daxil olur. Məktəbdə keçirilən dərsləri əla mənimsəməklə yanaşı, musiqiyə həvəsi, gözəl səsi ilə müəllim və şagirdlərin diqqətini özünə cəlb etməklə onların hörmətini qazanmışdır. Məktəbi müvəffəqiyyətlə bitirən Xəlil müəllimlərin təkidi ilə musiqi məktəbinə göndərilir. Xəlil musiqi məktəbində tar şöbəsində oxuyur. Orada musiqinin nəzəriyyəsini özünə məxsus çalarlala mənimsəyən Xəlil həmin şöbəni əla qiymətlərlə bitirir. Musiqi məktəbinin əlaçı məzunu olan Xəlili Qazax rayonundakı korlar üçün açılmış musiqi məktəbinə müəllim təyin edirlər. Gözəl ifa tərzinə, məlahətli səsinə görə, Qazax əhalisinin böyük

rəğbətini qazanmışdır.

Məşhədi Mirzə Xəlil bu minvalla dörd il Qazax musiqi məktəbində müəllimlik etdikdən sonra Masallı rayonuna qayıdır. Bu zaman Masallıda musiqi müəllimlərinə ehtiyac olduğu üçün ona mədəniyyət evində müəllim işləməyi məsləhət görürlər. Dini, mənəvi həyata bağlı olan Xəlil həmyerlilərinin sözünü yerə salmadı. Mahir tar ifaçısı, məlahətli səsə malik olan Xəlil müğənni olmasına baxmayaraq bircə gün də olsun oruc və namazdan kənarlaşmamışdır.

Mirzə Xəlilin ifasında xalq muğamları orijinallığı ilə böyük dinləyici kütləsinin rəğbətini qazanmışdır.

Lakin Mirzə Xəlilin səsində olan yanıqlı təsir onun musiqisindən uzaqlaşması üçün bir işarə idi. Çünki həmin yanğı və yanıqlığı eşidənlər ondan qəsidə də deməyi xahiş edirdilər. Artıq 1963-cü ildən Xəlil musiqi aləmində öz karyerasına son qoydu. Eşidənlər üçün təzə, özü üçün isə köhnə olan qəsidə, mərsiyə, rövza deməyə başladı.

Həmin ildən ömrünün sonuna kimi Məşədi Mirzə Xəlil hüzür məclislərində qəsidə, mərsiyə ifa etməklə əhli-beytin vəsf olunmasında məşhurlaşdı. Onun hər hansı qəsidəni deməzdən əvvəl ərəb və farsca dediyi başlanğıc hissəni dinləyəndə sanki həmin dilləri mükəmməl bilən ustadı eşidirdin. Məşədi Mirzə Xəlili Qazaxıstan, Krasnovodsk və başqa Orta Asiya ölkələrində məclislərə aparırdılar. Məşədi Mirzə Xəlili 1992-ci ilə qədər Masallı və Bakı kəndlərində tez-tez məscidlərdə, dərviş toylarında görmək olardı.

Buzovna kəndlərində Axund Hacı Soltanın, Axund Hacı Əhmədin, Molla Hacı Rasimin evində də tez-tez qonaq olardı.





O, "Əli ayağı" məscid-ziyarətgahını müntəzəm ziyarət edər və ziyarətgahın şeyxi, Şeyx Hacı Ariflə mehriban dostluq münasibəti saxlardı.

Məşədi Xəlil güclü hafizəyə malik olmağının nəticəsində "Qurani Kərim"in surələrini əzbərdən oxuyardı. O, "haqq, ədalət", düzgünlük aşiqi idi. Həmişə rastlaşdığı adamı səsindən, əlini-əlinə sürtməyindən tanıyardı. Dilində dediyi "bəli, xeyr" kəlmələri qəlbində möhkəm yer tutan saf mənəviyyatdan xəbər verirdi.

Həmişə həyatından razı olan Mirzə Xəlil deyərdi: "mən bu vəziyyətimə görə Allahdan narazı deyiləm". Ümidi Allaha bağlı olanlar bu təsəlli dərəcəsində olan məmnunluğu həyatda hər şeydən narazı qalanlara yaxşı dərsdir.

Məşhədi Mirzə Xəlil iti hafizəsinin nəticəsində iti zehni səbəbiylə çoxlu hədis, mərsiyə, qəsidə, atalar sözü və zərb məsələlər bilirdi. Məşhədi Xəlilin səlis nitqi, ecazkar səsi var idi. Bu üstünlüklər onu həmişə yas məclislərinin və dərviş toylarının yaraşığı etmişdi. Məşhədi Xəlil İslami bilikləri tam genişliyi ilə bildiyinə görə şərəfli ömrünü onun təbliğinə sərf etmişdir. Atası Molla Müseyibdən aldığı dini biliklər onun mövqeyini ucaltmışdı.

Məşhədi Mirzə Xəlil dinin "beşiyi" sayılan Masallıda yaşayarkən Ərkivan kəndindən olan Molla Məzlumdan bir din xadimi kimi böyükköməklik görmüşdür. Mirzə Xəlilə İslam dininin əsaslarını Masallının Babaser kəndindən olan Axund Şeyx Qüdrət öyrətmişdir. Masallıda Axund Şeyx Qüdrətin ruhanilərin yetişməsində böyük xidmətləri olmuşdur.

Babaserli Axund Şeyx Qüdrət İranda təhsil almış, dövrünün din alimlərindən biri olmuşdur. Onun elmindən Qafqaz

Müsəlmanları İdarəsinin sədri Şeyxülislam Hacı Allahşükür Paşazadə, Qafqaz İnstitutunun rektoru Axund Hacı Mir Əziz, Molla Barat, Axund Mir Cavad, Hacı Əhməd bəhrələnmişlər.

Məşhədi Mirzə Xəlil 1941-ci ildə ailə həyatı qurmuşdur. Onun beş qızı, üç oğlan övladları olmuşdur. Öz övladlarına uşaq yaşlarında namaz qıldırıb, oruc tutdurmuşdur.

Mirzə Xəlili bir neçə dəfə hafizəsinə görə sınaq etmişlər. Belə ki, gündüz və ya gecə də olsa mindiyi maşında getdiyi yeri bilərmiş. Əgər sürücü maşını başqa istiqamətə sürsəydi, sürücüyə yolu düz sür, deyərmiş. Evlərinin yanına çatanda sürücüyə çatdıqlarını bildirərmiş. Mirzə Xəlil sadə, təmiz, səliqəli geyimi, səmimi və mehribanlığı ilə fərqlənirdi. Heç vaxt dilinə başqasına aid sözləri gətirməzdi.

Onun Nizami, Füzuli, Nəsimi, Raci və Hafiz Şirazi, Sədi irsindən əzbər dedikləri onun dərin hafizə qabiliyyətindən xəbər verirdi.

Məşhədi Mirzə Xəlil 1992-ci ildə mart ayının 28-də Masallıda Yuxarı Baş məhəlləsində yaşadığı evdə vəfat etmişdir. Qəbri Masallı şəhərindəki qəbristanlıqdadır.

Məşhədi Mirzə Xəlilin özünə məxsus söylədiyi Dəmir qəsidəsi onun məharətinin, ifa tərzinin bariz nümunəsidir.






# Sənətkarlıq




Qızılağac kəndinin sakinlərinin müxtəlif sənət sahələrində özünə məxsus dəsti xətti olan sənətkarları da olmuşdur. Sənət aləmində sənətkarın zövqü, əl qabiliyyəti ən başlıca amildir. Məhz bunun nəticəsidir ki, yüksək zövqə malik olan sənətkarlar öz sənətlərinin incəliklərini qoruyub saxlayaraq babalardan yadigar qalmış irsi davam etdirmişlər.

Qızılağac qədim liman şəhəri kimi dünya ölkələrində tanınırdı. Bura gələn qonaqlar yerli müxtəlif sənətadamlarının düzətdikləri alətləri xatirə kimi alıb aparırdılar. Keçmiş zamanlarda Qızılağacda gəmi düzəltmək, torun müxtəlif növlərini hazırlamaq, qapı-pəncərə düzəltmək, ev tikmək kimi günün tələbini ödəyən digər sahələr üzrə də bacarıqlı, səriştəli, təcrübəli sənətkarlar olmasının nəticəsidir ki, indiyə qədər o sənət sahələri müxtəlif adamlar tərəfindən qorunub saxlanılır. Kənd camatının birgə fəaliyyəti və köməkliyi hesabınadır ki, sənətkarlıq inkişaf etdirilib. XVIII əsrin ilk illərindən kənd ərazisində indəyə qədər qalan yerlərin əlamət nişanları keçmiş sənətkarlardan xəbər verir. Kəndin Cınqırlı adlanan məhəlləsindəki "dərə" yeri keçmişdə qırmızı kərpic kəsilən yer olub. O torpaqdan bişirlən kərpiclər keyfiyyət cəhətinə görə digər torpaqlardan bişirilən kərpicdən keyfiyyətli olurdu. Kərpic bişirilməsini də bacarıqlı ustalar icra edərmiş. Sənətkarlardan tor, moluş, nəvid və s. balıq tutmaq üçün lazım olan alətləri yerli camaat alaraq ehtiyacların təmin edərdilər. Hətta onların toxuduğu torları başqa şəhərlərə Həştər-

xana aparırmışlar.

Gəmi (kiçik ölçülü) qayırmaq üçün dənizkənarı kəndin adamları yaxşı sənətkarlara müraciət ediblər. Bu sahədə Məşhədi Hilal adlı ustanın adı kənd camaatı içərisində tez-tez çəkilir. Adın çəkilməyinə səbəb onun sənətkarlığıdır. Məşhədi Hilal dəniz kənarı ərazilərində yaşayan balıqçılardan sifarişlər də alarmış. Onun düzəltdiyi gəmini suya salanda balıqçılar yığışıb qurluşuna, duruşuna, yüngüllüyünə baxıb sənətkarın sənətinə qiymət verərmişlər.

Qızılağac kəndində o vaxtlar hərəkət edən nəqliyyat vasitəsi kimi arabalardan istifadə olunurdu. Araba düzəltmək sahəsində usta İbrahim və onun qardaşı usta Əhəd sayılıb, seçilən sənətkar idilər. Keçmiş zamanlarda dülgərlik işləri bir neçə köhnə modelli alətlər vasitəsilə görülürdü. Buna baxmayaraq usta İbrahim çox zəhmət və dəqiqlik tələb edən araba çarxının topunu məharətlə düzəldərdi.

Yaşlı adamların söylədiklərinə əsasən, usta İbrahim bu sahədə Muğan kəndlərində də məşhurlaşmışdı. O, həm də qardaşı ilə birgə qapı-pəncərə də düzəldərmiş. Usta İbrahim uzun ömürlü olduğuna görə Moskvada çıxan "Oqonyok" jurnalında onun haqqında 1958-ci ildə bir səhifəlik yazı verilmişdi. Usta İbrahimin oğlu Museyib də dəmirçilik etmiş, arabanın dəmir işlərin görərmiş. Usta İbrahim həm də öz dövründə seçilib sayılan ağsaqqalardan biri idi. Kənddə 60-cı illərə kimi əsasən üstü lığlı (lığ-qamış kimi sucaq yerlərdə bitən yumşaq gövdəli bitki) evlər tikilirdi. Ev tikən ustalar və





ev üstü örtənlər də kənd ustaları olublar: onlardan usta Bəhlul, Zeynəlabdin daha çox fərqlənirdilər.

1960-cı ildən sonra ev damının örtükləri keramit və şifir materiallarından ibarət oldu. Son zamanlara qədər ev tikmək sahəsində usta Abduləhədin, qardaşı Cabirin, Əhədin, Nizam Abbasovun, Abduləhədin oğlanları Füzuli, Ağaşirin və Cəmilin zəhmətindən kənd camaatı faydalanırlar. Kənddə dəllək, ayaqqabı təmir edən, şüşə salan, televizor, radio cihazları təmir edən sənətkarlar da çox olub. Əvvəllər dəlləklər həsir sərib yerdə müştərilərinin başını qırxarmışlar. Onlar əsasən bu işi kənd hamamının və Məscidinin həyətində icra edərmişlər. Sonradan bazarın içərisində 1960-cı ildə məişət evi tikildi, orada sənətkarlar işlədilər. 1970-ci ildən sonra isə Şkola qabağında tikilən məişət evinə köçdülər. Bazardakı məişət evi çay içmək üçün təyin edildi. Ən məşhur sənətkarların indiki dövrdə gördüyü işlər əsl yaradıcılıq işləri kimi qəbul ediləsidir. Onlar tikintilərdə qədim memarlıq üslubunu qoruyub saxlayıblar.

## YÜZ YAŞ

***Yüz yaşa, min yaşa azdır***

Azərbaycanın Qızılağac kənd sakini İbrahim Ələsgər oğlu Ələkbərovun 100 yaşı tamam oldu. Bu yaşa baxmayaraq o, M.İ.Kalinin adına kolxozda çalışır. Kolxoz yarandığı vaxtdan onun üzvüdür və hər il 300-350 əmək günü qazanır. Ələkbərov bir neçə tikinti ixtisaslarına malikdir.

O, gözəl dülgər, tornaçı, bənna, malakeş və rəngsazdır. Araba (qoşqu) və onların təkərlərinin hazırlanması üzrə əvəzedilməz ustadır. Təxmini hesablamalara görə uzunmüddətli həyatı dövrü 2800-ə qədər araba qoşqu hazırlamışdır.



***Usta İbrahim oğlu ilə.***







İbrahim Ələkbər oğlunun yeddi oğlu, iki qızı və 70-ə yaxın nəvə-nəticəsi vardır. Hazırda onun 150-dən çox nəvə nəticəsi, kötükcəsi vardır.

Məqalə və şəkillər 1958-ci ilin may ayının "Oqonek" jurnalından götürülmüşdür.

*Mətn V.Şerişov,*
*foto M.Frişmanındır.*






# Əmək cəbhəsində




Ölkənin hər tərəfində olduğu kimi Qızılağac kəndində də II Dünya müharibəsindən sonra təsərrüfat quruculuq işində böyük canlanma başlandı. Kəndin kolxozçuları təsərrüfatın müxtəlif sahələrində öz əzmkarlıqlarını artırmaqla əkilən məhsullardan yüksək göstəricilər əldə etməyə nail oldular. Təsərrüfatın müxtəlif sahələrində işə olan şüurlu münasibət günü-gündən artdı. Kolxoz göstəriciləri ilə rayonda qabaqcıl təsərrüfatlardan biri olud. Kolxoz təsərrüfatına İbrahim Səlimovu sədr seçdikdən sonra kənd zəhmətkeşlərinin işə münasibəti dərindən dəyişdi. Hər bir kolxozçu işlədiyi sahəyə məsuliyyətlə yanaşırdı. Kolxozda heyvandarlığın da inkişaf etdirilməsi sahəsində böyük işlər görüldü. Rusiyadan cins heyvanlar gətirildi. Heyvanlara olunan qulluq nəticəsində məhsuldarlıq artaraq rayon üzrə yüksək məhsuldarlıq əldə olundu. Gənc heyvandar yüksək göstəricilərinə görə Səfura Seyfulla qızı Abdullayeva Sosialist Əməyi Qəhrəmanı adına layiq görüldü. İbrahim Səlimov kənddə quruculuq işlərinə böyük qayğı göstərirdi. Yeni-yeni heyvandarlıq binaları, mədəniyyət evi və digər yardımçı binalar inşa etdirdi. 1964-cü ildən kolxoz sovxoz quruluşu ilə əvəz olundu. Təsərrüfat, heyvandarlıq və tərəvəzçilik üzrə ixtisaslaşdı, tərəvəzçilikdə Sadıqova Alimə Lenin ordeninə layiq görüldü. Tükəzban Eynullayevanın da göstəriciləri yüksək olduğu üçün Ali Sovetə deputat seçildi.

Sadıqova Fatimə və Aminə bacıları da heyvandarlıqda yüksək dövlət mükafatı ilə təltif olundular. Qızılağacda mövcud olan Kalinin adına sovxoz 1964-cü ildən rayonda qabaqcıl sovxozlardan biri oldu. Bu işdə Sovxozun direktoru İbrahim Səlimovun xidmətləri əvəzsizdir. Qızılağacın istifadəsiz

qalan torpaqlarında hidrotexniki işlərin görülməsi nəticəsində həmin sahələr əkin üçün yararlaşdırıldı. Əkin sahələri genişləndirildi. 1979-cu ildə kənddə iri südçülük kompleksi istifadəyə verildi. Burada o dövr üçün müasir hesab olunan avadanlıqlar quruldu. Sağım işləri sağım aqreqatları ilə görülməyə başladı. Heyvandarlıqda yüksək göstəriclər əldə edildi. Aminə Sadıqovanın göstəriciləri rekord səviyyəyə çatdı. Onun əməyi yüksək qiymətləndirildi. Kompleks südçülük, ətçilik istiqamətində inkişaf etdirilirdi. Pribaltika ölkələrindən gətirilən heyvanlardan yüksək məhsuldarlıq əldə edildi. Yüksək göstəricilərə görə sovxoz keçici qırmızı bayraq ilə təltif olundu. Sovxozun iqtisadiyyatında tərəvəzçilik mühüm rol oynayırdı. Kələm, pomidor və digər tərəvəz bitkiləri də əkilirdi. Sovxozda soğan bitkisindən ən çox məhsuldarlıq əldə edilirdi. Onu da qeyd edim ki, soğan məhsulu Qızılağac torpağında ən yüksək məhsuldarlığa və keyfiyyətə malik olur.

Qızılağac təsərrüfatında, yəni əkin sahələrində bostan bitkilərindən də yüksək məhsuldarlıq əldə edilirdi. Qızılağac qarpızı şirinliyi ilə indi də məşhurdur. 1990-cı ildən sovxoz təsərrüfatında geriləmə özünü göstərdi. Bu da keçmiş SSRİ-nın zəiflənməsi və dağılması nəticəsində oldu. 1991-ci ildən islahat adı altında yenidənqurma siyasəti həyata keçirildi. Sovxoza məxsus olan heyvanlar və heyvandarlıq binaları özəlləşdirildi. Kənd təsərrüfat texnikası satıldı. Keçmiş SSRİ dağıldı. Sovxoz təsərrüfatı ləğv edildi, torpaqlar 1996-cı il iyun ayına kimi payı bəlli şəkildə kənd sakinlərinə 0,25 hektar, hər bir adama bölüşdürüldü. İndi təsərrüfat şəxsi təsərrüfata çevrilib. İş adamları öz bilik və bacarıqlarından istifadə etməklə yeni özəl təsərrüfatlar yaratdılar. Əsasən heyvandar-





lıq sahəsinə iş adamları üstünlük verdilər. İndi şəxsi təsərrüfatlarda çoxlu sayda heyvanlar saxlanılır. Heyvandarlıq üçün əlverişli yerlərə qayğı artırıldı. İndiki dövrdə şəxsi təsərrüfatlarda olan mal-qara sovxoz dövründəkindən bir neçə dəfə çoxdur. Bütün bu göstəricilərə, iş adamları öz səyi və bacarıqları nəticəsində nail olublar.

Qızılağac kəndində kolxoz idarə heyətinin sədrləri və sovxozun direktorları hamısı yerli kənd zəhmətkeşləri olan adamlar idi.

Sovxoz direktorları: İbrahim Səlimov, Məmməd Nağıyev, Yasər Əliyev, Natiq Məmmədov, Soltanağa Əsgərov və Telman Mustafayev olmuşlar.

## SAFURA SEYFULLA QIZI ABDULLAYEVA



O 1936-cı ildə Qızılağac kəndində anadan olmuşdur. Onlarca yaşıdları kimi məktəbdə təhsil almışdır.

1957-ci ildən kolxozda çalışmış, sonra sovxoz fermasında işləməyə başlamışdır.

On səkkiz yaşlı Safura Abdullayeva məktəbi bitirdikdən sonra sağıcı işləməyə başladıqda qarşısına bir sıra çətinliklər çıxmışdır. Fermada işləmək o qədər də asan deyildi. Fermanın təcrübəli işçiləri Safura Abdullayevaya diqqətlə, mehribanlıq, qayğı ilə yanaşdılar. Biliklərini təcrübələrini səbirlə, təmkinlə ona verdilər. İndi Safura Abdullayeva bunların hamısını hörmətlə xatırlayır. Həmin şəxsləri ehtiramla yad edir.

Safurə Abdullayeva qulluq etdiyi (o inəyin hərəsindən planda nəzərdə tutulduğuna nisbətən, xeyli çox süd götürürdü). Hər inəkdən bir ildə 4000 litr süd sağmağa nail oldu. Bu nailiyyətin sirri haqqında cavab verərək S.Abdullayeva deyir ki, müvəffəqiyyətin əsas sirri heyvanlara yaxşı qulluq etməkdən, onları vaxtlı-vaxtında yağlı, şirəli yemlə doydurmaqdan ibarətdir.

Heyvandarlığı inkişaf etdirmək, süd, ət və digər məhsulların istehsalını və tədarükünü artırmaq sahəsində qazandığı müvəffəqiyyətə görə Sosialist Əməyi Qəhrəmanı adı almışdır.





1965-ci ildə İsa Bayramovla ailə qurmuşdur.

Altıncı və yeddinci çağırış SSRİ Ali Sovetinin deputatı olmuş, Azərb. Komsomolunun Mərkəzi Komitəsi, rayon partiya və komsomol komitələri S.Abdullayevanın dəyərli işini yüksək qiymətləndirmişdir.

1964-cü ildə ona Respublikanın ən yaxşı gənc maldarı fəxri adı verilmişdir.

Azərbaycan Komsomolunun Mərkəzi Komitəsinin diplomu ilə mükafatlandırılmışdır.

Masallı rayon Partiya Komitəsinin fəxri fərmanını almışdır.

Bir çox dövlət fərmanları almışdır. S.Abdullayeva Bakı şəhərində yaşayır. Hal-hazırda Safura Abdullayeva prezident təqaüdçüsüdür.

Üç oğul, bir qız anasıdır.

## FATİMƏ ƏBDÜLQƏDİR QIZI SADIQOVA



Qızılağac kəndində S.Abdullayevadan sonra SSRİ Ali Sovetinə deputat Fatimə Sadıqova olmuşdur. O, 1946-cı ildə anadan olmuşdur. 1970-1975-ci ildə yüksək göstəricilər əldə etdiyinə görə F.Sadıqova SSRİ Ali Sovetinə deputat seçilmişdir. F.Sadıqovanın əməyini qiymətləndirərək onu “Qırmızı Əmək Bayrağı” ordeninə layiq görmüşlər.

F.Sadıqova Kalinin adına sovxozda yerli komitənin sədri, sonralar isə sovxoz partiya təşkilatının katibi olmuşdur. F.Sadıqova təcrübəli işçi kimi Qızılağacda tikilib istifadəyə verilən südçülük kompleksinin müdiri işləmişdir. Ali təhsilli zootexnikdir. Bir oğul, iki qız anasıdır. Həyat yoldaşı A.Fətullayev ali təhsilli bioloqdur, Masallı rayonunun Təbiəti Mühafizə idarəsinin müdir müavinidir.






# İdmançılar




Qızılağac kəndinin gəncləri idmana həmişə böyük maraq göstəriblər. Onlar idmanın müxtəlif sahələrində təlim-məşq prosesini keçərək, müxtəlif növ idman oyunlarında rayon birinciliyinə nail olublar. Kənd ərazisində bir neçə yerdə vaxtilə voleybol, futbol, daş qaldırma, güləş oyunlarını keçirmək üçün meydançalar və binalar mövcud idi. Gənclərin bir çoxu bu idman oyunlarında öz məharətlərini sınayırdılar. İndiki mədrəsənin yerində olan voleybol meydançasında hər gün voleybol yarışları keçirilirdi. Kənd idman cəmiyyətlərinin arasında voleybol və futbol üzrə birinciliklər keçirilirdi. 1964-cü ildə kolxozlar, sovxozlar ilə əvəz ediləndə hər sovxozda idman komitələri yarandı. Bu komitələrin idmanı yaymaqda böyük xidmətləri olmuşdur. İdman avadanlıqları ilə təmin edilən idmançılar müntəzəm məşğul olurdular. Kənd idman komitəsinə Havasət Qəribov rəhbərlik edəndən sonra idmançılar, rayon və respublika birinciliyində yarışlarda birinci yerləri tutdular.

Havasət Qəribov idmanın yunan güləş növündə respublikada 3-4 yerləri tutmuşdur.

Kəndin yetirmələri olan Firdövsi və Tahir Tağıyev qardaşları dzyu-do və sambo üzrə Azərbaycan çempionu, Beynəlxalq turnirin qalibi, Beynəlxalq dərəcəli idman ustası, dəfələrlə Azərbaycan çempionu olmuşlar.

F.Tağıyev Azərbaycan çempionu, SSRİ çempionu, Azərbaycan yığma komandasının üzvü, Dzyu-do və Sambo üzrə

SSRİ yığma komandasının üzvü, 50 yaşlılar arasında dünya çempionu olmuşdur.

Hal-hazırda Qızılağacda sərbəst güləş üzrə mütəmadi məşqlər keçirilir. Ali təhsilli idman müəllimi Soltanağa Həsənov sərbəst güləş üzrə ustalığa namizəddir. Onun yetirmələri dəfələrlə rayon çempionu olmuşlar. Azərbaycan birinciliyində 5-6-cı yerlər qazanıblar. Gənc idmançılardan Rauf Quliyev, Oqtay Qəribov doqquz rayon zona yarışlarında qalib olmuşlar.

Astara rayonunda keçirilmiş turnirdə Valid Həsənov birinci yer tutmuşdur.

Rauf Quliyev hal-hazırda Dinamo cəmiyyətinin yığma komandasının üzvüdür. Oqtay Qəribov Əli-Bayramlı şəhərinin yeniyetmələri arasında yığma komandanın üzvüdür. 1998-ci ildən bu günə kimi Qızılağac komandası hər il Masallı rayon komanda birinciliyində birinci yeri tutublar.

Bu sahədə məşqçi Soltanağa Həsənovun xidmətləri misilsizdir. Ümidverici idmançılar yetişmək ərəfəsindədir. Çünki bu sahəyə Respublika prezidentinin də böyük qayğısı, köməkliyi vardı.

Çox sevindirici əlamətdir ki, 1939-1941-ci ildə Masallı İdman Cəmiyyətinin sədri Qızılağaclı Tələt Məlikov olmuşdur.

Hal-hazırda idmançılarımız təlim-məşq proseslərində yüksək dərəcədə iştirak edirlər. Bu da gələcəkdə onların uğurlu nailiyyətlər qazanacağı gündən xəbər verir.





## FİRDOVSİ RAMAZAN OĞLU TAĞIYEV

***Allahın sənə verdiyi nemətləri itirmə: onun verdiyi nemətlərin əsəri səndə qorunmalıdır***



Azərbaycanın əməkdar məşqçisi, beynəlxalq dərəcəli idman ustası. Sambo üzrə dünya çempionu Firdovsi Ramazan oğlu Tağıyev 1946-cı ildə Qızılağac kəndində dünyaya gəlib.

Orta məktəbi doğma kəndində bitirib. Bir il Kalinin adına sovxozda fəhlə işlədikdən sonra dənizçilik məktəbinə daxil olub. Məktəbdə sambo ilə məşğul olmağa başlayıb. Respublikanın əməkdar məşqçisi Rauf Şəfiyevin rəhbərliyi altında Vodnik idman cəmiyyətində sambo üzrə təlim keçib.

1964-cü ildə yeniyetmələr arasında, 1965-ci ildə gənclər arasında respublika birinciliyinin qalibi olub.

1966-cı ildə yaşlılar arasında Avropa çempionu adını qazanıb.

F.Tağıyev həmin təqvimdən sonrakı 9-10 il ərzində mündəzəm olaraq respublika çempionluğunu özündə saxlayıb. R.Şəfiyevin məsləhəti ilə 1968-ci ildə dinamo idman cəmiyyətinə gəlib və tanınmış məşqçi Sabir Hüseynovun nəzarəti altında məşqlərə başlayıb. Dənizçilik məktəbinin dördüncü

kursunda oxuyarkən səhhətində əmələ gələn dəyişiklik ilə əlaqədar olaraq Politexnik Texnikumunun avtomobil şöbəsinə dəyişdirilib. Texnikumu bitirdikdən sonra 1970-ci ildə Azərbaycan Dövlət Bədən Tərbiyəsi İnstitutuna qəbul olub. Elə həmin il Dinamo Mərkəzi Şurasının çempionu şəxsində məşqçi kimi fəaliyyətə başlayıb.

Dinamo idman cəmiyyətində özünü həm idmançı, həm də püxtələşmiş məşqçi kimi göstərib.

1970-74-cü illərdə Azərbaycan yığma komandasının məşqçisi təyin edilib. O illərdə keçirilən spartakiadalarda yüksək yerlər uğrunda mübarizə aparıb və bir çox hallarda isə arzusuna çatıb. Keçmiş SSRİ-də DİN-nin sambo üzrə keçirilən yarışlarda ilk yerləri tutub.

1972-ci ildə dzyü-do idman növü üzrə keçirilən yarışlarda Azərbaycanda ilk dəfə olaraq çempion adını alıb. F.Tağıyev 1979-cu ildə sambo üzrə tanınmış mütəxəssis kimi Bədən Tərbiyəsi İnstitutuna dəvət olunub. Hal-hazırda güləş kafedrasının dosentidir.

Firdovsi müəllim respublikamızın hüdudlarını aşaraq çox-çox uzaqlarda, Əlcəzairdə də sanballı məşqçi kimi özünü göstərib. Ömrünün 3 (1985-1988-ci illər) ilini bu ölkədə güclü samboçular yetişdirməyə sərf edib.

O, zəhmətini bada verməyən şagirdlərindən Marif Hüseynovun, Nazit Şəfiyevin, Rəhman Abbasovun, Akif Qədimovun, Rəşad Quliyevin və başqalarının adını fəxrlə çəkir. F.Tağıyevin idman sahəsində göstərdiyi uğurlu nəticələr dövlətimiz tərəfindən yüksək qiymətləndirilərək ona 1992-ci ildə "Azərbaycan Respublikasının əməkdar məşqçisi" fəxri adı verilib.





1993-cü ildən beynəlxalq dərəcəli hakim elə həmin ildən də beynəlxalq dərəcəli idman ustası kimi tanınan F.Tağıyev respublikada dzyu-do üzrə məşqlərə rəhbərlik edir. O, 1998-99-cu və 2001-ci illlərdə ustad sanboçular arasında dünya çempionu seçilib.

Həyat yoldaşı voleybol üzrə idman ustalığına namizəddir.

Firdovsi Tağıyevin qazandığı bütün qələbələr onun aslan kimi güclü olmağına dəlalət edir, evlidir. İki oğul atasıdır.

# TAHİR RAMAZAN OĞLU TAĞIYEV

*Qüvvətli adam güləşdə qalib gələn deyil,*
*qəzəblənən vaxtı qəzəbini boğa biləndir*



Tahir Tağıyev 1950-ci ildə Masallı rayonunun Qızılağac kəndində kolxozçu ailəsində anadan olmuşdur. 1957-ci ildə Qızılağac kənd orta məktəbinin I sinfinə daxil olmuş. 1968-ci ildə həmin məktəbin XI sinfini bitirmişdir. Orta məktəbdə idmana olan marağı onu Azərbaycan Dövlət Bədən Tərbiyəsi İnstitutuna aparmışdır. Lakin həmin il instituta daxil ola bilmir. 1969-cu ildən 1971-ci ilə kimi ordu sıralarında hərbi xidmətdə olub. Hərbi Xidməti başa vurduğundan sonra Bakı şəhərindəki 2 nomrəli Avtobus parkında çilingər vəzifəsində işləyir. 1973-cü ildə ADBT İnstitutuna imtahan verərək qəbul olunur. 1978-ci ildə həmin institutu bitirib, Daxili İşlər Nazirliyində işə qəbul olunur.

1980-ci ildə Daxili İşlər Nazirliyinin Su Polisi İdarəsində 1985-ci ildə isə Cinayət axtarış şöbəsində işləyib. 1985-1990-cı ilə kimi 1 nömrəli Xaçmaz rayon su xətt bölməsinin rəisi vəzifəsində işləyib.

1990-cı ildə Daxili İşlər Nazirliyinin brokonerliyə qarşı





mübarizə şöbəsində işləyib. 1992-ci ildə Daxili İşlər Nazirliyinin Neftçala su xətt bölməsinin sədri, Lənkəran su xətt idarəsinin rəisi işləyib.

1994-cü ildən Masallı rayon Polis şöbəsində Cinayət Axtarış Şöbəsində işləyib, Masallı rayon Polis Şöbəsində Azyaşlılar üzrə qrup rəhbəri, baş müfəttiş vəzifəsində işləmişdir. Hal-hazırda ehtiyatdadır. Qızılağac 1 saylı orta məktəbində bədən tərbiyəsi müəllimidir.

Tahir Tağıyevin idman sahəsində yüksək göstəricilərə malikdir. Belə ki, o:

1971-ci ildə Sambo üzrə Bakı şəhər çempionu

1973-cü ildə Dzyüdo üzrə Bakı şəhər çempionu

1974-cü ildə Sambo üzrə Azərbaycan Respublikası çempionu

1978-ci ildə Dzyüdo üzrə SSRİ çempionatında 2-ci yer

1977-ci ildə Dzyüdo üzrə Azərb. respub. çempionu

1975-ci ildə SSRİ birinciliyində 3-cü yer

1977-ci ildə Ümumittifaq yarışında 1-ci yer Rusiya şəhərində

1974-cü ildə Sambo üzrə SSRİ İdman ustası

1975-ci ildə Dzyüdo üzrə SSRİ İdman ustalığına layiq görülmüşdür.

SSR-i dövründə o, bir neçə xarici səfərlərdə: Səudiyə Ərəbstanın Mədinə şəhərində və İraqın Kərbəla, Nəcəf şəhərlərində olmuşdur. Polis orqanlarında işlədiyi müddətdə DİN-nin fəxri fərmanları ilə təltif olunmuşdur.

3 övladı var.

## FİKRƏT SEYFULLA OĞLU MƏMMƏDOV

*İgid ölər, adı qalar*



Məmmədov Fikrət Seyfulla oğlu 9 dekabr 1961-ci ildə Lənkəran şəhərində qızılağaclı Seyfulla Məmmədovun ailəsində anadan olmuşdur. 1968-ci ildə Lənkəran şəhər orta məktəbinə I sinfə gedib, 1978-ci ildə həmin məktəbi bitirmişdir. 1978-ci ildə Azərbaycan Dövlət Neft Kimya İnstitutunun qaz və neft istehsalı fakultəsinə daxil olmuşdur. İnstitutun 2-ci kursunun 1-ci smestrini bitirdikdən sonra sənədlərini geri götürmüş və 1980-ci ilin fevral ayından may ayına kimi Lənkəran şəhərinin 7 saylı avtobazasında çilingər vəzifəsində işləmişdir.

1980-ci ildə Bakı Ali Ümumqoşun Komandanlıq məktəbinə daxil olmuşdur. 1984-cü ildə məktəbi bitirdikdən sonra Zaqafqaziya Hərbi Dairəsində desant qırıcı tağım komandiri vəzifəsində qulluq etmişdir. 1985-ci ilin avqust ayından 1987-ci ilin avqust ayına kimi Əfqanıstan Demokratik Respublikasında desant qırıcı tağım komandiri, qumbaraatan tağım komandiri, desant qırıcı bölük komandirinin müavini, desant qırıcı bölük komandiri vəzifələrində xidmət etmişdir. 1987-ci ilin noyabr ayından 1990-cı ilin avqust ayına qədər Zaqafqaziya Hərbi Dairəsində desant qırıcı bölük komandiri, əlahiddə





desant qırıcı taborunun qərargah rəisi vəzifələrində xidmət etmişdir.

1990-cı ildən 1993-cü ilə qədər M.Frunze adına Hərbi Akademiyada təhsil almışdır. Akademiyanı bitirdikdən sonra 1993-cü ilin avqust ayından dekabr ayına kimi Azərbaycan Respublikası Silahlı Qıvvələrində N saylı briqadada qərargah rəisi, 1993-cü ilin dekabr ayından 1995-ci ilin mart ayına kimi briqada komandiri vəzifəsində qulluq etmişdir. 1995-ci ilin mart ayından 1998-ci ilin may ayına kimi I Ordu Korpusunun Qərargah rəisi vəzifəsində qulluq etmişdir. 25 may 1998-ci ildə polkovnik Məmmədov Fikrək Seyfulla oğluna general mayor hərbi rütbəsi verilmişdir və III Ordu Korpusunun komandiri vəzifəsinə təyin olunmuşdur.

15 may 2002-ci ildə xidməti borcunu yerinə yetirərkən vəfat etmişdir. General mayor Məmmədov Fikrət Seyfulla oğlu Silahlı Qüvvələrdə xidmət etdiyi müddət ərzində özünü tələbkar və təşəbbüskar bir zabit kimi həm Sovet Ordusunda, həm də Azərbaycan Respublikası Silahlı Qüvvələrinin tərkibində tabeçilikdə olan əsgər və zabitlər tərəfindən tanınırdı.

General mayor Məmmədov Fikrət Seyfulla oğlu Azərbaycan Respublikasının ərazi bütövlüyünün bərpası naminə tabeliyində olan şəxsi heyətin döyüş hazırlığının yüksəldilməsində qüvvə və bacarığını əsirgəməmişdir.

Hərbi xidmətdə göstərdiyi yüksək zabit keyfiyyətlərinə görə SSRİ və Azərbaycan Respublikasının

- "Qırmızı Ulduz" ordeni,
- "SSRİ SQ Vətənə xidmətə görə" üçüncü dərəcəli orden,
- "Azərbaycan bayrağı" ordeni,
- "Əsgəri rəşadətə görə" medalı,

- Hərbi xidmətdə fərqləndiyinə görə birinci dərəcəli orden,
- "Minnətdar Əfqan xalqından" medalları ilə təltif edilmişdir.

Qızılağaclı Seyfulla Məmmədovun oğlu, Fikrət Məmmədovun vəfatı xəbərini eşidəndə qızılağaclılar öz general övladının yas mərasimində iştirak etdilər.



Mən Fikrət Məmmədov haqqında yazını yazmaq üçün onun Lənkərandakı ev muzeyinə üz tutdum. İki mərtəbəli evin eyvanından Lənkərandakı "Böyük bazar" meydanına tərəf diqqətlə tamaşa edən, başındakı zülfi qar kimi ağ olan ana gördüm. Fikrətin anadan olduğu evin qarşısında 2004-cü ildə xatirəsini əbədiləşdirmək üçün büst qoyulmuşdur.

General büstü qarşısında fatihə verdim. Allahdan rəhmət dilədim. Fikrətin yaşadığı binaya daxil oldum. Məni mərhumun anası və qardaşı qarşıladı. Gəlişimin məqsədini onlara bildirdim.







Bu vaxt ana çöhrəsində qəm-qüssə bəxş edən cizgiləri duymamaq olmazdı. Lakin məğrur, mərd, mübariz olan ana danışmağa başladı. Danışdıqca məni Albomdakı şəkillərlə tanış edirdi. Fikrət haqqında qəzet səhifələrində yazılanları, Ali Baş komandanlığın təltifatlarını, orden, medallarını, Türkiyə Hərbi İdarəsindən ona təqdim olunan hədiyyələri göstərdi.

Sonra mənə ev muzeyinə baxmağı təklif etdi. Fikrətin orta məktəbi qurtarana qədər yaşadığı otaq indi onun ev muzeyidir. Otağa daxil olanda Hərbi ləvazimatlar, geyim libasları, çoxlu sayda təltiflər, fəxri fərmanlar, orden, medallar, nələr... nələr, bir də sanki yuxarıda qeyd olunanlara və otağa daxil olanlara göz dikib baxan General Fikrətin portreti. Onun əməyi yüksək qiymətləndirilsə də belə, generalın narahatçılığı portretindən hiss olunur. Görəsən narahatçılığı nədir? Sözsüz ki, Vətən torpağımızın düşmən tapdağı altında qalmasıdır. Onun ruhu o otağa daxil olanları seyr edir. İnildəyən torpaqlarımızın xilas gününü gözləyir. Onda Fikrətin ruhu şad olacaq və təsəlli tapacaq. Fikrət haqında Mübariz Musa oğlu "Yaşamaq haqqı" (Şəms 2002) kitabını yazmışdır. Ağaddin Babayev "Moi sobesedniki" (Bakı 2002) kitabını, XXI əsr Azərbaycan ziyalıları "Beynəlxalq elm mərkəzi tərəfindən yazılan kitabda (210-cu səhifədə) yazı vardır.

F.Məmmədov ölümündən sonra XXI əsr Beynəlxalq diplomu, "Vektor" beynəlxalq elm mərkəzi tərəfindən Azərbaycanın tanınmış ziyalısı, qalibi mükafatı ilə təltif edildi.

General mayor Məmmədov Fikrət Seyfulla oğlunun əziz xatirəsi hərbi hissələrimizin şəxsi heyətinin qəlbində həmişə yaşayacaqdır. F.Məmmədov Bakı həşərində Fəxri xiyabanında dəfn edilmişdir.





## MAARİF QURBAN OĞLU QURBANOV

***Elm öyrənmək hər bir müsəlman kişi və qadına vacibdir***



Qurbanov Maarifin atası Qurbanov Qurban 1929-cu ildə Qızılağacda anadan olmuşdur. Qızılağacda orta məktəbi bitirib, əsgəri xidmətdən sonra Sara qəsəbəsinə köçərək gəmi sürücülüyündən kapitan vəzifəsinədək yüksəlib.

Onun oğlu Qurbanov Maarif Qurban oğlu 1955-ci ildə Nərimanabad 1 qəsəbəsində anadan olub. 1962-1972-ci illərdə Nərimanabad orta məktəbində oxuyub, 1972-ci ildə Ordjenekidze Zenit Raket hərbi məktəbinə daxil oldub. Oranı bitirdikdən sonra SSRİ-nin müxtəlif hərbi dairələrində qulluq edib, 1980-1984-cü ilərdə Havadan Müdafiə Qoşunlarının akademiyasının RMSF-na daxil olub, 1989-cu ildə oranı Qızıl medal ilə bitirib. 1989-cu ildən Moskvada Bauman adına texniki universitetdə işləyir. Həmin universitetin hərbi kafedra müdiridir.

Professordur, texnika elmləri doktorudur, hərbi rütbəsi polkovnikdir.


*Qurbanov Abdulbağı Qurban oğlu*

Qardaşı Qurbanov Abdulbağı Qurban oğlu 1962-ci ildə Nərimanabadda anadan olub. O da podpolkovnikdir. Hazırda RFKQ analtik informasiya mərkəzində xidmət edir.

Hər iki qardaşların hərbi sənətə sahib olmaları öz istəklərindən yaranmışdı. Onlar ata yurdu Qızılağacdakı qohumlarının ziyarətlərində olmağı özləri üçün rahatlıq bilirlər.

Ata-baba yurduna sadiq olan adamlardılar.





## MƏHƏMMƏDHƏSƏN ƏLƏSGƏR OĞLU MƏMMƏDOV

*Əl tutmaq, Əlidən qalıb*



Azərbaycan respublikasının müstəqilliyi uğrunda mübarizəyə qalxan regionlardan biri də Cənub zonası olmuşdur. Xalq azadlığı, azad yaşamaq uğrunda əzmkarlıq göstərilirdi. Belə bir gündə Azadlıq mübarizləri üçün strateji əhəmiyyəti olan Qızılağac kəndində 1918-ci ildə Ələsgər kişinin həyat yoldaşı boynunda olan uşağı dünyaya bəxş edərək, azad oldu. Azadlıq sədası körpə Məhəmmədhəsən üçün doğma söz oldu. Birinci sinifə Qızılağacdakı yeddiillik məktəbə qədəm qoyanda azadlığı, sərbəstliyi gördü. Yeddiillik təhsili başa vuran Məhəmmədhəsən Lənkərandakı Pedaqoji Texnikuma qəbul olundu. Oranı bitirərək 1936-cı ildə Qızılağac kəndinə müəllim işləmək üçün təyinat aldı. Bir vaxtlar dərs aldığı sinifə əlində sinif jurnalı daxil oldu. Öz bilik və bacaracağın dərs zamanı əsirgəməyən Məhəmmədhəsən müəllim, pedaqoji kollektivin dərin hörmətini qazandı. 1937-ci ildə tədris işləri üzrə direktor müavini, 1938-ci ildə isə direktor təyin edildi. Məhəmmədhəsən müəllimin məktəbə olan münasibəti məktəbin müəllim və şagird kollektivinə

də güclü təsir bağışladı. Dərsin tədris keyfiyyəti, şagirdlərin davamiyyəti yüksəldi. Məhəmmədhəsən müəllim kollektivin hörmətini qazandı.

1940-cı ildə Ordu sıralarına çağırılan Məhəmmədhəsən müəllim az vaxt içərisində rəhbərliyin hörmətini qazandı. Onun səy və işgüzarlığını görən hərbi hissənin rəhbərləri onun hərbi məktəbdə oxumasına köməklik göstərdilər. O, 1941-ci ildən 1946-cı ilə kimi hərbi hissələrdə xidmət göstərdi. Müharibə illərində hərbi hissənin siyasi şöbənin müdiri vəzifəsində işləmişdir. 1946-cı ildə ordudan tərxis olunanda podpolkovnik rütbəsində idi.

O, vətənə qayıtdıqdan sonra respublikanın ayrı-ayrı rayonlarında hərbi komissar vəzifəsində işləmişdir.

1955-ci ildən partiya işçisi kimi Bakı şəhərindəki Əzizbəyov rayon partiya komitəsində şöbə müdiri vəzifəsində işləmişdir. O, 1960-cı ildə Azərbaycan Dövlət Universitetini qiyabi olaraq bitirmiş və həmin ildən də onu Respublika Qırmızı Aypara cəmiyyətinin sədr müavini vəzifəsinə təyin etmişlər. 1980-ci ilə kimi həmin vəzifədə işləmişdir. İşlədiyi müddət ərzində bir neçə fəxri fərmanlarla, orden və medallarla təltif edilmişdir.

Hərbi sahədə 25 - qədər orden və medalla təltif edilmişdir. İki oğlu, bir qızı var. Hər üçü ali təhsillidir.

Məhəmmədhəsən öz xüsusiyyətləri müqabilində xalqın xatirəsində yaşayanlardan biridir. Məhəmmədhəsənin ən böyük üstünlükləri onun doğma Qızılağaca olan münasibəti idi. Anadan olduğu kəndin inkişafına, kənd adamlarının savadlanmasına böyük maraq göstərən idi.






# Qızılağac İkinci Dünya müharibəsi illərində




**1941**-ci ildə iyun ayında faşist Almaniyasının Sovetlər İttifaqına hücumu nəticəsində Böyük Vətən müharibəsi başlandı. Müharibənin çətinliyini bütün insanlar dadmağa başladılar. Müharibənin başlanması nəticəsində böyüklü, kiçikli hamı silaha sarılaraq Vətənin müdafiəsinə qalxdılar. O qanlı-qadalı günlərdə Qızılağac kəndindən də 300 nəfər cəbhəyə yolandılar. Döyüş meydanında olan Qızılağaclıların göstərdikləri igidliklər haqqında xoşxəbərlər gəlirdi. Ön cəbhə ilə bərabər arxa cəbhədə də çətinlik labüd idi.



***1941-1945-ci il döyüşçülərinə xatirə abidəsi***

Hamı cəbhəyə kömək etməyi özlərinə borc bilir, əlindən gələn köməklikləri əsirgəmirdilər. Ön cəbhədə olanlar üçün isti geyimlər, digər zəruri mallar göndərilirdi. Döyüşən Qızılağaclılar böyük şücaətlər göstərmiş, qəhrəmancasına düşmənlə mübarizə aparmışlar. Onların çox hissəsi dövlət tərəfindən təsis edilən orden və medallarla təltif olunmuşlar. Müharibədə Cabbar Rza oğlu Nağıyev böyük fədakarlıqlar göstərmişdir. Onun haqqında müharibə illərində qəzetlərdə böyük həcmli yazılar verilmişdir.

Cəbhəyə gedənlərdən 80 nəfər qayıtmışdır. Qayıdanların demək olar ki, hamısı müxtəlif dərəcəli xəsarət almışlar. Hətta bəziləri bədənlərində olan mərmi və güllə qəlpələrini özləri ilə qəbr evinə aparmışlar.

Müharibəyə gedənlər arasında çoxlu sayda ziyalılar da var idi. Onların əksəriyyəti rus-tatar məktəbini, gimnaziyanı və ali məktəbləri qurtaran mütəxəssislər idilər. Həmin illərdə məktəblər fəaliyyətini azaltmışdı, kəndçi balalarına dərs deyən müəllimlər azlıq təşkil etdilər.

Bütün bu çətinliklərə baxmayaraq yenə də məktəblər fəaliyyətin saxlamadan valideynlər ibtidai təhsil sahəsində bilikli gənclərin yetişməsinə nail olurdu.

1945-ci ilin may ayının 9-da Müharibə qələbə ilə başa çatdı. Həyatın pozulan ahəngi yavaş-yavaş bərpa edilirdi. Hər gələn günə yaradıcı baxışla yanaşan insanlar quruculuq işlərinə başladılar. O cümlədən, məktəblərdə canlanma baş verdi. Sinif otaqları artırıldı. Qızılağacda orta məktəb bərpa olundu. Ön cəbhədən qayıdan 80 nəfər Qızılağaclı döyüşçülər də





əmək cəbhəsində fəaliyyətə başladılar. Onlar kənd təsərrüfatı məhsularının əkilib becərilməsində, xalq təsərrüfatı sahəsində səylə çalışırdılar.

Sonrakı illərdə artıq həyat öz axarına düşmüş, insanların rifah halı yaxşılaşmış, müharibənin çətinliyi aradan götürülmüşdür. Müharibə iştirakçılarının şərəfinə Qızılağac kəndində 1985-ci ildə Xatirə abidəsi ucaldıldı. Hər il qələbə günü 9 may da o abidənin ətrafında cəmləşən Qızılağaclılar vəfat edənlərin ruhlarını yad edərək fatihə xeyrlər söylənilir. Mərasimdə iştirak edən böyük Vətən müharibəsi iştirakçılarına isə maddi köməklik göstərilir.

Hal-hazırda 2005-ci il dekabr ayına kimi onlardan beş nəfər yaşayır.

1988-ci ildə Ermənilərin Azərbaycan torpaqlarına təcavüzü nəticəsində Qarabağ müharibə meydanına çevrildi. Qarabağ torpaqları uğrunda döyüşlərdə iştirak edən Qızılağaclı gənclərdən dörd nəfər şəhid, bir nəfər itgin statusu alıbdır. 4 nəfər isə atəşkəs dövründə hərbi xidmətlərini yerinə yetirərkən şəhid olublar.

## RƏCƏB İSMAYIL OĞLU MƏMMƏDOV

*Çətinlikdə də, asanlıqda da, Allahdan razı ol*



1945-ci il 9 mayda xalqımızın II Dünya Müharibəsindəki tarixi qələbəsi dünya tarixinə qızıl hərflərlə yazılmışdır. Vətənin azadlığı və istiqlaliyyətini qoruyub saxlamaq və bəşəriyyəti faşizm kabusundan xilas etmək üçün Azərbaycanlılar və Azərbaycan gəncləri böyük tarixi vəzifəni şərəflə, ləyaqətlə yerinə yetirdilər.

Azərbaycanlı oğlan və qızlar müharibənin ilk günündən cəbhələrdə vuruşmuş, dinc quruculuq işlərimizə qəsd edən düşməndən amansızcasına intiqam almağa başlamışdır. Müharibənin ilk günlərindən bütün sovet gəncləri kimi Azərbaycanlı gənclər də qəhrəmanlıq, şücaət, göstərir və öz əsgəri borclarını döyüş bacarığı ilə yerinə yetirirdilər. Elə gənclər içərisində misilsiz xidmətləri ilə müharibədə igidlik göstərən partizan Rəcəbin də öz yeri, öz adı var.

Rəcəb Məmmədov 1924-cü ildə Masallı rayonunun Qızılağac kəndində anadan olmuşdur. Qızılağac kəndində təhsil alan Rəcəb uşaqlıq illərində Qızılağac yeddi illik məktəbi bitirmiş, valideynləri ilə Port-iliç şəhərinə köçmüşlər.





1941-ci ilin acı iyun xəbəri hər tərəfi bürüdü. Vətənin müdafiəsinə bütün ölkə qalxdığı bir zamanda Rəcəb də könüllü olaraq Böyük Vətən Müharibəsi cəbhəsinə yola düşdü. O da Alman-faşist işğalçılarına qarşı döyüşlərdə misilsiz hünər və rəşadət göstərdi. Sıravi əsgərlikdən qvardiya atıcı alayında kəşfiyyat bölməsinin komandiri vəzifəsinədək yüksəldi. Rəcəb Məmmədovun döyüş yolu Qafqazdan, Ukraynadan, Rusiyadan, Moldovadan, Rumuniyadan, Yuqoslaviyadan, Polşadan, Çexoslovakiyadan keçmiş və Berlində zəfərlə tamamlamışdır. Böyük Vətən müharibəsi cəbhələrində kəşfiyyatçı kimi ad çıxaran Rəcəb dəfələrlə qiymətli məlumatlarla geri dönmüş, hər dəfə də “dil” gətirməyə nail olmuşdur. Rəcəb Məmmədovun döyüş xidmətləri layiqincə qiymətləndirilmişdir. O, iki dəfə “Şöhrət” ordeni, “Qırmızı ulduz ordeni”, 28 adda müxtəlif medallarla və mükafatlarla təltif edilmişdir.

Rəcəb Məmmədov döyüş tapşırıqlarını yerinə yetirərkən bir neçə dəfə yaralansa da, təklikdə yenidən ön sıraya qayıtmış və qələbəyədək alman faşistlərinə qarşı mərdliklə vuruşmuşdur. Rəcəb döyüş şücaətlərinə yox, faşistləri məğlub etdiklərinə görə 9 may 1945-ci ildə sevindi. Bu sevinc təkcə Rəcəbin yox, bütün əzilən xalqın, məzlum xalqın sevinci idi. Qələbə əldə ediləndən sonra, görkəmində heç də başqalarından fərqlənməyən bir döyüşçü doğma kəndə qayıtdı. Hamı onu yola salanda, “bunun nə yaşı var, uşaqdır”- demişlər. Beş ildən sonra qayıdanda yenə uşaq təsiri bağışlayan Rəcəbin göstərdiyi qəhrəmanlıqdan, keçdiyi döyüş yolundan, əldə et-

diyi nailiyyətlərdən xəbərsiz idilər. İsmayıl kişinin oğlu Rəcəbi "xoş gəlmisən" sədaları ilə qarşıladılar, ata-anaya göz aydınlığı verdilər. Sən demə Rəcəbin göstərdiklərinin müqabilində əldə etdikləri orden, medallar da onun sinəsinə taxılanda qara çöhrəsinə işıq bəxş edəcəkmiş. Rəcəb müharibənin ağrı-acılarını nə qədər istəyirdi ki, unutsun, mümkün olmurdu. Hərdən qəmgin, hərdən həzin, hərdən də sevinc hissləri keçirərdi. Bu onun cəbhədə gözü ilə gördüyü hadisələrlə bağlı idi. 1947-ci ildə Vətənə dönən Rəcəb əmək cəbhəsində xidmətə başladı: ticarət sistemində işləməyə başladığı gündən müxtəlif vəzifələrdə çalışdı. Yaşadığı Lənkəran rayonunun Port-İliç qəsəbəsinin və rayonun ictimai-siyasi həyatında fəal iştirak etmişdir.

Rəcəb Məmmədov Böyük Vətən müharibəsi veteranı kimi tez-tez gənclər arasında olur, onların Vətənə, torpağa məhəbbət ruhunda tərbiyə olunması sahəsində müstəsna xidmətlər göstərirdi.

Rəcəb Məmmədovu müharibənin qələbə çalmasının il dönümü günlərində bayram şənliklərində iştirak etmək üçün Ukrayna, Moldova respublikasına tez-tez dəvət edirdilər. Rəcəb Məmmədovun keçdiyi döyüş yolu onun tale yolları idi. Müharibədən gələndən sonra Rəcəb ailə həyatı qurdu. Gözəl insan olan Rəcəb öz ailəsinə mehriban ata və qayğıkeş insan kimi rəhbərlik etdi.

Port İliç liman qəsəbəsində ticarət sahəsində işləyərkən neçə-neçə çətin dolanan ailələrə öz yardım əlini uzatmışdır.





Əl tutmaqla o bir vətəndaş kimi çətinliyin nə olduğunu bilirdi. Bilirdi ki, Allahın mənə bəxş etdiklərindən başqası da faydalanmalıdır. Neçə-neçə şəxslərə, ailələrə kömək əlini uzatdı Rəcəb... Özü isə bu xeyirxahlığın qiymətinin nə olacağını bilmirdi. Ancaq bu kəlamı əsas götürmüşdü: "Əl tutmaq Əlidən qalıb". Bəli bu dünyada imkansızlara köməklik edib, əlindən tutan, şəxslərin əlindən Allah tutar.

## SUBHAN MALİK OĞLU XƏLİLOV

## (1969-1992)

Qızılağac kəndində anadan olmuşdur. 1986-cı ildə orta məktəbi bitirmiş sonra Lənkəran şəhərində sürücülük kursunda təhsil almışdır. 1987-89-cu illərdə Krım vilayətində hərbi xidmətdə olmuşdur. 1989-cu ildə Bakı Neft Texnikumuna daxil olmuş. 1992-ci ilin oktyabr ayında isə könüllü olaraq Azərbaycan Milli Ordusunun tərkibində Qarabağa getmiş, bir çox kəndlərin müdafiəsində iştirak etmişdir. Laçın rayonunun Finqə kəndinin azad olunmasında böyük igidlik göstərmişdir. Oktyabr ayının 28-də Finqə kəndində gedən döyüşlərdə bomba qəlpəsindən qəhrəmancasına həlak olmuşdur. Subay idi.

Qızılağac bir saylı orta məktəbə cəsur döyüşçü şəhid Subhan Xəlilovun adı verilib.

***Axı nə görmüşdün bu dünyada sən***
***Bahar yetişməmiş bir qışa düşdün.***
***Bəlkə də taleyin hökmü beləymiş***
***Bəlkə də nagahan qarğışa düşdün.***



*Bu həsrət nə yaman həsrətdi qardaş.*
*Heç vaxt azalmayır qəmi, kədəri.*
*Min qayğı aldısa səni qoynuna*
*Yenə boş göründü oğulun yeri.*

*Billur arzuların, təmiz niyyətin.*
*Fələyin hökmüylə toxundu daşa*
*Qaldı xatirəndə atanın sözü*
*"Oğul, ömrün boyu xalqınçın yaşa".*





## ƏHLİMAN MUĞDƏT OĞLU CABBAROV

## (1974-1993)

Qızılağac kəndində anadan olmuşdur. 1991-ci ildə həmin kənddə orta məktəbi bitirmiş, 1992-ci ildə hərbi xidmətə çağrılmışdır.

130 saylı Şəmkir hərbi hissəsinin tərkibində Ağdərənin erməni quldurlarından təmizlənməsində igidlik və cəsarət göstərmiş, neçə-neçə erməni dığasını cəhənnəmə vasil etmişdir. Onun batalyon döyüşçüləri arasında böyük hörməti və nüfuzu var idi. 1993-cü il fevralın 11-də Əhliman Ağdərənin müdafiəsi zamanı döyüşlərdə qəhrəmancasına həlak olmuşdur. Əhliman 18 yaşında ikən canından çox sevdiyi vətən yolunda gənc ömrünü qurban verdi. Onun məzarı Qızılağac kənd qəbristanlığındadır. Yoldaşları, məktəblilər bura daim baş çəkir. Məzarına gül-çiçək düzülür. Subay idi.

Əhlimanın 1993-cü il yanvarın 23-də anasına yazdığı məktubundan.

"Yaxşı qulluq etdiyimə görə məni oxumağa göndərəcəklər. Zabit olacağam. Son qələbəyə kimi müqəddəs torpağımızı qoruyacağam. Məni gözləməyin, qardaşım Telmanı evləndirin. Nə vaxt lazım olsa özüm gələcəyəm!

Keçmiş "Qızılağac" sovxozu onun adına idi.

*Mən kiməm, nəçiyəm? Cavab varmı, yox?*
*Gördüm ki, torpağın zərrəsiyəm mən.*
*Dünyanın insana ehtiyacı çox*
*Nə kifayətiyəm, nə bəsiyəm mən.*



*Həyatın önündə ömür bir ansa*
*Şam tək yanmalıyıq biz zaman-zaman.*
*Dar gündə vətənin özü sınansa*
*Bizlər çıxmalıyıq bu imtahandan.*

*Döyüş bir cəbhədə olmayır, dədə*
*Həyat da döyüşdür, məktəb də döyüş.*
*Su tökməklə quyu dolmayır dədə*
*Arzu da döyüşdür, məktəb də döyüş.*

*Sən könül vermədün hər dumanlığa*
*Qəlbində fırtına təlatüm vardır*
*Döyüşkən arzuna, qəhrəmanlığa*
*Həyat hekayətin bariz misaldır.*





## AZAD ŞİKAR OĞLU XANMURADOV

## (1974-1993)

Azad Şikar oğlu Xanmuradov 1974-cü ildə Qızılağac kəndində fəhlə ailəsində anadan olmuşdur. 1983-cü ilin sentyabr ayında Qızılağac orta məktəbin I sinfinə daxil olmuş, 1991-ci ildə həmin məktəbi müvəffəqiyyətlə bitirmişdir.

1992-ci il oktyabrın 8-də hərbi xidmətə çağrıldı. 1993-cü il iyunun 20-də Füzuli bölgəsində xidməti vəzifəsini yerinə yetirərkən həlak olmuşdur. Subay idi.

Qızılağac kənd qəbristanlığında dəfn olunmuşdur.

***Mələklərin qanadında uçdular***
***Köləlikdən, əsarətdən qaçdılar***
***Haqq önündə cənnət adlı sarayın***
***Qapısını əlləriylə açdılar.***

***Şəhadətin şöhrət tacı şəhidlər***
***Millətimin qeyrət tacı şəhidlər***

***Səadətə sevinc yolu açanlar***
***Günəş olub aləmə nur saçanlar***
***Ölümüylə ölməzliyə qovuşan.***
***Ruhlar kimi asimana uçanlar.***

***Şəhadətin şöhrət tacı şəhidlər.***
***Millətimin qeyrət tacı şəhidlər.***



*Kim deyir ki, ulduz kimi batdınız,*
*Siz Allahın dərgahına çatdınız.*
*Ana torpaq sizi aldı qoynuna*
*Könüllərə həkk olundu adınız.*

*Şəhadətin şöhrət tacı şəhidlər!*
*Millətimin qeyrət tacı şəhidlər!*





# ŞAHİN VƏLİ OĞLU ABASOV

## (1971-1994)

1971-ci il martın 24-də Qızılağac kəndində anadan olmuşdur. 1988-ci ildə həmin kənddə orta məktəbi bitirmiş. 1989-1991-ci illərdə hərbi xidmətdə olmuşdur.



Bakı şəhərində sürücülük kursunu bitirdikdən sonra bir müddət sürücü işlədi. Düşmən ermənilərin Azərbaycan torpaqlarını işğal etməsi onun yuxusunu ərşə çəkmişdi. Evdə qərar tuta bilməmiş, 1993-cü ilin noyabr ayının 6-da könüllü olaraq cəbhəyə getmişdi. Beyləqanın müdafiəsində böyük fədakarlıq göstərmişdi. Yanvarın 6-da Beyləqan istiqamətində gedən döyüşlərdə Şahinin bircə sevgisi oldu: Vətən sevgisi - o bu sevgi uğrunda şəhidliyi şərəf hesab edib. Sevilməli vaxtı, ömrünün iyirmi üçüncü ilində şəhidlik zirvəsinə yüksəlib. Subay idi.

Ş.Abbasov Qızılağac kənd qəbristanlığında dəfn olunub.

*Tale yazan belə yazdı yazını*
*Qələm də onundur, kağız da onun,*
*Hər kəsə bir fəsil qismət eyləmiş,*
*Bahar da onundur, payız da onun.*

## LAÇIN SABİR OĞLU QURBANOV

1975-ci ilin sentyabr ayının 25-də Masallı rayonunun Qızılağac kəndində anadan olub.

1981-82-ci dərs ilində 2 saylı orta məktəbin 1-ci sinfinə daxil olub.

1991-92-ci tədris ilində 2 saylı orta məktəbi bitirib.

1994-cü ilin yanvarında Masallı rayon hərbi komissarlığından hərbi xidmətə göndərilib.

1994-cü ilin 20 aprelində Ağdamın İlxıçılar kəndində itkin düşüb.



*Qardaş demə qan olar,*
*Yel əsər, fəğan olar.*
*Qardaş gələn yollara,*
*Bacılar qurban olar.*







*Qızılağac 1 saylı məktəbin qarşısında müharibə iştirakçılarına qoyulmuş abidə*

Azərbaycanda Müsavat partiyası 1911-ci ildə oktyabr ayında yaranıb.

Azərbaycan Demokratik Cümhuriyyətinə gedən yol 1917-ci ildən başlayır. Rusiyada cərəyan edən hadisələrlə sıx bağlıdır. 1917-ci ilin martından etibarən demokratik müsavat partiyası açıq fəaliyyətə keçmiş, həmin ildə Gəncədə N.Yusifbəylinin Türk Ədəmi Mərkəziyyət partiyası tarix səhnəsinə çıxmış və 1917-ci ilin iyununda bu iki partiya birləşdi.

Bakıda keçirilən I qurultayda M.Ə.Rəsulzadə Mərkəzi Komitənin sədri seçilmişdir.

1918-ci il may ayının 26-da Zaqafqaziya Seyminin sonuncu iclası keçirildi. May ayının 27-də Seymin müsəlman fraksiyalarının ayrılıqda keçirdiyi iclasda Azərbaycanın müstəqilliyinin elan edilməsi və milli şura yaradılması haqqında qərar qəbul edildi.

Mayın 28-də Azərbaycan Milli Şurası yaradıldı və istiqlal bəyannaməsi elan edildi.

1927-ci ildə Masallı müsavat komitəsi özünün təşəbbüs qrupunu yaradaraq Masallıda təşkilatın bərpa edilməsi və sıralarının genişləndirilməsi işinə başlayan Müsavat komitəsinin fəaliyyət göstərdiyi bütün ətrafda birliyin baş istiqamətverici mərkəzi oldu.

Təşkilatın üzvləri qəza ilə Bakı müsavatçıları arasında əlaqələndirici rol oynayırdılar. Müsavatçılar əhalini inandırmağa çalışırdılar ki, tezliklə şura hökuməti yıxılacaq, bir neçə xarici ölkələrdəki müsavat qüvvələri Azərbaycan üzərinə hücum edib nəticədə Azərbaycan Demokratik Respublikası yenidən qurulacaq. Müsavatçılar hakimiyyət başına gələcəklər. 1929-

cü il aprel ayının 4-də 40-dan çox müsavat üzvləri həbs edildi. Gizli fəaliyyət göstərən təşkilatın özəyi ləğv edildi. Həmin illərdə Qızılağacda da Müsavatın gizli təşkilatı fəaliyyət göstərirdi . Qızılağaclı müsavat üsvülərindən aşağıda adları göstərilənlər həbs edildilər.

| | |
|---|---|
| **1. Əhməd Axundov** | **55 yaşında** |
| **2. Məlik Məlikov** | **35 yaşında balıqçı** |
| **3. Kəlbi Rəhim oğlu** | **60 yaşında sosial vəziyyətinə görə qolçomaq.** |
| **4. Zeynalabdin bəy Dadaşbəyov** | **37 yaşında balıqçı** |
| **5. Kərbəlayi Hüseyn Həsənov** | **46 yaşında qulluqçu** |
| **6. Bağır Zeynalov** | **50 yaşında** |
| **7. Molla Abdulla Bədirxan oğlu** | **67 yaşında** |
| **8. Fərəculla Qəribov** | **40 yaşında Az.balıqda işləyir** |
| **9. Cəbrayıl Sadıqov** | **40 yaşında Az.balıqda işləyir** |
| **10. Mirzə Abış oğlu** | **65 yaşında qolçomaq** |

Sonrakı illərdə bunların bəziləri uzun müddətli həbsxana ömrü yaşadılar. Azadlığa buraxılandan sonra Sadıqov Cəbrayıl, Məlik Məlikov, Bağır Zeynalov sövet hökumətinə xidmət etdilər. Cəbrayıl Sadıqov kənd sovetinin sədri vəzifəsində uzun müddət işləmişdir.

Fərəculla Qəribov isə Bakı şəhərinə köçmüş orada yaşamışdır.





Fərəculla Qəribovun haqqında həmişə söhbətlər olanda xeyirxahlığı yüksək qiymətləndirilir.

Bakı şəhərində olmağına baxmayaraq Qızılağaca tez-tez gələrək kəndçiləri ilə hal-əhval tutarmış. Hətta özünə məxsus olan Qızılağacdakı evini kənd camaatının ixtiyarına vermişdir. O evdən əvvəllər məktəb kimi, sonralar isə məscid kimi istifadə olunmuşdur. Onun xeyirxahlığı onun indi də xatırlanması üçün əsasdır.

Musavatın digər üzvləri də son ana qədər tutduqları yoldan dönməmişlər.

## AXUND OĞLU ƏHMƏD

***Bir kərə yüksələn bayraq bir daha enməz.***



Dünyada hər bir xalqın tarixində ən müqəddəs və əziz bir gün var. O da həmin xalqın azadlığa çıxdığı **İSTİQLAL** gündür. Xalqımızın tarixində belə bir müqəddəs gün **28 may 1918-ci ildir**. Həmin gün xalqımız öz varlığını axşam saat $19^{10}$-da bir xalq kimi mövcudluğunu bütün bəşəriyyətə çatdırmış və onun da dünyada müstəqil surətdə yaşayan xalqlar kimi öz etnoqrafik sərhədləri daxilində azad yaşamağa hüququ olduğunu qeyd etmişdir... Xalqımızın XX əsrdə ilk müstəqil dövləti olan **Azərbaycan Demokratik Respublikası** yarandı. M.Ə.Rəsulzadənin rəhbərliyi altında **Azərbaycan Milli Şurası** və ona tabe olan F.Xoyskinin hökumət kabinəsi iyunun 16-sı müvəqqəti paytaxt olan Gəncəyə köçdü. Beləliklə Azərbaycanda müstəqil milli dövlət orqanizminin yaradılmasının özülü qoyulmuşdur. Həmin özülün qoruyucularından biri də həmyerlimiz, müsavatçı M.Ə.Rəsulzadə şövqi, məhəbbəti, duhası rəğbəti ilə pərvəriş tapan Axund oğlu Əhməd idi.

Axund oğlu Əhməd haqqında məlum səbəblərə görə heç





bir sənəd qalmayıb. Onun haqqında məlumatı qızı Şövkət nənədən, kənd camaatından eşitdiyim, yadımda qalan məlumatdan, və "Yeni Müsavat" qəzetinin 11 mart 1993-cü il tarixli 10 saylı nüsxəsində getmiş arxiv materialı olan yazıdan öyrənə bildim.

Axund oğlu Əhməd 1873-cü ildə Lənkəran qəzasının Qızılağac kəndində anadan olmuşdur. 1926-cı ildən gizli təşkilat yaranandan sonra təşkilatın fəal və bacarıqlı üzvü kimi fəaliyyətə başlamışdır. O öz fəallığına görə Lənkəran qəza komitəsinə sədr təyin olunmuş, təşkilatın bütün işlərinə rəhbərlik etmişdir. Axund oğlu Əhməd təşkilatın iclaslarını keçirir, İrandakı müsavat mühacirləri ilə əlaqə yaradıb, nümayəndə göndərmək məsələlərini həll edir. Eləcə də Bakı ilə Lənkəran qəzasının Sovet hökumətinə qarşı barışmaz möyqedə duran gizli qrupları ilə əlaqə yaradılmasında iştirak edirdi. Doğma kəndi Qızılağacda Müsavat firqəsinə rəhbərlik etməklə Sovet hökumətinin kənddə keçirdiyi tədbir və kompaniyalara qarşı təbliğat aparırdı.

Axund oğlu Əhməd atasından ərəb, fars dillərini, müstəqil oxu nəticəsində rus dilini öyrənməklə sərbəst danışarmış.

Öz dövrünün savadlı və tanınmış adamlarından olmuşdur. O ticarət etməklə yanaşı bank işi ilə də məşğul olmuş, 3 il Qızılağacda (İlk bank binası indiki hamamın yanında olan iki mərtəbəli bina olub), 6 il Masallıda bankda işləmişdir.

Onun kənd camaatı arasında böyük nüfuzu olmuşdur.

Axund oğlu Əhmədin 9 uşağı olmuş. Onun Azərbaycan Demokratik Respublikasının başçısı M.Ə.Rəsulzadəyə böyük

məhəbbəti və rəğbəti olmuşdur. Buna görə də öz oğullarının adını M.Ə.Rəsulzadənin adına uyğunlaşdırmışdır.

**1. Məhəmməd Mehdi**
**2 Məhəmməd Şəfi**
**3. Məhəmməd Rəsul**
**4. Məhəmməd Kamil**
**5. Məhəmməd Səid**
**6. Məhəmməd Əmin**

"Yeni Müsavat" qəzetinin 11 mart 1993-cü il tarixli 10-cu sayında DTK-nın arxiv materiallarından götürülmüş məlumatda göstərilir ki, Axund oğlu Əhməd 1928-ci il 4 apreldə 55 yaşında həbs olunmuş, ona qarşı xaricdəki Müsavat mühacirləri ilə əksinqlabi əlaqələrinə görə, siyasi ünsürlərlə əlaqəyə görə, sovet hökumətinə qarşı silahlı qiyamın hazırlanmasındakı fəaliyyətinə görə Az.SSR Cinayət Məcəlləsi 34,66,72,73-cü maddələri ilə cinayət işi qaldırılmışdır. İstintaqın gedişində özünü qatı müsavatçı və Sovet hökumətinin barışmaz düşməni kimi büruzə vermişdir.

Axund oğlu Əhməd tutulandan sonra ailəsi incidilib, ailəsinin səsi alınaraq uşaqları məktəbdən çıxarılıb. Yaşadığı ev dəfələrlə yoxlanılıb və üç dəfə satışa qoyulub. Satışa qoyulmuş evi iki dəfə onun həyat yoldaşı Leyla xanım Yusif qızı, bir dəfə də Leyla xanımın qardaşı alıbdır. Leyla xanımın əri tutulandan sonra dəfələrlə dindirilib, olmazın mənəvi əzablarını çəkib və 1970-ci ildə vəfat vedib.





Axund oğlu Əhmədin Qızılağac kəndində yaşayan qızı Şövkət nənə ilə görüşəndə atası haqqında maraqlı məlumatlar verdi. O, atasının düzgün yol tutaraq üzv olduğu Müsavat partiyasının indi də fəaliyyət göstərdiyini bildikdə çox sevindi və şükr etdi ki, atasının həyatında üstün tutduğu Müsavat partiyasının davamçıları indi də vardır. Şövkət nənə atasının gördüyü işlərdən, onun camaat arasında olan hörmətindən ərəb, fars, rus dilində təmiz danışmasından, dövrünün savadlı adamı olmasından, evlərinə tanımadığı adamların yığışıb gizli söhbətlər etməsindən ürək dolusu danışdı. O, dedi - Ağam tutulmamışdan əvvəl bizim evə ağamın işlərinə göz qoymaq üçün təxminən 30 yaşında hündür, axsaq, qoltuq ağacı ilə gəzən bir oğlan göndərilmişdi. Təxminən 2 ay bu oğlan bizdə qaldı. Ağam hər gecə onunla oxuduğu kitablardan, Qurani Kərimdən, Kərbəla müsibətindən, xalqımızın bu günü və gələcəyindən danışırdı. Bir gecə NKVD işçiləri bizim evə gəlib ağanı aparmaq istəyirdilər. Öz qulaqlarımla eşitdim ki, həmin axsaq oğlan onlarla mübahisə edib deyirdi:

- Axı bu adam təmiz adamdır, kasıblara əl tutur, camaata ürəyi yanır, savadlıdır, dövlət əleyhinə heç bir iş görmür. Gələnlərdən biri həmin axsaq adamın üstünə qışqırıb dedi: Deməli o səni yoldan çıxarıb yedizdirib, içirdib, kökəldib. Biz səni kurorta göndərmişdik, yoxsa ona göz qoymağa?

Yaxşı, sənin dərsini verərik. Görünür yaşamaq istəmirsən.

Axsaq oğlan cavabında dedi: Mən axund oğlu Əhməd kimi adamlarla ölümə belə gedərəm!

Sonra onları götürüb apardılar. Axund oğlu Əhməd tutulan-

dan sonra onun barəsində ailəsinə heç bir məlumat verilməyib. Ailəsi müxtəlif yerlərə dəfələrlə müraciət edib heç bir cavab olmayandan sonra Mərkəzi Komitənin I katibi M.C.Bacırovla görüşüb Axund oğlu Əhməd haqqında məlumat almaq istəyiblər. M.C.Bağırovla görüşdükdən sonra ailəsinə bildiriblər ki, guya Axund oğlu Əhməd Türkiyəyə qaçıb. Əslində bu yalan məlumat idi. Şövkət nənə ağlaya-ağlaya dedi ki, sonradan eşitdiyimə görə Nargin adasında boğublar. O cinayətkar insanlar Axund oğlu Əhmədi qətlə yetirsələr də, ancaq haqqı boğa bilmədilər. Demokratik dövlətin yaranış vaxtında və sonralar **"Gültəkin"** ləqəbi ilə şeirlər yazan Əmin Abid (1898-1938) 28 may İstiqlal gününü belə tərənnüm etmişdir:

***İstiqlal, o yaşayan millətin qəlbində qan***
***İstiqlal, o səadət, həyat, zəfər, şərəf, şan***
***İstiqlal, o sönməyən bir məhəbbət məşəli***
***Könüllərdə tutuşur, gözlərdə sönsə belə!***





# KƏND SOVETİ

Qızılağac kəndində zəhmətkeş deputatlar Soveti Azərbaycanda Sovet hakimiyyəti qurulduğu vaxtdan yaradılmışdır. 1920-ci ildən Qızılağac kəndində yaradılan bu dövlət qurumuna ondan yuxarı şəxslər rəhbərlik etmişlər. Bu idarəçilik sistemi kəndin inkişafına xidmət edən bir təşkilat idisə, lakin onun rəhbərləri heç də bu ümidləri doğrultmurdular. Kənd camaatını incidib onlardan vergi almaqla, dövlətin yeritdiyi siyasəti yaymaqla məşğul olurdular. Lakin kəndin mədəni quruculuq işləri arxa plana çəkilirdi. Mövcud olan tikililər varlılara mənsub olduqlarına görə amansızcasına qarət edilirdi. Məhz bunun nəticəsi başqa sahələrdə də öz təsirini göstərdi. Dindarlar təqib edildi, Ali ruhani təhsili alanlardan tutmuş Quran oxuyan şəxslərə kimi qorxuya məruz qaldılar. Sovet sədrləri bu işdə əsas aparıcı rol oynayırdılar. Qızılağac kənd soveti sədri vəzifəsində işləmək üçün rayon rəhbərliyi tərəfindən başqa kəndlərdən adamlar təyin edilirdi. Onlar da burada heç bir quruculuq işi görməmiş, əksinə olanları söküb talamışlar. Sonradan 1936-cı ildən yerli kadrları bu vəzifəyə irəli çəkməklə kənd camaatının mövqeyi qorundu və abadlıq, quruculuq işləri görmək üçün zəmin yarandı.

Müharibə illərində də Qızılağac kənd zəhmətkeşləri böyük imtahan qarşısında olsalar da belə, kənd təsərrüfatını inkişaf etdirmək əzmi ilə səy göstərirdilər. 1950-ci ildən kəndin sosial-iqtisadi durumu yeni intibah dövrünə qədəm qoymağa başladı. Artıq öz işini bilən, kənd əməkçilərinin rifah halının yaxşılaş-

masına səy göstərən bacarıqlı, ixtisaslı mütəxəssislər bu vəzifəyə irəli çəkilməyə başladı. Məhz bunun nəticəsində Qızılağac kənd zəhmətkeş deputatları soveti plan və göstəriciləri yerinə yetirdiyinə görə rayonda qabaqcıllar sırasında öz yerini tutdu. Kənddə yeni tipli ictimai-iaişə, mədəni-məişət, binalarının tikilməyi ilə kənd camaatının rifah halı yaxşılaşmağa başladı. Bu da rəhbər kadrların kəndə yüksək münasibəti sayəsində həyata keçirdi.



***Qızılağac kənd ərazi nümayəndəliyinin binası***

Həmçinin onların rayon rəhbərliyi yanında böyük nüfuzları var idi. Keçmiş SSRİ İttifaqı dağılandan sonra həmin təşkilat başqa adla Rayon icra Hakimiyyətinin yerli nümayəndəsi kimi adlandı. Qızılağac kənd sovetinin sədrləri Ərkivandan Əmir, Boradigahdan, Qızılağacdan M.Əlizadə, Bəbir Ələkbərov, Abduləli Səfərov, Tağı Bədəlov, Yaqub Hüseynov, İbad Ələkbərov, Təyibə Rəhimova, Əliağa İsayev, Salman Abdullayev, İsrail Əsgərov, Eynal M. Rəhimov, Cəfər Sadıqov, Əzim Nəsirov, Yunis Sadıqov işləmişlər.





İcra hakimiyyətinin yerli nümayəndəsi vəzifəsində 1993-cüildən 2003-cü ilə kimi Zakir Abuşov işləmiş, 2003-cü ildən isə Fərhad Abbasov işləyir. Kənddə quruculuq, abadlıq işləri davam etdirilir. Yeni-yeni mədəni-məişət obyektləri salınır.

Dünya aləmində bir neçə karvan öz doğma vilayətini məcburiyyət qarşısında tərk edib. Onlar haqqında dini kitablarda çoxlu yazılar var. Elə karvanlarda olub ki, öz doğma vilayətini zorla tərk etdiriblər, ancaq onlar haqqında bir xatirə təsiri bağışlayan yazılar olmayıb. Heç kəs istəməz ki, öz doğma elindən-obasından ayrı düşsün. Lakin istəməklə yox, ayrılıq məcburi olanda nə etmək olar? Bir neçə məlumatlara diqqət edək. 1937-ci ildə Qızılağacdan sürgün olunanlar ailə başçısı və ailənin üzvləri olublar. Onlar aşağıdakılardır.

1. Məhəmməd Həsənov Kəlbi Abış oğlu
2. Məmmədov Cəfər Hacı Tağı oğlu
3. Talışxanov Miri bəy Nəbi oğlu
4. Hüseynov Məmməd
5. Məlikov Məlik
6. Məhəmmədhəsənov Rza Abış oğlu

Görəsən bunların vətəndən uzaqlaşdırılmasının səbəbi nədir? Onlar kim olublar?

Onlardan xalqa, hökumətə nə pislik yetişib?

Bu sualları çoxaltmaq olar. Cavabını da yazmaq. Ancaq bir neçə sual ilə kifayətlənib cavabın axtaraq. Cavabın axtarsaq da çarə yolu tapa bilmərik. Ona görə ki, olanlar olub, keçənlər keçib. Unutqanlıq olmasın deyə, xatırladıram. Onlar ortababkəndli olublar. SSRİ yaranmamışdan çox-çox əvvəl onların ata-babaları var qüvvələri ilə müxtəlif sahələrdə çalışıb, işgüzarlıqları, çalışqanlıqları sayəsində öz maddi imkanlarını artırmış və kənd sakinlərinin də güzaranının yaxşılaşması üçün yeni-yeni iş yerləri açıblar. Hacı Sadıqin bu sahədə

böyük xidmət olmuşdur. Xəzər sahilində bərgah (liman) təşkil edib, ticarətlə məşğul olub, Həştərxan vilayətindən taxta, şalban gətizdirərək satıb həm özü və ailəsini, həm də işləyənlərin ailəsini əmək haqqı ilə təmin edirdi. Hacı Sadıq haqqında "Qızılağac dünən və bu gün" kitabında müxtəsər də olsa məlumat vermişəm. Lakin bəzi faktları sadalamaqda məqsədim ondan ibarətdir ki, oxucu bilsin ki, 1937-ci ildə sürgün edilənlərin təqsiri nə imiş. Hacı Sadiqin limanı Qızılağacda, Göytəpədə, Maştağada olan hamamları və söhbət əsnasında söz açacağımız əmlakları var idi. Onun əmlakı babası Hacı Məmməddən qalmışdır.

Məhəmmədhəsənov Kəlbi və Rza qardaşları da təsərrüfata bağlı insanlar olublar. Onların çoxlu mal sürüləri, at ilxıları, hamamı, böyük imarətləri, geniş imkanları olub.

Məlikov Məlik də ortabab təbəqəyə mənsub idi. Onun da öhdəsində çoxlu təsərrüffat sahələri və qaramal ferması olub. Onu da qeyd edim ki, Məlikov Məlik 1929-cu ildə 35 yaşında müsavat partiyasının fəal üzvü kimi bir dəfə həbs olunmuş, sonradan həbsdən qaçmışdır.

Talışxanov Mir bəy, Hüseynov Məmməd, Məmmədov Cəfər də imkanlı kəndlilər kimi vətəndən didərgin olundular. Bunların başına gətirilən hadisələr ancaq və ancaq imkanlı olmaqları hesabına olub, hökumətə qarşı çıxmaqları yox.

Kəlbi və Rza qardaşlarının həyətində (indi Abuşov Məmmədin evi olan həyət) 1930-cu ildə artel və kolxoz qurluşuna məxsus yer olub. Əgər hökumətə qarşı çıxmaqları olsaydı öz həyətyanı sahələrini yeni qurulan hökumətin ixtiyarına verməzdilər. Nə isə...





1937-ci ilin tarixdə represiya qurbanları kimi qeyd edilən hadisələr Qızılağacda da özünü büruzə verdi. 1937-ci ilin isti may günü Xəzərin möhtəşəm dalğaları sahili döyəclədiyi ərazi. Bura Qızılağac kəndidir. Kənd əhalisi isti yay günlərində öz el-obasının adamları ilə birgə gün keçirirdi.

Kəlbi, Cəfər, Miribəy, Məhəmməd Məlik və Rza və onların ailələrinin ağlına da gəlməzdi ki, bu yaşayışı onlara rəva bilməyəcəklər. Lakin onlar gözləri ilə gördüklərinə inanmadılar. Nə etmişik, hansı günahın sahibiyik deyə, onların üstünə beşatılan tuşlayanlara sual olunurdu. Sual cavabsız qaldı. Ev-eşik sahibsiz, həmin adları çəkilən şəxsləri əli silahlılar eyni vaxtda evlərdən ailələri ilə birgə məcbur çıxardılar. Yarı çılpaq, ayaq yalın, indi də mövcud olan kənd soɣeti binasının birinci mərtəbəsində qaranlıq yerə saldılar. Nəzarətçilərin gətirdikləri arabalara mindirdilər. Kimi sevinir, kimlər isə göz yaşı töküb ağlayaraq haray-həşir salır. Daş ürəkli, daşnak niyyətlilər heç bir əlamətdən təsirlənmirlər. Onlar guya igidlik göstərib silahlarını o şəxslərə tuşlayıblar. Böyük kəndin kiçik karvanının ardınca gözlər baxır. Ürək hürkək, könül incik, körpə, böyük yola göz dikiblər, o karvan nə vaxt gələcək?..

Onları araba ilə aparıb Hacı Sadiqin öz limanından paraxoda mindirdilər. O, qaniçənlər heç kəsə imkan vermədilər ki, bir az yol azuqəsi və var-dövlətdən götürsünlər... Paraxoddan düşəndən sonra açıq yük vaqonlarına yüklədilər,sanitariya qaydaları qorunmayan bu vaqonlardakılardan çoxları mənzil başına çatmadı, yolda ikən həlak oldular. Qatar gedir, vaqonlarda olanlar isə hara gedəcəklərini, başlarına

nə gələcəyini bilmirlər. Əvvəl belə qərara gəlmişlər ki, kənddən çıxardılanları Xəzər dənizinə töksünlər. Sonra qərar dəyişilib, öldürmək yox, sürgün etmək. Nəqliyyatları vaqon, yerləri isə taxta döşəmə, üstü yanı açıq taxta qəfəs.

1937-ci ilin may ayı idi. Paravozun hər fit səsi gələndə, paravoz dayananda vaqonlarda olanların ürəyi çırpınır, başlarına nə gələ biləcəyini fikirləşirdilər.

Növbəti fit səsi, paravoz dayandı... Taxta vaqonların qapıları açıldı. Amiranə şəkildə hər vaqonda olanlara düşün yerə göstərişi verildi.

Neçə günün yol yorğunluğu unudulmuşdu, düşdükləri yeri isə tanımırdılar.

Karvanı qarşılayanlar yenə əli silahlı idi. Qızılağacdan olanlarla birgə olanlar bu yeri tanımırdılar. Yer özü-özünü onlara, tanıdırdı...

Mən otsuz, ələfsizəm, mən susuz səhrayam, mən insan yaşaması mümkün olmayan bir diyaram... Sən demə bu yer Qazaxıstan Respublikasının Cambul vilayətinin Çu adlı stansiyası imiş. Sürgündə olanın dedikləri: "Bizi vaqondan yerə salandan sonra iki hissəyə böldülər. Günəşli Azərbaycanda yaşayanları at tövlələrində (konniy - N.Q.) yerləşdirdilər. Nə yaxşı ki, dünyada yaxşılar var imiş. Bizi at tövlələrində yerləşdirəndən sonra silahlılar arxayınlaşdılar. Ac-susuz olduğumuz vaxt Qazax xalqının bizə ürəkləri yandı. Bizlərə həmin çətin günlərdə arxa-dayaq oldular. Biz hamımız həyatımız boyu Qazax xalqına borcluyuq. Bizə hər cürə maddi və mənəvi köməklik göstərdilər.

Çu stansiyasında yerlilərdən təşkil olunmuş sovxozlara bizi böləndən sonra başa düşdük ki, artıq bizim yaşamağa imkanımız olacaq. Bir hissəni "Novi Put" digəri isə "Drujba" kolxozlarında yerləşdirdilər. Hər qazmaya iki və üç ailə yerləşdirdilər. Aclıq və soyuq sürgünləri əldən salmışdı. Gündüzlər adamlar pencər yığıb qara unla qarışdırıb çörək bişirirdilər. Adam istəmir ki, bu çətinliklərin faciəsini geniş nəql etsin. Ancaq kitab yazanın xahişini nəzərə alıb doğma Azərbaycandan qovulmuşların başına gələni daha ətraflı yazmağa çalışmışam." (Məmmədov Allahşükürün oğlu Məmmədov Əyyub Allahşükür oğlu, 2004-cü il oktyabr ayı)





Hörmətli oxucu bu qısa, lakin məzmunlu təsir bağışlayan yazıya biganə qalmaq olmaz. Əgər onda didərginlər bu faciə ilə üzləşiblərsə bu gün bundan da böyük faciə Azərbaycanda mövcuddur. O faciə bir milyon Azərbaycanlılar ata-baba yurdundan didərgin düşmə faciəsidir. O vaxt da ermənilər, indi də ermənilər. Azərbaycan türk aləminə düşmən kəsilən ermənilər... kimlər... kimlər... kimlər...

# CƏFƏR HACI TAĞI OĞLU MƏMMƏDOV

*Böyüklük, ululuq, ürək genişliyi*
*dözümlə mümkündür*

O, qədim Qızılağacda bütün yaşayış evlərindən hündür və görkəmli bir evdə, böyük malikanə sahibi olan bir ailədə Hacı Tağı Hacı Məmməd oğlunun ailəsində 1885-ci ildə dünyaya gəlib. Cəfər Qızılağacdakı mədrəsədə və məktəbdə təhsil aldıqdan sonra, sovet quruluşu dövründə ali təhsil alıb. 1930-cu ildə Ali təhsilli Cəfər Hacı Tağı oğlu kənddə kənd sovetinin sədri işləmişdir. Onun babası Hacı Məmməddən qalan əmlakda atası Hacı Tağının da payı var idi. O dövrün kübar ailələrindən hesab olunurdu. Əmisi Hacı Sadiq, Hacı Hacağa da o mövqeyə malik olan ailə sahibləri hesab olunurdular.

Hacı Məmməddən qalan Liman, qədim hamam, iki mərtəbəli ev (dəmirli məktəb - N.Q.) və başqa əmlakalar var idi. Övladları ata irsinə sahib duraraq onu inkişaf etdirmiş, son nəticədə şöhrətlənmişlər.

O cümlədən Sara adasında və Digah kəndində dükanları, Göytəpədə (Prişibdə) hamamı, evi, əmlakı (onu səkkiz həyət adlandırırdılar.) var idi. Sonradan həmin evdə hərbiçilər məskunlaşdılar. 1937-ci ildə Məmmədov Cəfər hacı Tağı oğlunun böyük oğlu Allahkərimin 18, Allahşükürün isə 13 yaşları var idi.

Cəfərin oğlu Allahşükür 1942-ci ildə səfərbərliyə alınaraq beş il hərbdə olub. 3 dəfə yaralanıb, onun cəbhə yolu Ginzburqda (Kaliningrad) qurtarıb.







*Dəmirli məktəbin binası. (Hacı Məmmədin evi.)*
*.Cəfər bu evdə anadan olmuşdur.*

Allahşükür düşmən tankını məhv etdiyinə görə II dərəcəli şöhrət ordeni ilə təltif olunub. Daha sonra "Qızıl ulduz" ordeni "igidliyə görə medalı" ilə təltif olunub. Ümumiyyətlə, Allahşükür 13 medal və 3 ordenlə təltif olunmuşdur. Allahşükürün 6 övladı olub. Allahkərimin isə 8 övladı olub.

Allahkərim "Novi put" kolxozunda briqadir işləyib. 1962-1964-cü illərdə Allahşükür "Oblast istehsal ittifaqı" təsərrüfatında kolxoz sədri vəzifəsində işləyib.

1964-cü ildə onu rayonun çuğundurçuluq təsrrüfatına rəis vəzifəsinə təyin ediblər. Çoxlu fəxri fərmanlarla və mükafatla mükafatlandırılıb.

1971-ci ildə çörək yeyinti kombinatının direktoru vəzifəsinə təyin edilib.

1972-ci ildə vəfat etmişdir.

O mənəvi həyatını doğmalaşdığı "Novi put" kolxozuna həsr etmişdir.

Cəfər 1945-ci ildə oğlu Allahkərim isə 1999-cu ildə vəfat edibdir.

Allahşükürün 3 övladı ali təhsilli mütəxəssisdirlər.

Kənddə, yəni "Novi put"da böyük hörmət və nüfuza sahib olublar.

İndi də Qazaxıstanın bu yaşayış yerində onların çoxlu sayda nəvə, nəticə və kötükcələri vardır.

Orada yaşayan qızılağaclıların övladları demək olar ki, hamılıqla ali təhsilli mütəxəssidirlər. Qonşu Qırğızıstan, Tacikistanda müxtəlif vəzifələrdə işləyənləri də vardır.





## İMAMVERDİ KƏLBİ OĞLU MƏMMƏDHƏSƏNOV

***Allahın doğru yola saldığı kimsəni də, heç kəs yoldan çıxara bilməz.***



1925-ci ildə Masallı rayonunun Qızılağac kəndində anadan olmuşdur. 1937-ci ildə ailəvi "sürgün" olunmuşdur. Sürgün həyatını Qazaxıstanın Çu vilayətini "Yeni yol" kolxozunun ərazisində yaşamışdır.

1937-ci ildən əmək cəbhəsində fəaliyyət göstərib, 1943-cü ildə həqiqi hərbi xidmətə çağrılıb. O, müharibəni başa vurur. Budapeştin, Venanın, Praqanın alınmasında iştirak etmişdir. 1946-cı ildə ordudan tərxis olunaraq "Yeni yol" kolxozunda manqa başçısı vəzifəsində işləmişdir.

Çuğundurçuluqda sabit, yüksək məhsuldarlıq əldə etdiyinə görə o, ən yüksək dövlət mükafatı Sosialist Əməyi Qəhrəmanı, qızıl Ulduz medalı ilə təltif olunmuşdur.

Bacarıqlı əməyə görə o, bir neçə dəfə dövlət mükafatlarına layiq görülmüşdür. İ.K.Məmmədhəsənov əvvəl orta ixtisas məktəbində, sonra isə Ali təhsil müəssisəsində təhsilini davam etdirmişdir. Uzun müddət "Yeni yol" kolxozunda baş

aqronom vəzifəsində işləmişdir. 1985-ci ildə baş aqronomluqdan təqaüdə çıxmışdır. O, mənalı həyatını kənd təsərrüfatının inkişafına həsr etmişdir. İ.Məmmədhəsənov yüksək məhsul uğrunda mübarizə aparan, bacarıqlı təşkilatçı, beşillik planın vaxtında yerinə yetirilməsində əzmkarlıq nümayiş etdirmişdir.







O, 1999-cu ildə vəfat etmiş, yaşadığı "Yeni Yol" kolxoz ərazisindəki qəbristanlıqda dəfn edilmişdir. Lakin Çu şəhərinin mərkəzi xiyabanında onun şərəfinə büst qoyulmuşdur. "Yeni yol" kolxozu ərazisində onun adına məktəb və küçə vardır. Sürgün həyatı keçirən İmamverdi bir neçə dəfə Qızılağaca gəlmiş, anadan olduğu torpağı və doğmalarını ziyarət etmişdir. O, beş övlad atası idi. Qızı Gülqayıt Qızılağac kəndində gəlindir. İxtisasça diş həkimidir. Sənətinin mahir bilicisidir.

Qızılağac kəndində qədim zamanlardan dənizçilik sevimli peşə olmuşdur. 1960-cı ildən qızılağaclı gənclərin bu peşəyə sahib olmaqlarının nəticəsidir ki, indi Xəzər dəniz gəmiçiliyi idarəsində 50-dən çox müxtəlif vəzifələrdə işləyənlər olublar. Onlardan Tapdıq Kərimov, Bəylər Ağayev, Vaqif Əliyev, Nəhməd Abiyev, Abbas Ağayev, Hicran Fətullayev, Fuad Bayramov, Loğman Cabbarov və başqalarını göstərmək olar. İndi onlarla qızılağaclı mütəxəssis Xəzər dənizçilik idarəsinin qabaqcılları cərgəsində ön cərgədə gedirlər. Bəli, dənizçilik bütün qızılağaclılar üçün sevimli peşədir.

## ƏDALƏT AYAZ OĞLU ƏZİMOV



O, 1952-ci ildə Qızılağac kəndində anadan olmuşdur. Orta məktəbi qurtardıqdan sonra Bakı şəhərindəki Qafur Məmmədov adına dənizçilik məktəbinə daxil olmuşdur. Uzun müddət Xəzər Dənizçilik İdarəsində müxtəlif vəzifələrdə işləmişdir. İşləməklə yanaşı, 1991-ci ildə Odessa Dəniz Mühəndisləri İnstitutunu bitirmişdir. 1998-ci ildən uzaq səfərlər kapitanıdır. Hal-hazırda həmin idarədə gəmi kapitanı vəzifəsində işləyir. Öz sənətinin mahir bilicisi kimi neçə-neçə təcrübəli kadrlar yetişdirib.

Rəftar və münasibəti ilə fərqlənir. Onun iki oğlu vardır.

## SƏXAVƏT AYAZ OĞLU ƏZİMOV



1950-ci ildə Qızılağac kəndində anadan olub. 1957-ci ildə Qızılağac kənd orta məktəbinin 1-ci sinfinə qəbul olunmuş, 1967-ci ildə həmin məktəbi bitirmişdir.

1968-ci ildə Qafur Məmmədov adına Bakı dənizçilik yolları gəmi güc qurğuları fakültəsini bitirmişdir. Məktəbi bitirdikdən sonra Xəzər gəmiçiliyi idarəsində işləməyə göndərilmişdir. Çalışdığı müddət ərzində müxtəlif vəzifələrdə işləmişdir. Böyük təcrübəyə malik olan Səxavət uzun müddətdir ki, Xəzər dəniz gəmiçiliyində baş mexanik vəzifəsində işləyir.

Ailəlidir, bir oğul və bir qız atasıdır.

Səxavət öz rəftar münasibətləri ilə əcdadının adını doğruldur. Qızılağac kəndində vaxtı ilə babası Kərbəlayi Əzim, nüfuzlu, sözükeçən şəxsiyyət olmuşdur.






# Xeyriyyəçilər




## MƏSCİD TİKİNTİSİ

***Allahın məscidlərini yalnız Allah və qiyamət gününə iman gətirən, namaz qılan, zəkat verən və Allahdan başqa heç kəsdən qorxmayanlar təmir edə bilərlər. (Yalnız o qəbildən olan şəxslərin əməlləri Allah dərgahında qəbul olunar.) Məhz onlar doğru yolu tapa bilənlərdən ola bilərlər.***



***Kənd məscidinin ümumi görünüşü.***

1990-cı il sentyabr ayının 13-də köhnə məscid sökülüb, şəkildə göründüyü kimi tikildi. Tikinti 1990-cı il dekabrın 16-da tamamlandı (Məscid haqqında geniş məlumatı "Qızılağac dünən və bu gün" kitabında oxuya bilərsiniz). Qızılağac məscidi, Masallı rayonunda yeganə məsciddir ki, Respublika Mədəniyyət Nazirliyinin tarixi abidələr fonduna daxildir.



Hacı Həsən Ağa
(1948-2001-ci il)



1994-cü ıldə Hacı Həsən Ağa öz hesabına bu mədrəsəni inşa etdirdi.







***Dəstəmazxana***

Sakit Hacı Əli oğlu Əliyev 2001-ci ildə öz hesabına bu dəstəmazxananı inşa etdirib.



***Sakit Əliyev***



*Bu namazgahı 2004-cü ildə Hacı Məmməd Nəsir oğlanları Rasim və Namiqin köməkliyi ilə inşa etdirib.*



*Bu məqbərəni axundun nəvəsi Mikayıl Fətullayev öz hesabına inşa etdirib.*





# ƏLİÖVSƏT MUSA OĞLU ƏLİYEV

***Həqiqətən mal-dövlətiniz və oğul-uşaqlarınız sizin üçün ancaq bir sınaq vasitəsidir.Ən böyük mükafatı isə Allah dərgahındadır.***



Hər bir insan həyatı boyu məqsədinə nail olmağa çalışır. Bəziləri dövlət, sərvət, ailə qurmaq, övlad-uşaq sahibi olmaq, maddi və mənəvi dəyərlərə çatmaq arzusu ilə günlərini keçirir. Bəziləri həyatın müvəqqəti olduğunu bilir, mala, dövlətə yox, Allaha xatir işlər görməyə çalışır. Hər insan fani dünyaya bel bağlamaz. Ona görə ki, dünya həyatı Quranın buyurduğu kimi "oyun-oyuncaqdır". İnsan bu fanilikdən əbədi həyat üçün istifadə etməlidir. Bəziləri isə yollar axtarır, çıxış yolu. O, yol ki, onu mənəvi paklığa, mənəvi yüksəlişə çatdıra bilsin. O, yol ki, onu əməli ilə ilahi mərhəmətinə nail etsin... Bu istəklər yolunun yolçularından biri Məşədi Əlövsət Musa oğludur.

Onda olan inam yüksəkliyi onu mənəvi cəhətdən paklığa çatdırmışdır. Həyat yoldaşı Səyyara Kərimbala qızı ilə 2001-ci ildə Məşhəd ziyarətinə getdi. 8-ci imamı ziyarət etdi. Paklıq, inam, məhəbbət ona yeni istiqamətlər bəxş edirdi. Onda olan bu əlamətləri hər il imam Hüseyn(ə) haqqında verdiyi ehsanda hiss etmək olurdu. Qəlbində məhəbbət güclüdür. Ki-

çik xeyirxahlıqları çox olub. İmkansızlara kömək olub, məclislərdə iştirakı ilə seçilib, tanınıb.

Xeyrənnisə Ramazan qızının hüzür məclisində xeyriyyəçilik haqda söhbətimi tamam edəndən sonra dedim: Onu da bilmək lazımdır ki, bir müqəddəs məkana - Sultan Pir ziyarətgahına kömək lazımdır. Bina bir neçə əsr bundan qabaq inşa edilib. 1939-cu ildə Əlbala adlı qızılağaclı xeyriyyəçi öz hesabına onu təmir edib. Üst örtüyü suval örtüklə əvəz edib. Kim bu binaya Allah xatirinə yenilik bəxş etsə onun əvəzin Allah ona verəcək...



Bin neçə gün söhbətlərimi Həcc ziyarəti və xeyriyyəçiliyə həsr etdim. Məşhədi Əlövsətin qəlbində qərarlaşan xeyriyyəçilik qığılcımı alovlanaraq ətrafa işıq saçdı. Ona bu binanı tikməyə icazə verməyi xahiş etdi. Onu alqışladım, xeyirdualar verdim. Növbəti gün şad xəbəri məclisdə iştirak edən-





lərə çatdırdım. Kənd camaatı bu işi alqışladı... 2005-ci il dekabrın 18-də Sultan Pir ziyarətgahını sökməyə başladıq. Kəndimizin ziyalısı Asəf Cəfərovu, ustalar Füzuli, Ağaşirin, Cəmil Qurbanov qardaşları bu işi görməyə məsləhət gördük. Xeyriyyə işlərində həmişə təmənnasız işləyənlər səsimə səs verdi. İki günə bina söküldü, tikintiyə başlandı. Asəf Cəfərov, Füzuli, Ağaşirin, Cəmil əl qabliyyətlərini bu binada da göstərirlər...

Məşhədi Əlövsət Musa oğlu 1943-cü ildə anadan olub, orta ixtisaslı ticarətçidir. Uzun müddət ticarətdə işləyib, iki oğul, üç qız atasıdır. İki qızı, bir oğlu ali təhsillidir. Məşhədi Əlövsət xeyriyyəçilər salnaməsinə öz adını Sultan Pir ziyarətgahını tikdirməklə yazdırdı. Onun bu işini Allah özü qiymətləndirəcək.

# İBAD QƏZƏNFƏR OĞLU NƏSİROV



1950-ci ildə anadan olmuşdur. Uzun müddət hərbi sahədə qulluq etmişdir. O, öz hesabına "Biləş" çayı üstündə uzunluğu 47,5 m olan körpünü inşa etdirmişdir.

Kəndin xeyriyyə işlərində öz köməkliyini əsirgəmir.



*"Biləş" çayı üzərindəki körpü. 2003-cü ildə inşa edilmişdir.*







**Füzuli Əbdüləhəd oğlu Qurbanov**



**Ağaşirin Əbdüləhəd oğlu Qurbanov**



**Cəmil Əbdüləhəd oğlu Qurbanov**

1990-cı ildə tikilən kənd məsçidinin, 1994-cü ildə tikilən mədrəsənin, 2004-c ildə tikilən namazgahın, 2006-cı ildə tikilən "Sultan pir" ziyarətgahının ustaları olmuşlar. Göstərilən tikintiləri haqq rizasına tikmiş və heç bir təmənna ummamışlar. Qurbanov qardaşlarının gördüyü bu işlər əsl xeyirxahlıq nümunəsidir. Onlara işlərində uğurlar diləyirəm.

# HİDAYƏT (ELMAN) ADİL OĞLU ƏSGƏROV

*Hər bir haqq işin öz həqiqəti və*
*hər bir düzgün işin öz nüraniyyəti vardır*



Allah insanı ən ideal şəkildə yaratmış, ona bir çox xüsusiyyətlər bəxş etmişdir. O xüsusiyyətlərdən biri düşüncə qabiliyyətinə və düşündüklərindən nəticə çıxara bilmək şüurunun olmasıdır. İnsanda olan bu xüsusiyyətlər onu həmişə başqalarından fərqləndirir. Fərqli cəhətlərə malik olan insanlar haqqında yazmaq müəllifdən böyük məsuliyyət tələb edir. Ona görə ki, haqqında yazmaq istədiyin şəxsi tanımalı, onun nəyə qadir olduğunu, nəyə bağlı olduğunu bilməlisən.

Şəxsiyyətlər var tanınır, bəziləri isə tanıdır. Hidayət





Tanıdır gələcək illərə bu gün həyata bəxş etdiyi töhfələrlə ...

Qızılağaca doğma olan möhtəşəm Xəzərin həzin lay-lay sədaları, əsən sərin mehi ilk öncə bu evin sakinlərinə təsir bağışlayır. Çünki Hidayətin anadan olduğu ev Xəzərlə kənd evləri arasında ilk evlərdən biridir. Bu evdə Adil kişinin, Kafiyə bacının, Nərgiz xalanın sevincinə səbəb olan bir oğlan uşağı dünyaya gəldi. Ana babası Kərbəlayi Hüseynalı və İbrahim kişi də doğmalarının sevincinə şərik oldular. Bu uşağa Hidayət adı qoyuldu. Hidayət həyat yolunun başlanğıcına babası Kərbəlayi Hüseynalının dizləri üstündə qədəm qoydu. Yüz on yaşdan yuxarı olan babasının dizləri üstündə oturan bu uşaq əli ilə qar kimi ağ olan babanın saqqalını tumarlayır, özünü rahat hiss edirdi. Hidayət bilmirdi bu nurani kişinin ağ saqqalı və oturduğu dizi nə əhəmiyyətə malikdir. O, bilmirdi həmin saqqal Nəcəfdə, Kərbəlada, Samirədə, Kazımeyndə neçə-neçə ziyarət məqamlarında müqəddəslərin pak torpağına sürtülüb. O, bilmirdi oturduğu baba dizi neçə-neçə ziyarətgahlarda namaz halətində torpaq üstünə qoyulub. O bilmirdi müdrik, dünya görmüş babası öz dövrünün tanınan neçə-neçə müctəhidlərilə həmsöhbət olub... O, bilmirdi ki, bu baba öz nəvəsini həyatda hansı mövqedə görmək istəyirdi. Hidayət indi bilir ki, onun babaları necə gözəl məslək sahibi olan insanlar imişlər.

Bəli, Hidayət mərdlik yoluna uşaqlıqdan qədəm qoymuşdur. Ruhani babaların, nənələrin, ziyalı atanın könül oxşayan sözləri ilə...

Yeddi yaşı tamam olanda ilk dəfə məktəb oturacağı arxasında oturanda da Hidayət fərqlənirdi. Bu fərqlər onu əxlaqda, bilikdə, səmimiyyətdə tanıdırdı. Orta məktəbi bitirib

kamal atestatı alanda kamil insan olmaq üçün qarşısına məqsəd qoydu. Ali təhsilli gənc mütəxəssisin qarşısında hələ ona bələd olmayan böyük kollektivin üzvləri ilə ünsiyyət tapmaq dururdu. Az vaxt içərisində istəyinə nail olan Hidayət kollektivitn sevimlisi və qabaqcıl mütəxəssis kimi tanındı...

İşinin çoxluğuna baxmayaraq, kitablara olan marağını azaltmırdı. Kitab mütaliəsi onun ən çox sevdiyi bir əməl idi. Tez-tez kitab mağazalarına üz tutur, yeni nəşr olunan kitablarla tanış olurdu. Kitab insan idrakına güclü təsir bağışlayan köməkçi olduğu üçün Hidayətin də bu sahəyə qəlbində maraq hissi oyanırdı.

Hər təzə nəşr olunan kitabın müəllifi, adı ilə tanış olur, hansı nəşriyyatda çap olunduğu ilə maraqlanırdı. Kitab çapı yüksək zövq, dəqiqlik və gərgin əmək tələb edən bir sahə olduğunu bilən Hidayət bu sahədə xidmət göstərməyi qərara aldı. O bilirdi ki, antik dövrdən tutmuş indiyə qədər yazılan kitablar qorunub saxlanmaqla yanaşı, istifadə edənlərə böyük köməkçidir. Məhz Hidayət də öz köməkliyini gələcək nəsillərə nəşr edəcəyi kitabların varlığında gördü. 1990-cı ildən Poliqrafiya şöbəsində fəaliyyət göstərməyə başladı. Müstəqil müəssisə yaratdı. Hər bir varlığın adı olduğu kimi Hidayət də müəssisəyə ata xatirəsini əbədiləşdirmək üçün "Adiloğlu" adı qoydu.

Qədəmin uğurlu olsun "Adiloğlu" deyənlər də çox oldu.

Hidayət müəllimin təşkilatçılığı, səyi və bacarığı nəticəsində "Adiloğlu" nəşriyyatı müasir tələblərə cavab verən müəssisəyə çevrildi.

Müasir çap avadanlıqları ilə təchiz olunan bu nəşriyyatın kitabları nəinki respublikada, bir neçə xarici ölkələrdə də "Adiloğlu" nəşriyyatı şöhrətləndirdi. İndi bu nəşriyyatın çap





etdiyi kitabların sorağı dünya ölkələrindən gəlir.

Türkiyədən, İrandan, digər ölkələrdən müəlliflər bu nəşriyyata müraciət edirlər. Müəlliflər Hidayət müəllimin yüksək insani keyfiyyətlərə malik olduğunun şahidi olurlar. Bunun müqabilində ona minnətdarlıqlarını bildirirlər. Hidayətə olunan minnətdarlıqların fövqündə duran, tarixi keçmişi az qala unudulan, tarixi keçmişi müəyyən səbəblərə görə indiki dövrün insanlarına çatdırılmayan adı ilə fəxr etdiyi Qızılağacın və qızılağaclıların minnətdarlığıdır.

Məhz onun birbaşa köməkliyi sayəsində "Qızılağac dünən və bu gün" kitabı işıq üzü görmüşdü.

Öz doğma kəndinin tarixi keçmişi, indisi və gələcəyi ilə öyünən Hidayət müəllim həmin kitabın üz qabığındakı mənzərəni, kitabın cildini özü seçmişdir.

Bəli, əcdadlarının uyuduğu qədim Qızılağacı yenidən dünyaya tanıtdıran məhz Hidayətdir. Onun qəlbində Qızılağac və qızılağaclılara sonsuz məhəbbət vardır. Hər il Qurban, Orucluq, Novruz bayramlarında, məhərrəmlik ayında Hidayətin ailəsi ilə birgə Qızılağaca gəlməyi neçə-neçə imkansız şəxslərə sevinc bəxş edir. Kənd camaatı ilə birgə dini ayinlərdə iştirak edir. Hidayətin atası Adil ilə bağlı olan xatirələri çoxdur. O xatirələrdən birini həmişə xatırlayan Hidayət atasını özünün həyat müəllimi hesab etməsidir. "Adiloğlu" nəşriyyatında çap olunan kitablar gələcək nəsillər tərəfindən oxunub oyrənəcək və hər zaman yaddaşlarda yaşayacaq. Hidayət müəllim müəlliflərə ümid bəxş edən ziyalıdır. Həmçinin onlara böyük köməkçidir. O, həm də tabeliyində olan işçilərə çox əzizdir. Tabeliyində olan işçilərin ailələrinə sevinc bəxş edən məhz odur. Xeyriyyəçilik Hidayət üçün adi haldır. Hidayət müəllim

nəşriyyatda işıq üzü görəcək kitabların ilk oxucusudur. Kitabın "siqnal" nüsxəsini oxuyandan, nəzərdən keçirəndən sonra çapına icazə verir. Bu onun ensiklopedik biliyə malik olmasına böyük kömək etmişdir.

Bəli, Hidayət müəllim yaşayıb yaradan ziyalılardandır. Ona xüsusi zövq bəxş edən bu yaradıcılıq yeni-yeni üfüqlərə aparacaq.

Hidayət gözəl ailə başçısıdır. İki qızı, bir oğlu var. Qızları da, oğlu Teymur da orta məktəbdə oxumalarına baxmayaraq, dini ayinləri, İslami bilikləri, Quran tərcüməsini, İslama dair kitabları mütaliə edərək üstün cəhətlərə sahib olmuşlar.

Bəli, Hidayət əmin ola bilər ki, o, ikinci ixtisas seçməkdə düzgün yol tutmuşdur. Məhz bu yol onun daxili mənəfiyyatına bələd olmaq üçün kifayət imiş. Məhz bu yolla o tanınır və tanıdır. Kiçik həcmli yazıda Hidayətin daxili aləmində olan əlamətlərdən azca söz açdım. Lakin Hidayətin qəlbində, daxili aləmində olanları yazmaqla qurtarmaq olmaz. Çünki o Vətən fədaisi, millət aşiqi, anadan olduğu kəndin vurğunudur. Çünki o, sadə əməyilə yox, millətinin, xalqının, Vətəninin, kəndinin tərəqqisi ilə öyünən, fəxr edən ziyalıdır.

Mən Hidayət müəllimə və ailə üzvlərinə bütün işlərində uğurlar diləyirəm.





## ELƏ ADIN KİMİ...

De, danış elmdən, ədəbdən danış,
Quran nə deyibsə hidayət eylə.
Sən Tanrı yolunda inamla çalış,
Başa düşənlərə nəsihət eylə!

Elm Peyğəmbərdən qalma mirasdır,
Öyrənək beşikdən elmi qəbrədək.
Demirəm işimiz tamam tarazdır,
Çalışsaq Tanrı da eyləyər kömək!

Öyrənib hər işi ucalıq saydıq,
Mənəvi ucalıq çəkirdi bizi.
Haqqa gedən yolda çalışmasaydıq,
Pislər girdabına çəkərdi bizi.

İslam dünyasına bağlı olandan,
Yeni bir aləmə qovuşmuş oldun.
Sən qaranlıqlara işıq salandan,
Neçə bəlalardan sovuşmuş oldun.

O köhnə məscidin bərpa işində,
Getdin irəlidə bir əsgər kimi.
Duyurdum səninlə hər görüşəndə
İşdən güc alırdın müjdələr kimi.

Tikilən mədrəsə, dəstəmaz yeri,
Şərdən uzaq edir ürəyimizi.
Minarədən qalxan əzan səsləri,
Mənəvi paklığa çağırır bizi.

Sən cavan çağından ağsaqqalları,
Toplayıb başına çox iş görmüsən.
Bəzən yatıraraq qeyli-qalları
Neçə könülləri sevindirmisən!

Sənə tənə edən, ağız büzənin,
Gördüyün işlərdən xəbəri varmı?
Sənə daldalarda böhtan düzənin
Görəsən kiməsə səməri varmı?

Vətəninə bağlı hər insan oğlu,
Kökündən, soyundan uzaq düşməsin.
Bağlansın hər yanda qoy sərin yolu,
Şeytanla, iblislə dostluğu kəsin!

Tutduğun bu yoldan dönən deyilsən,
Bu yol çətin yoldur, şərəfli yoldur.
Qalxdığın zirvədən enən deyilsən,
Buyur boşluqları imanla doldur.

Müqəddəs kitab da deyir bu sözü,
Nəsihət dinləyər imanlı kəslər.
Dərgaha qaldıraq əllərimizi,
Tanrı ucalığa insanı səslər.





Olanlar, keçənlər qaldı arxada,
Nurlu gələcəyə ümidlə baxaq.
Böyük dəyişiklik olan dünyada,
Biz də sınaqlardan uğurla çıxaq.

Deyilən mənasız sözlərə baxma,
Yel qayadan daşı qopara bilməz.
İnsana dərd olar minnətli loxma,
Dar gündə əqidə, vətən keçilməz!

Tanrıya, Qurana bağlı sözündə,
İlahi eşqi var, şəfqətdi, qardaş!
Bu günün, sabahın, gələcəyin də,
Elə adın kimi nüsrətdi, qardaş!

Sən axund olandan bu doğma kəndi
Çox qondarma dəbdən azad etmisən.
Dost, səni ucaldan əməllərindi,
Məscid ətrafını abad etmisən!

Hər şey olsun deyə yerli-yerində,
İslama vicdanla xidmət edirsən
Xalqın xeyirində, xalqın şərində,
Görürəm çalışıb öndə gedirsən.

Tanrıdan, Qurandan söhbət açaraq,
Hamının gözündə uca olursan.
Elminlə qəlblərə işıq saçaraq,
Kamala yetirsən, yaşa dolursan!

Ona sevinirəm məclislər içrə,
İndi öz yerin var, öz söhbətin var.
İslam baxçasından gül dərə-dərə,
Duyuram ki, nurlu çox niyyətin var.

Başqa bir rəngə də yoxdur ehtiyac,
Necə tanımışam elə yazıram.
Elminlə hər yana işıq saç, nur saç,
Yaxşı əməlləri vəsfə hazıram!

Tanrı rizasına vəsf etdim səni,
O haqq yolu tutmaq asan iş deyil.
Sən də yeri düşsə yada sal məni,
Axı, hər əməl də yüksəliş deyil.

Elmindən soraqdır yazdığın kitab,
Bu da el-obaya xidmətdi, ey dost!
Elmin yollarında çəkilən əzab,
İnsana əbədi şöhrətdi, ey dost!

Tanrıya, Qurana bağlı sözündə,
İlahi eşqi var, şəfqətdi, axund!
Bu günün, sabahın, gələcəyin də,
Elə adın kimi nüsrətdi, axund!

**Qulu Vəci oğlu**





## MİNNƏTDARLIQ

Çox hörmətli əziz və mehriban oxucular!

Uzun müddət çəkdiyim zəhmətin, axtarışlarımın bəhrəsi olan bu kitab xeyirxah, təəssübkeş, səxavətli, mərhəmətli, mehriban insan olan Hidayət (Elman) Adiloğlunun köməkliyi ilə işıq üzü gördü. Hidayət (Elman) bu xeyirxahlığı ilə, həmişə məhəbbət bəslədiyi doğma Qızılağacın tarixi keçmişi ilə oxucuların tanış olması üçün şərait yaratdı.

Hidayətin bu xeyirxahlığı müqabilində Allahdan həmişə ona uğurlar diləyirəm.

Hörmətli oxucu, bu kitabda hər hansı səhv, nöqsan nəzərə çarpsa, irad və təkliflərinizlə birlikdə mənə bildirməyi unutmayın. Əgər müraciət niyyətində olmasanız, onda məni bağışlayın. Bağışlamaq böyük nemətdirsə, bağışlayanlar müdrik insanlardır. Allahdan mənim də bağışlanmağımı istəyin.

***Müəllifdən***

## MÜNDƏRİCAT

**Ziyalılar**



**Rəhbər işçilər**



**Səhiyyə işçiləri**







**Hüquqşünaslar**



**Çekistlər**



**Qızılağaclı yazıçılar**



**Musiqiçilər**



**Sənətkarlıq**

**Əmək cəbhəsində**



**İdmançılar**



**Hərbiçilər**



**Qızılağac İkinci Dünya müharibəsi illərində**



**Qızılağac Qarabağ müharibəsində**



**Müsavatçılar**







**Hara getdi o karvan?**



**Dənizçilər**



**Xeyriyyəçilər**

**Molla Kərbəlayi Nüsrət Qızılağaclı**
*(Nəsrullayev Nüsrət Nəsrulla oğlu)*

QIZILAĞAC VƏ QIZILAĞACLILAR

Dizayner: **Zaur QAFARZADƏ**
Bilgisayar tərtibatçı: **Rahilə MƏMMƏDOVA**
Yığıcı: **Sədaqət KƏRİMOVA**
Korrektor: **Elvira ƏSGƏROVA**

Yığılmağa verilmişdir: 20.12.2005
Çapa imzalanmışdır: 16.05.2006
Kağız formatı: 60x90 1/16
H/n həcmi: 32,5 ç.v.
Sayı: 500 Sifariş: 216

Kitab "ADİLOĞLU" nəşriyyatında
yığılmış və səhifələnmişdir.
*Ünvan: Bakı şəh., Nizami küç., 96/12*
*Tel.: 498-68-25; faks: 498-08-14;*
*Web: www.adiloglu.az; E-mail: info@ adiloglu.az*

"TS" mətbəəsində hazır diapozitivlərdən
istifadə olunmaqla ofset üsulu ilə çap edilmişdir.
*Ünvan: Bakı şəh. İ.Məmmədov, 1059*
*Tel.: 418-68-25*

## МАСАЛЛЫ РАЈОНУ




*Ottensin Xəzər dənizi xəritəsi (1722-1723-cü il)*